

AZƏRBAYCAN RESPUBLİKASININ PREZİDENTİ YANINDA
ALİ ATTESTASİYA KOMİSSİYASI











https://doi.org/10.69682/arti.2025.92.3
https://archive.org/details/elmi-s-rl-r-2025-1-son-sas – Internet Archive
https://journals.indexcopernicus.com/search/details?id=122986 – Index Copernicus
https://journalseeker.researchbib.com/view/issn/2409-8817 – Researchbib
https://www.slideshare.net/slideshow/scientific-works-volume-92-number-1-pdf-9f70/276305180– SlideShare
https://www.calameo.com/books/00733599562d968773953 – Calameo
https://isindexing.com/isi/viewjournal.php – International Scientific Indexing
http://olddrji.lbp.world/Search.aspx?J=Scientific%20Works&S=0 – Directory of Research Journals Indexing

**ISSN 2409-8817**
**E-ISSN 3078-2813**
**DOI: 10.69682**


**AZƏRBAYCAN RESPUBLİKASI ELM VƏ TƏHSİL NAZİRLİYİ**
**AZƏRBAYCAN RESPUBLİKASININ TƏHSİL İNSTİTUTU**

# *ELMİ ƏSƏRLƏR*

**cild 92, № 3, 2025**

# *НАУЧНЫЕ ТРУДЫ*

**том 92, № 3, 2025**

# *SCIENTIFIC WORKS*

**volume 92, № 3, 2025**


**“Elmi əsərlər” 1934-cü ildən çıxır**
**İldə 6 nömrə nəşr olunur**
**Redaksiyanın ünvanı**:
Bakı şəhəri, Zərifə Əliyeva küçəsi, 96
Tel: 493-96-21, 493-30-06

*Azərbaycan Respublikasının Təhsil İnstitutu Elmi şurasının iclasının qərarı ilə nəşr edilir.*

*Təsisçi: Azərbaycan Respublikasının Təhsil İnstitutu*
*"Elmi əsərlər" məcmuəsi Azərbaycan Respublikası Ədliyyə Nazirliyinin*
*11 iyul 2002-ci il tarixli 23 №-li əmri ilə qeydə alınmışdır.*

*Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə*
*tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir.*

## BAŞ REDAKTORDAN
## ОТ ГЛАВНОГО РЕДАКТОРА
## FROM THE EDITOR-IN-CHIEF

UOT 371

**Akif Nurağa oğlu Abbasov**
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun elmi katibi,*
*pedaqogika elmləri doktoru, professor, Əməkdar müəllim*
*https://orcid.org/0000-0002-9210-7141*
*https://doi.org/10.69682/arti.2025.92(3).5-9*
*E-mail: prof.akif@mail.ru*

# BÖYÜYƏ HÖRMƏT TƏRBİYƏSİNİN FORMALAŞDIRILMASININ VACİBLİYİ

**Akif Nuragha Abbasov**
*scientific secretary of the Institute of Education of the Republic of Azerbaijan*
*doctor of pedagogical sciences, professor, professor, Honored teacher*

# THE IMPORTANCE OF FORMING THE UPBRINGING OF RESPECT FOR ADULTS

**Акиф Нурага оглы Аббасов**
*ученый секретарь Института Образования Азербайджанской Республики,*
*доктор педагогических наук, профессор, заслуженный учитель*

# ВАЖНОСТЬ ФОРМИРОВАНИЯ ВОСПИТАНИЯ УВАЖЕНИЯ К ВЗРОСЛЫМ

**Xülasə.** Mənəvi tərbiyənin çox mühüm vəzifələrindən, tərkib hissələrdən biri də təhsilalanlarda özlərindən böyüklərə, yaşlılara hörmət hissinin formalaşdırılmasından ibarətdir. Tarixən yaşlı, ahıl, qoca adamlar, nüfuz qazanmış şəxslər cəmiyyətdə önəmli yer tutmuş, nüfuzları gözlənilmiş, hörmət və qayğı ilə əhatə olunmuşlar. Böyüyə hörmət insana hörmətdən ayrı nəzərdən keçirilmir.
***Açar sözlər**: böyüyə hörmət, böyüyə hörmət tərbiyəsi, qocalara hörmət, balacalara qayğı, qocaların nüfuzunu qorumaq*

**Summary**. One of the most important tasks and components of moral education is the formation of a sense of respect for elders in students. Historically, the elderly, old people, influential people occupied an important place in society, their authority was expected, they were surrounded by respect and care. Respect for elders is not considered separately from respect for a person.
***Key words**: respect for elders, upbringing of respect for elders, care for the young, protection of the authority of elders*

**Резюме**. Одной из важнейших задач и составляющих нравственного воспитания является формирование у обучающихся чувства уважения к старшим. Исторически пожилые, старые люди, влиятельные люди занимали важное место в обществе, их авторитет был ожидаем, они были окружены уважением и заботой. Уважение к старшим не рассматривается отдельно от уважения к человеку.
***Ключевые слова**: уважение к старшим, воспитание уважения к старшим, забота о молодых, защита авторитета старших*

Həzrəti Məhəmməd peyğəmdər qocaların hörmətini saxlamağı vacib sayırdı. Diqqət edək: Hər kim müsəlman qocanı əziz tutar, hörmət edər, Allah Qiyamət günü onu çətinliklərdən amanda saxlayar. O cavan ki, qocanı yaşına

görə əziz tutar, Allah o qocalan zaman birini gətirər ki, onu əziz tutsun.

Atalarımız heç də təsadüfi deməmişlər: "Böyüyə hörmət elə, sən də böyüyəcəksən", "Atana hörmət elə, oğlun sənə hörmət edər", "Böyüyə hörmət vacibdir", "Hamıya hörmət elə, hörmətin olar", "İstəyirsən qocalıqda hörmətin olsun, cavanlıqda qocalara hörmət elə", "Kiçiklərə hörmət elə, böyüklərdən hörmət qazan", "Kişiyə hörmət, artırar minnət", "Loğma qarın doyurmaz, hörmət artırar", "Özünə hörmət qoymayan, özgəyə də hörmət qoymaz", "Qocaya hörmət elə, sən də qocalacaqsan", "Tanrım, böyüklərdən ululuğu, qocalardan hörməti, cocuqlardan utancı qoparma".

Bu atalar sözlərindən çıxan məntiqi nəticə bundan ibarətdir ki, sən özündən böyüklərə hörmət etməlisən ki, gələcəkdə sən də yaşa dolacaqsan, qocalacaqsan. Sənə də hörmət qoyulsun. Dünya gör-götür dünyasıdır. Hər kəsin əməli, hərəkəti göz qabağında olur.

Böyük deyəndə heç də yalnız ağsaqqal kişi və ağbirçək qadın başa düşülmür. Yaşlı şəxslərin daha çox hörmətə, qayğıya ehtiyacı var. Lakin bu və ya digər şəxs xeyli yaşlıdır deyə bu, insanı onunla, onun hərəkəıt və əməlləri barədə öz fikrini açıq bildirməkdən, sözünü deməkdən, qüsurları göstərməkdən çəkindirməməlidir.

İnsan mədəniyyətinin göstəricilərindən biri də onun özündən böyüklərə hörmət və ehtiram bəsləməsi, onların qayğısına qalması, nüfuzunu qaldırmasıdır.

Vaxtilə biz tez-tez keçmiş ittifaqa daxil olan respublikaların şəhərlərinə, paytaxtlarına, xüsusən Moskvaya ezamiyyətə, elmi konfranslara gedər, adətən metrodan, avtobusdan, bəzən taksidən istifadə edərdik. Metroda, adətən belə çağırış səslənərdi: "Özünüzdən yaşlılara, qocalara, qadınlara, əlillərə, əliuşaqlılara yer verməyi unutmayın". Bu bizə çox qəribə görünərdi. Çağırışla da böyüyə hörmət olar? Bu yönümdə tərbiyə işlərinə uşağın kiçik yaşlarından başlamaq lazımdır. Bu, qana keçməlidir, tələbata çevrilməlidir.

Nəqliyyatda böyüyə, körpə uşaqlı şəxslərə, qadına yer vemək bizdə mənəvi normaya çevrilmişdir. Azərbaycanda dinməz-söyləməz, təklifsiz, xatırlatmadan qocalar, yaşlılar, hamilə qadınlar, əlillər avtobusun salonuna daxil olanda, metroya minəndə cavanlar, orta yaşlılar həmişə dərhal ayağa qalxıb onlara yer vemişlər. Hətta cavan qızlara da yer göstərilərdi. Böyüyə hörmət diktə ilə olmur, ailədə və məktəbdə verilən tərbiyənin nəticəsi kimi meydana gəlməlidir.

Vaxtilə məktəblinin, gəncin özünü görməməzliyə vurub üzünü pəncərəyə sarı çevirməsi, yaxud özünü qəzet, kitab oxuyan kimi göstərməsi ictimaiyyət tərəfindən tənə ilə qarşılanırdı.

İllər keçib. Ezamiyyıətlərə çox da getmirik. Öz metromuzla, avobusumuzla bazarlığa, şənliklərə, bayramlara, müxtəlif tədbirlərə gedib-gəlirik. Lakin əvvəlki illərdən fərqli olaraq qəribə mənzərə ilə qarşılaşırıq. Bir zamanlar – 30-40 il bundan əvvəl başqa respublikaların nəqliyyat vasitələrində qarşılaşdığımız hallar indi öz başımıza gəlir. Metronun vaqonlarındakı oturacaqların əksəriyyəti 6 nəfərlikdir. Vaqonun salonuna daxil olursan. Diqqəti cəlb edən nədir? 6 nəfərlik oturacağın 3-4-də yeniyetmə oğlan və qız, gənc, yaxud 30-40 yaşlı şəxs oturub. Onların başı üzərində yaşlı, ahıl kişi və qadın dayanıb. Əyləşənlərin əksəriyyəti əlində mobil telefon özünü məşğul göstərir, yerindən qalxıb nə qadına, nə özündən xeyli yaşlıya, nə qocaya yer təklif etmir. Çox pis!

Milli dəyərlərimizə laqeyd yanaşan bu şəxslərə ar olsun!

Ümummilli Lider Heydər Əliyev yaşlı insanlara qayğı ilə yanaşmağı, onlara qayğı göstərməyi vacib sayıdir. Diqqət yetirək: "Mən bu gün bir azərbaycanlı kimi, özündə həm milli-mənəvi dəyərləri, həm də ümumbəşəri dəyərləri cəm edən bir insan kimi deyirəm ki, bizim xalqımızın mənəvi-əxlaqi mentaliteti onun ən böyük sərvətidir, milli sərvətidir. Bizdə nə qədər gözəl əxlaqi qaydalar var, bunlar əsrlər boyu formalaşıb, məsələn, kiçiyin böyüyə hörməti, böyüyün kiçiyə qayğısı, övladın valideynlərinə hədsiz hörməti, valideynlərin də öz övladlarına olan qayğısı və məhəbbəti. Bu, bizim xalqımızın mentalitetidir. Ümumbəşəri dəyərlər konstitusiyamızda öz əksini tapıbdır. Biz hüquqi, demokratik, dünyəvi dövlət quruculuğu prosesi aparırıq. Bax bu bir cümlədə ümumbəşəri dəyərlərin ifadəsi öz yerini tapıbdır. Ümumbəşəri dəyərlərlə milli-mənəvi dəyərlərin vəhdəti, sintezi bizim milli ideologiyamızın bu günü və gələcəyidir".

Mənim bir hekayəm var. "Millətin qocası" adlanır. Tanış olaq: "İstanbul. Qitələrarası bir şəhər. Türkiyənin ən böyük şəhəri, dünyanın ən qədim mədəniyyət mərkəzlərindən biri. Təxmi-

nən 470 il Osmanlı imperiyasının paytaxtı, 30 Osmanlı sultanın iqamətgahı olub. İstanbul dünyanın ən özəl və gözəl şəhərlərindəndir. Şəhər iki qitədə – Avropa və Asiyada yerləşən nadir şəhərlərdən biridir.

Şəhərin baş küçəsində maşınlar şütüyür. Şəhər həmişəki xoş ahəngi ilə yaşayır, insanlara fərəhli günlər bəxş edir. Şəhərdə qələbəlikdir. Əhalinin sayı az qala 17 milyona çata. Meydanlar, küçələr dolub boşalır.

Sərin meh əsir. Kimisi işə, kimisi dükan-bazara, kimisi görüşə tələsir. İstanbul hər il doqquz milyona qədər turist qəbul edir. Budur, turistlər şəhəri gəzib-dolaşırlar. Füsunkar və tarixi yerləri, Aya Sofya məbədini, Topqapı sarayını görmək, İstanbul Boğazında – Qara dənizlə Mərmərə dənizini bir-birinə bağlayan su keçidində gəmi ilə gəzmək istəyirlər.

İşığaforun yaşıl işığı yanırdı. Adamlar bu küçədən o biri küçəyə adladılar. Yaşlı bir kişi keçməyə macal tapmadı. Qırımızı işıq piyadalara "gözlə" deyirdi. Maşınlar hərəkətə gəlmişdilər. Görünür, qocanın gözləri yaxşı görmürdü. Ayağını yolun hərəkət hissəsinə qoymuşdu. Yol polisi özünü yetirdi. Zolaqlı dəyənəyini qaldırıb yolu bağladı. Maşınlar dayandılar. Polis qocanın qolundan tutub ağır addımlarla o biri küçəyə apardı. Maşınlar gözləyirdilər. Polisin işarəsi ilə onlar yola düşdülər. Bu mənzərəni seyr edən turistlərdən biri polisə yaxınlaşdı:

– Səni başa düşmədim. Əldən düşmüş bir qoca kişiyə görə o qədər maşını saxlayıb gözlətdin. Buna dəyərdimi?

Polis ona baxıb gülümsədi, Turistin xətrinə dəymək istəmədi, amma sözünü dedi:

– O qoca elə-belə, adi qoca deyil, mənim millətimin qocasıdır! Ona əldən düşmüş, gərəksiz qoca kimi baxma. Mənim borcum onu qorumaqdır. Sən nə bilirsən o bu millət, bu Vətən üçün nələr edib. Bunu heç mən də bilmirəm... Amma millətimin bütün qocalarına bizim hörmətimiz və ehtiramımız var.

Turist pərt oldu. Səhvini anlayıb üzr istədi və yoluna davam etdi".

K.D. Uşinski uşaqlar üçün "Baba" adlı bir hekayə yazmışdır. Həmin nağılı diqqət mərkəzinə gətirək: "Baba çox qocalmışdı. Çətinliklə görür, zorla eşidirdi. Qocalıq sinəsinə çökmüşdü. Əl-ayağı əsirdi. Qaşığı ağzınaaparırdı ki, şorbanı içsin, şorba üst-başına tökülürdü.

Onun yöndəmsiz hərəkıətləri nə oğulnun, nə də gəlinin xoşuna gəlmirdi. Az qala ondan iyrənirdilər. Axırda ataya onlarla süfrə arxasında əyləşməyə imkan vermədilər. Qocanı sobanın arxasında əyləşdirir, ona gil qabda yemək verirdilər.

Qocanın əlləri əsirdi, qab-qacağı əlinda saxalaya bilmirdi. Fincan əlindən salıb sındırdı. Bunu görən oğul və gəlin qəzəblənib, qocaya yeməyi köhnə taxta qabdan verməyə başladılar.

Bu evdə bir nəvə də vardı. O, baş verən hadisələri izləyirdi. Bir gün oğlan yerdə oturub taxta parçalardan nə isə düzəldirdi. Anası özünü ona tutaraq:

– Ay oğul, edirsən? – deyə soruşdu.

Uşaq:

– Qab düzəldirəm, – dedi. – Atanla sən qocalanda sizii taxta qabdan yedizdirəcəyəm.

Ata və ana bir-birlərinə baxıb qızardılar. Öz səhvlərini başa düşüb qocanı süfrə arxasına gətirdilər, ona taxta boşqabda yemək, taxta fincanda çay və su verməkdən əl çəkdilər.

İbrətamiz hekayədir. Balaca oğlan öz ata-anasına layiqli dərs verir.

Məktəbdə təlim zamanı və dərsdən sonra təşkil olunan tədbirlərdə şagirdlərə başa salınmalıdır ki, böyüyə hörmət sahəsində xalqımızın gözəl ənənələrini davam etdirmək son dərəcə zəruri məsələdir. Aparılmış məqsədyönlü iş nəticəsində məktəblilər böyüklə qarşılaşanda ona salam verir, yaşlı adamın gəldiyini gördükdə ayağa qalxır və yaxud oturmaq üçün ona yer verir. Böyüyə hörmət qayğıkeşliklə sıx surətdə əlaqədardır. Yaşlı qadına ağır çantanı aparmaqda kömək etmək çox xeyirxah işdir, onun qayğısına qalmaq deməkdir. Böyüyə hörmət həm də yeri gəldikdə onunla məsləhətləşməyi, onun rəyini öyrənməyi tələb edir. Xüsusən ahıl adamdan məsləhət istədikdə onda sevinc hissi oyanır. Özünün hələ gərəksiz olmadığını, xeyrə-şərə yaradığını anlamaq duyğusu onun həyat eşqini alovlandırır, ömrünü uzadır. Lakin böyük də öz hörmətini saxlamalı, öz-özünə hörmət etməlidir.

Kinorejissor *Babək Abbaszadənin* "***Böyüklərə hörmət elə***..." adlı hekayəsini yadımıza salaq: "Nadir oxuduğu məktəbdən bir-iki dayanacaq aralıda yaşayırdı. Buna görə də çox vaxt məktəbə avtobusla gedirdi. Nadirin qəribə xasiyyəti vardı. Avtobusda boş yer görən kimi tez oturardı. Üzünü də pəncərəyə çevirərdi ki, avtobusa minən olanda ona yer verməsin. Bir dəfə

Nadir məktəbə gedirdi. Həmişəki kimi pəncərədən çölə baxırdı. Amma avtobusdakı danışıqları eşidirdi. Sinif yoldaşı Tofiqin səsi idi:

– Dayı, buyurun, əyləşin.

– Ay oğul, zəhmət çəkmə.

Yenə səs eşidildi:

– Dayı, burada yer var, gəlin, əyləşin.

– Ay bala, sən narahat olma. Burada bir oğlan var, istəyirəm o mənə yer versin.

Səs Nadirə yaxınlaşdı. Həmin kişi Nadirin başı üzərində dayanmışdı. Səs ona tanış gəlirdi. Nadir üzünü çevirəndə atasını gördü".

İbrətamiz əhvalatdır. Həmin hekayədən belə məntiqi nəticə çıxarmaq olar ki, sən nəqliyyatda özündən böyüklərə yer verməlisən. Bu, məktəbli kimi sənin mənəvi borcundur, həm də sən burada qoca, yaşlı kişiyə, qadına yer verirsənsə, başqa bir avtobusda, metroda kimsə sənin anana, bacına, atana öz yerini təklif edir. Başqa bir tərəfdən, indi böyüklərə hörmət etməlisən ki, qocalanda sənə də hörmət etsinlər.

Digər mənəvi keyfiyyətlər kimi böyüyə hörmət üzrə işə uşaq hələ kiçik yaşlarda ikən başlamaq lazımdır. Böyük Nizami demişkən:

Hər bir şey təməldən möhkəm qurulur,
Təməlsiz binalar çox tez də uçur.

Xeyirxahlıq kimi nəcib sifətin balacalara aşılanmasında ailənin üzərinə mühüm vəzifə düşür. Ailənin həyat tərzi, ata-ana, bacı-qardaş, baba-nənə, yaşlılarla uşaqlar arasında qarşılıqlı anlama, səmimiyyət, mehribanlıq və hörmət, tərbiyə prosesinin düzgün qurulması bu müsbət mənəvi keyfiyyətin təşəkkül tapmasına şərait yaradır. Ailənin bünövrəsi möhkəmdirsə, valideynlər vətəndaşlıq borclarını aydın dərk edirlərsə, özlərindən yaşlı adamlara qayğı və ehtiramla yanaşır, onlarla mehriban davranır və hörmətlə yanaşırlarsa, ata-ananın belə xüsusiyyətləri, keyfiyyətləri övladlarına da keçəcək, onların gözəl rəftarını yamsılamağa can atacaq, böyüklərə hörmət edəcəklər. Eyni sözlər pedaqoji kollektivlərin üzvlərinə də aiddir.

Ailə üzvləri yalnız öz aləmlərinə qapıldıqları, başqasının halına, sevincinə və dərdinə şərik çıxmağa çox da maraqlı olmadıqları, bir-birinə qarşı hörmətsizlik və kobudluq göstərdikləri təqdirdə uşaq da, təbii ki, onların təsiri altına düşəcək. Böyüyə hörmət ata-anaya hörmətlə sıx bağlıdır. Biz, hər şeydən əvvəl, öz valideynlərimizə hörmət etməli, onların qayğısına qalmalıyıq. Bunsuz, ümumiyyətlə, böyüyə hörmətdən söz gedə bilməz.

Səhərlər yataqdan qalxarkən evdəkiləri salamlamaq, onlara "sabahınız xeyir", axşamlar isə yatmamışdan əvvəl "gecəniz xeyrə qalsın" demək ailədə hökm sürən qarşılıqlı hörmətin, özündən böyüklərə ehtiramın əlamətidir. Böyüyə hörmət çox vaxt bu vərdişlər əsasında inkişaf edib təkmilləşir. Böyüyə hörmət özündən yaşlı adamlara qulaq asmağı, onlara yer verməyi, valideynlərin dediklərini yerinə yetirməyi, ata-anadan icazəsiz başqa yerə gedib onları nigarançılıq içərisində qoymamağı nəzərdə tutur.

Özündən böyüyün üstünə qışqırmaq, ona əl qaldırmaq, ağzını əyib lağa qoymaq, onunla kobud danışmaq yaramaz. Ata-ana, böyük bacı-qardaş paltarını dəyişərkən onlara kömək göstərən, ev paltarlarını və çəkmələrini gətirib onlara verən oğlan və qız ehtirama layiqdir.

Məktəbdə təlim zamanı və dərsdən sonra təşkil olunan tədbirlərdə şagirdlərə başa salınmalıdır ki, böyüyə hörmət sahəsində xalqımızın gözəl ənənələrini davam etdirmək son dərəcə zəruri məsələdir. Aparılmış məqsədyönlü iş nəticəsində məktəblilər böyüklə qarşılaşanda ona salam verir, yaşlı adamın gəldiyini gördükdə ayağa qalxır və yaxud oturmaq üçün ona yer verir. Böyüyə hörmət qayğıkeşliklə sıx surətdə əlaqədardır. Yaşlı qadına ağır çantanı aparmaqda kömək etmək çox xeyirxah işdir, onun qayğısına qalmaq deməkdir. Böyüyə hörmət həm də yeri gəldikdə onunla məsləhətləşməyi, onun rəyini öyrənməyi tələb edir. Xüsusən ahıl adamdan məsləhət istədikdə onda sevinc hissi oyanır. Özünün hələ gərəksiz olmadığını, xeyrə-şərə yaradığını anlamaq duyğusu onun həyat eşqini alovlandırır, ömrünü uzadır. Lakin böyük də öz hörmətini saxlamalı, öz-özünə hörmət etməlidir.

**Problemin aktuallığı**. Böyüyə hörmət bütün dövrlərdə olduğu kimi hazırda da son dərəcə aktuallıq daşıyır.

**Proeblemin yeniliyi**. Böyüyə hörmət tərbiyəsinin formalaşdırılmasının vacibliyi diqqət mərkəzinə gətirilir.

**Problemin praktik əhəmiyyəti**. Məqalə doktorantlar, dissertantlar, magistartlar üçün faydalı olacaqdır.

**Ədəbiyyat**

1. Abbasov, A.N. Pedaqogika: Orta ixtisas məktəbləri üçün dərs vəsaiti / A.N. Abbasov. -Bakı: Mütərcim, -2015. -360 s.
2. Abbasov, A.N. Pedaqogika: Müntəxəbat: Ali məktəblər üçün dərs vəsaiti / A.N. Abbasov, R.R.Məmmədzadə, L.A. Məmmədli. -Bakı: Mütərcim, -2021. -608 s.
3. Pedaqogika nəzəriyyəsi və tarixi: Ali təhsil müəssisələri üçün dərslik / A.N. Abbasov, L.A. Məmmədli, İ.B. Əmirəliyeva. -Bakı: Mütərcim, -2022. -464 s.
4. Abbasov, A.N. Pedaqogika: Ali təhsil müəssisələri üçün dərslik / A.N. Abbasov, H.Ə. Əlizadə. -Bakı: Mütərcim, -2024. -400 s.

**Redaksiyaya daxil olub**: 06.06.2025

*UOT 37.01.*

***Инара Самидали гызы Джафарова***
*преподаватель Азербайджанского Государственного*
*Педагогического Колледжа при Азербайджанском Государственном*
*https://orcid.org/0000-0001-5181-9946*
*https://doi.org/10.69682/arti.2025.92(3).10-13*
*E-mail: inara-asadova@mail.ru*

## ОБЩЕНАЦИОНАЛЬНЫЙ ЛИДЕР ГЕЙДАР АЛИЕВ ПРЕВРАТИЛ МЕЧТУ АЗЕРБАЙДЖАНСКОГО НАРОДА О СУВЕРЕНИТЕТЕ В ИСТОРИЧЕСКУЮ РЕАЛЬНОСТЬ

***İnarə Səmidəli qızı Cəfərova***
*Azərbaycan Dövlət Pedaqoji*
*Universitetinin nəzdində Azərbaycan Dövlət Pedaqoji*
*Kollecin müəllimi*

## ÜMUMMİLLİ LİDER HEYDƏR ƏLİYEV AZƏRBAYCAN XALQININ SUVERENLİK ARZUSUNU TARİXİ REALLIĞA ÇEVİRDİ

***Inara Samidaly Jafarova***
*teacher of the Azerbaijan State*
*Pedagogical College under the Azerbaijan State*
*Pedagogical University*

## NATIONAL LEADER HEYDAR ALIYEV TURNED THE AZERBAIJANI PEOPLE’S DREAM OF SOVEREIGNTY INTO A HISTORICAL REALITY

**Аннотация.** Статья посвящена подготовке Основного Закона, одному из важнейших событий в истории независимости нашего государства, как результату упорного труда Великого Лидера Гейдара Алиева, достижению серьезных успехов в области правовой системы, защиты прав человека и модернизации государственного управления в Азербайджане, а также проведению последовательных реформ по продолжению этих достижений и углублению конституционных принципов под руководством Президента Ильхама Алиева.
***Ключевые слова:*** *независимость, суверенитет, общенациональный лидер, демократия, права человека*

**Xülasə.** Məqalə, dövlətimizin müstəqillik tarixinin ən mühüm hadisələrindən olan Əsas Qanunun məhz Ulu Öndər Heydər Əliyevin gərgin əməyi nəticəsində hazırlanmasına, Azərbaycanda hüquq sistemi, insan hüquqlarının təminatı və dövlət idarəetməsinin müasirləşdirilməsi sahəsində ciddi nailiyyətlər əldə etməsinə Prezident İlham Əliyevin rəhbərliyi ilə bu nailiyyətlərin davam etdirilməsi və konstitusiya prinsiplərinin dərinləşdirilməsi üçün ardıcıl islahatlar həyata keçirilməsinə həsr edilmişdir.
***Açar sözlər:*** *müstəqillik, suverenlik, ümummilli lider, demokratiya, insan hüquqları*

**Abstract.** The article is dedicated to the preparation of the Fundamental Law, one of the most important events in the history of our state's independence, as a result of the hard work of the Great Leader Heydar Aliyev, the achievement of serious achievements in the field of the legal system, human rights protection and modernization of public administration in Azerbaijan, and the implementation of consistent reforms under the leadership of President Ilham Aliyev to continue these achievements and deepen constitutional principles.
***Keywords:*** *independence, sovereignty, national leader, democracy, human rights*

Жизнь и политическая деятельность Гейдара Алиева – Гениального лидера, внесшего неоценимый вклад в становление и развитие традиций национальной государственности в нашей стране, занимают исключительное место в нашей новейшей истории. Благодаря своим высоким гуманистическим качествам, прекрасным навыкам государственного управления и культуре служения народу великий лидер Гейдар Алиев относится к числу редких исторических личностей в мире. Сегодня мы благодарны Общенациональному лидеру Гейдару Алиеву за сохранение независимого Азербайджанского государства и становление его как могущественной страны. Уместно сказать, что Гейдар Алиев, гений современности, покоривший вершину бессмертия в сердцах каждого гражданина, оставил нашему народу в наследство богатые материальные и духовные ценности, альтернативную концепцию государственности, сильный Азербайджан, основанный на надежных политических и экономических основах. Одним словом, общенациональный лидер был, в прямом смысле этого слова, величайшим азербайджанцем. Будучи большим энтузиастом страны, народа, истории Азербайджана и его государственности, он стал спасителем Азербайджана, восстановившего свою независимость в конце XX века, тем самым предотвратив угрозу распада и уничтожения нашей страны. Общенациональный лидер Гейдар Алиев превратил стремление азербайджанского народа к суверенитету в историческую реальность и сохранил независимость, достигнутую ценой больших жертв, выдержав тяжелые испытания временем. Недостаточно перечислить заслуги великого лидера на благо прогресса нашего народа за годы его руководства нашей республикой. Азербайджанский народ воспринимает своего великого сына Гейдара Алиева не только как политического лидера, но и как непревзойденного автора идеологии национальной государственности. Потому что вне политического курса великого политического деятеля Гейдара Алиева нет азербайджанской государственности. Концепция развития независимого Азербайджана связана с именем общенационального лидера Гейдара Алиева. Именно благодаря возвращению великого лидера к власти в 1993 году по просьбе народа и его великой спасительной миссии были предотвращены опасные процессы, происходящие в нашей стране, обеспечена общественно-политическая стабильность, создан надежный фундамент для современного государственного строительства. Первая Конституция Азербайджанской Республики, подготовленная под непосредственным руководством Великого Лидера и принятая 12 ноября 1995 года, легла в основу широкомасштабных законодательных и институциональных реформ в нашей стране. Учитывая исключительную значимость принятия Конституции в истории национальной государственности, в соответствии с Указом от 1 ноября 1996 года, подписанным Великим Лидером Гейдаром Алиевым, 12 ноября ежегодно отмечается в нашей стране как День Конституции. В этом году исполняется 30 лет со дня принятия Конституции Азербайджанской Республики. В результате исторической победы в Отечественной войне, начавшейся 27 сентября 2020 года в ответ на армянские провокации, и успешной антитеррористической операции, проведенной 19-20 сентября 2023 года, полностью восстановлены территориальная целостность и суверенитет нашей страны, а на всех территориях, где была снята оккупация, установлена юридическая сила Конституции Азербайджана. Указом Президента Азербайджанской Республики господина Ильхама Алиева от 19

сентября 2024 года 20 сентября объявлено Днем государственного суверенитета в Азербайджанской Республике. В этом году исполняется 5 лет со дня нашей Победы в Отечественной войне. Учитывая эти знаменательные и важные даты, Президент Ильхам Алиев своим Указом от 28 декабря 2024 года объявил 2025 год в Азербайджанской Республике «Годом Конституции и суверенитета». Этот указ имеет особое значение с точки зрения более глубокого изучения истории нашей государственности. В рамках «Года Конституции и суверенитета» будет реализован ряд мероприятий и проектов. Эти меры направлены на укрепление правовой и управленческой базы Азербайджана, консолидацию конституционных ценностей и национального суверенитета. Мероприятия, которые пройдут в этом году, еще раз подчеркнут значимость независимости и государственности Азербайджана. Также в учебных заведениях будут организованы специальные занятия и лекции по теме конституции и суверенитета. Конституция Азербайджана составляет основу правовой и политической системы страны. В течение всего года будут проходить обсуждения конституционных реформ и нововведений, и эти реформы будут способствовать будущему развитию страны. В Азербайджане ведется ряд обсуждений и инициатив относительно объявления 2025 года «Годом Конституции и суверенитета». Эти обсуждения в основном охватывают следующие темы:

*Конституционные реформы:* Обсуждаются конституционные реформы с целью дальнейшего совершенствования правовой и управленческой системы Азербайджана. Эти реформы направлены на будущее развитие страны и укрепление ее правовой базы.

*Национальный суверенитет:* Обсуждаются также вопросы полного восстановления и защиты территориальной целостности и суверенитета Азербайджана. Эта тема имеет особое значение, особенно в связи с 5-летием Победы в Отечественной войне.

*Образование и просвещение:* В учебных заведениях организуются специальные занятия и лекции по теме конституции и суверенитета. Целью данных мероприятий является информирование подрастающего поколения о конституционных ценностях и национальном суверенитете.

*Международные отношения:* Ведутся обсуждения по укреплению позиций Азербайджана в международном сообществе и реализации проектов, которые будут способствовать развитию страны. Это обеспечит международное признание Азербайджана и укрепление его позиций.

*Публичные мероприятия:* проводятся различные конференции, семинары, выставки и другие публичные мероприятия. Эти меры обеспечат развитие правовой системы Азербайджана и пропаганду конституционных ценностей.

Эти обсуждения и мероприятия будут способствовать укреплению правовой и политической системы Азербайджана, укреплению национального суверенитета и содействию будущему развитию страны.

Следует отметить, что объявление в нашей стране «Года Конституции и суверенитета» является историческим шагом в деле утверждения нашего национального суверенитета и правовых ценностей. Масштабные реформы, которые будут реализованы в течение года, также заложат основу для продвижения азербайджанского народа по пути строительства правового государства.

**Актуальность статьи.** Великий лидер Гейдар Алиев является автором идеологии, в которую в равной степени верят все жители Азербайджана. Он заложил основу государства, способного защищать права всех граждан, и создал систему управления, основанную исключительно на верховенстве закона. Для этого, прежде всего, необходимо было добиться установления общественно-политической стабильности. Первые шаги, предпринятые нашим общенациональным лидером, привели к установлению прочной стабильности и формированию нормальной системы политических отношений в Азербайджане, что в целом привело к укреплению политических основ государства.

**Научная новизна статьи.** Указ, подписанный главой государства господином Ильхамом Алиевым, является возможностью формирования ценностей правовой государственности и суверенитета, имеющих особое значение для прошлого, настоящего и будущего нашей страны. «Год Конституции и суверенитета» направлен на укрепление правовых основ государства и усиление государственного суверенитета. В этом году

полное восстановление территориальной целостности и суверенитета Азербайджана будет праздноваться в соответствии с принципами, отраженными в Конституции.

**Практическая значимость статьи.** Суверенитет является гарантией независимости и территориальной целостности Азербайджана. В течение этого года будут реализованы различные мероприятия и проекты на тему суверенитета. Этот год также станет возможностью для дальнейшего укрепления позиций Азербайджана в международном сообществе и реализации проектов, которые будут способствовать развитию страны. Конституция и суверенитет Азербайджана являются краеугольными камнями будущего развития страны, и в этом году запланировано множество мероприятий для дальнейшего укрепления этих ценностей.

## Литература


1. Гейдар Алиев. Наша независимость вечна. Во II томе, -Баку: «Восток-Запад», -2013. -632 с.
2. Ильхам Алиев, Президент Азербайджанской Республики, Баку, 28 декабря 2024 г.
3. Политическое наследие Гейдара Алиева и азербайджанство». Сборник статей, «Наука и образование», -Баку, 2020. -448 с.
4. https://science.gov.az/az/news/open/31909.



**Redaksiyaya daxil olub:** 19.05.2025

*UOT 37.01.*

***Hümeyir Hüseyn oğlu Əhmədov***
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun*
*Elmi-pedaqoji kadrların hazırlanması şöbəsinin müdiri,*
*pedaqogika üzrə elmlər doktoru, professor,*
*Rusiya Təhsil Akademiyasının xarici üzvü,*
*RTA-nın Əməkdar elm və təhsil xadimi*
*https://orcid.org/0000-0003-0019-4266*
*https://doi.org/10.69682/arti.2025.92(3).14-19*
*E-mail: humeyir@gmail.com*
*a.humeyir@arti.edu.az*

***Lalə Akif qızı Məmmədli***
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun*
*Elmi-pedaqoji kadrların hazırlanması şöbəsinin aparıcı mütəxəssisi,*
*pedaqogika üzrə fəlsəfə doktoru, elmlər doktoru proqramı üzrə əyani doktorant*
*https://orcid.org/0000-0003-0686-3627*
*E-mail: lale23@mail.ru*
*l.memmedli@arti.edu.az*

***Pərvin Cavanşir qızı Əlizadə***
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun*
*Elmi-pedaqoji kadrların hazırlanması şöbəsinin aparıcı mütəxəssisi,*
*Türkiyə Respublikası Van Yüzüncü Yıl Universitetinin qiyabi doktorantı*
*https://orcid.org/0009-0009-5896-2177*
*E-mail: alizadapari.16@gmail.com*

# AZƏRBAYCANIN MUSİQİ TƏHSİLİNİN MEMARI ÜZEYİR HACIBƏYLİNİN PEDAQOJİ İRSİ

***Humeyir Huseyn Ahmadov***
*head of the department of Scientific and pedagogical personnel training of the*
*Institute of Education of the Republic of Azerbaijan*
*doctor of pedagogical sciences, professor*
*foreign member of the Russian Academy of Education*
*Honored scientist and educator of the Russian Academy of Education Sciences*

***Lala Akif Mammadly***
*leading specialist of the department of Scientific and pedagogical personnel training*
*of the Institute of Education of the Republic of Azerbaijan*
*doctor of philosophy in pedagogy*
*pull-time PhD student on the doctor of science Ppogram*

***Parvin Cavanshir Alizadeh***
*leading specialist of the separtment of Scientific and pedagogical personnel training*
*of the Institute of Education of the Republic of Azerbaijan*
*part-time doctoral student at Van Yuzuncu Yil University, Republic of Turkey*

## THE PEDAGOGICAL HERITAGE OF THE FOUNDER OF AZERBAIJAN PROFESSIONAL MUSIC EDUATION UZEYIR HAJIBEYLI

***Гумейир Гусейн оглы Ахмедов***
*заведующий отделом подготовки научно-педагогических кадров,*
*Института Образования Азербайджанской Республики,*
*доктор педагогических наук, профессор,*
*Иностранный член Российской Академии Образования,*
*заслуженный деятель науки и образования РАО*

***Лала Акиф гызы Мамедли***
*ведущий специалист отдела Подготовки научно-педагогических кадров*
*Института Образования Азербайджанской Республики,*
*доктор философии по педагогике,*
*докторант очной формы обучения по программе доктора наук*

***Парвин Джаваншир гызы Ализаде***
*ведущий специалист отдела подготовки научно-педагогических кадров Института Образования Азербайджанской Республики,*
*докторант заочной формы обучения Университета Ван Юзюнджю Йыл Турецкой Республики*

## ПЕДАГОГИЧЕСКОЕ НАСЛЕДИЕ ОСНОВОПОЛОЖНИКА ПРОФЕССИОНАЛЬНОГО МУЗЫКАЛЬНОГО ОБРАЗОВАНИЯ АЗЕРБАЙДЖАНА УЗЕИРА ГАДЖИБЕЙЛИ

**Xülasə.** Üzeyir Hacıbəyli (1885–1948) təkcə bəstəkarlıq və operaya verdiyi töhfələrə görə deyil, həm də musiqi pedaqoqu və nəzəriyyəçisi olaraq fəaliyyətinə görə Azərbaycan mədəniyyət tarixində monumental şəxsiyyət kimi dayanır. Bu məqalə Ü. Hacıbəyli yaradıcılığının pedaqoji ölçülərini tədqiq edir, onun Azərbaycanda musiqi təhsilinin institutlaşdırılması istiqamətində sistemli səylərini, Şərq və Qərb musiqi ənənələrinin nəzəri sintezini, Azərbaycan musiqiçiləri nəsillərinin formalaşmasında davamlı rolunu təhlil edir. Azərbaycan klassik musiqisinin atası kimi tanınan Üzeyir Hacıbəyli həm də ilk pedaqoji xidmətləri ilə müasir milli təhsilin əsasını qoymuş qabaqcıl maarifçi idi. Məqalədə Üzeyir bəyin ən əhəmiyyətli, lakin kifayət qədər öyrənilməmiş əsərlərindən biri olan "Hesab məsələləri" dərsliyi də təhlil edilir və Azərbaycan pedaqoji mühitinə təsiri haqqında məlumat verilir.
***Açar sözlər:*** *Üzeyir Hacıbəyli, musiqi, pedaqogika, tədris, təhsil, maarif*

**Abstract.** Uzeyir Hajibayly (1885–1948) stands as a monumental figure in the history of Azerbaijani culture not only for his contributions to composition and opera, but also for his work as a music teacher and theorist. This article explores the pedagogical dimensions of Uzeyir Hajibayli's work, analyzes his systematic efforts towards the institutionalization of music education in Azerbaijan, his theoretical synthesis of Eastern and Western musical traditions, and his continuous role in the formation of generations of Azerbaijani musicians. Known as the father of Azerbaijani classical music, Uzeyir Hajibayly was also a pioneering educator who laid the foundation of modern national education with his first pedagogical services. The article also analyzes one of Uzeyir bey's most important, but insufficiently studied works, the textbook "Calculus Issues", and provides information about its impact on the Azerbaijani pedagogical environment.
***Keywords:*** *Uzeyir Hajibayly, music, pedagogy, teaching, education, enlightenment*

**Аннотация.** Узеир Гаджибейли (1885-1948) является монументальной личностью в истории азербайджанской культуры не только благодаря своему вкладу в композиторское искусство и оперу, но и благодаря своей работе в качестве педагога музыки и теоретика. В этой статье исследуются педагогические аспекты работы Узеира Гаджибейли, анализируются его систематические усилия по институционализации музыкального образования в Азербайджане, его теоретический синтез восточных и западных музыкальных традиций и его постоянная роль в формировании поколений азербайджанских музыкантов. Известный как отец азербайджанской классической музыки, Узеир

Гаджибейли был также новаторским педагогом, заложившим основу современного национального образования своими первыми педагогическими заслугами. В статье также анализируется одна из важнейших, но недостаточно изученных работ Узеир бека, учебник «Арифметический задачник», и предоставляется информация о его влиянии на азербайджанскую педагогическую среду.
***Ключевые слова:*** *Узеир Гаджибейли, музыка, педагогика, преподавание, образование, просвещение*

Azərbaycanın görkəmli bəstəkarı və maarifçi ziyalısı Üzeyir bəy Hacıbəyli beynəlxalq aləmdə daha çox İslam dünyasında bəstələnmiş ilk operanın – "Leyli və Məcnun"un (1908) müəllifi kimi tanınır. Bununla belə, onun bir pedaqoq kimi töhfələri də eyni dərəcədə qiymətlidir. Azərbaycanda musiqi təhsilinin müasirləşdirilməsinin zəruriliyini dərk edən Ü. Hacıbəyli ənənəvi Azərbaycan milli musiqisini (muğam) Qərb klassik musiqi texnikası ilə birləşdirən sistemin əsasını qoymuşdur. Onun pedaqoji fəaliyyəti yalnız institusional inkişafla məhdudlaşmırdı, musiqişünaslıq, proqram tərtibatı və mədəni islahatlara qədər genişlənmişdi. Üzeyir Hacıbəylinin bir ziyalı kimi formalaşma illəri Azərbaycan tarixinin milli oyanış, intellektual islahatlar, dünyəvi təhsilə daha çox önəm verilməsi ilə əlamətdar olan kritik bir dövrünə təsadüf edir. İlk növbədə bəstəkar kimi tanınsa da, onun peşəkar müəllim şəxsiyyəti həyatında dərin kök salmışdı. Ü. Hacıbəyli 40 ildən çox təhsil fəaliyyəti ilə məşğul olub, əvvəlcə regional müstəvidə müəllim, daha sonra nəşrlər, dərsliklər və təşkilat rəhbərliyi vasitəsilə təhsil haqqında diskussiv tədris mühiti formalaşdıran bir ziyalı kimi Azərbaycan tarixinə adını qızıl hərflərlə yazdırmışdır. O, Zaqafqaziya Müəllimlər Seminariyasında təhsil almaqla başlayıb, burada rus və Avropa təhsil nəzəriyyəsi və praktikasına yiyələnmişdi.

1904-cü ildə oranı bitirdikdən sonra Bakıya köçməzdən əvvəl Hadrut kəndində sinif rəhbəri işləmiş, burada müəllimlik fəaliyyətini davam etdirmiş, eyni zamanda "İrşad", "Həyat", "İqbal", "Tərəqqi", "Kaspi" kimi mütərəqqi qəzetlərdə yazılar yazmışdır. Bu yazılarda tez-tez ana dilinin tədrisi, məktəb islahatları və müasir təbirlə desək, kurrikulumun hazırlanması da daxil olmaqla, aktual təhsil problemlərinə toxunulmuşdur. Üzeyir Hacıbəyli XX əsrin əvvəllərində Azərbaycanın mədəni və milli kimliyini formalaşdıran çoxşaxəli töhfələri ilə görkəmli Azərbaycan bəstəkarı, pedaqoqu, publisist və ziyalısı idi. Heydər Əliyevin vurğuladığı kimi, qeyri-adi istedadı, dərin vətənpərvərliyi, geniş elmi biliyi onu dünya miqyasında tanınan korifeylər sırasına yüksəltmişdi. Azərbaycan peşəkar musiqisinin banisi kimi geniş tanınsa da, onun jurnalistika və maarifçilik sahəsindəki fəaliyyəti eyni dərəcədə əhəmiyyətlidir və öz xalqının intellektual və siyasi yüksəlişinə dərin bağlılığını ortaya qoyur. Hacıbəyli 1918-1920-ci illərdə Azərbaycan Xalq Cümhuriyyəti dövründə "Azərbaycan" qəzeti vasitəsilə fəal jurnalistika ilə məşğul olmuş, burada əvvəlcə müxbir, sonra isə baş redaktor vəzifələrində çalışmışdır. Onun müxtəlif təxəllüslərlə dərc olunan məqalələrində siyasi, sosial və mədəni məsələlərə dərin bağlılığı əks olunmuşdur. "Milli Parlaman", "Ermənistan və Azərbaycan arasında münasibətlər" və "Dağıstana kömək" kimi başlıqları özündə əks etdirən bu yazılar xarici təhdidlər və daxili mürəkkəbliklərlə mübarizə aparan kövrək respublikanın tarixi salnaməsi rolunu oynayır. Ü. Hacıbəylinin redaksiya məqalələri təkcə publisistik ifadələr deyil, həm də milli ideologiyanın daşıyıcısı, azərbaycanlı kimliyini, dilini, müstəqilliyini möhkəmləndirirdi. Respublikanın suverenliyini xarici dövlətlərin imperiya ambisiyalarına və erməni millətçi təcavüzünə qarşı müdafiə etməsi onun kəskin geosiyasi şüurunu ortaya qoyur. Ü. Hacıbəyli açıq şəkildə milli birliyə, ictimai sayıqlığa və Azərbaycanın müstəqilliyinin beynəlxalq səviyyədə tanınmasına çağırıb, xüsusən də antimilli təbliğata qarşı çıxmaq üçün Qərb dövlətləri ilə iqtisadi əlaqələrə və Azərbaycanın təbii sərvətlərindən istifadə etməyə çağırıb. Onun qısa müddətdə əldə olunan müstəqilliyin sovet qüvvələrinə itirilməsi ilə bağlı narahatlığı xüsusilə Azərbaycan Xalq Cümhuriyyətinin süqutuna yaxın yazılarında təkrarlanan mövzu idi.

Ü. Hacıbəyli jurnalist fəaliyyəti ilə yanaşı, 1907-ci ildə qələmə aldığı riyaziyyat üzrə "Hesab məsələləri" dərsliyi milli pedaqogikada mühüm addım hesab olunurdu. Dərslik Ü. Hacıbəylinin maarifçilik prinsiplərinə sadiqliyini nümayiş etdirərək elmi təfəkkürə, mütərəqqi öyrənməyə və təhsildə Azərbaycan dilinin istifadəsinə xüsusi önəm verirdi. Azərbaycan terminologiyasının riyaziyyata çevrilməsi onu həm də xalq dilinin elmi təhsilində qabaqcıl ziyalı kimi göstərmişdir. Onun yaradıcılığının bu ölçüsü və mətbuata töhfə verən jurnalist səyləri də Şumann, Liszt və Vaq-

ner kimi böyük Avropa bəstəkarlarının səyləri ilə paraleldir (6, s.6). Bu, Hacıbəylinin təkcə böyük sənətkar deyil, həm də xalqının şüurunu formalaşdırmaq missiyası daşıyan ictimai ziyalı kimi mövqeyini nümayiş etdirir.

**Azərbaycanda musiqi təhsilinin əsasları: Şərqlə Qərbin sintezi**

Hacıbəylinin pedaqoji missiyası onun Azərbaycan musiqisinin təkamülünün formal təhsil sistemi tələb etdiyini dərk etməsi ilə başlamışdır. 1921-ci ildə o, Azərbaycan Dövlət Konservatoriyasının (indiki Bakı Musiqi Akademiyası) yaradılmasında mühüm rol oynamış, onun ilk direktoru olmuşdur. Burada o, həm Şərq, həm də Qərb musiqi ənənələri üzrə strukturlaşdırılmış təlimi tətbiq edərək, azərbaycanlı tələbələrin nəzəriyyə, bəstəkarlıq və ifaçılıq üzrə hərtərəfli təhsil almasını təmin etmişdi. Uzaqgörən pedaqoq olan Hacıbəyli yeni müəllimlərin yetişdirilməsi və dərsliklərin hazırlanması istiqamətində yorulmadan çalışıb, musiqi təhsilinin nəsillər boyu davamlılığını təmin etmişdi.

Ü. Hacıbəylinin ən təsirli pedaqoji nailiyyətlərindən biri onun "Azərbaycan xalq musiqisinin əsasları" adlı nəzəri əsəridir (1945). Bu traktat Azərbaycan xalq musiqisinin Qərb nəzəri çərçivəsində yazılmış ilk elmi tədqiqatıdır. Ü. Hacıbəyli bu əsərində muğamın Qərb notlarından istifadə edərək quruluşunu təhlil etmiş, xalq üslubunda Azərbaycan ladlarında musiqi bəstələmək qaydalarını, intonasiya və forma arasındakı əlaqələri araşdırmışdır (4).

Ü. Hacıbəyli muğamın şifahi ənənəsini yazılı nəzəriyyəyə çevirməklə onun sistemli şəkildə öyrədilməsinə şərait yaratmışdır. Bu, Şərqin improvizasiya ənənələri ilə Qərb akademik yanaşmasının birləşdirilməsində inqilabi addım idi və unikal Azərbaycan bəstəkarlıq və nəzəriyyə məktəbinin əsasını qoymuşdu.

**Təhsil proqramları və dərsliklər: "Hesab məsələləri"nin tarixi konteksti (1907)**

Ü. Hacıbəyli Azərbaycanda musiqi təhsilinin standartlaşdırılmasına yönəlmiş bir neçə dərslik və tədris materiallarının da müəllifidir. Əsərləri musiqi nəzəriyyəsi, harmoniya, solfecio, xalq melodiyalarının təfsiri ilə bağlı idi. Bu mətnlər əlçatan Azərbaycan dilində yazılmışdır ki, bu da onları ana dili olanlar üçün daha əlverişli etməklə yanaşı, həm də musiqi təhsilində Azərbaycan dilinin elmi dil kimi inkişafına töhfə vermişdir.

O hesab edirdi ki, hər bir vətəndaşın musiqi biliklərinə çıxışı olmalıdır ki, bu da onun dövlət məktəbləri üçün musiqi proqramlarının işlənib hazırlanmasında iştirakına təkan vermişdi və bununla da ölkədə musiqi savadının bazası genişlənirdi.

XX əsrin əvvəllərində Azərbaycanın təhsil sistemi pərakəndə idi, əksər məktəblər rus və ya fars materiallarından istifadə edir və azərbaycanca tədris təklif edirdilər. A.O. Çernyayevski (Vətən dili – 1883-cü il), H. Zərdabi, R. Əfəndiyev, F. Köçərli, N. Nərimanov və M. Mahmudbəyov kimi sələflərindən ilhamlanaraq Ü. Hacıbəyli Azərbaycan dilində orijinal tədris vəsaiti yaratmağa çalışırdı (7, s.4). Bu kontekstdə "Hesab məsələləri" dərsliyi əlamətdar nailiyyətə çevrildi. 1907-ci ildə nəşr olunmuş dərslik Azərbaycan ibtidai sinif şagirdlərinin və müəllimlərinin təhsil ehtiyaclarını ödəmək üçün hazırlanmışdır. Hacıbəyli təkcə əsas hesab öyrətməyi deyil, həm də praktiki, əlçatan və yaxşı qurulmuş məzmun vasitəsilə məntiqi təfəkkür, dil bacarıqları **və** mədəni kimliyi inkişaf etdirməyi qarşısına məqsəd qoymuşdur. Dərslik 105 səhifəni əhatə edir və ən sadədən ən mürəkkəbə doğru irəliləyiş üçün metodik şəkildə tərtib edilmiş 352 riyaziyyat problemindən ibarətdir (3). Kitabın strukturu Herbartın təhsilə formal estetik yanaşmasını və Hegelin substantiv (məzmun) estetikasını uzlaşdıran unikal klassik didaktik prinsipləri əks etdirir. Hacıbəylinin pedaqoji yanaşması **müasir təhsil nəzəriyyəsinin** bir sıra prinsipləri ilə uzlaşır: **Konstruktivizm:** problemin mərhələli həlli və məntiqin tətbiqi yolu ilə kəşfi və fərdi öyrənməyi təşviq etmişdir. **Mədəni həll yolu:** Yerli həyatı və peşələri riyaziyyat problemlərinə daxil etməklə, o, şagirdlərin mədəni şəxsiyyətlərinin və ətrafının dəyərini əyani şəkildə nümayiş etdirmişdir. **Uşaq mərkəzli təhsil:** O, uşaqların idrak inkişaf mərhələlərini yaxşı başa düşdüyünü göstərmişdir. Məsələn, dərslik, mücərrəd rəqəmləri təqdim etməzdən əvvəl şəkilli və ya konkret nümunələrlə başlayır. **Nitqin və məntiqin inteqrasiyası:** Bir çox məşğələlər təkcə hesablama bacarıqlarını deyil, həm də şifahi əsaslandırmanı inkişaf etdirir, tələbələrə məntiqi nəticələr çıxarmağa kömək edir. Bu inteqrasiya hesablamadan əvvəl şifahi təhlil tələb edən problemlərdə aydın görünür: "Kəndli əvvəlcə 4, sonra 3, sonra 2 ağac əkdi. Bunlardan 3-ü bitmədisə, neçəsi bit-

di?" Burada şagird uğursuz olanları çıxmadan əvvəl əkilmiş ümumi məbləği hesablamalıdır – yəni ardıcıl əsaslandırma prosesini yerinə yetirməlidir (2). "Hesab məsələləri"ni fərqləndirən təkcə onun məzmunu deyil, həm də onun metodoloji yeniliyi və Qərb pedaqogikasının Şərq kontekstinə uyğunlaşmasıdır. Burada didaktik-ornamental üslub özünü göstərir; Ü. Hacıbəylinin Şərq ədəbi estetikasını (məsələn, ornamentasiya, qafiyəli göstərişlər) Qərb məntiqi sərtliyi ilə qarışdırması dərsliyə mədəni dərinlik əlavə etmişdir. Kitab Azərbaycan dilində elmi lüğətin inkişaf etdirilməsi istiqamətində əsas işlərin qoyulması, milli dilin inkişafında əsas addımdır. Kitab təkcə təhsil deyil, həm də ictimai quruculuq məqsədlərinə xidmət edirdi, şagirdlərə riyaziyyatı iqtisadi rollar, əmək və ictimai həyat obyektivləri vasitəsilə öyrədirdi. "Hesab məsələləri" sovet dövründən əvvəlki dövrün məhsulu olsa da, onun təsiri sovet dövründə də davam edib və bu gün də aktuallığını qoruyub saxlayır. Belə ki, bu dərslik Azərbaycan dilində bir çox strukturlaşdırılmış riyaziyyat proqramlarından əvvəl yaranıb və gələcək dərslik müəlliflərinə və kurikulum tərtibatçılarına təsir etmişdir. Mədəni köklü, dünyəvi təhsil sisteminin formalaşmasında müəllim-ziyalıların rolunu nümunə göstərmişdir. Kitab həm də XX əsrin əvvəllərində Azərbaycan təhsilinin linqvistik, sosial və metodoloji qanunauyğunluqlarını özündə saxlayan tarixi sənəddir. Kitabın respublika miqyasında müasir Azərbaycan qrafikası ilə yenidən nəşri həm tarixin qorunub saxlanmasına, həm də təhsil islahatı səylərinə xidmət edir. Bu şərəfli missiyanı Azərbaycanın görkəmli pedaqoq alimi, akademik Hüseyn Əhmədov öz üzərinə götürmüş və Üzeyir bəyin bu əsərini transliterasiya edərək, müasir əlifbamıza çevirmişdir (1). Üzeyir Hacıbəylinin "Hesab məsələləri" riyaziyyat dərsliyindən daha artıq bir önəmə sahibdir; pedaqoji manifestdir, mədəni əsərdir və Azərbaycanın təhsil oyanışının güzgüsüdür. Elmi cəhətdən əsaslandırılmış quruluşu, mədəni baxımdan uyğun məzmunu və ana dilinin tədrisinin qabaqcıl tətbiqi ilə Ü. Hacıbəyli bu dərsliklə dövrünün həm intellektual, həm də milli ehtiyaclarını qarşılayırdı. Onun işi pedaqoqların mədəni davamlılığın və intellektual inkişafın nümayəndələri kimi necə çıxış edə biləcəyini nümunə göstərir. "Hesab məsələləri"nin elmi dəyəri onun metodoloji aydınlığında, linqvistik yenilikdə və uşaq psixologiyasının dərindən dərk edilməsində, onun Azərbaycan pedaqoji tarixində təməl mətnə çevrilməsindədir. Bir əsr sonra belə bu kitab formaca milli, ruha görə universal və mahiyyətcə humanist təhsilə baxışı ilhamlandırmaqda davam edir.

**Pedaqoji və institusional təsir**

Ü. Hacıbəyli yazılarından əlavə, bir çox görkəmli Azərbaycan bəstəkarlarının yetişdirilməsində böyük xidmətlər göstərmişdir. Təkcə bir faktı qeyd etmək kifayətdir ki, Şərqdə ilk operanın müəllifi olan Üzeyir bəy Şərqdə ilk opera yazan qadın kimi tarixə düşmüş Şəfiqə Axundovanın da müəllimi, yol göstərəni, maarifləndiricisi və ilham qaynağı olmuşdur. Onun təsiri bilavasitə qurduğu tədris sistemləri vasitəsilə genişlənmiş, bununla da milli kimliyi müasir bəstəkarlıq üsulları ilə birləşdirən işini davam etdirəcək musiqiçilər nəslini yetişdirmişdir.

Ü. Hacıbəyli bir idarəçi kimi Bakı Musiqi Akademiyası, Azərbaycan Filarmoniyası (Azərbaycan Dövlət Akademik Filarmoniyası) və müxtəlif xalq musiqi ansamblları kimi qurumların strukturunu və mənəviyyatını formalaşdırmışdı, bütün bunlar milli musiqi təhsilinin və yayılmasının həlledici qovşaqlarına çevrilmişdi.

Üzeyir Hacıbəylinin pedaqoji yaradıcılığını onun maarifçi ziyalı şəxsiyyətindən ayırmaq olmaz. O, həm Azərbaycan ənənələrinə, həm də Qərb metodologiyalarına əsaslanan möhkəm musiqi təhsili sistemi yaratmaqla Azərbaycan musiqisinin XX əsrdə və ondan sonrakı dövrlərdə yaşamasını və inkişafını təmin etmişdir. Üzeyir bəy "Həqiqət" qəzetində dərc etdirdiyi "Müəllimlərimiz və mətbuat" adlı məqaləsində (1910-cu il, 97-ci say) kənd müəlliminin cəhalətlə mübarizədə rolunu xüsusi qeyd edərək, ömrü boyunca bu rolu bütöv bir xalqın maarifçilik ideyalarına daşımışdır (3, s.58). Onun nəzəri yazıları, təhsil təşəbbüsləri və institut quruculuğu fəaliyyəti bu gün Azərbaycanda musiqinin tədqiqi və təcrübəsində əsas yer tutur. Ü. Hacıbəyli təkcə musiqi öyrətməyib, o, strukturlaşdırılmış, elmi və inklüziv təhsil vasitəsilə xalqa öz mədəni irsini tanımaq, qorumaq və yüksəltmək imkanları təqdim etmişdir. Onun milli tərəqqiyə sadiqliyi Azərbaycanın dövlət rəhbərliyi tərəfindən də yüksək qiymətləndirilməkdədir. Prezident İlham Əliyev və birinci xanım Mehriban Əliyeva Üzeyir bəyin irsinin təkcə musiqidə deyil, təhsildə, jurnalistikada əhəmiyyətini vurğu-

**Abstract**. The article highlights the life and work of Doctor of Pedagogical Sciences, Professor, Honored Teacher Akif Nurag oglu Abbasov. A.N. Abbasov was born on May 28, 1950 in the city of Ali-Bayramli (now Shirvan). He graduated from the Azerbaijan University of Languages, defended his candidate and doctoral dissertations. Under the scientific supervision of the professor, more than 40 people received the degrees of Doctor of Sciences and Doctor of Philosophy. A.N. Abbasov wrote more than 20 textbooks and teaching aids for comprehensive schools, higher and secondary specialized schools, special schools, more than 200 scientific articles. He is a member of the Union of Writers and Journalists.
***Keywords:*** *doctor of sciences, professor, Honored teacher, writer, journalist, scientist*

**Аннотация**. В статье освещается жизнь и деятельность доктора педагогических наук, профессора, заслуженного учителя Акифа Нурага оглы Аббасова. А.Н. Аббасов родился 28 мая 1950 года в городе Али-Байрамлы (ныне Ширван). Окончил Азербайджанский университет языков, защитил кандидатскую и докторскую диссертации. Под научным руководством профессора более 40 человек получили степени доктора наук и доктора философии. А.Н. Аббасов написал более 20 учебников и учебных пособий для общеобразовательных школ, высших и средних специальных школ, спецшкол, более 200 научных статей. Является членом Союза писателей и журналистов.
***Ключевые слова***: *доктор наук, профессор, заслуженный учитель, писатель, журналист, ученый*

**Möhtərəm Akif müəllim**!

Anadan olmağınızın 60 illiyi ilə əlaqədar Sizi, bütün ailə üzvlərinizi səmimi qəlbdən təbrik edirəm, həyatda, yaradıcılıq işlərinizdə yeni uğurlar diləyirəm!

Dünyada belə aksioma var: hər insan özünəməxsus, təkrarı olmayan bir dünyadır, onun ömrü bu mikrodünyanın həqiqi tarixidir. İnsan dünyasının qanun və qanunauyğunluqlarını, onun tarixinin inkişaf dinamikasını olduğu kimi öyrənmək, qiymətləndirmək, təqdim etmək bizim makrodünyamızın, bəşəriyyət tarixinin öyrənilməsi qədər çətin və mürəkkəbdir. Bunun nəticəsidir ki, şəxsiyyətlərin bir çoxunun tarixi öz həqiqi varlığı kimi təqdim olunmur, təhrif edilir. Belə vəziyyətin kütləviləşməsinin qarşısını almaq üçün ən asan və düzgün yol şəxsin tarixini onun özü və onunla birgə çalışan insanlar vaxtında yazsınlar.

Ömrünüzün 60 ilinin yarıdan çoxunu – 35 ilini eyni məkanda, eyni elmi mühitdə yaşayıb yaratmışıq. Bu müddətdə pedaqoji elmlərin yüksək pillələrinə tədricən yüksəlməyinizin bir neçə epizodunu xatırlamaqla, ömür yolunuzun əsas döngələrini olduğu kimi yığcam halda bildirməyi özümə borc bildim.

1975-ci ildə Maarif Nazirliyinin Pedaqogika İnstitutunda (indiki Təhsil Problemləri İnstitutu) elmi işlər üzrə direktor müavini, eyni zamanda institut ilk partiya təşkilatının katibi vəzifələrində işləyirdim, instituta işçilərin və aspirantların müsabiqə yolu ilə qəbulu komissiyalarına sədrlik edirdim.

İnstitutun ştatı az olduğundan, elmi işçilərin seçimində keyfiyyətə, məhsuldarlığa xüsusi əhəmiyyət verirdik. Müsabiqədə iştirak edənlər arasında ixtisası üzrə savadlılar çox olsa da, yazı və tədqiqatçılıq qabiliyyətləri zəif olurdu, bunların müstəqil tədqiqat aparmaq səviyyəsinə çatdırılmasına çox vaxt sərf edilirdi. Ona görə də istəyirdik ki, həm yüksək biliyi, müəllimlik təcrübəsi olan, eyni zamanda tədqiqat aparmağa tez yiyələnə bilən kadrları seçək. Akif müəllimi instituta elmi işçi qəbul etdiyimiz il – 1975-ci ildə məktəblilərin tərbiyəsi problemi son dərəcə aktuallaşmışdı. Səbəbi Moskva, Leninqrad, Rostov və digər iri şəhər məktəblərində pozğunluğun getdikcə artması idi. Mənəvi, əxlaq, əmək, hüquq tərbiyəsi gözlənilən nəticəni vermirdi.

Akif müəllim institutda tələb olunan əsas keyfiyyətləri – tədqiqata dərin marağı, bu işi aparmaq və yazmaq bacarığı ilə seçildiyindən işçi yerini tuta bildi. Əmək qabiliyyəti, intizamlılığı və səliqəliliyi ilə seçildi, məktəblərlə əlaqələrini genişləndirdi, elmi işləri yüksək səviyyədə yerinə yetirdi.

1980-ci illərin əvvəllərində SSRİ rəhbərliyində ailə tərbiyəsindəki faciəli vəziyyət barədə ciddi narahatlıq yaranmışdı. Sov.İKP MK Siyasi Büronun qərarı ilə "Ailə" adında fənn orta ümumtəhsil məktəblərinin tədris planına daxil edilmişdi. SSRİ Pedaqoji Elmlər Akademiyası və SSRİ Təhsil Nazirliyi müttəfiq respublikaların müvafiq qurumlarını da cəlb etməklə, qərarın yerinə yetirilməsi üzrə kompleks tədbirlər planı hazırlayıb həyata keçirməyə başladı. İlk növbədə fənn proqramı və dərslik tərtib edildi. Göstəriş verildi ki, "Ailə" fənni üzrə proqram və dərslik milli dillərə tərcümə edilərək, 1985-ci ildən tədrisə başlanılsın.

O vaxt mən Maarif nazirinin müavini işləyir və bütün tədris-tərbiyə işlərinin təşkili məsələlərinə məsuliyyət daşıyırdım. Çox böyük həcmli "Семья" dərsliyini oxudum. Milli tərbiyə məzmunundan çox uzaq olan, Azərbaycan ailələrinə xas olmayan faktlarla doldurulmuş bu kitabın respublika məktəblərinə verilməsinin qeyri-mümkünlüyü qərarına gəldim. Respublika rəhbərliyi ilə məsləhətləşdim. Bir variant meydana çıxdı ki, həmin dərsliyin müəllifi ilə razılaşaq, kitabı yerli şəraitə uyğunlaşdıraq. Bu məqsədlə, respublika variantında bizdən də həmmüəlliflər olsun. Dərsliyin moskvalı müəllifi təklifimizdən qəti imtina etdi. Onda özümüzün müstəqil proqram və dərsliyimizin, metodik ədəbiyyatımızın hazırlanmasını vacib bildik. Sual meydana çıxdı: bu işi kimlər görə bilər?

Şəxsiyyətinə, elmi yaradıcılığına dərin hörmət bəslədiyim psixoloqumuz, professor Əbdül Əlizadə ilə Akif Abbasovun birgə müəllifliyi əsasında işimiz ləyaqətlə yerinə yetirildi. Baltikyanı respublikalar: Latviya, Litva və Estoniya da belə hərəkət etmişdi.

İnstitutumuzda o qədər də elmi əsası olmayan belə bir mövqe var idi ki, doktorluq dissertasiyası mövzusu o zaman təsdiq edilsin ki, elmlər namizədinin ən azı 10 il tədqiqat stajı olsun. Mən 1976-cı ildə direktor təyin olunan kimi ilk tədbirim bu zərərli çəpəri dağıtmaq oldu. Gənclərin elmlər namizədi diplomu alan vaxtdan doktorluq dissertasiyası üzərində işləmələrinə şərait yaradıldı. Bu tədbir gənc milli kadrların inkişafına güclü təsir göstərdi. Oqtay Rəcəbov, Fərahim Sadıxov və başqaları kimi, Akif müəllim də yeni şəraitdən səmərəli istifadə etdi.

Ali Attestasiya Komissiyasında pedaqoji-psixoloji elmlər üzrə ekspert komissiyasında Akif müəllimin doktorluq dissertasiyasına baxılarkən komissiya üzvlərindən biri təklif etdi ki, mənim bəzi suallarım var, mümkünsə müəllif özü müzakirədə iştirak etsin. Buna ciddi ehtiyacın olmamasına baxmayaraq məsələnin başqa məcraya düşə biləcəyi ehtimalını nəzərə alaraq, komissiya sədri kimi təklifi nəzərə aldım. Akif müəllimin komissiyadakı təmkinli cavabları, onun doktorluq elmi dərəcəsi alması işini xeyli sürətləndirdi.

Belə nümunələrin sayını artırmaq olar. Bunların hamısından ümumi bir nəticəyə gəlirik ki, Akif müəllimin elmi yaradıcılığı son 35 (*hazırda 50* – kürsiv redaksiyanındır) ildə yüksələn xətt üzrə gedib, hər dövrün tələbinə uyğun olan aktual problemləri tədqiq edib. Yaradıcılığını şaxələndirərək elm-mədəniyyətin bir-biri ilə əlaqəli sahələri üzrə dəyərli əsərlər yazıb.

1975-ci ildə kənd məktəbi müəllimliyindən gələrək, 1931-ci ildən fəaliyyətə başlamış pedaqoji-psixoloji elmlər mərkəzində kiçik elmi işçi vəzifəsinə başlamış, bu gün pedaqoji elmlər doktoru, professor, Beynəlxalq Pedaqoji və Sosial Elmlər Akademiyasının həqiqi üzvlüyü səviyyəsinə qədər yüksəlmiş bir milli ziyalı həyatı, həqiqətən inkişafda olan bir canlı tarixdir. 35 (*50 il* – kursiv redaksiyanındır) il əvvəl müəllimlərindən müstəqil elm yoluna çıxmaq köməyi diləyən və bu yolu öyrənib inamla irəliləyən azərbaycanlı ziyalısının bu gün elmə həvəsli insanların öz səviyyəsinə yüksəlməyə köməkçi-müəllim olan Akif Nurağa oğlu Abbasovdan yeni-yeni, dəyərli əsərlər gözləmək haqqını özümüzdə saxlayırıq!

Müstəqil, suveren Azərbaycanın yüksək ixtisaslı, mərifətli, həqiqi elm yaradıcılığı ilə məşğul olan milli kadrlara olan ehtiyac bu gün daha da artmışdır.

***Dərin hörmətlə*, Zahid Qaralov,**
*pedaqoji elmlər doktoru, professor,*
*Pedaqoji və Sosial Elmlər Akademiyasının*
*həqiqi üzvü,*
*respublikanin əməkdar müəllimi*
*Bakı şəhəri, 15 dekabr 2010-ci i,*

**Redaksiyadan**: Akif Nurağa oğlu Abbasov Şirvan (keçmiş Əli Bayramlı) şəhər 1 və 2 nömrəli məktəblərində, keçmiş Azərbaycan Pedaqoji Dillər İnstitutunda (*hazırda ADU*) təhsil almış, Əli Bayramlıda çıxan "İşıq" qəzeti redaksiyasında müxbir, Sabirabad rayonunun Şıxsalahlı və Qaragüney kənd məktəblərində ingilis dili müəllimi, Azərbaycan Elmi-Tədqiqat Pedaqoji Elmlər İnstitutunda (*hazırda Təhsil İnstitutu*) kiçik elmi işçi, baş elmi işçi, şöbə müdiri; Bakı Qızlar Universitetində elmi işlər üzrə prorektor vəzifələrində işləmişdir. Hazırda Azərbaycan Respublikasının Təhsil İnstitutunun elmi katibidir.

Professor A.N. Abbasovun yaradıcılığı çoxsahəlidir. İlk növbədə o, ***müəllim**dir*, orta məktəbdə ingilis dilindən dərs deyib., ali məktəbdə pedaqogika fənnindən mühazirələr oxuyub.

Onun fəaliyyətinin ikinci istiqaməti ***elmi fəaliyyəti*** ilə bağlıdır. Elmlər doktoru, professor olmaqla bərabər onun elmi rəhbərliyi və elmi

məsləhətçiliyi ilə 40 nəfər elmlər doktoru və fəlsəfə doktoru diplomu almışdır.

Professor ümumtəhsil məktəbləri üçün 5 dərslik və dərs vəsaitinin [“Ailə”, “Ailə həyatının etika və psixologiyası”, ”Ailə həyatının etika və psixologiyası üzrə müntəxəbat” (*prof. Ə. Əlizadə ilə*); “ABC Book”: I sinif üçün ingilis dili dərs vəsaiti (*M. Məmmədova* ilə); “İngilis dilindən imla və ifadə mətnləri məcmuəsi” (V-XI siniflər üçün)]; ali məktəblər üçün 5 dərsliyin [“Pedaqogika”, “Ailə pedaqogikası”, “Milli əxlaq və ailə etikası”, “Pedaqogika nəzəriyyəsi və tarixi”, “Ailə dəyərləri”, “Pedaqogika” (prof. H.Ə. Əlizadə ilə)] və 4 dərs vəsaitinin [“Pedaqogika: müxtəsər konspekt və sxemlər”, “İxtisasa giriş”, “Ailə pedaqogikası: Müntəxəbat”, “Pedaqogika: Müntəxəbat”], xüsusi məktəblər üçün 4 dərsliyin (“Oxu-2”, “Oxu-3”, “Oxu-4”, “Oxu-5”)], kolleclər üçün “Milli əxlaq və ailə etikası” və “Pedaqogika” dərsliklərinin, 40-dan artıq kitab və kitabçanın, 250-dən artıq elmi məqalənin müəllifidir.

Akif Abbasov ***lüğətçilik*** sahəsində də səmərəli fəaliyyət göstərir. “İngiliscə-azərbaycanca pedaqoji-psixoloji lüğət” və “Azərbaycanca-ingiliscə pedaqoji-psixoloji terminlər lüğəti” hazırlayaraq nəşr etdirmişdir.

***Bədii yaradıcılıqla*** məşğuldur. “Aldanma sözlərə”, “Samsundan başlanan yol”, “Acı xatirələr”, “Sultan II Murad” və “Fateh Sultan Məhmət” romanlarını, “Atatürk” “Yaxşı dost” pyeslərini qələmə alıb. Hazırda “Allahın bəlası – Atilla” və “Artıq adam” romanları üzərində işləyir.

Bundan başqa, “Qız gəlin köçür”, “Lələşin ayaqqabısı”, “Qaş düzəltdiyi yerdə”, “Xəyanət”, “Dədəmə oxşayırsan”, “Xallı kəpənək”, “Gəl Məliyin dovğasına”, “Bir qıçlı öz atasıdır”, “Gəlin”, “Müdirin ayağı”, “Dar günün dostu”, “Geydirmə araq”, “Banu və babası”, “Atilla və babası”, “Pyeslər”, “Əsərləri. 10 cilddə. 1-10-cu cildlər”, “Böyük türk”, “Atatürk haqqında hekayələr” (I-II kitablar), “Roman, povest və hekayələr”, “Yumruq”, “Yumurta”, “Sənə quzu kəsim”, “Pensiya pulu”, “Ananın ürəyinə gedən yol”, “Hekayələr”, “Uşaqlar üçün hekayələr”, “Töhmət”, “Taxta qaşıq”, “Qızıləhməd almaları”, “Zoğal mürəbbəsi və başqa hekayələr” kimi bədii kitabların müəllifidir.

Kino rejissor Babək Abbaszadə Akif Abbasovun “Atatürk” pyesi əsasında libretto yazmış, bəstəkar Oqtay Rəcəbov “Atatürk” operasını bəstələmişdir.

Yazıçı Akif Abbasovun “Atatürk” pyesi türk dilinə çevrilmiş, Ankarada nəşr edilmişdir.

O, ***tərcüməçilik*** sahəsində də ***fəaliyyət*** göstərir İngilis və rus dillərindən tərcümələri 11 kitabda [“Kristi Tökerin ölümü”, “Yağış altında pişik”, “Tiflissayağı boşanma”, “Küçə tinində hadisə”, “Andro və Sandro” (*müəllif: G. Xuqayev*), “Ali təhsilli arvad” *(müəllif: T. Esenova*), “Duel” (*müəllif: M. Bayciyev*), “Yolagəlməz qadın” (*müəllif: U.S. Moem*), “Yağış” (*müəllif: U.S. Moem*) və “Edvard Barnardın ruh düşkünlüyü” (*müəllif: U.S. Moem)* “Canlılar yaşayan otaq” (*müəllif: Qrehem Qrin*)] toplanmış və nəşr edilmişdir.

Professorun yaradıcılığında ***elmi redaktorluq*** fəaliyyəti də diqqətəlayiqdir. Təxminən 200 monoqrafiya, dərslik, dərs vəsaiti, kitab və kitabçanın, metodik vəsaitin, tədris proqramının elmi redaktoru, bir çox bədii əsərin redaktorudur.

Onun fəaliyyətində ***kino yaradıcılığı*** da xüsusi yer tutur. *“Canavar balası”* (1997) və *“Qırmızı qar”* (1998) bədii filmlərinin redaktorudur.

**Professor Akif Nurağa oğlu Abbasovu anadan olmasının 75 illiyi münasibətilə təbrik edir, ona yeni yaradıcılıq uğurları və cansağlığı arzulayırıq!!!**

**Ədəbiyyat**


1. Alim və yazıçı ömrü: Professor Akif Abbasov – 60. Tərtib edənlər: L.A. Abbasova. Bakı: Mütərcim: 2010, 300 s.
2. Akif Abbasov – 70: Biblioqrafiya. Tərtib edənlər: L.A. Məmmədli. Bakı: Mütərcim: 2020, 124 s.
3. Professor Akif Abbasov – 75: Bibloqrafiya. Tərtib edənlər: L.A. Məmmədli. Bakı: Mütərcim: 2025, 164 s.
4. Ə. Abbasov, Alim-pedaqoq. “Azərbaycan müəllimi” qəz., 1996, 6 fevral
5. F .Rəhimov. Zəhmətin bəhrəsi (“Həmyerlimiz pedaqoji elmlər doktorudur” rubrikası ilə). ”İşıq” qəz., 1996, 19 mart
6. “Abbasov Akif Nurağa oğlu”. bax: X.Fətəliyev. “Ailədə milli tərbiyə” kitabında. Bakı: ADPU, 1996, s. 59.
7. “Akif Abbasov”. bax: S. Sailov. “Muğanın övladları” kitabında. Bakı: Gənclik, 1998, 185-186.

8. З. Джаппаров. Учитель из Ширвана. Газета “Вышка”, 1998, 3 aprel
9. “Akif Abbasov”. bax: Əjdər Ol. “Şirvana binə gəlləm...” kitabında. Bakı: Şirvannəşr, 1999, s. 173-174.
10. “Alim, pedaqoq, yazıçı, jurnalist Akif Abbasov”. bax: F.B. Sadıqov. “Pedaqoji düşüncələr” kitabında. Bakı: Ünsiyyət, 1999, s. 157-165.
11. “Ə.Y.Seyidov, M.M.Mehdizadə və M.Ə.Muradxanov məktəbinin davamçıları”. bax: Yusif Talıbov, Fərahim Sadıqov, Sərdar Quliyev. Azərbaycanda məktəb və pedaqoji fikir tarixi. Bakı: Ünsiyyət, 2000. - səh. 439-440.
12. Bizim müsahibə. ETPEİ: ali və orta ixtisas təhsili şöbəsində işlər necə gedir? Müsahibəni apardı: Ş. Məmmədov. - “Azərbaycan müəllimi” qəz., 2000, 11-17 avqust
13. V. Bəşirov. Elmi və bədii yaradıcılıqda. –“Azərbaycan müəllimi” qəz., 24-30 avqust 2000
14. V. Bəşirov. Elmi və bədii yaradıcılıqda. ”İşıq” qəz., 2000
15. H. Əliyev, V.Bəşirov. Mənalı ömrün səhifələri. “Təhsil” qəzeti, 1-15 iyun 2000
16. H.Ə. Əlizadə, F.N.Rəhimov. 50 illik ömrün işığında. ”İşıq” qəz., 2000, 31 dekabr.
17. “Abbasov Akif Nurağa oğlu”. L.N. Qasımova, R. Mahmudova “Pedaqogika”: Ali məktəblər üçün dərs vəsaitində. Bakı: BDU-nun nəşri, 2003, s. 448.
18. “Akif Abbasov” (1950). bax: Teymur Əhmədov. “XX əsr Azərbaycan yazıçıları” kitabında.
19. “Abbasov Akif Nurağa oğlu”. “Azərbaycan milli izahlı ensiklopedik pedaqoji lüğət” kitabında. Bakı, 2005, c. 8-9.
20. Ənvər Əhməd. Həyatın özü qədər gerçək nəsr. “525-ci qəzet, 2005, 26 noyabr
21. Malik Rəcəb. Professor Akif Abbasov. “Təhsil problemləri” qəz., 2006, 1-10 may
22. “Abbasov Akif Nurağa oğlu”. R. Əliyev, M. Mustafayev. “Azərbaycan psixologiya elminin inkişafı tarixindən” kitabında Bakı: Nərgiz, 2006, 2006, c. 33-42.
23. Davud Dəmirli. Ata və oğulun uğurları. “Açıq söz” qəz., 2007, 20 sentyabr
24. Prof. Abbas Hacıyev. Yeni mündəricəli alim, yazıçı-tərcüməçi. ”Mühakimə” qəz., 2008, 23-29 oktyabr, c. 12.
25. “Abbasov Akif Nurağa oğlu”. “Azərbaycan Milli Ensiklopediyasl”nda. I cild. Bakı, 2009.
26. “60 illik ömür yolu”: Pedaqoji oçerklər: Sələflərim və müasirlərim. Bakı: Elm və təhsil, 2010, s. 235.
27. 27.Abdulla Mehrabov. Xeyirxah insan, yenilikçi alim (Akif Abbasov – 60). “Azərbaycan müəllimi” qəz., 2010, 28 may
28. Telman Vəlixanlı. Alim, yazıçı, tərcüməçi, jurnalist (Akif Abbasov – 60) // “Mütərcim”, 2010, № 1, s. 204-205
29. 29.Piralı Əliyev. Xeyirxah və işgüzar alim (Akif Abbasov – 60) // Azərbaycan məktəbi, 2010, № 3, s. 108-110.
30. “Akif Abbasov” (1950). bax: Teymur Əhmədov. “Azərbaycan yazıçıları XX-XXI yüzillikdə: Ensiklopedik məlumat kitabı”nda. Bakı: Nurlar. 2011, 1056 s., s. 48-49
31. “İstedadın işığı, zəhmətin bəhrəsi...”. Vidadi Xəlilov. Ömür yollarında. Bakı: Nərgiz, 2012, s. 107.
32. Sevinc Əliyeva. Şərəfli bir ömür yolu // Pedaqoji aləm, 2019, № 1, s.
33. Hümeyir Əhmədov. Arzularının qanadlarında (Prof. A. Abbasov- 69). “Azərbaycan Təhsil şurası” qəz., 2019, 28 may. http://tehsilshurasi.az/manset/259-arzularnn-qanadlarnda.html
34. Ənvər Abbasov. Professor Akif Abbasova açıq məktub / “Azərbaycan müəllimi” qəzeti, 2020, 22 may, s 6
35. 35.Bədii tərcümələr mədəni zənginlik kimi - Akif Abbasovun tərcümə əsərləri haqqında - Adilə NƏZƏROVA. “Ədəbiyyat qəzeti”, 2023, 28 yanvar
36. Kamal Camalov. Akif Abbasov pedaqogika elminin yorulmaz təbliğatçısıdır. “Ziya” informasiya mərkəzi. http://zim.az/yeni-neshrler/5300-akf-abbasov-pedaqogka-elmnn-yorulmaz-tblatisidir.html
37. Fərahim Sadıqov. Şirvandan başlanan yol Professor Akif Abbasov (Portret cizgiləri) – 70. https://sia.az/az/news/social/827836.html

### *ÜMUMPEDAQOJİ PPROBLEMLƏR*
### *GENERAL PEDAGOGICAL PROBLEMS*
### *ОБЩЕПЕДАГОГИЧЕСКИЕ ПРОБЛЕМЫ*

*UOT 37.01.*

***Müseyib İbrahim oğlu İlyasov***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin kafedra müdiri,*
*pedaqogika elmləri doktoru, professor, Əməkdar müəllim*
*https://orcid.org/0000-0002-9379-1643*
*https://doi.org/1010.69682/arti.2025.92(3).36-42*
*E-mail: museyibilyas@gmail.com*

***Pərvanə İldırım qızı İmanova***
*pedaqogika üzrə fəlsəfə doktoru*
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*
*https://orcid.org/0000-0002-9542-4804*

# GƏLƏCƏK MÜƏLLİMLƏRDƏ KOMMUNİKATİV SƏRİŞTƏLƏRİN İNKİŞAF ETDİRİLMƏSİ

***Museyib Ibrahim Ilyasov***
*head of departament at Azerbaijan State Pedagogical University,*
*doctor of pedagogical sciences, professor, Honored teacher*

***Parvane Ildırım Imanova***
*doctor of philosophy in pedagogy*
*Azerbaijan State Pedagogical University*

# DEVELOPMENT OF COMMUNICATIVE SKILLS IN FUTURE TEACHERS
# РАЗВИТИЕ КОММУНИКАТИВНЫХ КОМПЕТЕНЦИЙ У БУДУЩИХ УЧИТЕЛЕЙ

***Мусейиб Ибрагим оглы Ильясов***
*заведующий кафедрой Азербайджанского Государственного Педагогического Университета,*
*доктор педагогических наук, профессор, Заслуженный учитель*

***Парвана Ильдырым гызы Иманова***
*доктор философии по педагогике*
*Азербайджанский Государственный Педагогический Университет*

**Xülasə.** Təhsil davamlı bir prosesdir. Gələcək müəllimlərin peşəkar mükəmməllik zirvələrinə doğru inkişafı xüsusi əhəmiyyət kəsb edir. Buna nail olmaq üçün universitet məzunu yalnız peşəkar bacarıqlara deyil, həm də əsasları məktəbdə formalaşan və sonra tələbənin peşə oriyentasiyasına uyğun olaraq universitetdə inkişaf etdirilən kommunikativ səriştələrə sahib olmalıdır. Müasir təhsilin nəticəsi qazanılmış səriştələrdir, yəni məzunların istənilən peşə vəzifələrini yerinə yetirmək istəyi, bacarığı və hazırlığıdır. Universitet məzununun kommunikativ səriştəyə yiyələnməsi onun əmək bazarında rəqabət qabiliyyətinin güclənməsinə təsir göstərir. Gələcək mütəxəssisin uğur qazanma qabiliyyəti, karyera yüksəlişinə nail olması, planlarına uyğun cəmiyyətdə layiqli mövqe tutması, əsasən "kommunikativ səriştənin inkişaf səviyyəsindən" asılıdır.
***Açar sözlər:*** *kommunikativ səriştə, ünsiyyət, təhsilin davamlılığı, peşə inkişafı, özünütəhsil.*

**Abstract.** Education is a continuous process. The development of future teachers towards the heights of professional excellence is of particular importance. To achieve this, a university graduate must possess not only professional skills, but also communicative competences, the basics of which are formed at school and then developed at the university in accordance with the student's professional orientation. The result of modern education is acquired competences, that is, the desire, ability and readiness of graduates to perform any professional duties. The acquisition of communicative competence by a university graduate affects the strengthening of his competitiveness in the labor market. The ability of a future specialist to succeed, achieve career advancement, and take a worthy position in society in accordance with his plans largely depends on the "level of development of communicative competence".

***Key words:*** *communicative competence, communication, continuous education, professional development, self-education.*

**Аннотация.** Образование – это непрерывный процесс. Особое значение имеет стремление будущих учителей к вершинам профессионального мастерства. Для этого выпускник вуза должен обладать не только профессиональными навыками, но и коммуникативными компетенциями, основы которых формируются в школе, а затем развиваются в вузе в соответствии с профессиональной направленностью студента. Результатом современного образования являются приобретенные компетенции, то есть желание, умение и готовность выпускников выполнять любые профессиональные обязанности. Приобретение выпускником вуза коммуникативной компетентности влияет на его конкурентоспособность на рынке труда. Способность будущего специалиста добиться успеха, карьерного роста, занять согласно своим планам достойное положение в обществе во многом зависит от «уровня развития коммуникативной компетентности».

***Ключевые слова:*** *коммуникативная компетентность, общение, непрерывность образования, профессиональное развитие, самообразование.*

Müasir cəmiyyət, sürətlə dəyişən tələblər uşaqlara keyfiyyətli təhsil verəcək yüksək ixtisaslı müəllim – pedaqoqların hazırlanması ehtiyacını önə çıxarır. Təhsilin modernləşdirilməsi tərbiyəçi və müəllimlərdən təlim və tərbiyə prosesinin hədəflərini və prioritetlərini dəyişdirməyi tələb edir. Gənc mütəxəssislərə elmi və metodiki dəstək onlara yeni pedaqoji təfəkkürün mənimsənilməsində, təhsil sistemindəki mürəkkəb problemləri həll etməyə hazırlıqda və pedaqoji bacarıqların artırılmasında, tədrisin və peşəkar inkişafın davamlı xarakterinə yiyələnməkdə kömək edəcəyindən müəllim hazırlığında bu məsələyə xüsusi diqqət yetirilməsi lazım gəlir.

Respublikamızda təhsilin modernləşdirilməsi ali pedaqoji təhsil müəssisələrindən hazırlanan pedaqoji kadrların həm peşəkar, öz peşəsini sevən və ixtisasını dərindən bilən mütəxəssis, həm də kommunikativ səriştəliliyin yüksək səviyyəsinə malik olmağı tələb edir. Bununla əlaqədar olaraq hazırda ali məktəblərin qarşısında tələbələrin kommunikativ səriştəliliyinin inkişaf etdirilməsi mühüm vəzifələrindən biri kimi durur. Ölkənin inkişafı onun kadr potensialı, təhsili, onun məzmunu və keyfiyyəti ilə müəyyən edildiyindən gələcək müəllimlərin hazırlanması prosesində təlimin fərdin özünüinkişafına istiqamətləndirilməsi ən vacib amillərdən birinə çevrilir.

Təhsil sisteminin modernləşdirilməsi ali təhsil müəssisələrindən kommunikativ səriştəyə əsaslanan, öz peşəsini dərindən bilən, peşə fəaliyyəti sahəsində interaktiv idarəetmə qabiliyyətinə malik kadr hazırlığını tələb edir.

Kommunikativlik, yaxud kommunikativ səriştəlilik insanın müxtəlif fəaliyyət sahələrində insanlarla müvəffəqiyyətlə ünsiyyət qura bilməsidir. Kommunikativ səriştələr insanın qarşılıqlı fəaliyyət prosesində başqa insanlarla düzgün münasibətdə olması, şəxsiyyətlərarası münasibətlərin əlverişli məcrada olmasının ən mühüm amillərindən biridir.

"Səriştə nəzəri və empirik biliklərin, təcrübənin mənalı ümumiləşdirilməsidir, səriştə insanın həyata keçirə bildiyi sosial və peşəkar fəaliyyətin intellektual və şəxsən müəyyən edilmiş təcrübəsidir. Kompetensiya əldə edilmiş bilik, bacarıq və vərdişlərə əsaslanan ümumiləşdirilmiş fəaliyyət üsullarını və onları öz peşə fəaliyyətində tətbiq etmək bacarığını ifadə edir" [3, s.13].

Kommunikativ səriştə müasir müəllimdən tələb olunan əsas səriştələrindən biridir. Pedaqoji fəaliyyətdə onun rolu və təsir imkanları əvəz-

edilməzdir. Onun bir neçə komponentini ayırd etmək olar: özünün və ətrafdakıların davranışlarını təhlil etmək bacarığı, sosial mövqeyə uyğun ünsiyyət qura bilmək bacarığı, sosial-mədəni (öz ölkəsinin tarixi, mədəniyyəti, adət-ənənələri haqqında biliklərdən istifadə etmək bacarığı), diskursiv (nitqi təşkil etmək, söhbəti davam etdirmək bacarığı, həmsöhbəti dinləmək, onun nöqteyi-nəzərini nəzərə almaq), strateji (tapşırıqlar qoymaq bacarığı, məqsədə çatmaq, həmsöhbətlə əlaqə qurmaq) və empatiya (özünü başqasının yerində qoya bilmək və mövcud vəziyyəti idarə etmək bacarığı) və s.

Kommunikativ səriştənin inkişafı uzun və kifayət qədər mürəkkəb bir yol keçir. Ünsiyyət pedaqoji prosesin subyektləri arasında qarşılıqlı qavrayış, canlı məlumat mübadiləsi, vahid kommunikasiya strategiyasının işlənib hazırlanması, qərarların qəbulu və münaqişələrin aradan qaldırılması daxil olmaqla, mürəkkəb qarşılıqlı əlaqələr sistemidir. Bu baxımdan pedaqoji kommunikativliyin özünəməxsus bir sıra çətinlikləri önə çıxır ki, bunlar xüsusən gənc müəllimlərin siniflə pedaqoji əməkdaşlığına, valideynlərlə işgüzar münasibətlərin formalaşmasına maneələr yaradır. Bunların əsasən aşağıdakılardan ibarət olduğunu göstərmək olar:

- Ünsiyyətdə olan insanların (müəllim və şagirdlər) müxtəlif yaş səviyyələrində olması.
- Müəllimin zəif temperament tipinə malik olması.
- Təhsilalanların fərdi xüsusiyyətlərinin nəzərə alınmaması.
- Müəllimlərin avtoritar və avtokratik ünsiyyət üslubuna malik olması.
- Şəxsiyyətlərarası ünsiyyət bacarıqlarının olmaması.

Kommunikativ səriştə müəllimin zəruri peşəkar əhəmiyyətli xüsusiyyətidir. O, gənc mütəxəssislərdən yaranan münaqişələri əvvəlcədən görməyə, həll etməyə və qarşısını almağa hazır olmağı, pedaqoji sahədə bilik və bacarıqlar əldə etməyi tələb edir.

Ünsiyyət fəaliyyətinin məhsuldarlığı birbaşa ünsiyyət bacarıqlarının inkişaf səviyyəsindən asılıdır. Bu baxımdan pedaqoji ixtisas tələbələrinin kommunikativ səriştəsinin inkişaf etdirilməsi problemi böyük elmi və praktiki əhəmiyyət kəsb edir. Ünsiyyət bacarıqları üzrə təlim tələb edən yeni təhsil, elmi və texnoloji çağırışlara cavab verə bilən məhsuldar, çoxfunksiyalı insanları inkişaf etdirmək məqsədi daşıyır [11].

Hal-hazırda gələcək müəllimlərin pedaqoji ünsiyyətə hazırlanması problemi ilə bağlı tədqiqatların işlənməsi intensiv xarakter alır.

İ.A. Zimney ünsiyyətin məzmununu iki istiqamətdə xarakterizə edir: birincisi, bir çox şəxsi keyfiyyətləri özündə cəmləşdirir və ikincisi, müəyyən hərəkət və bacarıqlar vasitəsilə üzə çıxır [6, s. 195]. Kommunikativ səriştə müxtəlif növ fəaliyyət növlərində- peşəkar kommunikativ fəaliyyət zamanı motivasiya və dəyər komponenti ilə müəyyən edilir ki, bu da humanist yönümlü yanaşmanı özündə əks etdirərək, özünütəşkilə, özünüinkişafa və özünü təkmilləşdirməyə şərait yaradır. Dövrün tələblərinə uyğun olaraq, pedaqoji fəaliyyətin təşkili zamanı səmərəli qarşılıqlı əlaqənin qurulması gələcək müəllimlərin peşəkarlığının, inkişafının tərkib hissəsidir. Kommunikativ səriştə uğurlu şəxsi inkişafın ən vacib amilin' çevrilməklə, fərdin intellektual və peşəkar potensialının müəyyənləşdirilməsində, sosiallaşmasında təsirli bir mexanizm rolunu oynayır.

Gələcək müəllimin kommunikativ qabiliyyətinin inkişafı mürəkkəb çoxkomponentli bir prosesdir, burada əsas məsələ, şəxsiyyətin humanist kommunikativ nüvəsinin formalaşması, hər bir insanın ən böyük dəyər kimi qəbul edildiyi, ona münasibətini və davranışını əks etdirmə səviyyəsinə çatmasını nəzərdə tutur [4, s. 126].

Qeyd etmək lazımdır ki, kommunikativ səriştənin inkişaf etməsi birbaşa ünsiyyət bacarıqlarının artma səviyyəsindən asılıdır. Kommunikativ səriştə, peşəkar və şəxsi ünsiyyətin vacib təzahürünün əhəmiyyətini dərk etmək, kommunikativ keyfiyyətlərini yaxşılaşdırmaq üçün daxili istəyi və gündəlik şəxsi ünsiyyət tərzini əhatə edən inteqrasiya olunmuş peşəkar və şəxsi xüsusiyyətdir.

Kommunikativ səriştənin mahiyyətinə əsaslanaraq onun ən mühüm xüsusiyyətlərini aşağıdakı kimi qruplaşdırmaq olar:

– tələbələrin kommunikativ səriştə haqqında bilikləri, qabiliyyətləri;

– tələbələrin öz kommunikativ keyfiyyətlərini artırmaq istəyi və kommunikativ səriştənin inkişafına daxili ehtiyac və münasibət təcrübəsi;

– ünsiyyət bacarıqları və davranış vərdişləri;

– çətin pedaqoji situasiyalarda kommunikativ mövqe və üslub üzrə təcrübə;

– fərdin kommunikativ dəyərləri, oriyentasiyası.

Kommunikativ səriştə həmçinin müəllimin peşəkar səriştəsinin strukturunda aparıcı rol oynayan üç komponentdən ibarətdir: qavrayış, interaktiv və kommunikativ. Bu komponentlər müasir informasiya məkanında genişlənir və aşağıdakı fərziyyələrə əsaslanır:

1. İnformasiya-kommunikasiya- peşəkar pedaqoji problemlərin həllinə əsaslanan xüsusi hazırlanmış texnikadan istifadə etməklə təlim zamanı kommunikativ səriştə inkişaf etdirilə bilər;

2. Həll edilən hər bir problem üçün tələbənin fəaliyyət alqoritmi – bu alqoritmin strukturuna müəllim və tələbənin hərəkətləri, əlavə elektron resurslar, fəaliyyətlərin monitorinqi mərhələləri, səmərəli şərtlər, müxtəlif təhsil səviyyələrində olan tələbələrin – bakalavr və magistrantların dərsdənkənar fəaliyyətləri daxildir [9, s.191].

Gələcək müəllimlər psixoloji və pedaqoji fənlər üzrə praktik məşğələlər, seminarlar zamanı səmərəli ünsiyyət nümunələri haqqında biliklər əldə edirlər. Tələbələrin özünüidarəetmə sistemi əldə edilmiş biliklərin həyata keçirilməsinə kömək edir, kommunikativ təcrübənin genişlənməsinə töhfə verir və onlara qrup yoldaşları və müəllimləri ilə gündəlik işgüzar münasibətlərdə ünsiyyət bacarıqlarını inkişaf etdirmək üçün imkanlar təqdim edir. Belə ki, müxtəlif kollektiv fəaliyyətlər prosesində tələbələr insanlara məxsus psixoloji xüsusiyyətlərlə tanış olur, kollektivdə sosial-psixoloji vəziyyətləri təhlil edir, idarəetmənin pedaqoji-psixoloji üsulları ilə tanış olurlar.

Universitetdə təşkil olunan elmi-praktik fəaliyyətlər tələbələrin motivasiyasını artırır və tələbələrin diqqətini müzakirə olunan məsələlərin həlli yollarının tapılmasına cəlb edir.

Şəxsiyyətin inkişafında və formalaşmasında fəaliyyət və ünsiyyət mühüm rol oynayır. İnsanlar ta qədim zamanlardan başlayaraq ətraf mühitə təsir göstərmiş, yəni fəaliyyətlə məşğul olmuşlar. İnkişaf həmişə fəaliyyətlə bağlı olmuşdur, yəni onlar bu prosesdə bir-birləri ilə qarşılıqlı münasibətdə, ünsiyyətdə olmuşlar. Deməli, insanların ətraf mühitə münasibəti fəaliyyəti, bir-birlərinə münasibəti isə ünsiyyəti yaratmışdır və bunlar bir birləri ilə əlaqəli olmuşdur [1, s.142]. Qarşılıqlı əlaqələrin intensivləşməsi gələcək müəllimləri ünsiyyət bacarıqlarını təkmilləşdirməyə həvəsləndirir. Bu, iştirakçıların sonrakı axtarış fəaliyyətinə emosional təkan verir, bu da öz növbəsində onların konkret hərəkətlərində reallaşır. Müzakirə obyekti təkcə xüsusi olaraq tərtib edilmiş problemlər deyil, həm də ondan irəli gələn peşəkar təcrübə və iştirakçıların özlərinin şəxsiyyətlərarası münasibətləri ola bilər. Bu cür müzakirələr hər bir iştirakçıya öz nöqteyi-nəzərini və hörmətini anlamağa kömək edir və başqaları ilə münasibət qurmasına, həmçinin ünsiyyətin keyfiyyətinə təsir edir.

Bundan əlavə, tələbələr özünüidarə kontekstində kommunikativ təcrübəni genişləndirməklə ünsiyyət ehtiyacını dərk edirlər, çünki daimi və müvəqqəti özünüidarəetmə orqanlarının fəaliyyətində iştirak onun iştirakçıları arasında daimi ünsiyyəti nəzərdə tutur. Buna misal olaraq fakültə günlərinin hazırlanması və keçirilməsini göstərmək olar. Bu, kifayət qədər mürəkkəb bir prosesdir, ona hazırlıq çox vaxt aparır və tələbələrin özünü necə fəal ifadə etməsindən asılıdır. Bu zaman müxtəlif tədbirləri və kollektiv işləri hazırlayan müvəqqəti özünüidarə orqanları yaradılır. Fəaliyyət prosesində gələcək müəllimlər qarşılıqlı yardım, təşəbbüs, yaradıcılıq bacarıqlarını inkişaf etdirirlər. Onlarda liderlik, məsuliyyət və məhsuldar ünsiyyət qurmaq və əməkdaşlıq etmək bacarığı formalaşır.

Pedaqoji ünsiyyət sahəsində tələbələrin ehtiyac duyduğu kommunikativ səriştənin formalaşması universitetdə bir neçə mərhələdən keçir: 1) kommunikativ bacarığın mahiyyəti ilə tanışlıq; 2) kommunikativ təsirin standart üsullarının mənimsənilməsi; 3) avtomatik ünsiyyət bacarıqları; 4) bacarıqların tətbiqində improvizasiyanın inkişafı [10, s.293].

Bir səviyyədən digər səviyyəyə keçid-özünü tədricən göstərən bir proses olub, şəxsi keyfiyyətlərdə və peşəkar səriştələrdə müsbət dəyişikliklərlə müşayiət olunur [5, s.161].

Kommunikativ səriştənin əməliyyat-fəaliyyət komponenti ünsiyyət bacarıqlarının inkişafı ilə müəyyən edilir və fəaliyyətdə özünü göstərir, yəni: ünsiyyət tərəfdaşlarına psixoloji təsir göstərmək və əməkdaşlıq münasibətlərini təşkil etmək bacarığı üzə çıxır. Əməkdaşlıq etmək bacarığı öz nöqteyi-nəzərini formalaşdırmaq, münaqişəni tənzimləmək və kompromis həll yolları tapmaq bacarığını nəzərdə tutur.

Fəaliyyət prosesində tələbələr gündəlik olaraq müxtəlif kommunikativ vəzifələri həll etməli olurlar. Müəyyən bir iş sahəsinə cavabdeh olan biri təşəbbüsü inkişaf etdirir və sosial əhəmiyyətli fəaliyyətlərə ehtiyacı ödəyir. Mövqeyindən və vəziyyətindən asılı olaraq münasibətlərini qurmağı öyrənir. Beləliklə, gələcək müəllimlər kommunikativ səriştənin əməliyyat-fəaliyyət komponentini təkmilləşdirirlər.

Münaqişə savadlılığı da kommunikativ sistemdə mühüm yer tutur. Gələcək müəllimin kommunikativlik səriştəliliyinə yiyələnməsi mahiyyət etibarı ilə ziddiyyətli məsələdir. Buna görə gələcək müəllimin şəxsiyyətinin mövqeyi və onun xüsusi təzahürü – münaqişə mövqeyi – münasibətlər təcrübəsinin formalaşmasında böyük rol oynayır. Qəbul edilmiş mövqe fərdin uğurunun göstəricisi olmaqla yanaşı, münaqişə münasibətlərinin fərdin uğurlu inkişafının amili kimi çıxış edir.

Münaqişəli vəziyyət, "həmişə qeyri-adi"dir və "onu məhsuldar qarşılıqlı əlaqə kanalına çevirmək müəllimdən yaradıcı yanaşma, yüksək kommunikativ səriştə, avtoritar pedaqogikanın stereotiplərini dəf etməyi tələb edir" [7, s. 135]. Konstruktiv şəkildə həll edilən münaqişələr həm müəllimin peşəkar yüksəlişinə, həm də tələbələrin şəxsi inkişafına müsbət təsir göstərir. Ona görə də gələcək müəllimlərin peşə fəaliyyətlərində konfliktli vəziyyətlərə hazır olması və onlardan qorxmaması, konstruktiv həll yolları tapması vacibdir. Bunun üçün onlar konfliktlə bağlı yüksək kommunikativ səriştəyə malik olmalıdırlar.

Kommunikativ fəaliyyətin subyekti kimi müəllimin əsas vəzifəsi müxtəlif situasiyalarda məlumat mübadiləsinin yaranması və təhsil məkanı hüdudlarında onun səmərəli idarə olunmasına şərait yaratmaqdır.

Kommunikativ səriştəyə malik müəllimin ünsiyyət subyekti kimi fəaliyyəti bir sıra prinsiplərlə tənzimlənir:

1. **Hədəf prinsipi** – sözün kimə ünvanlandığını, yəni auditoriyanın fərdi psixoloji xüsusiyyətlərini, onun tərkibini, yaşını, oriyentasiyasını nəzərə almaq zərurətini əhatə edir.

2. **Şəxsi daxil olma** prinsipi – hər iki tərəfdən iştirakçıların daxili fəaliyyəti olmadan həqiqi ünsiyyət əlaqəsinin qurulmasının mümkünsüzlüyünü göstərir.

3. **Mənalılıq prinsipi** kommunikativ qarşılıqlı əlaqə üçün müəyyən subyekt əsasının məcburi xarakterini təsbit edir.

4. **Həqiqilik prinsipi** pedaqoji ünsiyyət zamanı ötürülən məzmuna görə məsuliyyəti xatırladır.

5. **Qarşılıqlı anlama prinsipi** daxil olan mesajları başa düşmək və ünsiyyət partnyorunu anlamağa diqqət yetirmək zərurətini vurğulayır.

6. **Əlçatanlıq prinsipi** informasiyanın mürəkkəbliyinə riayət etmək, eləcə də arzu olunan informasiya kanalına daxil olmaq üçün şərait yaratmaq zərurətini göstərir.

7. **Açıqlıq prinsipi** müəllimin ünsiyyət çərçivəsində manipulyativ hərəkətlərdən istifadə etməsinin mümkünsüzlüyünə diqqəti cəlb edir. Manipulyasiya insanı şüursuz şəkildə və ya öz istəyinə, fikrinə və ya ilkin niyyətinə zidd olaraq nəyəsə sövq etmək (məlumat vermək, hərəkət etmək və s.) məqsədilə ona təsir etməkdir.

8. **İnformasiya təhlükəsizliyi prinsipi** kommunikantların şəxsiyyətinin mümkün psixofizioloji və sosial-psixoloji deformasiyalarının qarşısını alan qaydalara riayət etməyi tələb edir.

9. **Əks əlaqə prinsipi** pedaqoji hərəkətlərin korreksiyası məqsədilə kommunikativ hərəkətlərin nəticələrinin və təsirlərinin müəyyənləşdirilməsinə təkan verir [8, s. 10].

Pedaqoji ünsiyyətin mühüm cəhətlərindən biri onun hədəflənməsidir. Müəllimin onun üçün ünsiyyət tərəfdaşları və ya auditoriya seçmək və istədiyi şagirdlə münasibət qurmaq imkanı yoxdur. Təhsil sisteminin müxtəlif pillələrində təlim iştirakçılarının yaş həddinin nəzərə alınması müəllimdən yaşa uyğun olaraq məlumat və ünsiyyət ehtiyaclarının dinamikasını, onların ödənilməsi yollarını, şəxsiyyətin inkişafının müxtəlif həyat mərhələlərində emosional, idrak, nitq sahələrinin xüsusiyyətlərini bilməsini tələb edir.

Ümumi semantik və psixoloji məkanın yaradılmasına qayğı göstərmək pedaqoji ünsiyyətin zəruri və ən vacib vəzifəsidir. Müəllimin kommunikativ fəaliyyətinin əsas vəzifəsi məlumatın ötürülməsinə nail olmaq deyil, əksinə məlumat mübadiləsinin yaradılması və tələbənin dinləyib, anlaması üçün şəraitin yaradılmasından ibarətdir. Müəllimin qarşılıqlı əlaqədə – məlumatın ötürülmə sürətini, modallığı, həyəcan səviyyəsini, tənqidi və təklifi nəzərə alması vacibdir. Müəllimin şagirdlərlə qurduğu düzgün

əlaqə və münasibət kommunikativ qabiliyyətə malik olmaqla bağlıdır. Onların yaş xüsusiyyətlərini nəzərə almağı bacarmaq, onlarla ünsiyyət yarada bilmək və bu qəbildəndir [2, s.167].

Ali təhsil təhsilin məzmununa, forma və metodlarına görə orta məktəbdən fərqlənir. Ali təhsil pilləsində "Müəllim-tələbə" səviyyəsində pedaqoji ünsiyyət məktəbdə olan "müəllim-şagird" münasibətindən fərqlənir və bu, səmərəli birgə fəaliyyətə mane olan yaş baryerinin aradan qaldırılmasına əhəmiyyətli dərəcədə kömək edir. Fəaliyyətlərdə tərəfdaşlıq prinsipinə əməl etmədən tələbələri müstəqil işə cəlb etmək və peşəkar oriyentasiya formalaşdırmaq çətindir. Müəllim və tələbə arasında qarşılıqlı əlaqənin inkişafı müəllimin ünsiyyətə yaradıcı münasibətinə əsaslanır. Tələbələrdə yaradıcı təfəkkürün inkişafına səbəb olan müsbət əhval-ruhiyyəli mühitin formalaşdırılması, peşəyə qarşı marağın, sevginin yaradılması, onların peşə marağından tədris prosesinin idarə edilməsində vacib amil kimi istifadə edilməsi universitetdə təhsilin emosional məhsuldarlığını təşkil edir.

Təhsil məkanında peşə və şəxsi azadlıq dərəcəsi əsasən ünsiyyət sistemi vasitəsilə müəyyən edilir. Kommunikativ nəzarət pedaqoji qarşılıqlı əlaqə üçün eyni dərəcədə əhəmiyyət daşıyır. Müəllimin fəaliyyət azadlığı daha çox onun malik olduğu və əks əlaqə vasitəsilə aldığı məlumatdan düzgün istifadə etmək, ötürmək, şərh etmək bacarığı ilə bağlıdır. Pedaqoji fəaliyyətin strukturunda müəllimin səriştəliliyində kommunikativ mədəniyyət meyarları xüsusi əhəmiyyətə malikdir.

Peşə fəaliyyətini qiymətləndirmək üçün əsas göstəricilər arasında aşağıdakıları xüsusilə qeyd etmək olar:

1. Ümumi ünsiyyət tərzi – ünsiyyət vəziyyətinin, müəllimin kommunikativ hərəkətlərinin yaratdığı emosional fonun dərk edilməsindən; digər ünsiyyətçilərə informasiya və psixoloji təzyiqin olmamasının mövcudluğundan; empatiya, verilən rəyin xarakteri, konflikt səviyyəsi, kommunikativ çeviklik, obraz xüsusiyyətləri, pedaqoji ünsiyyətin etikası və s. ibarət olması;

2. Kommunikativ fəaliyyətin hədəflənməsi – konkret olaraq ünsiyyət prosesində hədəfin müəyyən edilməsi və fəaliyyətin istiqamətlənməsi;

3. İnformasiya xarakterli kommunikativ əlaqə – qarşılıqlı informasiyanın ötürülməsi və qəbul edilməsi;

4. Kommunikativ fəaliyyətin əsas növlərində (danışma, dinləmə, yazma, oxuma) bacarıqlar – bura nitq mədəniyyətinin, şifahi olmayan ünsiyyət vasitələrinin fərdi potensialının, mətnlərlə işləmə sənətinin və linqvistik səriştənin daxil olması;

5. Metodiklik (lazımi informasiyanın ötürülməsinin optimal yolunu tapmaq bacarığı).

6. Öz kommunikativ hərəkətlərinin digər iştirakçıların niyyətləri ilə uzlaşması (uyğunlaşması).

7. Əlaqə prosesinin yaranması üçün əks əlaqə imkanlarından istifadə – qarşılıqlı anlama və hissetmədən istifadə.

Real pedaqoji proses şəraitində kommunikativ fəaliyyətin müşahidəsi, müasir mədəniyyətin imkanları müəllim üçün fəaliyyətində kommunikativ vasitələrin, informasiya və kommunikasiya texnologiyalarının bütün imkanlarından geniş istifadə perspektivini açır. İnformasiyaların sürətli yenilənməsi tempini nəzərə alaraq müəllim onu tez bir zamanda emal etməlidir: təhlil etmək, sistemləşdirmək, qiymətləndirmək, dərslər üçün məlumat və metodiki material yaratmaq və s. Məhz kommunikativ vasitələrin müxtəlifliyinin nəzərdən keçirilməsi və təhlili müəllimin kommunikativ fəaliyyətinin təkmilləşdirilməsində bir neçə vacib sahəni müəyyənləşdirməyə kömək edər, eyni zamanda pedaqoji məkanın dialoq yönümünün artmasına mühüm təsir göstərər.

**Problemin aktuallığı.** Universitet tələbələri arasında kommunikativ səriştənin öyrənilməsinin və onun təhsilin davamlılığı kontekstində inkişafının aktuallığı həm də təhsil prosesinə səriştə əsaslı yanaşmanın tətbiqi ilə bağlıdır ki, bu da onların aydınlaşdırılmasında ehtiyac yaradır. Məqalə müasir mütəxəssislərin kommunikativ hazırlığının keyfiyyətinin yaxşılaşdırılmasının aktual problemini ortaya qoyur. Tədqiqatın məqsədi peşə hazırlığı prosesində tələbələrin kommunikativ bacarıqlarını inkişaf etdirilməsi yollarını müəyyənləşdirməkdən ibarətdir.

**Problemin elmi yeniliyi.** Peşəkar inkişafda kommunikativ səriştənin formalaşdırılması fərdin mövqeyini və səviyyəsini ifadə edən pedaqoji hadisə kimi tədqiq edilməsi məqalənin elmi yeniliyidir.

**Problemin praktik əhəmiyyəti.** Tədqiqatımız təhsilin davamlılığını nəzərə alaraq pedaqoji universitetlərdə tələbələrin kommunikativ səriştəsinin inki-

şaf etdirilməsi probleminin həllinə öz töhfəsini verə bilər.

**Ədəbiyyat**


1. İlyasov, M.İ. Müəllimin pedaqoji ustalığı. Dərs vəsaiti./ M.İ. İlyasov -Bakı: Elm və təhsil, -2013. -216 səh.
2. Qasımova, L.N. Pedaqogika. Dərslik. / L.N. Qasımova, R.M. Mahmudova. -Bakı: Çaşığolu, -2012. - 548 s.
3. Агафонова, И. Д. Формирование коммуникативной компетенции у менеджеров в дополнительном профессиональном образовании: автореферат диссертации … кандидата педагогических наук / Ирина Да ниловна Агафонова. -Екатеринбург, 2009. 26 с. Текст: непосредственный.
4. Бодалев А.А. Психология общения. – М.; Воронеж: МОДЭК, -2002. – 265 с.
5. Давлятшина, О.В. Научно-методическое сопровождение профессионально личностного развития педагогов в условиях общеобразовательной организации [Текст] / О.В. Давлятшина // Вестник Вятского государственного гуманитарного университета. – 2015. – №1. – С. 158–164.
6. Зимняя, И.А. Педагогическая психология: учеб. пособие / И.А. Зимняя. – Ростов н\д. : изд-во «Феникс, -1997 – 480 с.
7. Рыданова, И.И. Основы педагогики общения / И.И. Рыданова. – Минск : «Беларуская навука», -1998 – 319 с.
8. Сысоева, Е. Ю. Коммуникативная культура преподавателя вуза: учебное пособие / Е. Ю. Сысоева. – Самара : Изд-во «Самарский университет», -2014. – 144 с.
9. Tatyana Noskova, Tatiana Pavlova, Olga Yakovleva, Nina Sharova. Communicative Competence Development for Future Teachers. ear of publication: 2014.Pages: 188-198 DOI Address: https://doi.org/10.15804/tner.14.38.4.14.
10. Yakovleva T. V. The system of levels of communicative skills of future teachers in the process of university training. Udk. 37.032.p-292-295
11. Rodríguez Fuentes, A., Ayllón Blanco, M. F., Gallego Ortega, J. L., & Gómez Pérez, I. A. (2017). The Communication Skills of Future Teachers during their Initial Training. Multidisciplinary Journal of Educational Research, 7(1), 88-118. doi:10.17583/remie.2017.2200


**Redaksiyaya daxil olub:** 01.05.2025.

UOT 37.01.

***Firədun Nadir oğlu İbrahimov***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*
*Şəki filialının professoru,*
*pedaqogika elmləri doktoru*
*https: //orcid.org/0000-0002-0775-1048*
*https://doi.org/10.69682/arti.2025.92(3).43-53*
*E-mail: firedun52@mail.ru*

***Vüqar Əbülfət oğlu Abdurahmanov***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*
*Şəki filialının baş müəllimi,*
*riyaziyyat üzrə fəlsəfə doktoru*
*https://orcid.org/0000-0001-5181-9946*
*E-mail: abdurahmanov_v@mail.ru*

# TƏHSİLALAN MƏRKƏZLİ TƏLİMİN TƏŞKİLAT FORMASINDA ANALİTİK VƏ EVRİSTİK FƏALİYYƏT NÖVLƏRİNİN TƏNZİMLƏNMƏSİ

***Firadun Nadir Ibrahimov***
*professor of the Sheki branch under the Azerbaijan State Pedagogical University, doctor of pedagogical sciences*

***Vugar Abulfat Abdurahmanov***
*senior lecturer at Şhaki branch under the Azerbaijan State Pedagogical University, doctor of philosophy in mathematics*

# REGULATION OF ANALYTICAL AND HEURISTIC ACTIVITIES IN THE FORM OF A PERSONALITY-ORIENTED EDUCATIONAL ORGANIZATION

***Фиредун Надир оглы Ибрагимов***
*профессор Шекинского филиала Азербайджанского Государственного Педагогического Университета,*
*доктор педагогических наук*

***Вугар Абульфат оглы Абдурахманов***
*старший преподаватель Шекинского филиала Азербайджанского Государственного Педагогического Университета,*
*доктор философии по математике*

# РЕГУЛИРОВАНИЕ АНАЛИТИЧЕСКОГО И ЭВРИСТИЧЕСКОГО ВИДОВ ДЕЯТЕЛЬНОСТИ В ОРГАНИЗАЦИОННОЙ ФОРМЕ ОБУЧЕНИЯ, ОРИЕНТИРОВАННОЕ НА ОБУЧАЮЩЕГОСЯ

**Xülasə.** Məqalədə göstərilir ki, fərd real aləm haqqında özünün bütün biliklərini yalnız öz təcrübəsi əsasında deyil, ümumiyyətlə, bəşəriyyətin təcrübəsindən istifadə etməklə əldə edir və bu məntiqə dayanaraq iddia etmək olar ki, təhsilalanlar da təlim prosesində həm bilikləri hazır şəkildə, həm də öz potensial imkanlarına müvafiq müvafiq müstəqil yolla əldə etmək təcrübəsini mənimsəməlidirlər. Odur ki, təlim prosesində təhsilalan əqli fəaliyyətin analitik və evristik növlərinin fəal subyektinə çevrilməlidir. Analitik və evristik fəaliyyətin optimal münasibətlərini o təlim sistemi ehtiva edir ki, o təhsilalan mərkəzli əlamətə malik olur .

İşdə vurğulanır ki, təhsilalanın optimal psixi inkişafı və əqli proseslərinin aktivliyi şərtlərinin diqqət mərkəzində saxlanılması, tələbat, motiv, maraqlarının, emosional faktorların inkişaf xüsusiyyət və qanunauyğunluqlarının gözlənilməsi prosesinin idarə olunması üçün xüsusi əhəmiyyətə malikdir və təlim prosesinin

mahiyyəti ilə bağlı təzahür edən "$məzmun \rightleftarrows metod \leftrightarrows təşkilat\ forması$" dialektikasında özünə yer alan komponentlərin və bunlar arasındakı münasibətlərin (asılılıq və şərtlənmə münasibətlərinin) "$məzmun \Leftrightarrow forma$" kateqoriyalarının kontekstində formalaşdırılması arxa plana keçirilməməlidir. Metodik sistemdə məqsədin nəticəyə çevrilməsi prosesində metoda təlim materialının hərəkət forması, təşkilat formasının (xüsusi halda dərsin) təlim materialı ilə ona adekvat seçilmiş metoda (birgə halda) məzmunu kimi baxmaq gərəkdir. Bu yanaşma təlimdə alqoritmik və evristik münasibətlərin tənzimlənməsi və təhsilalan mərkəzli təlimimin reallaşması baxımdan faydalıdır.
***Açar sözlər:*** *təlim; təhsilalan mərkəzli təlim; məzmun və forma; dərsin strukturu; didaktik və metodik struktur; analitik və evristik fəaliyyət; daxili altstruktur; məntiqi-psixoloji altstruktur.*

**Abstract.** Please contact us, in beta form, but also have your own potential to acquire independently should master the experience. Therefore, in the learning process, the student must become an active subject of analytical and heuristic thinking activity. It provides an optimal connection of analytical and heuristic activity with the learning system, which has a personality-oriented nature.

The paper emphasizes that, focusing on the optimal mental development and activity of mental processes of the learner, the components occupy a relevant place in the dialectic of "content ⇄ method ⇆ organizational form", which manifests itself in relation to the requirement, motive, marriage and essence of the training process, and according to them, the relations (formation of dependent relations and conditioning relations) in the context of the parts "content ⇔ form" should not recede into the background. In the process of turning the method into the main goal in the methodological system, it is necessary to take into account the form of movement of the educational material, the formation of the organization (in the particular case of the teacher), educational material and an adequately chosen method (in the joint case). This approach is useful from the point of view of regulating algorithmic and heuristic relations in teaching and implementing student-centered learning.
***Keywords:*** *training; student-centered learning; content and form; lesson structure; didactic and methodological structure; analytical and heuristic activity; internal infrastructure; logical and psychological infrastructure.*

**Аннотация**. В статье показано, что все свои знания о реальном мире человек приобретает не только на основе собственного опыта, но и в целом, используя опыт человечества. Исходя, из этой логики можно утверждать, что опыт приобретения знаний учащиеся должны приобретать как готовый, так и самостоятельно в соответствии со своими потенциальными возможностями в процессе обучения. Поэтому в процессе обучения учащий должен стать активным субъектом аналитического и эвристического видов мыслительной деятельности. Оптимальное соотношение аналитической и эвристической деятельности содержится в системе обучение, ориентированное на учащегося.

В работе подчеркивается, что сохранение условий оптимального психического развития и активности психических процессов обучающегося в направленности, потребности, мотиве, интересах, эмоциональных факторах, особенностях развития и закономерностях процесса развития имеет особое значение для управления, причем в контексте категорий «содержание ⇔ форма» компонентов и связей между ними (зависимость и обусловленность), которые проявляются в диалектике «содержание ⇄ метод ⇆ организационная форма», проявляющейся в сущности процесса обучения. Тут образование не следует отодвигать на второй план. В процессе превращения цели в результат в методической системе метод следует рассматривать как форму действия учебного материала, содержание учебного материала, форму организации (особенно преподавателя) и адекватно выбранный метод (в совместном случае). Этот подход полезен с точки зрения корректировки алгоритмических и эвристических отношений в обучении и реализации обучения, ориентированного на учащегося.
***Ключевые слова:*** *обучение; обучение, ориентированное на учащегося; содержание и форма; структура урока; дидактическая и методическая структура; аналитическая и эвристическая деятельность; внутренняя инфраструктура; логико-психологическая инфраструктура.*

*Tədqiqat mövzusunun aktuallığı.* IV sənaye inqilabının çağırışlarına adekvat, səmərə verən mükəmməl təlim konsepsiyası işlənib praktiklərin sərəncamına verilməmişdir. Elə bir konsepsiya ki, təhsilalanların hər birinin potensial imkanlarına uyğun inkişafını sürətləndirməyin nəzəri və praktik yollarını tam şəkildə açıb göstərmiş olsun. Bu sistem təhsilalanların təlim fəaliyyətinin elə təşkili və idarə olunmasından ibarətdir ki, o, bəşərin sosial təcrübəni əldə etmək, onu qoruyub saxlamaq və yaradıcılıqla inkişaf etdirməyə yönələn fəaliyyət təcrübəsinə

istinad etməlidir. Belə bir fəaliyyət analitik və evristik növlərin müəyyən nisbətini ehtiva etməli, onu özündə saxlamalıdır. Analitik və evristik fəaliyyətin optimal münasibətlərini o təlim sistemi ehtiva edir ki, o təhsilalan mərkəzli əlamətə malik olur. Təlim prosesində belə bir mühitin mövcudluğu onun təşkilat formasının altstrukturların (xarici və daxili strukturların) məntiqi bağlılığından, hər bir altstrukturun elementlərinin seçilməsindən və bu elementlərin funksiyalarının reallaşma səviyyəsindən asılıdır. Söylənilənlərə rəğmən iddia edirik ki, "Təhsilalan mərkəzli təlimin təşkilat formasında analitik və evristik fəaliyyət növlərinin tənzimlənməsi" IV sənaye inqilabının çağırışlarına müvafiq təhsilin həyata keçirilmə yolu kimi dərk edilən təhsilalan mərkəzli təlim prosesinin formalaşdırılması problemin həllinə yönələn aktual tədqiqat məsələsidir.

*Tədqiqat üzrə əldə olunmuş materialların interpretasiyası.* Məlumdur ki, hər bir fərd real aləm haqqında özünün bütün biliklərini yalnız öz təcrübəsi əsasında deyil, ümumiyyətlə, bəşəriyyətin təcrübəsindən istifadə etməklə əldə edir, yəni son nəticədə biliyimiz ictimai praktikanın nəticəsidir, bu praktikanın subyekti bəşəriyyətdir, insan bu biliklər sisteminə bir neçə istiqamət üzrə yiyələnir. Bunların arasında: 1) insanlar biri-digərinə bəşərin öz ictimai tarixi inkişafı prosesində əldə etdiyi biliyin bir qismini, əsasən, hazır şəkildə ötürür (təbii ki, müxtəlif yol və vasitələrlə); 2)insan öz praktikası ilə real aləm haqqında biliklərə müstəqil yiyələnir – kimi istiqamətlərinin məxsusi yeri vardır.

Vurğulanan məntiqə dayanaraq iddia etmək olar ki, təhsilalanlar da təlim prosesində həm bilikləri hazır şəkildə, həm də öz təcrübələrinə müvafiq müstəqil yolla əldə etmək təcrübəsini mənimsəməlidirlər. Eyni zamanda onlar bu prosesdə biliklər xəzinəsini zənginləşdirməyə də hazırlanmalıdırlar. Təkzib olunmur ki, bunlar bir-birindən ayrılmaz və bir-birini tamamlayan proseslərdir. Biliklərin hazır qəbulu inkişafa əsaslanır (əldə olunan biliklər inkişafın həmin səviyyəsində aktual şəkildə istifadə oluna bilir). Biliklərin axtarış yolu ilə əldə olunması isə inkişafın yaxın zonasından aktual zonasına istiqamətlənməklə onu (şagirdlərin inkişafını) sürətləndirən prosesdir. Təlim prosesində biliklərin və fəaliyyət üsullarının hazır şəkildə verilməsinə, başqa sözlə, biliklərin və fəaliyyət üsullarının reproduktiv qaydalar sistemi ilə ötürülməsinə üstünlük verən altsistemin (təhsilalan mərkəzli mükəmməl təlim sistemində ehtiva olunan) məktəb praktikasında özünə yer tapması zərurətdir.

Biliklərin və fəaliyyət üsullarının reproduktiv qaydalar sistemi ilə əldə olunmasını təlim təcrübəsində zərurətə çevirən amillərdən biri də evristik fəaliyyətin analitik fəaliyyətə əsaslanması, analitik fəaliyyət prosesində zamana və məkana görə müəyyən mərhələ kimi çıxış etməsidir. Həqiqətin əldə olunmasında bir çox hallarda analitik fəaliyyət evristik üsullarla tamamlanır (yeninin axtarış üsulu ilə əldə edilməsi və interpretasiya olunması nəticəsində). Bilik və fəaliyyət üsullarının əldə olunmasında analitik fəaliyyətin "çəkisi" böyükdür. Çünki şagird təlim prosesində fəaliyyətə həm özü, həm də əldə olunma yolu bəlli olan bilik və fəaliyyət üsullarını əxz etməli olur.

Nəhayət, həqiqətlər dərslik və digər mənbələrdə analitik üsullarla şərh olunduğundan (yaradıcılığın sirləri pünhan olduğundan, dərslik və digər mənbələrdə tədqiqatın həqiqətə aparıb çıxaran şərhləri formallaşmış qaydada təqdim edilir) təlim təcrübəsində praktiklər də ona uyğun yollarla təlim prosesini idarə etməyə cəhd göstərirlər.

Lakin deyilənlər biliyin və fəaliyyət üsullarının reproduktiv üsullarla verilməsini zəruri etsə də, məktəbin qarşısında duran bütün vəzifələrin həyata keçməsi üçün (məxsusi olaraq azad və yaradıcı şəxsiyyətin formalaşması prosesinin sürətləndirilməsi baxımdan) kifayət deyildir. Odur ki, sözügedən prosesi həm yaxşı idarə olunan prosesə çevirmək, həm məktəbin vəzifələri və həm də bəşərin təcrübəni əldə etmək üsullarının əhatə olunması baxımlarından tamamlamaq, qısası, onu konkret məqsədi həyata keçirmək nöqteyi-nəzərindən daha optimal sistemlərlə tamamlamaq lazımdır, psixoloq və pedaqoqlar tərəfindən məhz belə sistemləri formalaşdırmaq (əsaslı arqumentlərə uyğun şəkildə) vacib sayılıb, bu sahədə xeyli tədqiqatlar aparılmışdır.

Təəssüflər olsun ki, IV sənaye inqilabının çağırışlarına adekvat, səmərə verən mükəmməl təlim konsepsiyası işlənib praktiklərin sərəncamına verilməmişdir. Elə bir konsepsiya ki, təhsilalanların hər birinin potensial imkanlarına uyğun inkişafını sürətləndirməyin nəzəri və praktik yollarını tam şəkildə açıb göstərmiş olsun.

Fikrimizcə, burada prof. B.A. Əhmədovun belə bir mülahizəsini xatırlamaq yerinə düşər: “Təlim nəzəriyyələrinin ən başlıca qüsuru ondan ibarətdir ki, onların heç birində məsələyə kompleks yanaşma özünü qabarıq şəkildə büruzə vermir. Birincisi, ona görə ki, hər nəzəriyyə bir psixoloji konsepsiyaya əsaslanır və digər konsepsiyaların müsbət cəhətlərini ehtiva etmir. İkincisi, ona görə ki, həmin nəzəriyyələr təkcə psixoloji konsepsiyalara istinad edir və nəticədə pedaqogika psixologiyaya tabe etdirilir” [1, s. 143].

Bu deyilənlərdən belə qənaətə gəlmək olur ki, təhsilalanların hazırlıq səviyyələrindəki çatışmazlıqlardan qurtara bilən və məktəbin qarşısında duran vəzifələrə cavab verən təlim sisteminə hökmən reproduktiv təlim tipi tamamlanmalıdır. Biz belə hesab edirik ki, bu sistem şagirdlərin təlim fəaliyyətinin elə təşkili və idarə olunmasından ibarətdir ki, o, bəşərin sosial təcrübəni əldə etmək, onu qoruyub saxlamaq və yaradıcılıqla inkişaf etdirməyə yönələn fəaliyyət təcrübəsinə istinad etməlidir. Belə bir fəaliyyət analitik və evristik növlərin müəyyən nisbətini ehtiva etməli, onu özündə saxlamalıdır. Analitik və evristik fəaliyyətin optimal münasibətlərini o təlim sistemi ehtiva edir ki, o təhsilalan mərkəzli əlamətə malik olur. Bu sistemdə yeninin əldə olunmasında *təlimi problem* əsasında təhsilalanların axtarışları dominantlıq edir, “problemlilik” məxsusi xüsusiyyət kimi təzahür edir.

Yeri gəlmişkən vurğulayaq ki, yaradıcı təfəkkürün analitik və evristik növlərə bölünməsi problemin həlli zamanı şagirdlərin yalnız əqli əməliyyatlarının anlaşılmasını yüngülləşdirməkdən ibarət olmayıb, eyni zamanda ayrı-ayrı əqli əməliyyatların həyata keçməsi üçün pedaqoji şəraitin yaradılması naminə müəllimin praktik fəaliyyəti üçün də əhəmiyyətlidir. Problemin həlli zamanı əqli fəaliyyətin hər iki növünün uzlaşmasının, əlaqələndirilməsinin əhəmiyyəti məlumdur. Əlbəttə, problemin məzmunundan və digər faktlardan asılı olaraq bu və ya digər növ üstünlüyə malik ola bilər ki, bu da təbii haldır. “Sistem təhlili” ideyası (L. Bertalanfi) bizi bu qənaətə gətirir [2, s. 8].

Əqli fəaliyyətin analitik növü problemin həlli zamanı əqli hərəkətlərin dəqiq ardıcıllığı ilə, mövcud həll alqoritmi ilə bağlıdır. Analiz və sintez, ümumiləşdirmə, abstraktlaşdırma və konkretləşdirmə – bu əqli əməliyyatlar bir-birini izləyir, müəyyən ardıcıllıqla, mərhələlər üzrə, pillə-pillə, yüksələ-yüksələ problemin həllinə nail olur. Təfəkkürün istiqamətliliyi verilənlər və axtarılanlar arasında münasibətlərdə müəyyənləşir, həllin üsulu sınaq və səhvi rədd etmə yolu ilə tapılır. Müvafiq qaydalar düzgün seçiləndə təfəkkürün alqoritmik məntiqi gec-tez həllə gətirib çıxarır.

Müasir psixologiyada intuitiv təfəkkürün analitik təfəkkürdən fərqinin xüsusiyyətlərini C. Bruner açmağa çalışmışdır [3, s. 53-64]. O, analitik və intuitiv təfəkkürü müqayisə edərək göstərir ki, analitik təfəkkür onunla xarakterizə olunur ki, onun ayrı-ayrı mərhələləri aydın təsəvvür edilir, nitqlə onu ifadə etmək olur. Bu zaman insan fikrin gedişini və məzmununu anlaya bilir və təfəkkür mühakiməsini ümumidən xüsusiyə, xüsusidən ümumiyə keçmə formasında qəbul edə bilir. Əqli fəaliyyətin evristik növünün əsasında intuitiv təfəkkür durur [4, s. 70].

Elmi fəaliyyətdə intuisiyanın rolu çox böyükdür. Bunu görkəmli elm adamları dönə-dönə qeyd etmişlər. Görkəmli rus riyaziyyatçısı V.A. Steklovun sözləri ilə desək, intuitiv proses “şüursuzluq şəraitində”(*təhtəlşüur-F.N., V.A*) yaranır. Burada formal məntiq qətiyyən iştirak etmir, həqiqətə əqli nəticələr sayəsində deyil, məhz intuisiya adlandırdığımız hissin təsiri ilə nail oluruq... “O şüura tamamilə isbatsız olaraq hazır hökmlər kimi daxil olur” [5].

Təlim-idrak prosesinin təşkilində müəllimin bu və ya digər əqli fəaliyyət növünün (məntiqinin) xüsusiyyətlərini bilməsi vacib məsələlərdəndir. Əqli fəaliyyətin analitik növünün strukturu pedaqogika və psixologiyada məlumdur [6, s. 112], [7, s. 21-22]. Sözügedən struktur belədir: 1) çətinliyin dərki və problem situasiyasının təhlili; 2) əsas çətinliyin müəyyənləşdirilməsi; 3) məlum alqoritmlərin tətbiqi və ya analitik yolların axtarılması ilə həllin axtarışı; 4) həll və onun düzgünlüyünün yoxlanılması.

Əqli fəaliyyətin evristik növünün strukturu prinsipcə müxtəlif ola bilər. Onun ayrı-ayrı mərhələləri analitikə yaxındır, lakin özünün spesifikası vardır. Əqli fəaliyyətin evristik növünün strukturu belədir: 1) çətinliyin dərki və problem situasiyasının analizi; 2) əsas çətinliyin müəyyənləşdirilməsi və problemin formuləsi; 3) a) fərziyyə irəli sürmək yolu ilə həll üsullarının axtarışı və onların inkişafı (yeni alqoritm tərtibi) və ya b) hipotez irəli sürmək və intuitiv yolla həllin tapılması; 4) əldə olunmuş nəticəni prak-

tikaya tətbiq etmək yolu ilə hipotezin doğruluğunu yoxlamaq. [6; 112]. Biz belə bir qənaətdəyik ki, ikinci yol təhsilalanların əqli qabiliyyətlərinin inkişafı prosesinin idarə olunması praktikasını yaxşılaşdırır.

Tədris-idrak prosesinin idarə olunması probleminin həllində xüsusi əhəmiyyət kəsb edən məsələlərdən biri də təfəkkürün funksiyası ilə bağlıdır. Psixologiya müəyyənləşdirmişdir ki, təfəkkür müxtəlif funksiyalara malikdir, fəaliyyət nümunəsini möhkəmləndirmək onun yeganə funksiyası deyildir. Təfəkkürün əsas funksiyası həm yeni biliklərin, həm yeni fəaliyyət üsullarının əldə etmək qabiliyyətinin formalaşması ilə bağlıdır. Bu yeni bilik və fəaliyyət üsulu keçmiş təcrübə əsasında mənimsənilir. Biliklər sistemi ilə eyni zamanda onlardan istifadə olunması üsullarını şagird mənimsəyir, intellektual fəaliyyət, məntiqi əməliyyat sistemi əldə edir, hansı ki, onun köməyi ilə o, öz biliklərindən praktik və nəzəri məsələlərin həllində istifadə edir.

Təlim prosesinin təhsilalanların analitik və evristik fəaliyyətlərinin uzlaşması əsasında təşkili və idarə olunması onun dinamikliyinə səbəb olur, burada dialektik ziddiyyətlərin əmələ gəlməsi və onun həlli başlıca xüsusiyyət kimi təzahür edir. Şagirdlərin yüksək emosional aktivliyi təmin olunur. Belə ki, bu prosesdə təhsilalan sistematik olaraq problemli vəziyyətə düşür, hansı ki, təhsialanın əqli fəaliyyəti onun psixi fəaliyyətinin hissi-emosional sferası ilə də sıx bağlıdır. Təlimin təhsilalan mərkəzli tamalanmış (formalaşmış təhsil məkanının çağırışlarına adekvat hesab olunan) sistemi biliklərin reproduktiv və produktiv mənimsənilməsinin məqbul münasibətlərini təmin edir, təhsilalanların yaradıcı fəaliyyətini gücləndirir.

Təlim prosesinin təhsilalanların analitik və evristik fəaliyyətlərinin uzlaşması əsasında təşkili və idarə olunması aşağıdakı funksiyaların yerinə yetirilməsini şərtləndirir: 1) təhsilalanların yeni bilik və yeni fəaliyyət üsullarını müstəqil mənimsəmə fəaliyyətinə cəlb olunması funksiyasını; 2) təhsilalanların idrak müstəqilliyi və yaradıcı qabiliyyətlərinin inkişafına təsir göstərmək funksiyasını; 3) təhsilalanların dialektik təfəkkürünün formalaşması funksiyasını.

Bu ümumi funksiyalardan başqa, daha üç funksiyanın da həyata keçməsinə şərait yaranmış olur: 1) təhsilalanların yaradıcı mənimsəmə vərdişlərinə yiyələnməsi üçün (məntiqi priyomlar və ayrı-ayrı yaradıcı fəaliyyət üsullarının tətbiqi üçün); 2) təhsilalanlar tərəfindən biliklərin yaradıcı tətbiqi vərdişlərinin formalaşması üçün (mənimsənilmiş biliklərin yeni situasiyada tətbiqi üçün); 3) təhsilalanların yaradıcı fəaliyyət vərdişlərinin formalaşması(elmi tədqiqatın metodlarını əldə etmək üçün).

Göstərilən funksiyalardan hər biri təhsilalanların müxtəlif cür praktik və nəzəri (intellektual) fəaliyyətlərindən və təlimin özünəməxsus xüsusiyyətlərinin nəzərə alınmasından asılı olaraq həyata keçirilir. Təlimin birinci və başlıca xüsusiyyəti təhsilalanların biliklərin müəyyən həcmdə, möhkəm, dərin və şüurlu mənimsənilməsinə yönələn analitik və evristik (problemli və qeyri-problemli axtarış) fəaliyyətlərinin vəhdəti əsasında cərəyan etməsidir. İkinci xüsusiyyəti şagirdlərin analitik və evristik fəaliyyətlərinin vəhdəti əsasında cərəyan edən təlim prosesinin idarə olunması prosesində onların (təhsilalanların) təfəkkürünün dialektik, məntiqi və yaradıcı qabiliyyətlərinin formalaşmasına səbəb olmasıdır.

Yaradıcı təfəkkür və bununla əlaqədar olaraq bütövlükdə intellektual hərəkətlərin ardıcıllıq sırası məhz problemin qoyuluşuna və həllinə istiqamətlənən əqli axtarışın müəyyən strukturu ilə bağlıdır. Əqli fəaliyyətin ardıcıllığı D. Dyui tərəfindən belə səciyyələnir: a) problemin qoyuluşu; b) problemin həlli c) həllin yoxlanılması. Bir çoxları təfəkkür psixologiyasının işlənilməsində təfəkkür mərhələlərini müəyyənləşdirilməsini D. Dyuinin əsas xidmətlərindən hesab edirlər [4, s. 72].

Bu problemə toxunan başqa bir müəllif A.M. Matyuşkin beş mərhələnin mövcudluğunu göstərir: 1) problem situasiyanın yaranması və problemin qoyuluşu; 2) məlum həll üsullarından istifadə olunması; 3) yeni həll üsullarının axtarışı oblastının genişləndirilməsi, yeni münasibət və fəaliyyət prinsiplərinin müəyyənləşdirilməsi; 4) tapılmış prinsipin realizə olunması; 5) həllin düzgünlüyünün yoxlanması. Biliklərin yaradıcı şəkildə mənimsənilməsi işində bunun daxili mexanizminin dərk edilməsi baxımından bu ardıcıllıq böyük əhəmiyyətə malikdir. Xüsusilə də beş mərhələdən ikinci, üçüncü, dördüncü problemin həlli prosesinin özünün mexanizminin konkretləşməsini özündə saxlayır [8, s. 194-195], [9]

Psixoloji ədəbiyyatda daha ümumiləşmiş şəkildə təfəkkürün əsas iki konsepsiyası təqdim olunur: birincisi, təfəkkür–analiz və sintez pro-

sesi kimi; ikincisi, təfəkkür-interiorizasiya əməliyyatlarının sistemi kimi. Pedaqoji psixologiyada bu iki konsepsiya təlimin tədqiqatında iki əsas istiqamət şəklində əks olunur. Onlardan biri anlayışların formalaşması nəzəriyyəsidir. Bu istiqamətin nümayəndələri hesab edirlər ki, təhsilalanların əqli inkişafı üçün mühüm stimul təlim prosesində intellektual çətinlikləri onların (təhsilalanların) fəal şəkildə aradan qaldırmasıdır (D.N. Boqoyavlinski, N.A. Mençinskaya, E.N. Kabanova-Meller, L.V. Zankov və b.). İkinci, əqli fəaliyyətin formalaşma nəzəriyyəsidir. Bu istiqamətin nümayəndələri məktəblilərin əqli fəaliyyətinin inkişafında xarici fəaliyyətin daxiliyə çevrilməsi ilə əqli fəaliyyətin mərhələlərlə idarə olunmasını mühüm üsul hesab edirlər (A.N. Leontyev, P.Y. Qalperin, D.B. Elkonin, V.V. Davıdov).

D.N. Boqoyavlinski və N.A. Mençinskaya hesab edirlər ki, idrak prosesində əsas sadə element assosiasiyadır. Onlar müəyyənləşdirmişlər ki, təhsilalanların daha çox idrak aktivliyi problem situasiyası ilə ortaya çıxır, bu situasiya isə məsələnin həllinin aktiv axtarışı şəraitində yaranır. Biliklərin mənimsənilməsində müəyyənedici iki şərt vardır: 1) yeni material problemli xarakter daşısın; 2) yeni biliklərə tələbat yaransın, fikri fəallıq motivlərlə, idrak maraqları və emosional münasibətlərlə bağlansın [10, s. 110 ].

Vurğulayaq ki, pedaqoji tədqiqatlarda anlayışların formalaşdırılması konsepsiyası ilə interiorizasiya əməliyyatı konsepsiyasının əlaqəsi araşdırılmışdır. Birinci istiqamətin nümayəndələrinin tədqiqatlarında məsələ həllinin konkret mexanizminin bir çox prinsipial tərəfləri açılmışdır. Bu barədə Q.S. Kostyuk yazırdı ki, məsələ həlli insanın keçmiş təcrübəsi əsasında, onun vasitəsi ilə həyata keçirilir ki, buraya ümumiləşmiş assosiasiyalar, bilik, bacarıq, vərdişlər və s. daxildir. Ancaq məsələnin həllini təkcə keçmiş təcrübənin müxtəlif elementlərinin bərpasından ibarət hesab etmək birtərəfli olardı, həll yeni fikrin yaranmasıilə nəticələnir, gizli şəkildə mövcud olan obyektiv münasibətləri də əks etdirir [11, s. 57-70 ].

Əqli fəaliyyətin formalaşdırılması nəzəriyyəsinin yaradıcılarından olan D.B. Elkonin və V.V. Davıdovanın konsepsiyası onunla fərqlənir ki, tədqiqatçılar təhsilalanların əqli fəaliyyətlərinin inkişafında başlıca cəhəti təlim metodları ilə bağlamır, mənimsənilmiş biliklərin məzmununda görürlər. Müəlliflər o mövqedən çıxış edirlər ki, müasir məktəbin qarşısında üç vəzifə durur: 1) müəyyən həcmdə biliklərin mənimsənilməsi; 2) əqli inkişaf; 3) idrak motivlərinin yaradılması. Bu vəzifələrin hər birinin öz həlli yolu var. Bu məsələlərdən hər hansı birinin həlli digərinin həllinə avtomatik olaraq səbəb olmur. Onları yalnız eyni vaxtda, eyni yolla həll etmək olar. Müəyyənedici, mərkəzi halqa bu vəzifələrin həllində mənimsənilməli biliklərin məzmuna adekvat tədris üsulları ilə onların üzvi əlaqələndirilməsidir. Müəlliflər hesab edirlər ki, təlimin məzmununun dəyişməsi intensiv əqli inkişafa və təlim motivlərinin formalaşması ilə bağlı məsələlərin həlli üçün əsas yaradır.

Təhsilalanın optimal psixi inkişafı və əqli proseslərinin aktivliyi şərtlərinin diqqət mərkəzində saxlanılması, tələbat, motiv, maraqlarının, emosional faktorların inkişaf xüsusiyyət və qanunauyğunluqlarının gözlənilməsi prosesinin idarə olunması üçün xüsusi əhəmiyyətə malikdir.

Burada yuxarıda vurğulananlarla yanaşı, təlim prosesinin mahiyyəti ilə bağlı təzahür edən "$məzmun \rightleftarrows metod \leftrightarrows təşkilat\ forması$" dialektikasında özünə yer alan komponentlərin və bunlar arasındakı münasibətlərin (asılılıq və şərtlənmə münasibətlərinin) "$məzmun \Leftrightarrow forma$" kateqoriyalarının kontekstində formalaşdırılması arxa plana çəkilməməlidir. Metodik sistemdə məqsədin nəticəyə çevrilməsi prosesində metoda təlim materialının hərəkət forması, təşkilat formasının (xüsusi halda dərsin) təlim materialı ilə ona adekvat seçilmiş metoda (birgə halda) məzmunu kimi baxmaq gərəkdir. Bu yanaşma təlimdə alqoritmik və evristik münasibətlərin tənzimlənməsi və təhsilalan mərkəzli təlimimin reallaşması baxımdan faydalıdır. Tədqiqatdan əldə etdiyimiz materialların ümumiləşməsi bizi belə qənaətə gətirir.

Nəhayət, söylədiklərimizə rəğmən tədqiqat prosesində əldə olunmuş materialların ümumiləşməsinin “Təhsilalan mərkəzli təlimin təşkilat formasında analitik və evristik fəaliyyət növlərinin tənzimlənməsi” məsələsi üzrə interpretasiyasını təqdim edək.

Dərsin təkmilləşdirilməsi (onun əsas forma olması səbəbli) təxirəsalınmaz tələbdir. Ədalət naminə söyləmək olar ki, dərsin təkmilləşdirilməsi ilə bağlı xeyli araşdırmalar aparılmışdır, bu proses hazırda davam etdirilməkdədir; onun tipləri və strukturu dəqiqləşdirilməkdə, təlim materialının

prosessual hərəkətinin forması rolunu oynaya biləcək səviyyədə təşkil və idarəedilməsinin nəzəriyyə və praktikası işlənməkdədir. Bunlara baxmayaraq, dərslə bağlı məsələlərin həllində indinin özündə də yekdillik yoxdur. Bəzən dərslərin tip və növlərinin müəyyənləşdirilməsində didaktik anlayışları bir növ psixi anlayışlarla eyniləşdirmək cəhdləri ilə də rastlaşırıq [12, s . 547].

Fikrimizə əyanilik gətirə biləcək bəzi mülahizələrə diqqət yetirək. M.N. Skatkin qeyd edirdi ki, "... dərs pedaqoji prosesin bu və ya digər dərəcədə bitmiş bir parçası, yaxud hüceyrəsidir" [13, s. 149]. Prof. B.A. Əhmədov yazırdı: "Müəllimin dərs ili üçün sabit tərkibli şagird qrupunun kollektiv idrak fəaliyyətinə (və həyata düzgün münasibətinin formalaşdırılması prosesinə) konkret rejim üzrə (həm də kollektivin hər bir üzvünün fərdi xüsusiyyətlərini nəzərə almaqla) bilavasitə rəhbərlik etməsinə dərs deyilir" [1, s. 188]. Prof. A.O. Mehrabov da prof. B.A. Əhmədovun fikrinə oxşar şəkildə yazırdı ki, dərs müasir pedaqogikanın mühüm anlayışlarından biri kimi istifadə olunmaqdadır. Hələ də onun müəllimin rəhbərliyi altında cədvəl üzrə, müəyyən olunmuş şagird kontingenti ilə, vaxt çərçivəsində keçirilməsi pedaqoji tələb kimi öz qüvvəsini saxlayır...Standart dərsin parametrləri kimi onları yerinə yetirirlər [14, s. 18].

Təlimin əsas təşkilat forması sayılan dərs xeyli uzun tarixə malikdir. Professor A.N. Abbasov yazır ki, məktəbin inkişaf tarixində müxtəlif təlim sistemləri mövcud olmuşdur. Həmin sistemlərdə ayrı-ayrı təşkilat formalarına: təlimin fərdi-qrup formasına (orta əsr məktəblərində), qarşılıqlı şəkildə bir-birinə təlim vermək formasına (İngiltərədə Bell-lankaster sistemi), təhsilalanların qabiliyyətlərinə görə fərdiləşdirilmiş təlim forması (Manheym), briqada-laborator formasına (Dalton planının şəkli dəyişdirilmiş forması, XX əsrin 20-ci illərində, sovet məktəblərində tətbiq olunub) sinif-dərs formasına (350 ildən çoxdur ki, inkişafdadır) yer ayrılıb. Təlimin məqsədi, məzmun və metodları onun təşkilat formasında qarşılıqlı əlaqə şəraitində təzahür edir.... Təlimin təşkilinin müxtəlif formalarının meydana gəlməsi, inkişafı, təkmilləşdirilməsi və tədricən bəzilərinin sıradan çıxması inkişaf edən cəmiyyətin tələbləri, ehtiyacları ilə bağlı olmuşdur [15, s. 286].

Bəşərin sosial təcrübəsinin bir hissəsini özündə saxlayan təlim materialı və onun mənimsənilməsinə yönələn təlim metodlarının təkmilləşməsi ilə bağlı onların mövcudluq forması (yuxarıda vurğuladığımız kimi, dərs üçün təlim materialı və metodlar birlikdə məzmun yerində çıxış edir) təkmilləşməyə bilməz ("Forma" ilə "Məzmun" kateqoriyalarının dialektikası belədir!). Dərsin təkmilləşdirilməsi ilə bağlı psixoloqlar xeyli iş görmüşdür. Təsadüfi deyildir ki, "ənənəvi dərs"lə yanaşı "müasir dərs", "inkişafetdirici dərs", "problemli dərs", "mərhələli dərs", "sintetik dərs" və s. keyfiyyət əlamətlərini əks etdirən anlayışlardan istifadə olunur.

Qeyd edək ki, gərgin pedaqoji, psixoloji, metodoloji araşdırmalarla müasir dərs və ona verilən tələblər formalaşdırılmışdır. Doğrudur, "müasir dərs" anlayışından istifadə pedaqoji ədəbiyyatda birmənalı qarşılanmır. Dərsə verilən tələblərin dəyişməsindən, onun məktəbin bu günkü vəzifələrinə uyğun qurulmasından və müvafiq terminalogiyadan istifadə olunmasından bəhs etməyi daha məqsədəuyğun sayırlar.

"Yeni pedaqoji təfəkkürün inkişafında şərti surətdə iki mərhələni fərqləndirmək olar. Birinci mərhələdə ənənəvi didaktik sistemin elmi-tənqidi təhlili axarında dərsin optimallaşdırılması başlıca psixoloji və pedaqoji problem kimi xüsusi əhəmiyyət kəsb edirdi. Ənənəvi dərsin alternativi kimi müasir dərs anlamı da bu mərhələdə yaranmışdı" mülahizəsinin müəllifi prof. Ə.Ə. Əlizadə yazırdı ki, "müasir dərs" anlamında "müasir "sözünün özünəməxsus evristik mənası var. "Müasir dərs" "bu günkü dərs" demək deyildir. Zamanın uğurlarına söykənən dərsə müasir dərs deyilir. Bu anlamda, adətən, bir-biri ilə üzvi surətdə bağlı olan iki cəhəti ayırd edirlər. Çox vaxt müasir dərs dedikdə, onu təkcə dərsin elmi-nəzəri səviyyəsini yüksəltmək, müasirləşdirmək kimi başa düşürlər. Dərs özünün elmi-nəzəri səviyyəsinə görə zəmanənin uğurlarını əks etdirməlidir. Bu şəksizdir. Lakin müasir dərs anlamını təkcə bu kökdə izah etmək birtərəfli olardı. Söhbət pedaqoji fenomendən gedir. Müasir sözü də məhz dərsi səciyyələndirir. Bu, istər psixoloji və pedaqoji, istərsə də dilçilik baxımından belədir. Dərs təkcə özünün elmi-nəzəri səviyyəsinə görə deyil, həm də pedaqoji konsepsiyasına-yeni pedaqoji təfəkkür ölçüləri ilə qurulmasına görə müasir olur. Müasir bilikləri müasir üsulla-müasir dərsi ümumi şəkildə belə səciyyələndirmək olar [16, s. 17-18].

Etiraf olunmalıdır ki, təlimin təşkilat forması kimi o, hələ də səmərəli şəkildə tədqiq

olunmaqdadır, onun tipləri və strukturu dəqiqləşdirilməkdədir, təlim materialının özünün prosessual hərəkətinin forması rolunu oynaya biləcək səviyyədə təşkil və idarə edilməsinin nəzəriyyə və praktikası işlənilməkdədir. Amma buna baxmayaraq dərslə bağlı məsələlərin (onu bütöv sistem kimi xarakterizə edən) həllində indinin özündə də yekdillik yoxdur. Məsələn, dərsin təsnifatı didaktiklərin çoxdan müzakirə mövzularından biri olmuşdur.

Dərsin tipologiyası məsələsi ilə bağlı çoxlu didaktik xarakterli (həmçinin metodik xarakterli) tədqiqatlar aparılmışdır. Bu istiqamətdə tədqiqat aparan müəlliflər təsnifləşdirmə zamanı dərsin bu və ya digər əlamətini, cəhətini əsas kimi qəbul etmişlər. Y.A. Talıbov, Ə.A. Ağayev, İ.N. İsayev, A.İ. Eminovun müəllifləri olduqları "Pedaqogika" kitabında göstərilir: "Dərsin tipləri və quruluşu məsələsində bir qrup müəllif təlim prosesini əsas götürməklə: a) giriş dərsləri; b) tədris materialı ilə ilk tanışlıq dərsləri; c) anlayış yaradan dərslər və s. İkinci qrup müəlliflər tədris metodlarını əsas hesab etməklə dərsləri: a) mühazirə dərsləri; b) müsahibə dərsləri; c) laboratoriya məşğələləri dərsləri və s. tiplərə bölürlər. Üçüncü qrup müəlliflər isə dərsləri onun qarşısında duran didaktik vəzifələrlə bağlı təsnifləyirlər [17, s. 159-160].

Yeri gəlmişkən onu da vurğulayaq ki, müasir dərs nəzəriyyəsində və təlim təcrübəsində dərslərin didaktik məqsədlərə görə bölgüsündən bir iş aləti kimi istifadə edir, həm də bu zaman belə bir düzəliş verirlər ki, "xalis şəkildə" (yalnız yeni məlumatı verən, yaxud yalnız bilik, bacarıq və vərdişləri möhkəmləndirmək məqsədi ilə keçirilən) dərslərə nadir hallarda təsadüf edilir, eləcə də xalis proqramlaşdırılan və xalis problemli dərslərə az təsadüf olunur. Real tədris prosesində demək olar ki, hər bir dərs didaktik məqsədlər kompleksini yerinə yetirir və bu zaman müxtəlif təlim üsullarından istifadə edilir. Qeyd edək ki, dərsin məqsədə görə tipologiyası ideyası B.P. Yesipovun adı ilə bağlıdır. O, dərsin 6 tipini fərqləndirmişdir.(Bax: [18, s. 34]). B.P. Yesipovun təqdim etdiyi tipologiyanı Azərbaycan pedaqoqları-akademik M.M. Mehdizadə və prof. N.M. Kazımov da inkar etmirdi [14], [19]. N.M. Kazımov yazırdı ki, bu bölgünün üstün cəhətləri vardır. Əvvəla, dərs tiplərinin adlandırılmasında eyni üslub gözlənilir, ikincisi, bölgü didaktik vəzifələrin həllinə əsaslanır. Lakin bu bölgünün də çatışmayan cəhətləri vardır. Əvvəla, real təlim zamanı, məsələn, yalnız yeni biliyi mənimsədən dərs, yaxud yalnız bacarıq və vərdişləri formalaşdıran dərs olmur. Bu və ya digər tipə aid olan bir dərsdə bir neçə didaktik vəzifə yerinə yetirilə bilər. İkincisi, dərsin tipləri təlimin mərhələlərinə lazımınca uyğun gəlmir. Bu bölgüdə, məsələn, təlimin ilk mərhələsinə-tədris materialının qavranılmasına uyğun gələn dərs tipi nəzərə alınmır [19, 173 ].

Bizim diqqətimizi M.İ. Maxmutovun mülahizələri hər zaman çəkmişdir və bu gün də daha çox çəkməkdədir. M.İ. Maxmutov məşğələnin təşkili məqsədlərini (problemlilik prinsipi də nəzərə alınmaqla): a) yeni materialın öyrənilməsi; b) bilik, bacarıq və vərdişlərin təkmilləşdirilməsi; c) öyrənmə dərəcəsinə nəzarət və qiymətləndirmə kimi üç məqsədin birləşdirilməsi əsasında təsnif edir [20, s. 76]. O göstərirdi ki, "...müasir dərs ənənəvi dərsdən məqsədləri, məzmunu, təşkilati-metodik tərəfləri, şagirdlərin fəaliyyətlərinin aktivlik dərəcəsi, strukturu, tempi, TV-nin xüsusiyyətləri və s. ilə fərqlənir. Müxtəlifliyinə baxmayaraq müasir dərsləri (problemlilik prinsipinə əsasən) iki qrupda birləşdirmək olar: a) problemli dərslər; b) problemli olmayan dərslər. Bunların fərqi təlimin metod və vasitələrində, dərsin strukturunda axtarılmalıdır. Problemli dərslərin məntiqi-psixoloji (daxili) və didaktik (xarici) strukturunu ayırmaq mümkündür. Dərs daxili struktur nöqteyi-nəzərindən problemli o zaman hesab olunur ki, müəllim düşünülmüş şəkildə problemli vəziyyət yaradır və müstəqil təlimi problem qoymaq və həlli axtarmaq, yerinə yetirmək üzrə şagirdlərin axtarış fəaliyyətini təşkil edir (yüksək dərəcəli problemlilik) və ya problemi özü qoyur və onu həll edir, axtarış situasiyası üzrə fikrin məntiqini şagirdlərə göstərir. Şagirdlərin idrak fəaliyyətinin yüksək səviyyəsi problemli vəziyyətlə şagirdlərin idrak, maraq və emosional hisslərinin uzlaşması zamanı əldə olunur" [20, s. 77-78].

Burada biz müasir dərsə baxışın bəzi yeni elementlərini görürük. Problemli dərsin didaktik göstəricisi onun kompleksliliyi, "sintetikliyidir". Bu, kombinə edilmiş dərsin eyniyyəti deyildir. Sintetik dərsdə eyni zamanda bir neçə didaktik məsələ həll olunur (kombinə edilmiş dərsdə də bu belədir). Lakin bu, başlıca deyildir. Sintetik dərsin mahiyyəti ondan ibarətdir ki, keçilmişlərin təkrarı, bir qayda olaraq, yeni materiala gi-

rişlə birləşir, zəruri biliklərin aktuallaşması mərhələsində yeninin öyrənilməsinə başlanılır, yeninin əldə olunması müstəqil işlə bağlanır, biliklər praktikaya sistematik olaraq tətbiq olunur, bilik, bacarıq və vərdişlərin təkrarı yeni əlaqə və uzlaşmalarda fasiləsiz reallaşdırılır. Əsas mərhələlərin (yeni materialın izahı, onun qavranılması, yeni anlayışların mənimsənilməsi, vərdişlərin işlənməsi və sairənin kompleksliliyi problemli dərsin əsas xüsusiyyəti kimi müşahidə olunur. Didaktik nöqteyi-nəzərdən problemli olmayan dərs problemlidən təlim prosesinin mərhələlərinin dəqiq ayrılışı ilə fərqlənir, dərsin əsas elementlərinin sintetikliyi olmur [ 21, s. 416].

Didaktik məqsədləri, təlim materialının məzmununu, həmçinin təlimin ümumi metodlarını nəzərə almadan dərsin strukturunu qurmaq olmur. Aktuallaşdırma, yeni anlayış və fəaliyyət üsullarının formalaşdırılması və mənimsənilmişlərin tətbiqi öyrənmə prosesinin nəticələri kimi çıxış edir, həm də bunlar dərsin üç ümumiləşmiş didaktik vəzifəsi kimi bir dərsdə, müxtəlif dərəcələrdə, onun tipindən, növündən asılı olmayaraq həll olunur. Onlar həm də dərsin ümumi didaktik strukturunun komponentləridir (eyni zamanda dərsin əsas mərhələləridir). Dərsin ümumi didaktik strukturu dərslərin təşkilinin alqoritmi, ümumi təlimatıdır. Bu struktur dərsin metodik strukturunda açılır və konkretləşir. Onun elementləri müəllim və şagirdin müxtəlif fəaliyyət növləridir. Əgər didaktik strukturun komponentlərinin sayı dəyişməzdirsə, metodik strukturun elementlərinin sayı dəyişən kəmiyyətdir. Bu dərsin metodik strukturunun çoxlu variantlarını şərtləndirir. Praktik olaraq bütün fənlər üçün, bütün növ və tip dərslər üçün vahid metodik struktur vermək qeyri mümkündür. Bu strukturu yalnız model şəklində təsəvvür etmək olar [22, s. 102-104].

Altstrukturların əsasları bir-birindən fərqlənir: didaktik vəzifələr sistemi və təlim prosesinin məntiqi əsasında didaktik struktur qurulur; didaktik struktur əsasında metodik struktur qurulur; mənimsəmənin daxili altstrukturu şagirdin produktiv əqli fəaliyyətinin məntiqi əsasında qurulur. Problemli dərslə qeyri-problemli dərsin strukturları arasındakı fərq bundan ibarətdir ki, problemli dərs tipində məntiqi-psixoloji struktur həm mənimsəmə prosesinin ümumi məntiqi, həm də yaradıcı əqli fəaliyyətin məntiqi ilə müəyyənləşir, qeyri-problemli dərs tipində bunlardan birincisindən danışmaq olar [21, s. 418-419 ].

Dərsin metodik altstrukturunun xarakteri yalnız onun ümumi didaktik strukturunun məzmunundan asılı deyildir. Didaktik struktur təlimin və müasir dərsin əsas mərhələlərini əks etdirir. Didaktik və metodik strukturları arasındakı bağlayıcı həlqələr dərsin daxili məntiqi-psixoloji altstrukturlarına xidmət edir. Dərsin daxili altstrukturu tədris-idrak prosesini əks etdirən elementlərdən ibarətdir.

Dərsin daxili altstrukturu tədris-idrak prosesini əks etdirən elementlərin elə münasibətlərindən ibarətdir ki, burada tədris-idrak prosesi əldə olunmuş bilik və təcrübənin bərpası və yeninin mənimsənilməsi prosesi duyğu və qavrayışlarla başlanır, sonra məntiqi əməliyyatlarla yeni bilik hasil edilir, anlaşılır, dərk olunur. Ayrı-ayrı xassə, əlamətlərin ümumiləşdirilməsi öyrənilmişləri sistemləşdirməyə imkan verir. Bu proses yeni biliyin köhnə biliklər (əldə olunmuşlar) sisteminə daxil olması ilə başa çatır. Bu prosesdə adətən tədris-idrak prosesinin elementləri bilavasitə görünmür, hiss olunmur, onlar metodik altstrukturun aşağıda göstərilən elementlərində ifadə olunur: bərpaetmə-sorğuda, çalışmalarda və s.; anlama-cavabların düzgünlüyündə, sualın qoyuluşunda, mühakimə və məntiqi nəticələrdə, tətbiq qaydalarında və s.; ümumiləşdirmə – biliyin hissələrini əlaqələndirməyi bacarmaqda, keçmiş mənimsənilmişlərdə yeninin yerini müəyyən etmənin düzgünlüyündə və s.

Bu elementlərin funksional bağlılığı və onların ardıcıllığı mənimsəmənin ümumi məntiqini determinilәşdirir. Onlar şagirdlərin reproduktiv və produktiv fəaliyyət növləri ilə birbaşa bağlıdır. Mənimsəmənin yaradıcı xarakteri produktiv əqli prosesin məntiqi ilə (təlim probleminin qoyuluşu və həlli ilə ) bilavasitə əlaqədardır. Odur ki, yaradıcı axtarış fəaliyyəti ilə bağlı təlim prosesinin idarə olunmasında daha bir altstruktur da nəzərə alınmalıdır. Deməli, təlim prosesinin əsas təşkilat formasının metodik strukturunun öz daxili altstrukturları ilə uzlaşması məsələsinin həlli zamanı şagirdin və müəllimin fəaliyyətinin xarakteri, növləri nəzərə alınmalıdır. Şagirdin analitik fəaliyyətinə yönələn metodik struktur, onun yaradıcı axtarış fəaliyyətinə yönələn metodik strukturla əlaqəli olsa da, bunlar eyniyyət təşkil etmir. Belə ki, şagirdin təlim fəaliyyəti analitik xarakter daşıdığı təqdirdə, metodik struktur mənimsəmə prosesinin ümumi məntiqinə uyğun gəldiyi halda, o, evristik xarakter daşıdıqda burada şagirdin

həm də produktiv əqli fəaliyyətinin məntiqi nəzərə alınmalıdır.

Dərsin metodik strukturu həm didaktik struktur, təhsil, tərbiyə və inkişaf vəzifələri, həm də müəllim və şagirdin fəaliyyət növü ilə müəyyən olunur. Dərsin strukturunun optimallığı başlıca olaraq aşağıdakı amillərin nəzərə alınmasından və müəyyənləşməsindən asılıdır: a) təlim materialının məzmunu; b) didaktik məqsəd və didaktik vəzifələr; c) təlim metod və vasitələri; ç) şagirdlərin yaş və fərdi xüsusiyyətləri; ə) şagirdlərin öyrənməyə qabillik səviyyəsi.

Dərsin metodik strukturunu müəyyənləşdirərkən, uyğun variantı seçərkən müəllimin özünəməxsus peşəkarlığı, ustalığı, hazırlığı da mühüm şərtdir.

Qabaqcıl təcrübəyə malik müəllimlər təlim materialını bütün komponentlər üzrə, həm də bunları məntiqi, psixoloji, tərbiyəvi və didaktik aspektdən hərtərəfli təhlil edir və bunun əsasında şagirdin fəaliyyətində analitik və evristik növlərin nisbətini müəyyənləşdirir. İdarəetmənin metodik strukturu da məhz bu zəmin əsasında müəyyən edilir.

***Nəticə.*** 1. IV sənaye inqilabının çağırışlarına müvafiq formalaşması zəruri sayılan təhsilin həyata keçirimə yolu kimi dərk edilən təlim prosesi təhsilalan mərkəzli olmalıdır;

2. Təlim prosesinin təhsilalan mərkəzli olması tələbinin reallaşması üçün sözügedən prosesdə təhsilalanın digər bir sıra şərtlərlə yanaşı analitik və evristik fəaliyyətlərinin münasibətləri tənzimlənməlidir;

3. Yaradıcı təfəkkürün analitik və evristik növlərə bölünməsi "təlimi problemin" həlli zamanı şagirdlərin yalnız əqli əməliyyatlarının anlaşılmasını yüngülləşdirməkdən ibarət olmayıb, eyni zamanda ayrı-ayrı əqli əməliyyatların həyata keçməsi üçün pedaqoji şəraitin yaradılması naminə müəllimin praktik fəaliyyəti üçün də əhəmiyyətlidir.

4. Yaradıcı təfəkkür və bununla əlaqədar olaraq bütövlükdə intellektual hərəkətlərin ardıcıllıq sırası məhz problemin qoyuluşuna və həllinə istiqamətlənən əqli axtarışın müəyyən strukturu ilə bağlıdır.

5. Təlimi problemin məzmunundan və digər faktlardan asılı olaraq təlim prosesində bu və ya digər növ(analitik və ya evristik) üstünlüyə malik ola bilər;

6. Metodik sistemdə məqsədin nəticəyə çevrilməsi prosesində metoda təlim materialının hərəkət forması, təşkilat formasının (xüsusi halda dərsin) təlim materialı ilə ona adekvat seçilmiş metoda (birgə halda) məzmunu kimi baxmaq gərəkdir; bu yanaşma təlimdə alqoritmik və evristik münasibətlərin tənzimlənməsi və təhsilalan mərkəzli təlimimin reallaşması baxımdan faydalıdır.

7. Təhsilalanın optimal psixi inkişafı və əqli proseslərinin aktivliyi şərtlərinin diqqət mərkəzində saxlanılması, tələbat, motiv, maraqlarının, emosional faktorların inkişaf xüsusiyyət və qanunauyğunluqlarının gözlənilməsi təhsilalan mərkəzli təlim prosesinin idarə olunması üçün xüsusi əhəmiyyətə malikdir;

8.1. Təlim prosesinin əsas təşkilat formasının metodik strukturunun öz daxili altstrukturları ilə uzlaşması məsələsinin həlli zamanı şagirdin və müəllimin fəaliyyətinin xarakteri, növləri nəzərə alınmalıdır.

8.2. Dərsin metodik altstrukturunun xarakteri yalnız onun ümumi didaktik strukturunun məzmunundan asılı deyildir və didaktik struktur təlimin və müasir dərsin təşkilinin əsas mərhələlərini əks etdirir;

8.3. Didaktik və metodik struktur arasındakı bağlayıcı həlqələr dərsin daxili məntiqi-psixoloji altstrukturlarına xidmət edir və dərsin daxili altstrukturu tədris-idrak prosesini əks etdirən elementlərdən ibarətdir;

8.4. Təlim prosesində analitik və evristik fəaliyyətin optimal münasibətlərinin tənzimlənməsi onun təşkilat formasının altstrukturların (xarici və daxili strukturların) məntiqi bağlılığından, hər bir altstrukturun elementlərinin seçilməsindən və bu elementlərin funksiyalarını reallaşdıra bilməsi səviyyəsindən asılıdır;

9.1. Şagirdin analitik fəaliyyətinə yönələn metodik struktur, onun yaradıcı axtarış fəaliyyətinə yönələn metodik strukturla əlaqəli olsa da, bunlar eyniyyət təşkil etmir;

9.2. Şagirdin təlim fəaliyyəti analitik xarakter daşıdığı təqdirdə, metodik struktur mənimsəmə prosesinin ümumi məntiqinə uyğun gəldiyi halda, o, evristik xarakter daşıdıqda burada şagirdin həm də produktiv əqli fəaliyyətinin məntiqi nəzərə alınmalıdır; 10. Qabaqcıl təcrübəyə malik müəllimlər təlim materialını bütün komponentlər üzrə, həm də bunları məntiqi, psixoloji, tərbiyəvi və didaktik aspektdən hərtərəfli təhlil edir və bunun əsasında şagirdin fəaliyyətində analitik və evristik növlərin nisbətini müəyyənləşdirir, idarəetmənin metodik strukturu da məhz bu zəmin əsasında müəyyən edilir.

**Problemin aktuallığı.** IV sənaye inqilabının çağırışlarına adekvat, səmərə verən mükəmməl təlim konsepsiyası işlənib praktiklərin sərəncamına verilməmişdir. “Təhsilalan mərkəzli təlimin təşkilat formasında analiitik və evristik fəaliyyət növlərinin tənzimlənməsi” IV sənaye inqilabının çağırışlarına müvafiq təhsilin həyata keçirilmə yolu kimi dərk edilən təhsilalan mərkəzli təlim prosesinin formalaşdırılması problemin həllinə yönələn aktual tədqiqat məsələsidir.

**Problemin elmi yeniliyi.** 1) Tam sistem olan təlim prosesinin idarə olunmasının səmərəliliyinin onun məzmunu ilə forması arasında adekvatlığın tapılmasından asılılı olduğu diqqətə çatdırılmışdır; 2) IV sənaye inqilabının çağırışlarına müvafiq formalaşması zəruri sayılan təhsilin həyata keçirimə yolu kimi dərk edilən təlim prosesi təhsilalan mərkəzli olmalıdır; 3) Təlim prosesinin təhsilalan mərkəzli olması tələbinin reallaşması üçün sözügedən prosesdə təhsilalanın digər bir sıra şərtlərlə yanaşı analitik və evristik fəaliyyətlərinin optimal münasibətləri tənzimlənməlidir; 4) Təlim prosesində analitik və evristik fəaliyyətin optimal münasibətlərinin tənzimlənməsi mühitiinin mövcudluğu onun təşkilat formasının altstrukturlarının (xarici və daxili strukturların) məntiqi bağlılığından, hər bir altstrukturun elementlərinin seçilməsindən və bu elementlərin funksiyalarını reallaşdıra bilməsi səviyyəsindən asılıdır;

**Problemin praktik əhəmiyyəti.** İnanırıq ki, tədqiqat prosesində əldə olunan elmi yeniliklərə istinad olunması praktik pedaqoqun fəaliyyətinin(təlim prosesinin təşkil və idarə olunması üzrə fəaliyyətinin) səmərəliliyinə müsbət təsir edəcəkdir.

**Ədəbiyyat**


1. Əhmədov, B.A. Pedaqogikadan mühazirə konspektləri / B.A. Əhmədov -Bakı: Maarif, -1983. -352 s.
2. Mirzəcanzadə, A.X. İxtisasa giriş: Heft və qaz profilli ali məktəblər üçün dərs vəsaiti /A.X. Mirzəcanzadə. -Bakı: BDU-nun nəşriyyatı, -1990. -368 s.
3. Брунер Дж. Процесс обучения. -М.: Изд-во АПН РСФСР, -1962. -294с
4. İbrahimov, F.N. Təlimdə alqoritmik və evristik fəaliyyətin optimal nisbətlərinin əsaslarına dair oçerklər(monoqrafiya). -Bakı: Mütərcim, -1998. - 398 s.
5. Əkbərov M.S. Elmi idrakın romantikası.-Ulduz. -Bakı, -1972. -№ 2.
6. Махмутов М.И. Теория и практика проблемного обучения. -Казань: Татарское книжное издательство, -1972. -551с.
7. Пушкин В.Н. Эвристика-наука о творческом мышлении. -М.: Полиздат, -1967. -210 с.
8. Матюшкин А.М. Актуальные вопросы проблемного обучения. В кн: В. Оконь. Основы проблемного обучения. -М.: Просвещения, -1968. -519 с .
9. Матюшкин А.М. Психологические закономерности мышления в проблемном обучении,-Советская педагогика, -1969. -№ 9
10. Богоявленский Д.Н. и Менчинская Н.А. Психология усвоения знаний в школе. -М.: Изд-во АПН РСФСР,-1960. -316 с.
11. Костюк Г.С. Вопросы психология мышления. В кн. «Психологическая наука в СССР» т.1, -М.: Изд-во АПН РСФСР, -1959. -416 с.
12. İbrahimov, F.N., Pedaqogika: Dərslik. I cild / F.N. İbrahimov, R.L. Hüseynzadə. -Bakı: Mütərcim, -2013. -708 s.
13. Скаткин М.Н. Активизасия познавательной деятельности учащихся. -Народное образование,-1966. -№ 1.
14. Mehdizadə M.M. Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları. -Bakı: Maarif, -1982. - 382 s.
15. Abbasov, A.N. Pedaqogika: Müntəxəbat: Ali təhsil müəssisələri üçün dərs vəsaiti. / A.N. Abbasov, R.R. Məmmədzadə, L.A. Məmmədli. -Bakı: Mütərcim, -2021 . -608 s.
16. Əlizadə. Ə.Ə. Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. -Bakı: Pedaqogika, -2004. -432 s.
17. Talıbov, Y.A. Pedaqogika: Bakalavirat təhsil səviyyəsi üzrə dərs vəsaiti) / Y.A. Talıbov, Ə.A. Ağayev, İ.N. İsayev, A.İ. Eminov. –Bakı: Adiloğlu , -2003. -140 s
18. Есипов Б.П. Самостоятельная работа учащихся на уроке. -М.: Учпедгиз , -1961. -412 с.
19. Kazımov, N.M., Haşımov Ə.Ş. Pedaqogika: Dərslik / N.M. Kazımov, Ə.Ş. Haşımov. -Bakı: Maarif -1996. -416 s.
20. Махмутов М.И. Современный урок. Вопросы теории. -М.: Педагогика, -1981. -192с
21. Feyziyev, C.Ə. Didaktika (Dərs vəsaiti) / C.Ə. Feyziyev , F.N. İbrahimov, S.R. Bədiyev. -Bakı: Mütərcim, -2011. -624 s.
22. Махмутов М.И. Проблемное обучение: Основные вопросы теории. -М.: Педагогика, -1975. -208 с.


**Redaksiyaya daxil olub:** 03.06.2025

*UOT 37.01.*

***Əsmət İdris qızı İsmayılxanova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*
*Ümumi pedaqogika kafedrasının dosenti, pedaqogika üzrə fəlsəfə doktoru*
*https://orcid.org/0000-0002-1151-4440*
*https://doi.org/10.69682/arti.2025.92(3).54-58*
*E-mail: a.ismayilxanova@gmail.com*

# TƏLİM PROSESİNDƏ MÜSAHİBƏ, DİSKUSİYA VƏ DEBATLAR VASİTƏSİLƏ ŞAGİRDLƏRİN YARADICI FƏALİYYƏTİNİN TƏTBİQİ İMKANLARI

***Asmat Idris Ismailkhanova***
*associate professor at the department of General pedagogy*
*of Azerbaijan State Pedagogical University*

# CREATIVE STUDENT PRACTICES THROUGH INTERVIEWS, DISCUSSIONS, AND DEBATES IN THE EDUCATIONAL PROCESS

***Асмет Идрис гызы Исмаилханова***
*доцент кафедры Общей педагогики*
*Азербайджанского Государственного Педагогического Университета,*
*доктор философии по педагогике*

# ПРИМЕНЕНИЕ ТВОРЧЕСКОЙ ДЕЯТЕЛЬНОСТИ УЧАЩИХСЯ В УЧЕБНОМ ПРОЦЕССЕ ПОСРЕДСТВОМ ИНТЕРВЬЮ, ДИСКУССИЙ И ДЕБАТОВ

**Xülasə.** Müəllif məqalədə qeyd edir ki, interaktiv təlim metodlarının tətbiqi təhsil islahatının prinsiplərinə əsaslanan məqsədləri, vəzifələri həyata keçirməyə, fənn müəllimini şagirdlərə istiqamətlənmiş dərs prosesini təşkil etməyə, demokratik psixoloji-sosial mühit yaratmağa və obyektiv qiymətləndirmə sistemini tətbiq etməyə sövq edəcək. Bu cür yanaşmanın müsbət cəhəti real motivasiyanın yaradılması prosesidir. İdrak fəaliyyətinin gedişatında və inkişafında bu yanaşma məktəblinin təfəkküründə mövcud olan ziddiyyətlərin həllinə əsaslanır.

Müəllifin fikrincə? interaktiv metodlardan- diskusiya və debatlardan, müsahibə üsullarından fənlərin tədrisində istifadə edilməlidir. Bu üsulların tətbiqi şagirdlər tərəfindən biliklərin mənimsənilməsinə, yeni-yeni elmi biliklərin "kəşf edilməsi"nə, bu biliklərin əlavələr edilməklə yenidən işlənməsinə, tətbiq edilməsinə, istənilən şəraitdə meydana çıxan problemlərin həllində şagird kollektivi ilə əməkdaşlıq etməyə, daha düzgün, real vasitələr axtarıb tapmağa və öz bacarıqlarını nümayiş etdirməyə münbit şərait yaradır.

***Açar sözlər.*** *debat, diskussiya, müsahibə, metod, əqli hücum, interaktiv təlim, kollektivçilik, taymkipper, akvarium, spiker, hakim*

**Abstract.** The author notes that the introduction of interactive teaching methods encourages the realisation of goals and tasks based on the principles of educational reforms. It promotes the organisation of a student-centreed learning process, fostering democratic, psychological and social environment, as well as the implementation of an objective assessment system. A positive aspect of this approach is the process of fostering genuine motivation. This method is based on resolving contradictions in students' thinking during the course and development of cognitive activity.

According to the author, interactive methods such as discussions, debates, and interview techniques should be utilised in teaching subjects. The application of these methods creates favourable conditions for students to assimilate knowledge, discover new scientific insights, refine and apply this knowledge with additions, collaborate with peers to solve emerging problems in any situation, seek and find more accurate and practical solutions, and demonstrate their skills.

***Keywords:*** *debate, discussion, interview, method, intellectual challenge, interactive learning, collectivism, timekeeper, aquarium technique, speaker, referee*

**Аннотация.** Автор статьи отмечает, что применение интерактивных методов обучения способствует реализации целей и задач, основанных на принципах реформ в сфере образования. Это стимулирует организацию учебного процесса, ориентированного на учащихся, создание демократической психолого-социальной среды и внедрение объективной системы оценивания. Положительным аспектом такого подхода является процесс формирования реальной мотивации. Данный метод основывается на разрешении противоречий, присутствующих в мышлении учащихся, в ходе и развитии познавательной деятельности.

По мнению автора, в преподавании предметов следует использовать интерактивные методы, такие как дискуссии, дебаты и техники интервью. Применение этих методов создаёт благоприятные условия для усвоения знаний учащимися, открытия новых научных знаний, их переработки с дополнениями и применения, сотрудничества с коллективом учащихся для решения возникающих проблем в любой ситуации, поиска и нахождения более точных и практических решений, а также демонстрации своих навыков.

***Ключевые слова:*** *дебаты, дискуссия, интервью, метод, интеллектуальный вызов, интерактивное обучение, коллективизм, тайм-кипер, аквариум, спикер, судья*

İnnovativ təlim prosesində fənn müəllimi öz işlərini Azərbaycan Respublikasının Təhsil Qanununun tələb etdiyi səviyyədə qurmalı, tədris etdiyi fənni müasir tələblərə uyğunlaşdırmalı, şagirdləri ilə fəaliyyətdə olmalı, elmi yenilikləri yaxından izləyərək onlardan bəhrələnməli, dərsini günün tələbləri səviyyəsində təşkil etməlidir.

Müasir dövrdə təhsilimizdə böyük uğurlar qazanılmaqdadır. Ona görə də hər bir fənn müəllimi yeni texnologiyalardan səmərəli istifadə edərək onları təlimə tətbiq etməyi bacarmalıdır. İnteraktiv (fəal) təlim mexaniki yaddaşa deyil, şagirdlərin fəal dərketmə mövqeyinə və təfəkkürün inkişafına əsaslanır. İnteraktiv (fəal) təlimdə elmi biliklərin müstəqil əldə edilməsi, tədqiqat aparılması, öyrənmə fəallığının artırılmasına təkan verəcək problemli situasiyaların yaradılması üçün münbit şəraitin qurulması, nəzəri biliklərin yaradıcı şəkildə tətbiq edilməsi və digər şagird yoldaşları ilə əməkdaşlıq etməyi bacarmaq, sərbəstlik və müstəqillik kimi amillər ön planda olur.

İnteraktiv təlim metodlarının tətbiqi Təhsil islahatının prinsiplərinə əsaslanan məqsədləri, vəzifələri həyata keçirməyə, fənn müəllimini şagirdlərə istiqamətlənmiş dərs prosesini təşkil etməyə, demokratik psixoloji-sosial mühit yaratmağa və obyektiv qiymətləndirmə sistemini tətbiq etməyə sövq edəcək. Bu cür yanaşmanın müsbət cəhəti real motivasiyanın yaradılması prosesidir. İdrak fəaliyyətinin gedişatında və inkişafında bu yanaşma məktəblinin təfəkküründə mövcud olan ziddiyyətlərin həllinə əsaslanır.

İnteraktiv metodlardan- diskussiya və debatlardan, müsahibə üsullarından fənnlərin tədrisində istifadə edilməlidir. Bu üsulların tətbiqi şagirdlər tərəfindən biliklərin mənimsənilməsinə, yeni-yeni elmi biliklərin "kəşf edilməsi"nə, bu biliklərin əlavələr edilməklə yenidən işlənməsinə, tətbiq edilməsinə, istənilən şəraitdə meydana çıxan problemlərin həllində şagird kollektivi ilə əməkdaşlıq etməyə, daha düzgün, real vasitələr axtarıb tapmağa və öz bacarıqlarını nümayiş etdirməyə münbit şərait yaradır.

**Diskussiya** metodiki üsul olaraq təlim prosesində tədris fəaliyyətinin digər növlərinə də tətbiq edilməkdədir. Diskussiya zamanı əsasən şagirdlər istənilən məsələnin müzakirə edilməsində şəxsi fikirlərini sərbəst şəkildə ifadə edir, onu əsaslandırır, faktların obyektiv təhlilini öyrənirlər. Prosesin gedişində sinfin bütün şagirdləri qarşıdakı qrupun üzvlərini maraqla dinləyir, onların fikirlərinə hörmətlə yanaşır, danışıqda hər kəs öz növbəsini gözləyir, müsbət vərdişlərə və diskussiya xarakterli mədəniyyətə yiyələnirlər.

Yüksək mədəniyyətin gözlənilməsi diskussiya zamanı çox müsbət əxlaqi xüsusiyyət hesab edilir. Prosesin gedişində şagirdlərin hər hansının haqlı və yaxud haqsız olduğu təqdirdə böyük dözüm nümayiş etdirmələri diskussiya mədəniyyətinin ən vacib şərtidir.

Qeyd etmək lazımdır ki, diskussiya mədəniyyəti dərin pozitiv və əxlaqi-normativ məzmuna malikdir. Digər yoldaşlarının fikirlərinə dözümlülük göstərmək, hörmətlə yanaşmaq, dinləmək mədəniyyəti aşılamaq kimi müsbət vərdişlər üçün diskussiya aparmağın yollarını və vasitələrini şagirdlərə öyrətmək mütləqdir. Yüksək səriştəyə malik fənn müəllimi bu vaxt öz şagirdlərinə diskussiya aparmağın yollarının onların özləri tərəfindən təklif edilməsinə imkan yaradırlar.

Belə olduğu təqdirdə şagirdlər çox böyük həvəslə “əqli hücum” metodundan istifadə edərək diskussiyanı təşkil etmək üçün müxtəlif təkliflər irəli sürürlər. Bəs bu təkliflər hansılar ola bilər?

– eyni vaxt ərzində yalnız bir şagird fikir söyləyə bilər;

– qalan şagirdlər yoldaşlarını dinləməlidir;

– şagirdin çıxışına digər yoldaşları tərəfindən müdaxilə edilməməlidir;

– danışanın fikri bitdikdən sonra şagirdin özünə deyil, onun fikrinə tənqidi yanaşılmalıdır;

– diskussiya zamanı verilmiş vaxta əməl edilməlidir;

– fikir söyləyən şagirdi ələ salmaq qeyri-etik hərəkət olduğundan buna yol vermək olmaz;

– yoldaşının danışdıqlarına fikir bildirmək istəyən əl qaldıraraq icazə istəməlidir və s. Diskussiyanı təşkil edən müəllim bu cür etik qaydaları uşaqlara xatırlatmaq üçün üçün onu böyük hərflərlə kağıza yazaraq şagirdlərin gözü qarşısında divardan asır və bütün şagirdlərin bu qaydalara əməl etməsini onlara xatırladır.

Bu qaydaları tədris ilinin sonuna kimi divarda saxlamaq lazımdır ki, hər bir şagird mütəmadi o qaydaları oxusun və onlara riayət etsin. Yeri gəldikcə bu qaydalara düzəlişlər və əlavələr etmək də lazım olur.

Diskussiya təşkil edilərkən aşağıdakılar nəzərə alınmalıdır:

– qoyulmuş məsələ həm aktual, həm də yaddaqalan olmalıdır;

– təriflər düzgün və mülahizələr aydın olmalıdır;

– sanballı dəlillər gətirilməlidir;

– diskussiya başa çatdıqdan sonra ümumiləşdirmələr aparılmalı və şagirdlərə yekun vurmaq bacarığı aşılanmalıdır;

– şagirdlərdə dinləmə mədəniyyəti formalaşdırmaq.

Diskussiya aparılan müddət ərzində düzgün sayılmayan hərəkətlərə yol verilməməlidir. Bu hərəkətlər hansılardır:

– mülahizələrdə təkrara yol verməmək;

– mövzudan kənara çıxmamaq;

– anlaşılması çətin müddəalar;

– dəlil çatışmazlığı;

– fikir bildirən şagird yoldaşını günahlandırmaq;

– digər şagirdləri hədələmək və. s.

Şagirdlərdə diskussiya qabiliyyətlərini, bacarıqlarını formalaşdıran ən vacib metodlardan biri “akvarium” metodudur ki, bu metodda bütün qrupların eyni fikirdə olmaları elə də əhəmiyyət daşımır. Əsas məqsəd problem üzrə müzakirə aparmaq və diskussiyanın düzgün təşkilini nümayiş etdirməkdən ibarətdir.

Diskussiya qaydaları əvvəlcədən müəyyən edilir. “Akvarium” metodu iki variantda aparılır. Variant I. Bu zaman uşaqlar iki qrupa ayrılır və birinci qrup dairəvi düzülmüş stullarda əyləşirlər. Birinci qrupa daxil olan şagirdlər müəllimin onlara verdiyi problemi müzakirə edirlər. Digər qrupun şagirdləri isə bir qədər kənarda düzülmüş stullarda oturaraq diskussiyanın gedişatını və burada iştirakçıların hansı qaydalardan istifadə etdiklərini izləyirlər.

Diskussiyaya maksimum 15-20 dəqiqə vaxt ayrılır. Vaxt başa çatan kimi digər qrupun üzvləri diskussiyanın gedişatına qiymət verirlər. Bu qrup öz yerinə keçərək yerlərini digər qrupun üzvlərinə verirlər və digər qrup kimi bu qrup da onlara verilmiş problemi həll etməyə başlayırlar. Variant II. Birinci qrupa daxil olan iştirakçılar müəllimin onlara verdiyi problem haqqında müzakirələr aparırlar. Hər bir iştirakçı dəqiq dəlillər irəli sürür. Digər qrupun iştirakçıları kənardakı stullarda oturaraq 1-ci qrupun irəli sürdüyü dəlilləri təhlil edirlər. Sonra öz dəlillərini müzakirə edərək hazırlayırlar. Diskussiya 15-20 dəqiqədən sonra sona yetir və qrupun bütün üzvləri yerlərini dəyişirlər. Bu zaman onlar diskussiya apararaq digər qrupun gətirdikləri arqumentləri təkzib edirlər və diskussiya bununla da sona çatır.

**Debatlar.** Diskussiyadan fərqli olaraq debatlar opponentini deyil, üçüncü tərəfin inandırılması prosesini nəzərdə tutur.

Üçüncü tərəfin vəzifəsi isə ondan ibarətdir ki, hər bir tərəfin fikrini dinləsin, sonda öz seçimini etsin. Onların seçimi isə bir şeyə, yəni, “bu tərəfləri inandırdı”-təsdiqinə əsaslanır ki, debatın bütün iştirakçılarının əsas məqsədi gətirdikləri sübutlar və dəlillərin köməyi ilə üçüncü tərəfi öz mövqelərinin doğru olduğuna inandırmaqdan ibarətdir.

Debata bir çox tələblər verilir ki, debatda qoyulan mövzular mütləqdir ki, təsdiq formasında olsun və aşağıdakı prinsiplər gözlənilsin:

– debatda müzakirə olunacaq mövzu müasir dövr üçün aktuallıq kəsb etməlidir;

– mövzu şagirdlərin diqqətini özünə cəlb edəcək dərəcədə maraqlı olmalıdır;

– qoyulan mövzu az da olsa “münaqişə” yaratmalıdır ki, mövzuya alternativ fikirlər irəli sürülə bilsin;

– qoyulan mövzu nə çox geniş, nə də qısa olmalıdır və mövzu elə qoyulmalıdır ki, heç bir tərəfin üstünlüyü hiss edilməsin;

Debata daxil edilən təhsil texnologiyaları bunlardır:

– debatda qoyulan mövzunun araşdırılması;

– irəli sürülmüş sübut və dəlillərlə iş;

– verilən anlayışlarla iş;

– debatda qoyulmuş mövzuya aid sualların hazırlanması, yaxud verilən “çarpaz suallar”;

– tərəflərin natiqlik məharəti və nitq mədəniyyətinin səviyyəsi;

– sonda hakimlik, yaxud qərarları kim, necə qəbul etməli.

Debat zamanı çıxış edərkən bütün iştirakçılar “spiker” adlandırılır. Debatda reqlamentə dəqiq əməl etmək üçün “taym-kipper” iştirak edir.

Spiker komandalar (“A”və ”B”mövqeyi) arasında debatlar hakim qarşısında həyata keçirilir.

a – “A” mövqeyini təsdiqedici kimi qəbul edərsək, onların spikeri debatın mövzusunu necə ifadə edilibsə eləcə də təsdiq edirlər.

b – “B” mövqeyi təkzibedici qismində qəbul edilirsə, onun spikeri mütləq şəkildə “A” mövqeyinin gətirdikləri arqumentləri təkzib etməlidir. Bu “B” mövqeyinin vəzifə borcudur və təkzib etdikdən sonra “B” mövqeyi öz dəlillərini və arqumentlərini təklif edirlər.

Proses getdiyi andan “A” mövqeyinin üzvləri öz dəlillərinin dəqiqliyini təsdiq edərkən, “B” mövqeyinin spikerləri onların söylədiyi dəlillərin zəif, hətta inandırıcı olmadığını sübut etməyə çalışacaqlar.

c – Debat zamanı hakimlərin vəzifəsi hər iki tərəfin gətirdiyi arqumentlərin hansının daha inandırıcı olduğunu müəyyən etməkdir. Hər iki mövqenin fikrini dinlədikdən sonra hakim öz seçimini edir və onu əsaslandırır.

Debat keçirildiyi zaman spikerlər izah edilən, sübut edərək nəticə çıxarılan arqumentləri qeyd edib sübut-dəlilləri, arqumentləri, bu arqumentləri təsdiqləyən statistik nəticələri, faktları və mütəxəssislərin rəylərini təqdim edirlər.

“Çarpaz suallar” – debat vaxtı “A” mövqeyinin spikerlərinin verdiyi suallar və ”B” mövqeyinin cavablarından ibarət axırıncı prosesdir. Suallara verilən cavabların nəticəsi debat iştirakçılarının mövzunu necə mənimsədiklərini göstərir. Bu vaxt spikerin birinin cavablarının digərinin mövqeyini zəiflətdirdiyi və öz mövqeyini necə qüvvətləndirdiyi də qiymətləndirilir.

**Müsahibə** – irəli sürülmüş mövzu ilə bağlı fakt və hadisələr haqqında şagird kollektivinin məlumatı olması ilə əlaqəli aparılır.

Müsahibə metoduna bir çox tələb verilir:- veriləcək suallar mövzuya uyğun olmalı;- suallara veriləcək cavablar dəqiqliklə qeyd olunmalı;

– soruşulan sualların xüsusiyyətlərinin dəqiq uçotu aparılmalıdır.

Müsahibədə iştirak edən hər şagirdin yaddaş vərəqəsi olmalıdır və belə sual qoyulur: müsahibə necə aparılmalıdır?

Müsahibə başlamadan bir neçə sual dəqiqləşdirilir. Məsələn, suallar bu məzmunda ola bilər:

– müsahibədə siz nəyi aydınlaşdırmaq istəyirsiz?

– tərtib etdiyiniz suallar sadə və aydındırmı?

– müsahibəni kiminlə aparacağınızı əvvəlcədən müəyyən et.

– verdiyiniz sualın cavablarına diqqət et, aldığınız cavabları kağızda qeyd et.

– sonda nəticələri təhlil edərək ümumiləşdir.

Tədris prosesində təlim metodlarının tətbiqi fənn müəlliminin daha səmərəli nəticələr əldə etməsinə münbit şərait yaradır və bu prosesin müvəffəqiyyətli gedişinə stimul verir.

Diskussiya, debatlar və müsahibə vasitəsilə şagirdlərin yaradıcılıq fəaliyyəti formalaşır və onlar daha yüksək nəticələr əldə edirlər. Eyni zamanda şagirdlər kollektivçiliyin mənasını anlayır, birgə fəaliyyət zamanı kollektivin necə böyük uğurlar əldə etdiyini dərk edirlər ki, şagirdlərdə kollektiv çalışmaq bacarığı formalaşır.

**Problemin aktuallığı.** Problemin aktuallığı ondan ibarətdir ki, diskussiya, debatlar və müsahibə vasitəsilə şagirdlərin yaradıcılıq fəaliyyəti formalaşır və onlar daha yüksək nəticələr əldə edirlər. Eyni zamanda şagirdlər kollektivçiliyin mənasını anlayır, birgə fəaliyyət zamanı kollektivin necə böyük uğurlar əldə etdiyini dərk edirlər ki, şagirdlərdə kollektiv çalışmaq bacarığı formalaşır.

**Problemin elmi yeniliyi.** Tədris prosesində təlim metodlarının tətbiqi fənn müəlliminin daha səmərəli nəticələr əldə etməsinə münbit şərait yaradır və bu prosesin müvəffəqiyyətli gedişinə stimul verir.

**Problemin praktik əhəmiyyəti**. İnteraktiv təlim metodlarının tətbiqi Təhsil İslahatının prinsiplərinə əsaslanan məqsədləri, vəzifələri həyata keçirməyə, fənn müəllimini şagirdlərə istiqamətlənmiş dərs prosesini təşkil etməyə, demokratik psixoloji-sosial

mühit yaratmağa və obyektiv qiymətləndirmə sistemini tətbiq etməyə sövq edəcək.

**Ədəbiyyat**


1. İsmixanov M.A. Məktəbin idarə edilməsi: Dərs vəsaiti / M.A., İsmixanov, R.Ə. Bəxtiyarova / -Bakı: 2012. - 235 s.
2. Mehrabov A.O. Təhsildə səriştəli yanaşma: mahiyyəti və əsas xüsusiyyətləri // Azərbaycan məktəbi, - Bakı, 2007, № 1, -112 s.
3. Azərbaycan Müəllimlər İnstitutunda “ Təhsildə innovasiyalar haqqında “ mövzusunda keçirilmiş elmi praktik konfrans, 25 aprel 2014-cü il


**Redaksiyaya daxil olub:** 29.04.2025.

*UOT 37.01.*

***Aydın Xalid oğlu Kərimov***
*Mingəçevir Dövlət Universitetinin müəllimi,*
*Gəncə Dövlət Universitetinin fəlsəfə doktoru proqramı üzrə doktorantı,*
*https://orcid.org/0009-0007-8861-7791*
*https://doi.org/10.69682/arti.2025.92(3).59-65*
*E-mail: aydin.karimov@mdu.edu.az*

# BACARIQLAR VƏ KOQNİTİV BACARIQLAR

***Aydin Khalid Karimov***
*lecturer at Mingachevir State University,*
*doctorial student in the program of doctor of philosophy*
*at Ganja State University*

# SKILLS AND COGNITIVE SKILLS

***Айдын Халид оглы Керимов***
*преподаватель Мингечевирского Государственного Университета,*
*докторант по программе доктора философии*
*Гянджинского Государственного Университета*

# НАВЫКИ И КОГНИТИВНЫЕ НАВЫКИ

**Xülasə.** Məqalədə insan bacarıqlarından bəhs olunur. Bacarıqlar insanın hərəki və ya əqli imkanlara yiyələnməsi üçün icra etdiyi hərəkətləri müvafiq qaydada yerinə yetirməsi kimi şərh edilir. Göstərilir ki, fəaliyyət prosesində yeni bacarıqlarla yanaşı yeni biliklər çalışma, tapşırıq, oyun, təmrin, test, layihə və s. vasitəsi ilə formalaşır. Məqalədə aparılan təsnifatlaşdırmada bacarıqlar dərketmə, təlim, əmək, təşkilati, kommunikativ və s. sahələrə ayrılır. Bacarıqların əsasında duran motor bacarıqların psixofizioloji xüsusiyyətləri izah edilir. Göstərilir ki, motor bacarıqlar olmadan digər bacarıqlar da inkişaf edə bilməz. Məqalədə, həmçinin koqnitiv bacarıqların da təsnifatlaşdırılması aparılır. Təsnifatda sensor sinqalların qəbul edilməsi, diqqət, hafizə, təfəkkür, nitq kimi idrak prosesləri üzrə formalaşan koqnitiv bacarıqların qısa izahı verilir. Burada diqqət mərkəzinə gətirilən digər məsələ koqnitiv bacarıqların tətbiqini stimullaşdıran digər psixoloji quruluşlarla bağlıdır. Qeyd edilir ki, sosial – koqnitiv bacarıqlar kimi ayırd edilən bu bacarıqlara motivləşmə, komandada işləmək, özününizamlama, təşkilatçılıq, məqsədqoyma, qərar qəbuletmə, sosial intellekt, emosional intellekt, sosial rol davranışı və s. daxildir. Nəticədə bacarıqların insan həyatında, peşəkar fəaliyyətindəki mühüm rolu qeyd edilir.
***Açar sözlər:*** *bacarıq, motor bacarıq, koqnitiv bacarıq, koqnitiv qabiliyyət, sosial-koqnitiv bacarıqlar, öyrənmə, mənimsəmə, sensor siqnallar, diqqət, hafizə, məntiqi düşünmə, dil*

**Abstract.** This article discusses human skills. Skills are interpreted as actions that a person performs to acquire motor or intellectual abilities, carrying out those actions in the appropriate manner. It is shown that, alongside new skills, new knowledge and habits also emerge during the process of activity. Skills are formed through various activities in the learning process, such as work, tasks, games, exercises, tests, projects, etc. In the classification presented in the article, skills are divided into fields such as perception, learning, labor, organization, communication, and so on. The psychophysiological characteristics of motor skills, which form the basis of other skills, are explained. It is stated that without motor skills, the development of other skills is impossible. The article also provides a classification of cognitive skills. A brief explanation is given for cognitive skills formed through the perception of sensory signals, attention, memory, thinking, speech, and other cognitive processes. Another issue highlighted is the relationship between cognitive skills and other psychological constructs that stimulate their application. It is noted that the social-cognitive skills include motivation, teamwork, self-regulation, organizational skills, goal setting, decision making, social intelligence, emotional intelligence, social role behavior, and so on. In conclusion, the important role of skills in human life and professional activity is emphasized.

***Keywords***: *skill, motor skill, cognitive skill, cognitive ability, social-cognitive skills, learning, assimilation, sensory signals, attention, memory, logical thinking, speech*

**Аннотация.** В статье повествуется о человеческих навыках. Навыки трактуются как действия, которые человек выполняет для овладения двигательными или умственными возможностями, выполняя их в соответствующем порядке. Показано, что в процессе деятельности, помимо новых умений, появляются новые знания и навыки. Навыки формируются через различные виды деятельности в процессе обучения, такие как работа, задания, игры, упражнения, тесты, проекты и др. В классификации, проведенной в статье, навыки разделены на области восприятия, обучения, труда, организации, коммуникации и т. д. Объясняются психофизиологические особенности моторных навыков, лежащих в основе других умений. Утверждается, что без моторных умений невозможно развитие других навыков. В статье также проводится классификация когнитивных навыков. В классификации дается краткое объяснение когнитивных навыков, формирующихся в процессе восприятия сенсорных сигналов, внимания, памяти, мышления, речи и других когнитивных процессов. Особое внимание уделяется другому вопросу, связанному с психологическими конструкциями, стимулирующими применение когнитивных умений. Отмечается, что к социально-когнитивным навыкам относятся мотивация, командная работа, саморегуляция, организационные навыки, постановка целей, принятие решений, социальный интеллект, эмоциональный интеллект, социальное поведение и др. В результате подчеркивается важная роль навыков в жизни человека и его профессиональной деятельности.

***Ключевые слова***: *навыки, моторные навыки, когнитивные навыки, когнитивные способности, социально-когнитивные навыки, обучение, усвоение, сенсорные сигналы, внимание, память, логическое мышление, речь*

Həyatda özümüzü anladığımız, tanıdıımız, dərk etməyə başladığımız dövrlərdən etibarən yeni-yeni şeylər öyrənməyə çalışırıq. Əvvəllər bunu dağınıq, qeyri-müəyyən hərəkətlərlə edirdiksə, artıq öyrənməyin vacibliyini anladıqdan sonra, onları məqsədyönlü şəkildə edirik. Çalışdıqlarımız isə bizdən böyüklərin hərəkət, danışıqları olur. Onlar kimi hərəkət etmək, danışmaq, təqdim etmək istəyirik. Bütün bu istəklər hələ məktəbəqədər yaşdan yaranan böyümək tələbatlı ilə bağlı olur. İlk dövrlərdə bu tələbat özünü böyüklərə oxşamağa canatma, daha sonralar isə özünüinkişaf tələbatı kimi göstərir. Nəhayət, beş-altı yaş dövründə, özümüzü şəxsiyyət kimi tanıdıqdan sonra bütün bunların öyrənmə və mənimsəmə yolu ilə baş verə biləcəyini anlayırıq. Məktəb təhsilinin ilk illərindən daha ciddi işlərə doğru yönəlirik – bilikləri mənimsəməyə və tətbiq etməyə.

Biz sizə burada hər bir insan övladının hələ körpəlikdən başlayaraq özündə formalaşdırdığı bacarıqların necə yaranmasının qısa xülasəsini xatırlatdıq. Bəli, bacarıqlar yalnız şüurlu olaraq deyil, həm də körpəlikdən instinktiv qüvvələrin təsiri ilə formalaşmağa başlayır. Beş yaşdan sonra bu proses şüurlu cəhdlərlə davam edir, yəni biz özümüzdə bu və digər bacarıqların formalaşdırmaq üçün fəallıq göstəririk. Artıq bilirik ki, hər hansı bir işi yerinə yetirmək üçün müvafiq bacarıqlara sahib olmalıyıq.

Bəs nədir bacarıqlar və onun quruluşunda nələr durur?

Hər gün edəcəyimiz hərəkətləri beynimizdə konstruksiyalaşdırırıq. Sadə və ya mürəkkəb hərəkətlərin icrası üçün planlar qururuq. Bəzi prosesləri şüursuz, bəzilərini şüurlu olaraq nizamlayırıq. Əgər bizdən adət etdiyimiz hərəkətlərin icrası tələb olunursa, məlumatların təhlilinə, hərəkətlərin planlaşdırılmasına o qədər də vaxt sərf etmirik. Bəzən bu barədə, ümumiyyətlə düşünmürük, çünki onlar artıq bizdə avtomatlaşmış bacarıqlardır: yol getməyimiz, yazı yazmağız, qidalanmağımız, söhbət etməyimiz kimi. Ancaq, əgər bizdən tanımadığımız yolu getmək, Çin mətbəxində istifadə edilən çubuqlarla qidalanmaq, yad dildə danışmaq tələb olunursa, əlbəttə ki, tərəddüd yaranacaq. Ona görə ki, bu sahələrdə yeni bacarıqlarımız olmaya bilər.

"Bacarıq" bizə təkrarlar yolu ilə formalaşan və hərəkətlərin avtomatlaşması ilə nəticələnən fəaliyyət qabiliyyəti kimi məlumdur. Onların sayı çoxdur: yazmaq, oxumaq, öyrənmək, mənimsəmək, hesablamaq, rəqs etmək, şəkil çəkmək, ünsiyyət bacarığı və s. Psixologiyada sadaladığımız bacarıqların hər birinin öz quruluşu və öz xüsusiyyətləri vardır. Əgər biz yazmaq bacarığından danışırıqsa, bu zaman daha çox psixomotor quruluşdan, öyrənmə, mənimsəmədən danışarkən idrakdan, intellektdən və ya koqnisiyadan, ünsiyyətdən bəhs ediriksə - dinləmək, danışıq aparmaq, qarşılıqlı əlaqələri tənzimləmək kimi məsələlərdən bəhs etmiş oluruq.

Kembric Universitetinin izahlı lüğətində bacarıq – "nəyisə öyrənmək üçün xüsusi qabiliyyət", "təlim və tərbiyə yolu ilə inkişaf etdirilən və fəaliyyət üçün faydalı olan xüsusi bir qabiliyyət", kimi izah edilir [20]. Mənbələrdə bacarıqların inkişaf etdirilməısi nümunələri də verilir: semantik bacarıqların tətbiqi fonoloji, morfosintaktik və linqvistik bacarıqlar tələb edir, texniki, koqnitiv, musiqi bacarıqları həyata keçirilməsində də mühakimə tələb edən dəqiq müəyyən edilmiş qabiliyyətlər lazım gəlir [21; 22].

Əgər biz fəaliyyət sahəmizdə üzləşdiyimiz təcrübələrə diqqət yetirsək, aydın olur ki, kompüter mühəndisliyinin dərin riyazi bacarıqları müxtəlif proqramların hazırlanması və Aİ sistemi üzrə (kompüterllərdə süni intellektin məhsuldar, yaradıcı, oyun, əyləncə, təhlükəsizlik və s. proqramlarla yüklənməsini təmin edən texnoloji sahə) texnologiyaların tətbiqini, psixolinqvisitk bacarıqlar yazıçılıq, şeriyyət, musiqi bacarıqları bəstəkarlıq, ifaçılıq yaradıcı şəxsiyyəti peşəkarlıq səviyyəsinə qaldırır, onun uğurlarını təmin edir, müəllimin şagirdlərlə, tələbələrlə şəxsiyyətlərarası münasibətlər qurmaq bacarıqları tədrisin keyfiyyətinə əhəmiyyətli təsir göstərir.

L.Ş. Əmrahlı bacarıqların psixoloji mahiyyətini belə izah edir: *"Bacarıq dedikdə - insanın (subyektin – şagirdin, müəllimin) hərəki və ya əqli imkanlara yiyələnməsi üçün icra etdiyi hərəkətləri müvafiq qaydada yerinə yetirməsi başa düşülür. Bu zaman yeni bacarıqlarla yanaşı yeni biliklər və vərdişlər də yaranır. Bacarıqlar təlim prosesində yerinə yetirilən mümarisələr: çalışma, tapşırıq, oyun, təmrin, test, layihə və s. vasitəsi ilə formalaşır"* [3, s. 8].

Bacarığın tətbiq edilməsi vasitələri müxtəlif ola bilər, lakin onun nəticələri gözlənildiyi kimi olmalıdır. Bacarığın başlıca əlaməti - insanın konkret situasiyada özünün bilik və vərdişlərini tətbiq edə bilməsidir. Buna "icraetmə bacarığı" və ya "tətbiqetmə bacarığı" da deyilir. Bacarıqlı insan müvafiq bacarıqlar sistemindəki hərəkətləri dəqiq mənimsəmiş, onu müxtəlif vaxtda, müxtəlif situasiyada tətbiq etməyi bacaran insandır. Bacarıqların əsas qruplaşmasına bunlar daxildir *[3, s. 9,* şəkil 1*]*: dərketmə (koqnitiv) bacarıqları; ümumi təlim və ya əmək bacarıqları; konstruktiv bacarıqlar; təşkilati bacarıqlar; texnoloji bacarıqlar; kommunikativ bacarıqlar.




***Şəkil 1.***

***Ümumi bacarıqlar***

Bacarıq anlayışı bilik – bacarıq- səriştə triadasının bir hissəsini təşkil edir. Bacarıqların formalaşmasının ən mühüm mərhələsi görüləcək işin beyində şüurlu şəkildə planlaşdırılmasıdır. Bu proses hərəkətlərin konstruksiyalaşdırılması kimi baş verir. Kurikulum taksonomiyala-

rında bu proses idraki bilik kimi bizə məlumdur. Bundan sonra həmin hərəkətlər psixomotor sahəyə köçürülür, affektiv proseslərlə müşayiət olunur [12].

Bacarıqların formalaşması prosesi həm psixogizioloji araşdırmalarda, həm də öyrənmə nəzəriyyələrində əsas mövzulardan biridir. A.N.Bernşteyn [8], B.Blum [13], A.S.Finn [13], J.Martins [11], Ə.Ə.Əlizadə, H.Ə.Əlizadə [1], L.Ş.Əmrahlı [3], İ.H.Sultanova [7], R.Ə.Əyyubova [4] və b. araşdırmalarından aydın olub ki, bacarıqlar əvvəlcə müstəqil, inkişaf etmiş və şüurlu olaraq baş verən, icra edilən fəaliyyət üsulu kimi formalaşır, vərdişə çevrilir. Eyni cür hərəkətlərlə dəfələrlə təkrarlanan vərdişlər hansısa sahə (yemək, geymək, qaçmaq, yazmaq, tutmaq, hoppanmaq, məntiqlə düşünmək, məsələ həll etmək və s.) bacarıqlar yaradır. Nəticədə avtomatik hərəkətlər yaranır. Belə avtomatik hərəkətlər sonra bacarığa çevrilir. Hər bir bacarıq müəyən bir vaxt müddətində, enerji sərf edərək, dəfələrlə təkrarlanan hərəkətlərlə qurularaq inkişaf edir.

D.A.Pospelov [9], A.R.İsmayılov [5], G.A.Rzayeva, A.N.İbrahimova [6] insan tərəfindən yaradılan süni intellektin məhz koqnitiv bacarıqlara əsaslandığını bildirirlər. D.A.Pospelov bunu belə izah edir ki, *"situasiyanın idarə edilməsi süni intellekt nəzəryyəsinin ideyalarına əsaslanan mürəkkəb texniki və təşkilati sistemlərin idarə edilməsi metodudur: idarəetmə obyekti və onun idarə edilməsi üsulları haqqında biliklərin məntiqi-liqvistik modellər səviyyəsində təqdim edilməsi, öyrənmə və mənimsəmə metodlarından istifadə, nəzarət prosedurlarının qurulması" və s. [9, s. 7].*

G.A.Rzayeva və A.N.İbrahimova göstərirlər ki, *"süni intellekt sistemləri" anlayışına yanaşma texniki sahədə qeyd olunan tarixi faktorlardan asılı olaraq formalaşmış və inkişaf etmişdir. B.J.Copeland hesab edir ki, süni intellekt insanlara xas olan məqsədyönlü fəaliyyətin, kompüter nəzarətindəki mexanizmin müəyyən qaydada icra etmə qanunauyğunluğudur. A.N.Averkin, D.A.Pospelov kimi müəlliflər süni intellekti ümumi olaraq insanı digər canlılardan fərqləndirən şüur elementlərini özündə əks etdirən, yaradıcı fəaliyyəti realizə edən ağıllı sistem kimi xarakterizə etmişlər" [6, s. 11].*

Bir sözlə, bacarıqlar çoxsaylı məşqlərin, xüsusi şəraitdə və vasitələrlə təşkil olunmuş təkrarlanan hərəkətlərin yerinə yetirilməsi nəticəsində formalaşır. Onları inkişaf etdirmək üçün hərəkət üsulları dəyişdirilərək daha da təkmilləşdirilə və möhkəmləndirilə bilər. Məhz bacarıqlar sayəsində hərəkətlər daha tez, dəqiq və düzgün yerinə yetirilir. Bu əsasda yeni bilik və yeni bacarıq qazanılır.

Bacarıqların əsasında vərdişlər durur. Fəlsəfədə vərdişlərin (habitus) ilk izahı Foma Akvinalı tərəfindən verilmişdir. O, vərdişləri işin keyfiyyəti (qualitas) kimi səciyyələndirir. Bacarıqlara isə daha geniş mənada, insanın daxili imkanları, potensialı kimi baxılır. İnsanın sağlamlığı (sanitas), elmi və fəziləti (virtus) bacarıqlarla müəyyən edilir. Vərdişlərdən fərqli olaraq bacarıqların aktuallaşması üçün, bir qayda olaraq, müəyyən, şərtlər, meyllər tələb olunur [21, s. 3].

Bacarıqlar – motor (hərəkət) bacarıqları üzərində inkişaf edir. Motor bacarıqlar əvvəllər dəfələrlə həyata keçirilən, özünü və mühiti öyrənməyə, dəyişməyə, inkişaf etdirməyə yönəldilən hərəkətlər toplusudur. Belə təkrarlanan hərəkətlərin köməyi ilə avtomatlaşma baş verir. Psixologiyada bacarıqların məşhur tədqiqatçısı N.A.Bernşteyindir. O, motor bacarıqların formalaşmasının fərdiyyətdən asılı olan məsələlərini öyrənərək ətraflı şəkildə onların izahını vermişdir. *"Hərəkətləri idarə etmək mürəkkəb fiizoloji və psixoloji proses olub, baş beyin qabığının müxtəlif sahələrində baş verir. N.A.Bernşteyn onların şaquli prinsipinin minimum beş səviyyəyə ayırır. Hər bir səviyyə özünü funksiyasına, lokallaşmasına və afferentasiyasına malikdir [19, s. 253-254].*

N.A.Bernşteyn, həm də motor bacarıqların bir neçə səviyyədə formalaşdığını müəyyən etmişdir. Onlar tədqiqatçı tərəfindən E, D və C səviyyələr kimi izah edilir.

E səviyyəsi – hərəklərin məqsədəyönəlişliyi fəaliyyətin istiqamətini təmin edir, hərəkətləri mənalandırır.

D səviyyə – hərəkət, korreksiya və avtomatizm baş verir. Burada insanın zəncirvari hərəkəti onun semantikasını təmin edir.

C səviyyədə – insanın məkan səviyyəsidir. Burada səylər tənzimlənir. Mühitə və bütün xarici amillər davamlı uyğunlaşma baş verir. C səviyyə həm də müxtəlif funksiyaları olan iki altsəviyyəyə malik olmasına baxmayaraq, ümumi xarakterisitkaya malik olan birləşmiş səviyyədir. C1 altsəviyyə hərəkətin məkandakı yerini və xarici mühit təsirlərinə qarşı davamlı tənzimlən-

məsini təmin edir. C2 altsəviyyə hədəflərin və hərəkətlərin dəqiqliyini müəyyənləşdirir.

Dərketmə (koqnitiv) bacarıqlar sensor siqnalların qəbul edilməsi, həmin siqnallar əsasında əvvəllər qavranılan, tanınan obyektlərin xassə və keyfiyyətlərinin avtomatik olaraq xatırlanması, onlar üzərində əməliyyatların aparılması prosesidir. Koqnitiv bacarıqlar düşünmək, diqqət yetirmək, alınan məlumatı emal etmək, əqli hərəkətləri planlaşdıraraq icra etmək və nəticəyə gəlmək prosesidir. *"Koqnitiv bacarıqlar İKT-dən istifadə etməklə səmərəli fəaliyyət göstərmək, müasir məlumat vasitələrinə, telekommunikasiya texnologiyalarından peşə fəaliyyətində məqsədəuyğun istifadə, zəruri məlumatların axtarışı, təhlili və seçimi, yeni informasiyanı yaradıcı şəkildə təhlil etmək, öz işində məlumatların qorunmasını təmin etmək, informasiyaların işlənməsi, ümumiləşdirilməsi, saxlanılması, ötürülməsi və yüksək səviyyədə nəticə əldə etmək bacarığıdır" [16].*

Koqnitiv bacarıqlar, eləcə koqnitiv funksiyalarla bağlıdır. Koqnitiv funksiyalar, bir tərəfdən, ətraf aləmdən gələn informasiyaların düzgün emalına cavabdehlik daşıyır, digər tərəfdən, bütövlükdə koqnitiv prosesləri nizamlayır. Nəticədə həmin funksiyalar anlayışlarla, riyazi əməliyyatlarla, mətnlərlə işləməyi, yeni biliklər əldə etməyi, həmin biliklər əsasında yeni bacarıqların formalaşmasını təmin edir.

Müəllifin fikrincə, koqnitiv bacarıqlar beynin ətrafımızdakı dünya haqqında məlumatları necə emal etməsi ilə əlaqəli zehni qabiliyyətlərdir. Başqa sözlə desək, insanın öz hissləri ilə dərk etdiyi, həm də mülahizə və düşüncələri ilə qəbul etdiyi şeydir.

Koqnitiv bacarıq inkişaf etdikcə şaxələnərək daha kiçik bacarıqlara bölünür. Bu prosesi aşağıdakı kimi təsvir edə bilərik (şəkil 2).




**Şəkil 2.**

***Koqnitiv bacarıqların diferensiallaşması***

Koqnitiv bacarıqların formalaşması əhəmiyyətli dərəcədə koqnitiv qabiliyyətlərdən asılıdır. Koqnitiv qabiliyyətlər dünyanı dərk etmək üçün özünün fərdi və koqnitiv üslubu əsasında ətraf aləmin reallıqları haqqında məlumatların təhlilini aparmaq, bu məlumatların nəticələrindən özünüinkişaf üçün istifadə etmək kimi məsələlərlə bağlıdır. Koqnitiv qabiliyyətlərin əsasında insanın fərdi quruluşuna xas olan qavrama, yaddasaxlama və yadasalma, məntiqi təhlil aparmaq, həmin fəaliyyətə yaradıcı yanaşmaq kimi özünəməxsus qabiliyyətlər durur. Beyin zədələnmələrində qabiliyyətlərin işi pozula, zəifləyə bilir. Bu zaman koqnitiv qabiliyyətlərin iş əmsalı aşağı düşür, bütövlükdə əqli əməliyyatlarda ləngimə, pozuntu və yayınmalar baş verir.

Koqnitiv bacarıqların təsnifatı onu quruluşu baxımından da aparılır (şəkil 3).




*Şəkil 3.*

***Koqnitiv bacarıqların təsnifatı***

Diqqətin xüsusiyyətlərinə görə insanın malik olduğu bacarıqlar: davamlılıq, seçicilik, mərkəzləşmək, paylanmaq və s.

Yaddasaxlama və yadasalma bacarıqları: işçi hafizənin genişliyi, uzunmüddətlilik, tez xatırlama, tez yadasalma, obrazların, sürətlərin tanınması və s.

Məntiqi düşünmə bacarığı: müxtəlif obraz, hadisə və tapşırıqlar üzərində düşünərək onları cavablandırmaq, həll etmək və qərar qəbul etmək.

Topoqrafik bacarıqlar: sensor inteqrasiya proseslərini mükəmməlliyi, vizual görmə və eşitmə, məkan münasibətlərinin, bədən koordinasiyasının, zaman hissinin, hərəkətlərin dərki və s.

Psixolinqvistik bacarıqlar: dil məlumatlarının emalı, həmsöhbətin dediklərini anlamaq, qavramaq və cavablandırmaq, dil kodlarını başa düşmək, mətnlərdən açar sözlər seçmək, denotatları müəyyənləşdirmək, yad dili asan öyrənmək və s.

Sosial-koqnitiv bacarıqlar. Koqnitiv bacarıqların inkişafında və tətbiqində onu stimullaşdıran sosial-psixoloji quruluşlar da vardır. Onlara motivasiya, komandada işləmək, özününizamlama, təşkilatçılıq, məqsədqoyma, qərar qəbuletmə, sosial intellekt, emosional intellekt, sosial rol davranışı və s. daxildir. Eləcə də insanın ünsiyyət, münasibət, kommunikativlik sahəsindəki bacarıqları sosial-koqnitiv bacarıqları əhatə edir. O cümlədən sosial və emosional intellektin, sosial rol davranışın quruluşuna daxil edilən bır sıra bacarıqlar da sosial bacarıqlara aiddir.

Koqnitiv bacarıqlar həm də təlim-öyrənmə bacarıqlarıdır. Onların böyük bir qismi hər bir kəsin həyatında məktəb təlimində inkişaf edərək formalaşır. Ə.Ə.Əlizadə, İ.H. Sultanova *"Taksonomiya nəzəriyyəsi və təcrübəsi: müasir məktəbin işıqlı yolu"* həmin bacarıqları taksonların (məqsədlərin) əsas nəticəsi olaraq izah edirlər *[2]*. Yəni, dərsin məqsədi şagirdlərdə mövzu üzrə müvafiq koqnitiv bacarıq formalaşdırmaqdır. Ə.Ə.Əlizadə, H.Ə. Əlizadə dərsdə bacarıqların yaradılması prosesi belə aydınlaşdırırlar: "Təlim məqsədlərinin taksonomiyası tədris prosesini elmi-metodik səviyyədə planlaşdırmaq və onun nəticələrini ölçmək imkanı verir. Onun əhəmiyyətini bu ölçülərlə qiymətləndirmək lazımdır. Öyrənmə taksonomiyası iki blokdan – a) bilik (informasiya), b) bacarıq və vərdişlər sistemindən ibarətdir. Birinci blok B.Blumun taksonomiyasının əsas kateqoriyalarına söykənir. İkinci blok baca-

rıq və vərdişlərin sistemli öyrədilməsini nəzərdə tutur” *[1, s. 201-203].*

**Problemin aktuallığı.** Koqnitiv bacarıqlar həm insanın şəxsi həyatında, həm də peşə fəaliyyətində lazımdır. Bu bacarıqlar olmadan insan nə sosiallaşa, nə də şəxsiyyətə çevrilə bilməz. Nə təlim materiallarını öyrənə, nə də onları tətbiq edə bilməz.

**Problemin elmi yeniliyi** koqnitiv bacarıqlar, koqnitiv bacarıqların tətbiqini stimullaşdıran digər psixoloji quruluşlar, motor bacarıqların psixofizioloji xüsusiyyətləri və onların əhəmiyyəti ilə bağlıdır.

**Problemin praktik əhəmiyyəti.** Məqalədə qeyd edilən koqnitiv bacarıqlar hələ kiçik yaşlardan başlayaraq uşaqlarda formalaşdırılmağa başlanmalı, bu proses hər bir fərd tərəfindən həyatın sonuna qədər davam etməlidir.

**Ədəbiyyat**


1. Əlizadə, Ə.Ə., Əlizadə H.Ə. Pedaqoji psixologiya / Ə.Ə. Əlizadə, H.Ə. Əlizadə. - Bakı: ADPU-nun mətbəəsi, - 2010. - 600 s.
2. Əlizadə, Ə.Ə., Sultanova İ.H. Taksonomiya nəzəriyyəsi və təcrübəsi: müasir məktəbin işıqlı yolu / Ə.Ə.Əlizadə, İ.H. Sultanova. - Bakı: 2008. -172 s.
3. Əmrahlı, L.Ş. Koqnitiv bacarıqlar/ L.Ş.Əmrahlı. - Bakı: MBM, - 2014.- 198 s.
4. Əyyubova R.Ə. Problemli situasiyalarda tələbələrin koqnitiv fəaliyyətinin psixoloji xüsusiyyətləri / psixologiya üzrə fəlsəfə dokroru diss.../ -Bakı: 2024. -143 s.
5. İsmayılov A.R. Təhsildə süni intellekt və onun inkişafı// “Süni intellekt və onun tətbiq sahələri” mövzusunda Respublika elmi konfransın materialları, 07-08 dekabr 2023, Sumqayıt DU, -s. 233-235.
6. Rzayeva G.A. Süni intellekt, insan hüquqları və fərdi məlumatların təhlükəsizliyi: Dərslik / G.A.Rzayeva, A.N.İbrahimova. - Bakı: Bakı Dövlət Universiteti, 2021. – 200 s.
7. Sultanova İ.H. Təhsilin psixopedaqoji məsələləri: taksonomiyalar // Standart və kurikulumlar: nəzəri və praktik məsələlər, TPİ, - 2016, s. 66-94.
8. Бернштейн Н.А. Физиология дивижений и активность/ Н.А.Бернштейн. – М.: Наука, - 1990. – 495 с.
9. Поспелов Д.А. Ситуационное управление: Теория и практика Изд. 2. / Д.А. Поспелов. – М.: Наука, – 1986. – 288 с.
10. Что такое когнитивные навыки и почему они так важны для человека/ https://www.ferra.ru/news/techlife/chto-takoe-kognitivnye-navyki-i-
11. Мартинс Ж. Разница между профессиональными и коммуникативными навыками. https:// asana.com/ru/resources/hard-skills-vs-soft-skills
12. Триллинг В., Фадел Ч. Навыки человека XXI века. https:// rcpp.by/ article /navyki- cheloveka-xxi-veka/
13. Bloom B.S. Taxonomy of educational objectives / B.S.Bloom, M.D.Engel hart, E.J.Furst, Hill W.H., D.H.Krathwohl. – London: David McKay Company, 1956.-207 pp.
14. Finn A.S. Cognitive Skills, Student Achievement Tests, and Schools// A.S. Finn, M.Kraft, M.West / Psychological Science, January, 25(3), 2014/. – p. 736-744.
15. Thomas K. Learning taxonomies in the cognitive, affective, and psychomotor domains/ K. Thomas. - Rocky Mountain Alchemy, 2004. – 17 pp.
16. Kurikulum-Koqnitiv bacarıqlar nə deməkdir? https://aztehsil.com/ kurikulum / 139- kurikulum-koqnitiv-pacarqlar-n-demkdir.html
17. Süni intellekt haqqında dünyada ilk qanun https://www.azerbaijan-news.az/ posts/detail/suni-intellekt-haqqinda-dunyada-ilk-qanun-tesdiqlendi
18. Бернштейн о построении движений. Развитие двигательных навыков// https://a-mov.ru/books/bernstein-o-postroenii-dvizhenij/009.html
19. Широканова Л. И. Двигательные навыки по концепции Н. Ф. Бернштейна/ chrome-extension://efaidnbmnnnibpcajpcglclefindmkaj/https://elib.institutemv
20. Cambridge English Corpus /Skill/https://dictionary.cambridge.org/ dictionary
21. Cognitive Skills/ chromeextension://efaidnbmnnnibpcajpcglclefin dmkaj/ https: / /egyankosh.ac.in/ 1710413122
22. What is Cognitive Ability? https://ca.indeed.com/career-advice/career-develop- ment /cognitive-ability


**Redaksiyaya daxil olub:**12.05.2025.

UOT 681.142.37

***Cavahir İsaxan qızı Maçanova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin Şamaxı filialının müəllimi*
*https://orcid.org/0000-0002-8437-3693*
*https://doi.org/10.69682/arti.2025.92(3).66-69*
*E-mail: cava_machanova@yahoo.com*

# LAYİHƏ ƏSASLI ÖYRƏNMƏDƏ MÜƏLLİMİN ROLU

***Javahir Isakhan Machanova***
*lecturer of the Shamakhi branch of the Azerbaijan State Pedagogical University*

# THE ROLE OF THE TEACHER IN PROJECT-BASED LEARNING

***Джавахир Исахан гызы Мачанова***
*преподаватель Шемахинского филиала*
*Азербайджанского Государственного Педагогического Университета*

# РОЛЬ УЧИТЕЛЯ В ПРОЕКТНОМ ОБУЧЕНИИ

**Xülasə.** Layihə əsaslı təlimdə müəllim öyrənmənin ötürücüsü kimi çıxış edir, layihə əsaslı təlim prosesində müəllim şagirdləri istiqamətləndirir və onlara lazımi bacarıq və biliklərin formalaşmasına kömək edir. Fasilitatorlar həmişə şagirdlərə daha yaxşı öyrənmə təcrübəsi əldə etməyə kömək edirlər. Ən yaxşı nəticələrə nail olmaq üçün layihə əsaslı öyrənmə üçün təlimatlar lazımdır. Müəllim şagirdlərə layihələri üzərində işləyərkən onlara rəy, dəstək və istiqamət verən məşqçi kimi xidmət edir. Layihə əsaslı öyrənməyə başlamazdan əvvəl müəllimlər ideyalar üzrə beyin fırtınası aparmağa və işin hara gedə biləcəyi ilə bağlı imkanları müzakirə etməyə, tələbələrin maraqlandığı mövzu haqqında düşünməyə, şagirdlərə suallarını ifadə etməyə kömək etməli və onları mövcud resurslara yönəltməyə hazır olmalıdırlar.
***Açar sözlər:*** *layihə metodu, müəllim, rol, bacarıq, bilik*

**Abstract**. In project-based learning, the teacher acts as a facilitator of learning, guiding students through the project-based learning process and helping them develop the necessary skills and knowledge. Facilitators always help students achieve a better learning experience. Guidelines are needed for project-based learning to achieve the best results. The teacher serves as a coach, providing feedback, support, and direction to students as they work on their projects. Before beginning project-based learning, teachers should be prepared to brainstorm ideas and discuss possibilities for where the work could go, think about the topic that students are interested in, help students articulate their questions, and direct them to available resources.
***Key words***: *project method, teacher, role, skills, knowledge*

**Аннотация.** При проектном обучении преподаватель выступает в роли посредника в обучении, направляя учащихся через процесс проектного обучения и помогая им развить необходимые навыки и знания. Фасилитаторы всегда помогают учащимся добиться лучшего опыта обучения. Руководящие принципы необходимы для обучения на основе проектов для достижения наилучших результатов. Учитель выступает в роли тренера, обеспечивая обратную связь, поддержку и направление ученикам во время работы над своими проектами. Прежде чем приступить к проектному обучению, учителя должны быть готовы провести мозговой штурм идей и обсудить возможности дальнейшего развития работы, подумать о теме, которая интересует учащихся, помочь учащимся сформулировать свои вопросы и направить их к доступным ресурсам.
***Ключевые слова:*** *метод проекта, учитель, роль, умения, знания*

Müasir dövrdə şagirdlər arasında texniki bacarıqların tətbiqi üçün texnologiya vacib olsa da, mükəmməl nəticələr əldə etmək üçün müəllimlərin lazımi bilikləri və izahı olduqca zəruridir.

Buna görə də, layihə əsaslı öyrənmə haqqında danışarkən, mürəkkəb konsepsiyanı ən sadə şəkildə şagirdlərə ötürə bilən praktik müəllimlər təsvir olunur. Bu işi yalnız robototexnika və ya süni intellekt vasitəsilə etmək olmaz. Bu texnologiyalar insan beynini, izahını və biliyini əvəz edə bilməz. Baxmayaraq ki, müasir dövrdə biliyin ötürülməsində köməkçi kimi faydalı ola bilər.

Layihə əsaslı öyrənmədə müəllimə öyrənmənin asanlaşdırıcısı kimi çıxış edir, layihə əsaslı təlim prosesində şagirdləri istiqamətləndirir və onlara lazımı bacarıq və bilikləri inkişaf etdirməyə kömək edir. Fasilitatorlar həmişə şagirdlərə daha yaxşı öyrənmə təcrübəsi əldə etməyə kömək edirlər. Layihə əsaslı öyrənmə üçün ən yaxşı nəticə üçün qaydalar lazımdır.

Müəllim şagirdlərə layihələri üzərində işləyərkən onlara rəy, dəstək və istiqamət verən məşqçi kimi xidmət edir

Buna görə də, müəllimlər şagirdlərə bilik və bacarıqlarına uyğun tapşırıq verməli, onların istedadını üzə çıxartmağa çalışımalıdır. Fərdi bacarıqların tələb olunduğu yerlərdə məşqçilər onları lazımı şəkildə istiqamətləndirməlidir. Layihə əsaslı öyrənmədə çox vaxt komanda işinə üstünlük verilir.

Layihə əsaslı təlimdə müəllimlərin rolu unikal və genişdir. Bu öyrənmə üsulu müəllimə müvafiq tədbirlər təşkil etməyə, onu maraqlandıran dərslərdə iştirak etməyə mane olmur.

Layihə əsaslı təlimə başlamazdan əvvəl müəllimlər ideyaları beyin fırtınası ilə aparmağa və işin hara gedəcəyi ilə bağlı imkanları müzakirə etməyə, şagirdlərin maraqlandığı mövzu haqqında düşünməyə, şagirdlərə suallarını aydın ifadə etməyə kömək etməli və onları mövcud resurslara yönəltməyə hazır olmalıdırlar.

Layihə əsaslı öyrənmə uşaqların təbii suallarını və istəklərini qiymətləndirən onların hazırlayacaqları layihə ilə maraqlanan müəllim tələb edir. Layihə əsaslı öyrənmə prosesində müəllim həm də öyrənəndir. Müəllimlər şagirdlərlə birgə öyrənirlər və öyrəndiklərini siniflə müzakirə edirlər. Bu həm də müəllimin öyrənməyə dəyər verdiyinin göstəricisidir.

Layihə əsaslı siniflərdə müəllimlər informasiya paylayıcısı və bütün suallara cavab verən rollarını tərk etmişlər. Müəllimə , sinifdə şagirdlər üçün bələdçi, model və fasilitatordur. Bununla belə, onlar sinfin ən nüfuzlu adamıdırlar. Layihə əsaslı sinif otaqlarında müəllimlər yüksək səslə düşünmək və sualları şagirdlərə əks etdirərək layihə işini asanlaşdırırlar. Layihə təlimatçıları bütün şagirdlər və qismən istedadlı şagirdlərlə işləyərkən sinifdə sual strategiyalarından istifadə edirlər.

Müəllimlər layihənin hansı mərhələdə və harada olduqlarını görmək üçün layihə boyu şagirdlərlə tez-tez müzakirə edir və onlara irəliləyişləri və hələ də görməli olduqları işlər barədə təlimat verirlər. Bundan əlavə, müəllim şagirdlərinə başqaları ilə səmərəli ünsiyyət qurmaq, mübahisələri həll etmək, dostlarına kömək etmək imkanı verməklə layihə zamanı özlərini təkmilləşdirmək imkanı yaradır və bununla da onlara lazımi bacarıqlara yiyələnməyə şərait yaradır.

Layihə əsaslı öyrənmə prosesində müəllimlər köməkçi, vasitəçi və s rolları icra edir. Belə rollarla yanaşı, onların səsyazma rolları da var. Müəllimlər iş toplayır və uşaqların işlərindən nümunələri araşdırır və layihələr haqqında onlarla müsahibə aparırlar. Bunun sonunda müəllimlər hər bir uşaqdakı inkişafı qiymətləndirirlər (Williams, 1998: 15).

Layihə əsaslı təlim mühitində, xüsusən də texnologiya tərəfindən dəstəklənən LƏÖ mühitində olan müəllimlərdən aşağıdakı peşəkar xüsusiyyətlərə malik olmaq və ya öyrənmək tələb olunur. Bunlar:

1. Şagirdlərin LƏÖ mühitində necə davranacağını öyrənmək,

2. Təhsilin məqsədlərinə və mövcud resurslara uyğun gələn daha yaxşı layihələri tapmağı və inkişaf etdirməyi öyrənmək,

3. İstər layihələr üzərində işləyərkən, istərsə də layihə tamamlandıqda tələbələrə effektiv rəy bildirməyi öyrənmək,

Fleming müəllimlərin layihə işlərini uğurla yerinə yetirmələri və bu prosesdə tələbələrə lazımi dəstəyi göstərmələri üçün müxtəlif təkliflər irəli sürmüşdür. Bu təkliflər;

• Şagirdlərə layihə tələblərinə kömək etmək üçün birbaşa təlimat daxil olmaqla bir sıra öyrənmə, öyrətmə fəaliyyətləri hazırlayın.

• Layihə üçün vacib resursları skan edin. İctimai və ya məktəb kitabxanalarında bu resursların mövcud olduğundan əmin olun.

• Şagirdlərə problem və ya sualları müəyyənləşdirməyə və zamanla hədəflərə çatmaq üçün planlar hazırlamağa kömək edin.

Növbəti mərhələdə isə, didaktika elementləri ilə şəxsi metodikanı özündə birləşdirən bədii informasiyanın qəbulunda xüsusi psixoloji-pedaqoji hazırlıq nəzərdə tutulur. Çevik taktiki şərh, şagirdlərə və yeniyetmələrə fərdi-psixoloji yanaşma zamanı qəbul edilən informasiyanın məqsədəuyğunluğu, estetik obyektlə ünsiyyətdən faydalanma və düşünmə atmosferi yaradılması da unudulmamalıdır.

Daha sonrakı mərhələ isə hiss, emosiya, təəssüratı aşkar etmək və onları möhkəmləndirməkdən ibarətdir. Belə ki, bu zaman bədii informasiyanın qavranılması və dərk edilməsi davam etdirilir, biliklər genişləndirilir, şagirdlərin və yeniyetmələrin əxlaqi-estetik mülahizələri və təsəvvürləri qiymətləndirilir. Şagirdlərdə telemaraqlar çox zəif və pərakəndə haldadır. Belə ki, müasir gənclərin əksər hissəsi estrada-əyləncə və intellektual proqramlarına, müxtəlif kinofilmlərə, cüzi hissəsi isə incəsənət verilişlərinə (ədəbiyyat, teatr, rəssamlıq, heykəltəraşlıq, balet və s. ) və təhsil proqramlarına maraq göstərirlər. Bu isə əslində gənc nəslin görüş dairəsinin inkişafına mane olur. Ona görə də elə bir şərait yaradılmalıdır ki, həm pedaqoji kollektiv, həm də valideynlər gənc nəslin incəsənət, ədəbiyyat, təhsil və digər aktual verilişlərə baxmağa istiqamətləndirilməsi üçün optimal imkana malik olsunlar. Bu işdə televiziya işçiləri də öz fəallığını artırmalıdırlar. Belə ki, televerilişlər və proqramlar hazırlanarkən müasir gəncliyin maraq və istəkləri nəzərə alınmalıdır. Bunun üçün telekanallarla məktəblər arasında fəal birliyə nail olmaq lazımdır. Məhz televiziya verilişləri vasitəsilə şagirdlərdə və yeniyetmələrdə bədii emosiya və hisslərin aşılanmasına, estetik mədəniyyətlərinin yüksəldilməsinə nail olmaq mümkündür. Onlar arasında tez-tez sorğuların keçirilməsi də məqsədəuyğundur.

Televiziya daha geniş kütləni əhatə etdiyi üçün belə sorğuların onlar tərəfindən aparılması daha məqsədəuyğun, daha səmərəli olar. Bunu da unutmaq olmaz ki, şagirdlər və yeniyetmələr televiziya verilişlərinin mənəvi-estetik istiqamətini, onların ideya bədii məğzini kifayət qədər dərk edə bilmədiklərindən, televerilişlərin məntiqi təhlilini verməkdə, bədii məfkurəni anlamaqda və verilişlərə müstəqil qiymət verməkdə çətinlik çəkirlər. Məhz buna görə də istənilən nəticəni əldə etmək üçün şagirdləri və yeniyetmələri televerilişlərin qəbulu səriştəliliyi, onların estetik tərbiyəsinin forma və üsulları, gənclər və məktəblilər üçün hazırlanan televerilişlərin bədii-pedaqoji imkanları nəzərə alınmalıdır. Bu məsələləri həyata keçirərkən televiziya işçiləri və müəllimlər şagirdlər üçün birgə mühazirələr və görüşlər təşkil etməli, onlara televiziyanın spesifikliyi, proqramların strukturu, televerilişlərin seçimi, baxışı və s. haqqında məlumat verilməlidir. Bununla yanaşı, müntəzəm olaraq mini proqramlar da (incəsənət, ədəbiyyat, təhsil və s.) hazırlamaq məqsədəuyğun olar. Belə teleproqramların hazırlanmasında həm şagirdlər, həm də müəllimlər iştirak etməlidirlər.

Son zamanlar televiziyaların bu məsələlərə xüsusi yer ayırması, verilişlər təşkil etməsi çox fərəhlidir. İstər milli televiziyada, istərsə də bəzi özəl telekanallarda hazırlanan intellektual, maarifləndirici verilişlər, eləcə də aparılan tok-şoular da məhz bu problemlərin həllinə yönəldilmişdir. Bütün bunlarla yanaşı, eksperiment kimi, şagirdlərə və yeniyetmələrə müxtəlif tematik mövzular vermək, onların hazırladıqları ssenari, oçerk, teleesse və s. televiziyada nümayiş olunmalıdır. Bu, ilk növbədə həm gənc nəslin estetik mədəniyyətinin yüksəldilməsində öz təsirini göstərər, həm də dövrün tələblərinə cavab verən verilişlər hazırlanarkən gənc nəsli düşündürən problemlər nəzərə alınar. Bu da televerilişlərin həm rəngarəng, həm də baxımlı olmasına şərait yaradar, maraq kəsb edər. Televiziya verilişləri vasitəsilə gənc nəslin estetik mədəniyyətinin yüksəldilməsi və tərbiyəsi hazırda aparılan təhsil islahatlarına tam uyğunlaşdırılmalı və onun prinsipləri əsas kimi qəbul edilməlidir.

**Problemin aktuallığı.** Yaşadığımız müasir həyat özü araşdırılan bu sahədə tərbiyə və təhsildə zamanın tələbinə uyğun dəyişikliklərin edilməsini diktə və zəruri edir. Odur ki, məktəb, ailə, televiziya, digər kütləvi informasiya vasitələri daimi dəyişiklikdə olan məktəbli şəxsiyyətinin formalaşdırılmasına güclü təsir göstərən ən əsas komponentlərdən hesab olunur. Çünki, televiziya incəsənətin müxtəlif növləri ilə qarşılıqlı əlaqədə olan çox funksiyalı sistemdir. Onun əsasında şifahi sözün, dinamik təsvirin və musiqinin sintezi durur. Televiziya məhz bunların vasitəsilə gənc nəslin mənəvi aləminə, təfəkkürünə estetik təsir göstərir. Bu baxımdan şagirdlərin və yeniyetmələrin tərbiyəsində və estetik mədəniyyətinin yüksəldilməsində televiziyanın rolunun durmadan artması qanunauyğun hadisə kimi səciyyələndirilir.

**Problemin elmi yeniliyi.** Məktəblərdə bu problemin mövcud vəziyyəti, onun öyrənilməsi və ümumiləşdirilməsi, estetik tərbiyənin pedaqoji prob-

lem kimi tədqiq edilməsi, şagirdlərin və yeniyetmələrin estetik mədəniyyətinin yüksəldilməsində müasir televiziyanın rolu və onun təsir imkanlarının aşkar edilməsi, televiziyalar ilə məktəblərin iş birliyinin zəruriliyi elmi-nəzəri baxımdan əsaslandırılmışdır.

**Problemin praktik əhəmiyyəti.** Tədqiq edilən problemlə əlaqədar hazırkı real şəraitə uyğun olaraq müəyyənləşdirilən mövcud iş sisteminin televerilişlər vasitəsilə şagirdlərin və yeniyetmələrin estetik tərbiyəsinin inkişafına təsir göstərməsidir. Müəyyənləşdirilən bu iş sistemi, səmərəli forma və istiqamətlər, təklif olunan tövsiyələr mövcud problem dairəsində uğur qazanmağa zəmin yaradır.

## Ədəbiyyat


1. Ağayev Ə. Azərbaycan ictimai-pedaqoji fikrində şəxsiyyətin formalaşması problemi. Monoqrafiya. / Ə. Ağayev, V. Rzayev. -Bakı: Avropa,- 2005.- 288 s.
2. Əhmədov N. Yeniyetmələrin estetik tərbiyəsi. -Bakı: Elm, -1974.- 32 s.
3. Kazımov N. Tərbiyənin elmi-pedaqoji əsasları. -Bakı: Maarif, -1983.- 135 s.
4. Quliyev E.H. Televiziya iki əsrin ayrıcında. -Bakı: İşıq, -1993.- 286 s.
5. Məhərrəmov Q.M. Televiziya haqqında etüdlər. -Bakı: Azərbaycan Dövlət Nəşriyyatı, -1996.- 215 s.
6. Абека-Нюнде Селестине. Роль телевидения в формировании личности молодого человека: /Автореферат кан.фил.наук/ -Москва, 1980.- 165 с.
7. Верб М.А. Формирование эстетических ориентаций старших школьников: Учебное пособие. - Ленинград:1976.-82 с.
8. Гафар Аскерзаде, Акиф Таваккюльоглы. История Азербайджанской журналистики. -Баку: ABC polygraph,- 2015.- 455с.
9. Каюмов А.А. Радио и телевидение как средство идейно-политического воспитания учащихся-старшеклассников: /Автореф. На соиск. дис. … канд. пед. наук/ -Москва, 1974.- 21 с.
10. Leonard H.Clark,Irving S.Star. Secondary and middle school teaching methods. (Fifth Edition): -New-York: 1986.- pp 125-142


**Redaksiyaya daxil olub:** 20.05.2025

UOT 37.1

***Pərvanə İntiqam qızı Hüseynova***
*Bakı Dövlət Universitetinin*
*pedaqogika kafedrasının fəlsəfə doktoru proqramı üzrə dissertantı*
*https://orcid.org/0000-0001-6110-3917*
*https://doi.org/10.69682/arti.2025.92(3).95-99*
*E-mail: pervanehuseynova097@gmail.com*

# AİLƏ ŞƏXSİYYƏTİN İNKİŞAFINDA SOSİAL-MƏDƏNİ MÜHİT KİMİ

***Парвана Интигам гызы Гусейнова***
*диссертант по программе доктора философии кафедры Педагогики*
*Бакинского Государственного Университета*

# СЕМЬЯ КАК СОЦИОКУЛЬТУРНАЯ СРЕДА В РАЗВИТИИ ЛИЧНОСТИ

***Parvana Intigam Huseynova***
*dissertation student in the program of philosophy*
*of the department of Pedagogy at Baku State University*

# FAMILY AS A SOCIO-CULTURAL ENVIRONMENT IN THE DEVELOPMENT OF PERSONALITY

**Xülasə**. Müasir dövrdə insanın sosiallaşmasında əsaslı rola malik olan faktorlardan biri ailədir və uşaq dünyaya ilk dəfə ailədə göz açır. N. Gəncəvi ailəni uşağın düşdüyü ilk cəmiyyət adlandırır və uşaqlar yaxşı və pis xüsusiyyətləri öz ailəsindən, valideynlərindən götürürlər. Hər bir ailə, istər pedaqoji, istər psixoloji, istər sosial aspektdən, özündən sonra gələn ailələr üçün örnək rolunu oynayır və burada böyüyən uşaqlar öz valideynlərinə məxsus olan ailə modelini gələcək ailə həyatında təkrar edir.

Klassik yanaşma ailəni sosial institut kimi müəyyən edir və onun əsasını təşkil edən nikah kişi ilə qadın arasındakı sosial münasibətlərin formasıdır. Nikah, eyni zamanda, cinsi həyatı tənzimləyir, ailə daxilində ər-arvad münasibətlərini, onların hüquq və vəzifələrini, uşaqların tərbiyəsinin məqsədini müəyyən edir. Azərbaycan Respublikasının Konstitusiyası təknikahlığı qanuni yolla təsbit etmişdir.

Cəmiyyətin sosial özəyi olan ailə öz mənəvi mədəniyyəti və dəyərləri ilə cəmiyyətin sosial-ictimai mənzərəsini yaradır. O öz mədəni səviyyəsinə uyğun şəxsiyyət yetişdirir və onun üzvləri bir-biri ilə məişət birliyi, qarşılıqlı məsuliyyət və yardım, ümumi ailə büdcəsi, valideynlər arasında və valideynlərlə uşaqlar arasındakı münasibətlər sistemi vasitəsilə bağlı olurlar.
***Açar sözlər:*** *müasir ailə, ailə münasibətləri, müasir ailənin problemləri, ailə münaqişələri*

**Abstract.** In modern times, one of the factors that plays a fundamental role in human socialization is the family, and a child first sees the world in the family. N. Ganjavi calls the family the first society a child enters, and children take good and bad traits from their family and parents. Each family, whether from a pedagogical, psychological, or social aspect, plays the role of an example for the families that come after it, and children growing up here repeat the family model that belongs to their parents in their future family life.

The classical approach defines the family as a social institution and its basis is marriage, which is a form of social relations between a man and a woman. Marriage, at the same time, regulates sexual life, determines the relations between husband and wife within the family, their rights and duties, and the purpose of raising children. The Constitution of the Republic of Azerbaijan legally establishes monogamy.

The family, which is the social nucleus of society, creates the socio-public landscape of society with its spiritual culture and values. It cultivates a personality in accordance with its cultural level, and its members are connected to each other through household unity, mutual responsibility and assistance, a common family budget, and a system of relationships between parents and between parents and children.
***Key words****: modern family, family relationships, problems of the modern family, family conflicts*

**Аннотация.** Одним из факторов, играющих основополагающую роль в социализации человека в наше время, является семья, именно в семье впервые появляется на свет ребенок. Н. Гянджеви называет семью первым обществом, в которое попадает ребенок, и дети наследуют хорошие и плохие черты от своей семьи и родителей. Каждая семья, будь то с педагогической, психологической или социальной точки зрения, служит образцом для подражания для последующих семей, и дети, растущие в этой семье, повторяют семейную модель своих родителей в своей будущей семейной жизни. Классический подход определяет семью как социальный институт, а ее основой является брак – форма социальных отношений между мужчиной и женщиной. Брак также регулирует половую жизнь, определяет взаимоотношения мужа и жены в семье, их права и обязанности, а также цели воспитания детей. Конституция Азербайджанской Республики законодательно устанавливает моногамию.

Семья, являясь социальным ядром общества, создает социально-политический ландшафт общества со своей духовной культурой и ценностями. Она воспитывает личность, соответствующую ее культурному уровню, а ее члены связаны друг с другом домашним единством, взаимной ответственностью и помощью, общим семейным бюджетом и системой взаимоотношений между родителями и между родителями и детьми.

***Ключевые слова:*** *современная семья, семейные отношения, проблемы современной семьи, семейные конфликты*

**Problemin aktuallığı.** Müasir ailənin həyat səviyyəsi dövlətin sosial siyasətini özündə əks etdirir və ondan asılı olaraq dəyişir. Cəmiyyətdə gedən bütün dəyişikliklər, təhsildə, informasiyanın ötürülməsində yeni texnologiyaların tətbiqi, sosial-siyasi və həm qlobal, həm də lokal xarakterli iqtisadi böhranlar müasir ailəyə öz ciddi təsirini göstərir. Ailənin klassik formulası zamanla dəyişikliyə uğrayır və müasir ailə əvvəlki illərin ailə tiplərindən əsaslı şəkildə fərqlənir. Bu fərqlənmə özünü daha çox emosional-psixi funksiyaların dəyişməsində büruzə verir. Son illərdə ailə üzvləri arasındakı sosial-psixoloji münasibətlərdə dəyişikliklər özünü göstərir ki, bu da müasir ailənin problemlərinə müəyyən qədər şərait yaradır:

1. Müasir ailələrin çoxu təkuşaqlıdır və onlar valideyn və uşaqlardan ibarətdir, nənə-baba, digər qohumlar (əmi, bibi) ayrı yaşayırlar. Bu amil gənc ailələri yaşlı nəsillərin sosial təcrübəsindən və sosial dəstəyindən məhrum etməklə, ailə üzvləri, qohumlar arasında sosial məsafəni dərinləşdirir.

2. Kəndlərə və kiçik şəhərlərə nisbətən böyük şəhərlərdə əmək prosesində "qadın" və "kişi" əmək bölgüsü aradan çıxır. Qadınların həm ailə təsərrüfatında, həm də ictimai-faydalı əməkdə iştirakı genişlənir, sosial statusu yüksəlir.

3. Ailədə ər-arvad arasındakı münasibətlərə mövcud stereotiplər və onların bir-birindən gözləntilərinin reallaşmasında klassik ailə dəyərləri güclü təsir göstərir.

4. Valideynlər ilə övladlar arasındakı münasibətlər getdikcə mürəkkəbləşir və bu da müəyyən problemlərə yol açır. Uşaqlar ailə daxilində çox erkən sosial status qazanır və vaxtlarının çoxunu ailədən kənar mühitdə yaşıdları ilə müxtəlif kurslarda keçirirlər. Bu gün valideyn nüfuzu əvvəlki illərə nisbətən zəifləyir və onun yerinin valideynin şəxsi nüfuzunun tutması zərurəti yaranır.

Ailə dövlətin kiçik modelidir və sosial bazis rolunu oynamaqla cəmiyyətin inkişaf prosesində daim diqqət tələb edir. Ailənin mövcud olması oradakı qarşılıqlı münasibətlərin səviyyəsi və keyfiyyəti ünsiyyət ənənələrindən, ailənin tipindən, uşaqların sayından, ailəyə kimin rəhbərlik etməsindən və bu rəhbərliyin üslubundan, valideynlərin şəxsi keyfiyyətlərindən asılı olur.

**Problemin işlənmə dərəcəsi.** Hər bir insan ailədə kortəbii sosiallaşma prosesindən keçir və onun nəticələri insanın təhsil səviyyəsində, sosial statusunda, maddi şəraitində, sosial cəhətdən hansı səviyyədə olmasından (prososial, asosial, antisosial), ailə üzvlərinin qarşılıqlı münasibətlər sistemində əks olunur.

Ailənin sosiallaşma funksiyasında ailə tərbiyəsi onun üzvləri arasındakı qarşılıqlı təsir mexanizmi ilə reallaşır və burada təsir əks təsirə bərabərdir. Yəni valideynin uşağa təsiri kimi, uşağın da valideynə pedaqoji-sosial təsiri mövcuddur. Bu prosesdə tərbiyə ailənin şəxsiyyət resurslarından asılı olur ki, bunlar da ailə tərkibi (tam, natamam ailə), bacı-qardaşların, nənə-babanın olması və ya olmaması, ailə üzvlərinin sağlamlıq və təhsil vəziyyəti ilə şərtlənir.

Müasir dövrdə dünyada gedən qloballaşma ailə institutlarına da təsir edir və ailə müna-

sibətlərində qeyri-sabitlik müasir dövrün spesifik sosial problemlərindən biridir. Azərbaycan ailəsi bu problemlərdən kənarda qala bilmir və Şərq ailə sisteminə Qərb ailə dəyərlərinin müdaxiləsi bir sıra problemlərə yol açır. Ailənin demoqrafik-sosial tədqiqatları son dövrlərdə boşanmaların sayının durmadan artması haqqında həyəcan təbili çalır. İndi cəmiyyətin qoruya biləcəyi istehkamlardan biri ailə istehkamı, ailə qalası olmalıdır və onun xalqımıza məxsus milli-mənəvi dəyərlər əsasında qurulması, tənzimlənməsi cəmiyyətin, dövlətin əsas vəzifələrindən biri kimi diqqət mərkəzində saxlanılmalıdır. Gənclər arasında nikaha hazırlıq, nikahın hüquqi-normativ əsaslarına dərindən bələd olmaq, ailə məsələlərinə ciddi yanaşmaq, ailə büdcəsinin düzgün idarə edilməsi bacarıqlarının mənimsənilməsi, ailədaxili münasibətlərin elmi-pedaqoji cəhətdən düzgün qurulması – bu vəzifələr gələcəyin uğurlu ailə tandeminin əsasını təşkil edir.

Uşaqların sosial tərbiyəsində, sosiallaşmasında funksional (normal) və disfunksional (qeyri-normal) ailə tiplərinin rolunu da qeyd etmək lazımdır. Funksional-normal ailə tipi elə ailədir ki, o özünün vəzifələrini diferensial şəkildə, məsuliyyətlə həyata keçirir, onun üzvlərinin hamısının tələbatları hamını qaneedəcək səviyyədə ödənilir. Belə ailə tipində valideynlər arasında güclü həmrəylik, yaşlı və gənc nəsillər arasında isə varislik orada uşaqlar üçün rahat sosiallaşma mühiti yaradır.

Disfunksional-qeyri-normal ailələr öz funksiyalarını yerinə yetirə bilmir, burada sosiallaşma şəraitinə daimi qorxu və əsəb gərginliyi mane olur.

Ailədə sosial ünsiyyətin pozulması uşağı qeyri-ixtiyari olaraq küçə mühitinə təhrik edir və onun "küçə qruplarına" qoşulması kriminogen vəziyyətin yaranmasına şərait yaradır. Bu da uşaqların sosial inkişafında "sosial inkişaf şəraiti"nin vacibliyini aktuallaşdırır. Bu termini elmə L. Vıqotski gətirmiş və ona görə sosial inkişaf şəraiti uşağın sosial varlığının mahiyyətini, həyat tərzinin spesifikliyini əks etdirir. Buraya, eyni zamanda digər amillər də daxildir: uşağın ailədə mövqeyi, statusu, rolu, ailə üzvlərinə münasibətinin xarakteri.

Gələcək nəsillərin ahəngdar tərbiyəsi və inkişafı üçün cəmiyyətin imkanları çoxşaxəlidir. Tərbiyə sahəsində bütün məsuliyyəti və ağırlığı məktəbin üzərinə qoymaq düzgün deyil. Məktəb sosial tərbiyəni düzgün həyata keçirmək üçün ona sistemli yanaşmalıdır. Sosial tərbiyə tarixən üç mərhələdə aparılıb: birinci mərhələdə məktəb öz vəzifələrini ailə ilə əməkdaşlıq şəraitində həyata keçirib. Bu əlaqə məktəbin cəmiyyətdə sosial status qazanmadığı dövrlərə təsadüf edir.

Qlobal xarakterli müharibələrdən sonra əhalinin şəhərlərə axını, urbanizasiya proseslərinin sosial təsiri ilə məktəbin sosial tərbiyə sahəsində rolu artmağa başladı. Bu dövrdə məktəb ailə ilə bərabər, həm də əmək kollektivləri ilə də əlaqə yaratmağa başladı və ailə, məktəb, əmək kollektivi və ictimaiyyətdən ibarət əməkdaşlıq reallaşmağa başladı. Bu tərəflərin hər birinin sosial tərbiyə prosesində öz vəzifələri var idi. Bu sistemdə ailə üstün rola malik idi və ailə ilə məktəb arasında əlaqə qırıldıqda və ya zəiflədikdə məktəb özünün tərbiyə funksiyasının yerinə yetirilməsində çətinliklərlə üzləşir. Məktəblə ailə arasındakı əlaqə obyektiv və subyektiv amillərdən asılılığı ilə şərtlənir və iqtisadi problemlər üzündən məktəbə gəlməyə vaxtı olmayan və ya məktəblə əlaqəni əlavə vaxt itkisi hesab edən valideyn məktəblə əlaqəni itirir. Belə problemli vəziyyətdə sinif rəhbərinin funksiyası artır: o həm şagirdi, həm də valideyni sosial istiqamətdə tərbiyə etməli, onu məktəbə cəlb etməklə tərbiyə prosesinin subyektinə çevirməyi bacarmalıdır. Valideynlərlə aparılan işin keyfiyyətli olması üçün sinif rəhbərinin pedaqoji ustalığı, pedaqoji taktı başlıca rola malikdir.

Ailə üzvləri arasında ünsiyyət və onun səviyyəsi valideynlərin fəaliyyətinin kommunikativ istiqamətinə daxildir. Ailədaxili münasibətlər sistemində ata-ana, ata-uşaq və uşaq-uşaq münasibətləri uşaqların sosial-pedaqoji istiqamətdə inkişafına təsir edir. Valideynlə uşaq arasında ünsiyyətin olmaması ailədə sosial yetimlik yaradır və sosial inkişaf şəraitinə mənfi təsir göstərir.

Məktəb ailələrlə iş prosesində müxtəlif pedaqoji iş formalarından istifadə edə bilər. Təcrübə göstərir ki, valideynlərlə fərdi qaydada pedaqoji iş aparmaq daha səmərəlidir.

Müasir ailələrdə sosial tərbiyə problemlərinin həllində müəyyən amillər, onun tipi, ailədaxili münasibətlərin sosial-pedaqoji xarakteri nəzərə alınmalıdır. Ailə problemləri içərisində qəddarlıq, emosional, fiziki və seksual təcavüz sosial baxımdan ən ağır təzahür formalarıdır.

**Məqsəd və vəzifələr.** Ailədə baş verən qəddarlıq çox vaxt onun yaşlı üzvlərinə qarşı yönəlir və bu da onların atılmasında, baxımsız qalmasında istifadə olunur. Ailə zorakılıqları içərisində ərin arvadını döyməsi qəddarlıq kimi qiymətləndirilir və statistik məlumatlar göstərir ki, ailədəki qəddarlıq hallarında çox vaxt qadın qurban gedir. Müasir ailələrdə ər-arvad qəddarlığı aşağı təhsil səviyyəsinə malik, az gəliri olan, bir çox hallarda isə ali təhsilli ailələrdə olur. Ailə zorakılığı sosial amillərlə yaranır və ailədə gərginlik, alkoqollu içkilərə və narkotik maddələrə meyllilik aparıcı amilləri təşkil edir.

Ailə zorakılığı haqqında fikirlər müxtəlifdir və alimlərin bir qismi burada daha çox qadınların zorakılığa məruz qalmasını qeyd edirlər. Amma son dövrlərdə kişilərin də qəddarlığa, sosial təzyiqlərə məruz qalması hallarına rast gəlinir. Qəddarlığa sosial istiqamətdə cinslərarası mübarizə obyekti kimi baxmaq düzgün olmazdı və bu problemin həllində cinsindən asılı olmayaraq, bütün insanlara qarşı zorakılığın aradan qaldırılması vətəndaş cəmiyyətinin vacib vəzifəsi kimi qarşıda durmalıdır.

XXI əsrin qloballaşma şəraitində ailə dəyərləri aşılanmaya məruz qalır və ailə dəyərlərinə ən sarsıdıcı zərbə vuran boşanmalar həm sosial, həm də demoqrafik proses kimi inkişaf etmiş bütün ölkələr üçün səciyyəvidir.

80-90-cı illərdə boşanmaların artan xətt üzrə getməsi onun qlobal problem səviyyəsində qiymətləndirilməsini aktuallaşdırdı. Bir çox ölkələr bu sosial bəlanın qarşısını almaq üçün onu dövlətin demoqrafik siyasətinin tərkib hissəsi kimi qəbul etdilər və bu sahədə optimal variantlar axtarmağa başladılar. Ancaq buna baxmayaraq boşanma sürətlə artmaqda davam edir. Belə nəticəyə gəlmək olar ki, boşanmaların çoxu uşaqların yeniyetməlik dövrünə təsadüf edir və yeniyetməliyin keçid xüsusiyyətləri ilə ailədə sosial iqlim daha da kəskinləşir. Ailənin boşanma ərəfəsində yeniyetmələrdə gələcəklə bağlı qorxu, inamsızlıq hissi onların ətrafdakılarla normal ünsiyyətinə mane olur və onlar həmyaşıdları, müəllimləri ilə ünsiyyətdən qaçırlar. Gərgin psixoloji-emosional vəziyyət nəticəsində onların təlimdə akademik göstəriciləri aşağı düşür və onların davranışlarında qeyri-əxlaqi çalarlar özünü göstərməyə başlayır.

Boşanmaların növləri də ailənin sosial həyatına güclü təsir edir və mahiyyətinə görə fərqlənən yuridik və faktiki boşanmalar üçün verilən vaxt ərzində baş verən münaqişələr bu problemin kulminasiya nöqtəsini təşkil edir. Belə gərgin vəziyyətdə yeniyetmə üçün sanki hamı yad insana çevrilir və xüsusilə müəllimlərin onu başa düşməməsi, onu danlaması ilə şagird psixi depressiyaya düşür.

Yuridik boşanmaların fiziki boşanma mərhələsinə keçməsinə qədər valideynlərin eyni mənzildə yaşamaq məcburiyyəti tərəflər arasındakı münaqişəni daha da kəskinləşdirir. Hadisələrin müşahidəçisi olan uşaqlar özləri belə istəmədən bu münaqişələrin iştirakçılarına çevrilirlər. Ən ağrılı məqam isə uşağın ata ilə ana arasında seçim etməsi olur və bu proses onun mənəvi dünyasını zülmətə çevirir, sevdiyi valideynlərindən biri ilə ayrılmaq ona çox çətin gəlir. Belə bir problemli vəziyyətdə uşaq təlimdən və sinif yoldaşlarından uzaqlaşır, müəllimə qulaq asmır, akademik səviyyəsi getdikcə zəifləməyə başlayır. Fikri dağınıq olan, bütün günü valideynlərinin boşanma problemi haqqında düşünən uşağın sinif yoldaşları və müəllimləri ilə tez-tez mübahisəsi düşür. Belə hallar özünə qapanan, öz daxili dünyasını heç kimə açmaq istəməyən uşağın həm ailədən, həm də məktəbdən uzaqlaşmasına səbəb olur.

**Problemin praktik əhəmiyyəti.** Məqalədə irəli sürülən elmi-nəzəri fikirləri, texnikaları müəllimlər tərəfindən gündəlik dərs praktikasında şagirdlərin fəallığının artırılmasında, təhsil işçiləri, valideynlər, bu sahədə tədqiqat aparan elmi işçilər öz fəaliyyətində istifadə edə bilərlər.

**Problemin elmi yeniliyi.** Ailədə psixoloji mühitin sağlamlığı şiddətdən, xəyanətdən və yalandan uzaq olmaq, etibarlı və sağlam ünsiyyət qurmaq, sevgi və empatiya hissini gücləndirməklə formalaşdırmaqdır.

**Əldə edilən nəticələr.** Apardığımız təhlil göstərir ki, hadisələrin gedişi uşaqlar üçün çox ağrılı, çətin keçir və onlar üçün üzücü bir dövr başlayır. Boşanmadan sonra uşaqlar daha çox ana ilə qalırlar və onların tərbiyəsində atanın rolu getdikcə aradan çıxmağa başlayır. Bütün bu baş verənlər uşaqların sosial inkişafına çox böyük zərbə vurur və atanın ailədən getməsi uşaqların gender identikliyinin formalaşmasını təhlükə altına alır. Çünki atanın olmaması oğlanlarda maskulin keyfiyyətlərin formalaşmasına mənfi təsir göstərir, onların sosiallaşmasında ananın fəal iştirakı ilə femin xüsusiyyətlər özünü büruzə verməyə başlayır. Boşanmadan sonra atanın uşaqlar ilə ünsiyyət saxlaması çətinləşir, bəzən ana özü bilə-bilə bu ünsiyyətin qarşısını almağa çalışır ki, bu da uşaqla ana arasında münaqişələrə gətirib

çıxarır. Boşanmadan sonra da münasibətlərdəki ziddiyyətlər valideynlərə uşağın tərbiyəsində əməkdaşlıq şəraitində iştirak etməyə mane olur, təəssüf ki, ata və ana sanki şəxsi qərəzliklərini uşağın həyatından üstün tuturlar. Məhz bu şərait uşaqları kriminogen qruplara sövq edir. Aparılan sosioloji tədqiqatlar göstərir ki, ataların 30 %-i keçmiş həyat yoldaşları ilə münasibətlərində gərginlik olsa belə, onlar uşaqları ilə bu çətinliyə rəğmən, əlaqə saxlayırlar. Ancaq boşanmış ataların daha böyük faizi – 60%-i uşaqları ilə görüşmür, onların təlim-tərbiyəsində iştirak etmir və valideynlik borcunu ancaq aliment ödəməkdə görürlər. Beləliklə də ailələrdə yaranmış problemlər xarakterindən asılı olmayaraq, burada böyüyən uşaqların sosial-psixoloji və mənəvi inkişafına zərbə vurur.

**Ədəbiyyat**


1. Sosial pedaqogika / Ə.A. Ağayev, Y.T. Hüseynova, T.Ə [və b.] - Bakı: ADPU, – 2008. -s. 48
2. Əlizadə, H. Sosial pedaqogika / H. Əlizadə, R. Mahmudova. Dərslik.-Bakı: «Bakı Universiteti» nəşriyyatı,-2013. -206 s.
3. Quliyev, S.M. Ailə pedaqogikasının mühüm problemləri / S. Quliyev.-Bakı: Nurlan,- 2005.-104 s.
4. Qurbanova L. Ailənin psixoloji problemləri və həlli yolları / L. Qurbanova.-Sumqayıt: Bilik, -2012. -58 s.
5. Makarenko, A.S. Valideynlər üçün kitab. / A. Makarenko. -Bakı, 1983. -123 s .


**Redaksiyaya daxil olub:** 27.05.2025

*UOT 378:371.12*

***İsmət Məmməd qızı Məmmədova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*
*İbtidai təhsilin pedaqogikası kafedrasının dosenti*
*https://orcid.org/0009-0002-8733-5788*
*https://doi.org/10.69682/arti.2025.92(3).100-103*
*E-mail: ismetmemmedova49@mail.ru*

# İBTİDAİ SİNİF MÜƏLLİMİNİN TƏRBİYƏVİ FƏALİYYƏTƏ HAZIRLANMASININ PEDAQOJİ PROBLEMLƏRİ

***Исмет Мамед гызы Мамедова***
*доцент кафедры Педагогики начального образования*
*Азербайджанского Государственного Педагогического Университета*

# ПЕДАГОГИЧЕСКИЕ ПРОБЛЕМЫ ПОДГОТОВКИ УЧИТЕЛЯ НАЧАЛЬНЫХ КЛАССОВ К ВОСПИТАТЕЛЬНОЙ ДЕЯТЕЛЬНОСТИ

***Ismat Mammad Mammadova***
*associate professor of the department of Pedagogy of primary education at*
*Azerbaijan State Pedagogical University*

# PEDAGOGICAL PROBLEMS OF PRIMARY SCHOOL TEACHER TRAINING FOR EDUCATIONAL ACTIVITIES

**Xülasə.** İnsanın hər hansı bir işi yerinə yetirməyə hazırlanmasının səmərəliliyi əsasən onun bu vəzifəni yerinə yetirməyə hazır olma dərəcəsindən və bir şəxsiyyət kimi güclü xarakterindən asılıdır. Güclü xarakteriniz və hərəkət etmək üçün motivasiyanız varsa, hazırlıq prosesini təşkil etmək daha asan olur. Eyni zamanda, uğurlu fəaliyyət üçün ilkin şərt kimi hazırlıq uzunmüddətli və strukturlaşdırılmış peşə fəaliyyəti, o cümlədən təhsil fəaliyyətinə müsbət münasibət, peşəkar fəaliyyətin tələblərinə cavab verən şəxsi keyfiyyətlər, pedaqoji qabiliyyətlər, fəaliyyətə hazır olmaq motivləri, habelə mühüm bilik, bacarıq və bacarıqlardır.
***Açar sözlər:*** *şəxsiyyət, bilik, bacarıq, ədalət, səmimiyyət*

**Abstract.** The effectiveness of preparing a person for any work depends largely on the level of his readiness for this work and his strong character as a person. If there is a strong character and motives for readiness for activity, it becomes easier to organize the preparation process. In this case, preparation becomes a prerequisite for successful activity, as a prerequisite for long-term and certain structure of professional activity, as well as a positive attitude to educational activity, personal qualities corresponding to the requirements of professional activity, pedagogical abilities, motives for readiness for activity, as well as important knowledge, skills and habits.
***Key words****: personality, knowledge, skill, fairness, sincerity*

**Аннотация.** Эффективность подготовки человека к выполнению какой-либо задачи во многом зависит от степени его готовности к выполнению этой задачи и от его сильного характера как личности. Если у вас сильный характер и мотивация к действию, организовать процесс подготовки становится проще. При этом подготовка, как предпосылка успешной деятельности, представляет собой длительную и структурированную профессиональную деятельность, а также положительное отношение к учебной деятельности, личностные качества, соответствующие требованиям профессиональной

деятельности, педагогические способности, мотивы готовности к деятельности, а также важные знания, умения и навыки.
***Ключевые слова**: личность, знания, мастерство, справедливость, искренность*

Şagird şəxsiyyətinin formalaşdırılmasında ictimai hadisə kimi tərbiyənin və tərbiyəvi fəaliyyətin əhəmiyyəti təhlilinə əsasən deyə bilərik ki, dövlətin iqtisadi quruluşundan maddi texniki bazasından asılı olmayaraq, Azərbaycanda bütövlüklə insanların xüsusilə gənc və böyüyən nəsillərin tərbiyəsi bütün tarixi dövrlərdə yüksək səviyyədə dəyərləndirilmiş diqqət mərkəzində olmuşdur.

Müəllimin tərbiyə işinə hazır olmasını bir qayda olaraq alimlər müəllim şəxsiyyətinin inkişafı və fasiləsiz peşə hazırlığı çərçivəsində öyrənmişlər. Pedaqoji-psixoloji ədəbiyyatın və elmi-tədqiqat işlərinin təhlili bizə bir sahəni problem qismində araşdırmağa sövq etdi.

Tədqiqatçıların fikrincə, müəllim hazırlığında fasiləsizlik və varislik təhsil sisteminin, hər bir sonrakı pilləsinə məqsəd məzmun və təşkilat formalarının varisliyi vasitəsi ilə ötürülür.

Beləliklə, ibtidai sinif müəlliminin peşə hazırlığı ilə bağlı olan bu konsepsiyalardan bizim tədqiqatımız üçün aşağıdakı müddəaları vacib hesab etmək olar.

1. İbtidai sinif müəlliminin peşə fəaliyyətində şəxsiyyət mövqeyinin əsas yer tutması.
2. İbtidai sinif müəlliminin peşə fəaliyyətində nəzəriyyə ilə təcrübənin vəhdətinin reallaşdırılıması.
3. Tərbiyə işinin ibtidai sinif müəlliminin peşəkarlığına istinad edilməsi.
4. İbtidai sinif müəlliminin şəxsiyyət kimi özünüinkişafı və özünütəkmilləşdirilməsi, fərdi yaradıcılığını reallaşdırılması üçün hərtərəfli şərait yaradılması.
5. Fasiləsiz pedaqoji təhsil ideyasının həyata keçirilməsi [1, s. 91].

Bu müddəaların hər birini qanunauyğun hesab etmək olar. Lakin bu gün Azərbaycanın Avropa təhsil sisteminə inteqrasiyası, yeni ictimai-iqtisadi şərait universitet tələbələri və gələcək müəllimlərin təhsil müəssisələrində tərbiyə işinin aparılmasına hazırlığı probleminə və ibtidai sinif müəlliminin şəxsiyyətinə yeni, daha mütərəqqi mövqedən yanaşmağı tələb edir.

Müəllimin tərbiyəvi fəaliyyətə hazırlanmasının qiymətləndirilməsində fərqli münasibətin olduğunu nəzərə alaraq bu fikrə iki əsas yanaşmanı qeyd etmək olar:

1. tərbiyəvi fəaliyyətə hazırlanma;
2. şəxsiyyət kimi formalaşdırma.

Tərbiyəvi fəaliyyətə hazırlanma dedikdə, müəllimin bu fəaliyyətə başlamağa hazır olması və psixi proseslərin boş verdiyi şərait nəzərdə tutulur. Bu yanaşmada hazırlanmanın müəllimin daxilən bu prosesə hazır olma hissi ilə şərtləndiyi nəzərə çarpır. Hazır olma hissi ilə tələbatlar və motivlərin əsasında tərbiyəvi fəaliyyətdə məqsədin müəyyənləşdirilməsindən başlayır.

Fəaliyyətə hazır olma hissi tələbatlar və motivlərin əsasında məqsədin müəyyənləşdirilməsindən, yaxud insanın qarşısında duran vəzifələrin dərk etməsindən başlanır. Bundan sonra insan qarşıdakı fəaliyyət üçün plan, sxem və s. hazırlayır, ayrı-ayrı hissələrin hazırlığı ilə məşğul olur. Ümumiyyətlə, fəaliyyətə hazır olmaq, onun təşkili və qorunub saxlanılmasında şəxsiyyətin keyfiyyətləri həlledici rol oynayır.

Beləliklə, fəaliyyətə hazır olmanın funksional istiqamətini öyrənən alimlər belə hesab edirlər ki, şəxsiyyətin bu və ya digər fəaliyyətə hazırlanması onun bu fəaliyyətə hərtərəfli hazır olması ilə şərtlənir.

Müəllimin şəxsiyyət kimi hazırlanmasına üstünlük verən alimlər onun fəaliyyətinin səmərəli olmasını təmin edən şəxsi təhsilin vacibliyini ön plana çəkirlər.

Pedaqoqların fikrincə şəxsiyyət kimi hazırlanma müəllimin interaktiv keyfiyyətlərinin – bilik, bacarıq, vərdişlər konkret hərəkətlərə maraq və həvəsin göstərilməsi və bu kimi keyfiyyətlərin məcmusu kimi başa düşülür. Hazır olma öz əməyini təşkil edə bilmək, inkişaf perspektivlərini görmək və müstəqil işləmək bacarıqlarını özündə birləşdirir.

Hazır olmanı təhsilli olmaq, təlim görmək, başqa sözlə, şəxsiyyətin vacib bilikləri fəal surətdə, uğurla mənimsəməsi, bacarıq və vərdişlərə yiyələnməsi kimi izah edirlər.

Şəxsiyyət qarşısında qoyduğu məqsədə çatmaq üçün bütün vacib olan məlumatları toplayıb fəaliyyət planı hazırlayır və mövcud real şəraiti təhlil edir.

Bir çox müəllimlər qeyd edirlər ki, insanın hər hansı bir işə hazırlanmasının səmərəliliyi onun bu işə hazır olma səviyyəsindən bir şəxsiyyət kimi möhkəm xarakterli olmasından çox ası-

lıdır. Əgər möhkəm xarakter və fəaliyyətə hazır olma motivləri varsa, hazırlanma prosesini təşkil etmək asanlaşır. Bu halda hazırlanma uğurlu fəaliyyətin ilkin şərti kimi uzunmüddətli və müəyyən struktura peşə fəaliyyətinə eyni zamanda tərbiyəvi fəaliyyətə müsbət münasibətə, peşə fəaliyyətinin tələblərinə uyğun şəxsi keyfiyyətlərə, pedaqoji qabiliyyətlərə, fəaliyyətə hazır olma motivlərinə, eləcə də, vacib bilik, bacarıq və vərdişlərə malik olur.

Peşəkarlıq komponentinin peşəkarlıq meyarları tərbiyə işinin nəzəri əsaslarını, tərbiyə işinin metodikasını müxtəlif növ təhsil müəssisələrində tərbiyə prosesinin təşkilinə müasir yanaşmaları, şəxsiyyətin inkişafının psixoloji və pedaqoji əsaslarını, uşaq fiziologiya və psixologiyasını bilmək.

Peşəkarlıq meyarlarına qnostik, layihələşdirici, konstruktiv, təşkilatçılıq, kommunikativ bacarıqları özündə birləşdirən pedaqoji bacarıqlar da aiddir.

Qnostik bacarıqlara – peşə mədəniyyətini yüksəltmək: peşəkarlıq qabiliyyətinin artırılması üçün planlar hazırlamaq, şəxsi əməyin nəticələrini təhlil etmək, həmkarlarının təcrübəsini öyrənmək, yenilik axtarmaq, yaradıcılıq üsullarına yiyələnmək kimi əlamətlər aiddir [5, s. 73].

Layihələşdirici bacarıqlara tərbiyə işinin məqsəd və vəzifələrini müəyyənləşdirmək, sinfin tərbiyə sistemini modelləşdirmək, tərbiyə işinin planını hazırlamaq və həyata keçirmək, sinifdənxaric tədbirlərin proqramını tərtib etmək və həyata keçirmək kimi əlamətlər aiddir.

Konstruktiv bacarıqlara tərbiyə işinin forma və üsullarını seçmək, hər bir kollektivin möhkəmliyi üçün uşağın mövqeyini yüksəltmək, tərbiyə işi aparmaq və bu kimi digər əlamətlər aiddir.

Təşkilatçılıq bacarıqlarına qarşıya qoyulmuş məqsədə nail olmaq üçün şagirdlərin və özünün fəaliyyətini təşkil etmək keçirilmiş tərbiyəvi tədbiri təhlil etmək, məktəblinin tərbiyəlilik səviyyəsini öyrənmək hər bir şagirdin, qrupun pedaqoji-psixoloji xasiyyətnaməsini hazırlamaq, zəmanət vermək kimi bacarıqlar aiddir.

Kommunikativ bacarıqlara – özünə və ünsiyyətdə olduğu həmkarına müsbət münasibət, enpotik anlaşma ünsiyyət zamanı həmkarının hisslərini, vəziyyətini, baxışlarını başa düşmək, müəllim-şagird, müəllim-sinif kollektivi əlaqələrini yaratmaq, ünsiyyət nəticələrini təhlil etmək, ünsiyyət nəticəsində gözlənilənlər haqqında məlumat verə bilmək və s. aiddir.

Şəxsiyyət komponentinin şəxsiyyət meyarları bunlardır: müəllim şəxsiyyətinin vacib peşə keyfiyyətləri (pedaqoji məqsəd, intuisiya, nikbinlik, refleksiya, uzaqgörənlik və s. əlamətlərlə ifadə olunur), müəllim şəxsiyyətinin istiqamətlənməsi (müəllimlik peşəsinə məhəbbət, işə vicdanlı münasibət, məsuliyyət, tərbiyəvi fəaliyyətdə yaradıcılıq və s. əlamətlər), müəllim şəxsiyyətinin xarakteri (pedaqoji takt, ünsiyyət qabiliyyəti, təmkinlik, tələbkarlıq, ədalətlilik, dözümlülük, səmimilik, həyatsevərlik, yumor hissi və s. əlamətlər), müəllimin peşə qabiliyyətləri (inkişaf etmiş, təxəyyül, emosional, iradi keyfiyyətlər, məqsədyönlü yaddaş, inamlı-ifadəli nitq və digər bu kimi əlamətlərdə özünü göstərir) [2, s. 327].

Həyat məktəbi ən yaxşı tərbiyə məktəbidir. Bünövrə olmaq etibarilə tərbiyəçilərdən tərbiyəvi fəaliyyət tələb edir. Tərbiyəalanların insanların ictimai və əmək həyatı ilə geniş və hərtərəfli məlumatlanırlar. Tərbiyəalanların real münasibətlərə, ictimai fəaliyyətin müxtəlif növlərinə sövq etməyi tərbiyənin həyatla əlaqə formasını həyata keçirtmək ibtidai sinif müəllimlərinin tərbiyə və fəaliyyətində müstəsna rolu vardır.

Bu məsələlərin həllində hər bir insanın və cəmiyyətin həyatında əməyin rolunu şagirdlərə başa salmaq, anlatmaq əmək fəaliyyətində şəxsi və ictimai maraqları birləşdirmək, cəmiyyətin tələbatına, arzusuna uyğun müvafiq peşə seçmək, həmçinin ictimai əmlaka təbii sərvətlərə qayğı münasibət bəsləmək ibtidai sinif müəllimlərinin tərbiyəvi fəaliyyətə hazırlanmasının əsası kimi başa düşülür.

İbtidai sinif müəlliminin tərbiyəvi fəaliyyətə hazırlanmasının tərbiyəvi təsirləri vəhdəti, məktəblərin ailə və ictimaiyyətin qüvvələrini birləşdirmək kimi başa düşülür. O, tələb edir ki, bütün iştirakçılar tərbiyə işində birgə iştirak edərək tərbiyəalanlara razılaşdırılmış vahid tələblər verilməsini təşkil etsinlər.

Təhsilalanların şəxsiyyəti ailənin, yoldaşların, ətrafdan yaşlı adamların, ictimai təşkilatların şagird təşkilatlarının təsiri altında formalaşır. Şəxsiyyət formalaşmasında ailənin böyük təsiri rolu var. Ailə ilə əlaqələri möhkəmləndirmək tərbiyə məsələlərinin həll edən zaman ona istinad etmək lazımdır.

Tərbiyə prosesinin məzmunu altında təhsilalanların yiyələnəcəkləri biliklər, bacarıqlar,

vərdişlər, baxışlar və əqidələr sistemi, şəxsiyyət əlamətləri və keyfiyyəti, möhkəm davranış vərdişləri başa düşülür.

Yaxşı, düzgün təşkil olunmuş tərbiyə insanı vətəndaş, işçi, ailə başçısı olmağa hazırlayır. Amma bu keyfiyyətlərin formalaşmasında ibtidai məktəb və ibtidai sinif müəllimi əsaslı özüldür.

Yetişən nəsli həyata hazırlamaq lazımdır. Cəmiyyətdə köklü yenidənqurma getdiyi indiki müasir dövrdə tərbiyə haqqında konkret proqram tərtib etmək və tərbiyəçilərə hazır resept vermək çətindir. Yetişən nəsli mükəmməl həyata hazırlamaq lazımdır. İbtidai məktəbdə ibtidai sinif müəllimlərinin tərbiyəvi fəaliyyəti hazırlanmasının tərbiyənin məzmununun əsasını hərtərəfli əsasını hərtərəfli inkişaf etmiş şəxsiyyətin formalaşdırmaq prinsipinin təşkili durur, əsası qoyulur. Obyektiv faktorlar tərbiyə şəraitində özünün göstərir.

Başlıca nəticələr ondan ibarətdir ki, tərbiyə prosesi müxtəlif mərhələlərdən keçərək o zaman effektli olur ki, biliklər, əqidələr, hisslər praktik fəaliyyətlə birləşsin və qovuşsun. Burada məktəblilərin elmi mədəniyyət, incəsənət sahələrində və cəmiyyətin yenidənqurulmasında tərbiyə alanlar tərəfindən norma və qaydaları şüurlu dərk edərək, dünyagörüşlərinin həyata baxışlarının formalaşmasına tam diqqət yetirərək tərbiyəvi fəaliyyətə yiyələnməsini nəticə olaraq müsbət qiymətləndirilməsini təmin etsinlər.

Bu gün Azərbaycanın Avropa təhsil sisteminə inteqrasiyası yeni ictimai-iqtisadi şərait universitet tələbələri və gələcək müəllimlərin təhsil müəssisələrinin də tərbiyə işinin aparılmasına hazırlığı probleminə və ibtidai sinif müəlliminin şəxsiyyətinə yeni daha mütərəqqi yanaşmağı tələb edir.

**Problemin aktuallığı.** Göründüyü kimi müasir dövr üçün bu mövzuda qeyd olunmuş pedaqoji problemlərin həlli aktuallıq kəsb edir.

**Problemin yeniliyi.** İbtidai siniflərdə müəllimlərin tərbiyəvi fəaliyyətə hazırlanmasında pedaqoji problemlərinə həsr olunub.

**Problemin praktik əhəmiyyəti.** Doktorant dissertantlarda, həmçinin magistrantlarda maraq doğuracaqdır.

**Ədəbiyyat**


1. Paşayev, Ə.X. Pedaqogika: Dərs vəsaiti / Ə.X. Paşayev. F.A. Rüstəmov,– Bakı: Nurlan, - 2007. – 178 s.
2. Rüstəmov, F.A. Pedaqogika tarixi: Dərs vəsaiti. – Bakı: Nurlan, - 2006. - 750 s.
3. Mirzəyeva, F. Pedaqoji ustalığın əsasları: Dərs vəsaiti. / X. Rüstəmova, F. Mirzəyeva. – Bakı: Nurlan, - 2014, - 121 s.
4. Quliyev, S. Müəllim ixtisasına giriş: Dərs vəsaiti. / M. İsmixanov, S. Quliyev. – Bakı: Elm və təhsil, - 2015, - 153 s.
5. Abdullayev, A. İbtidai təhsilin pedaqogikası: Dərs vəsaiti. / S. Abdullayeva, A. Abdullayev. – Bakı: Elm və təhsil, - 2016, - 108 s.
6. Qasımova, L. Pedaqogika: Dərs vəsaiti. / L. Qasımova. R. Mahmudova,– Bakı: Nurlan, - 2008, - 232 s.


**Redaksiyaya daxil olub:** 27.05.2025

# *HƏYAT BİLGİSİ FƏNNİNİN TƏDRİSİ METODİKASI*
# *METHODOLOGY OF TEACHING THE SUBJECT OF KNOWLEDGE OF THE WORLD*
# *МЕТОДИКА ПРЕПОДАВАНИЯ ПРЕДМЕТА ПОЗНАНИЕ МИРА*

*UOT 373.3.016:504*

***Zeynəb Tahir qızı Ələkbərova***
*Gəncə Dövlət Universitetinin*
*Təhsilin pedaqogikası və metodikası kafedrasının müəllimi*
*https://orcid.orq/0000-00001-7399-5692*
*https://doi.org/10.69682/arti.2025.92(3).104-112*
*E-mail: zeyneb.alekberova02@gmail.com*

## İBTİDAİ SİNİFLƏRDƏ HƏYAT BİLGİSİ FƏNNİNİN TƏDRİSİNDƏ İNKİŞAFETDİRİCİ MÜHİTİN YARADILMASI ŞAGİRDLƏRİN TƏLİM MARAĞININ YÜKSƏLDİLMƏSİ AMİLİ KİMİ

***Zeynab Tahir Alakbarova***
*teacher of the department of Pedagogy and methodology of education*
*at Ganja State University*

## CREATING A DEVELOPING ENVIRONMENT IN TEACHING THE SUBJECT OF "LIFE SCIENCE" IN PRIMARY CLASSES AS A FACTOR IN INCREASING STUDENTS' INTEREST IN LEARNING

***Зейнаб Тахир гызы Алекберова***
*преподаватель кафедры Педагогики и методики обучения*
*Гянджинского Государственного Университета*

## СОЗДАНИЕ РАЗВИВАЮЩЕЙ СРЕДЫ ПРИ ПРЕПОДАВАНИИ ПРЕДМЕТА «ПОЗНАНИЕ МИРА» В НАЧАЛЬНЫХ КЛАССАХ КАК ФАКТОР ПОВЫШЕНИЯ ИНТЕРЕСА УЧАЩИХСЯ К ОБУЧЕНИЮ

**Xülasə.** İbtidai siniflərdə təhsilin keyfiyyətli olması səbəblərindən biri şagirdlərdə təlim marağının formalaşdırılmasından ibarətdir. Bunun reallaşdırılması isə bir sıra amillərlə bağlıdır. Bu amillər içərisində tədris prosesində inkişafetdirici mühitin yaradılması xüsusi yer tutur. İnkişafetdirici mühit özünün bir sıra təsir imkanları ilə təlimin maraqlı olmasına, şagirdlərin pedaqoji prosesdə fəal subyekt kimi iştirak etməsinə, təlimdə yüksək müvəffəqiyyətlərin əldə edilməsinə mühüm təsir göstərir. İbtidai siniflərdə tədris edilən "Həyat bilgisi" fənninin bu sahədə həm böyük imkanları, həm də bu imkanları reallaşdırmaqla şagirdlərin həyati bilik, bacarıq və vərdişlərə yiyələnmələrində mühüm rolu vardır. Məqalə belə bir problemə həsr olunmuşdur. Məqalədə "Həyat bilgisi" fənninin tədrisi prosesində inkişafetdirici mühitin təsir imkanları araşdırılmış, aparılmış eksperimental tədqiqatın nəticəsi olaraq bu imkanların kiçikyaşlı şagirdlərdə təlim marağının yüksəldilməsində mühüm rol oynadığı əsaslandırılmışdır.
***Açar sözlər:*** *maraq; həyat bilgisi; inkişafetdirici mühit; dərs; inkişaf; kiçikyaşlı məktəbli*

**Abstract.** One of the reasons for the quality of education in primary schools is the formation of interest in learning in students. The realization of this is related to a number of factors. Among these factors, the creation of a developmental environment in the educational process occupies a special place. A developmental environment, with its many influences, has a significant impact on making learning interesting, on students' participation as active subjects in the pedagogical process, and on achieving high success in learning. The subject of "Life Science" taught in primary grades has both great opportunities in this field and an im-

portant role in students' acquisition of vital knowledge, skills and habits by realizing these opportunities. The article is devoted to such a problem. The article examines the potential impact of the developmental environment in the teaching process of the subject "Life Skills", and as a result of the conducted experimental research, it is substantiated that these opportunities play an important role in increasing interest in learning among young students

***Keywords:*** *interest; life knowledge; developmental environment; lesson; development; young schoolchild*

**Аннотация.** Одной из причин качества образования в начальных классах является формирование у учащихся интереса к учебе. Реализация этого зависит от ряда факторов. Среди этих факторов особое место занимает создание развивающей среды в образовательном процессе. Развивающая среда, с ее многочисленными факторами, оказывает существенное влияние на то, насколько интересным будет обучение, на участие учащихся в качестве активных субъектов педагогического процесса и на достижение высоких результатов в обучении. Предмет «Познание мира», преподаваемый в начальных классах, имеет как большие возможности в этой области, так и важную роль в приобретении учащимися жизненно важных знаний, умений и навыков путем реализации этих возможностей. Статья посвящена именно такой проблеме. В статье рассматривается потенциал воздействия развивающей среды на процесс обучения предмету « Познание мира», и в результате проведенного экспериментального исследования обосновывается, что данные возможности играют важную роль в повышении интереса к обучению у школьников младшего возраста.

***Ключевые слова:*** *интерес; познание мира; развивающия среда; урок; развитие; школьник младшего возраста*

Hazırda elə bir informasiya cəmiyyətində yaşayırıq ki, demək olar ki, hər gün elmdə, incəsənətdə, sosial həyatda yeni-yeni informasiyalarla qarşılaşırıq. İbtidai sinif şagirdləri də bu proseslərdən kənarda qalmır. İnformasiyanın bol olması və kiçikyaşlı məktəblilərin maraq dairələrinin genişliyi onların idrak fəaliyyətinin idarə edilməsi üçün müəllimin bu prosesdə yenilikçi, fəal olması tələbini qarşıya qoyur. Dərsin səmərəli nəticələnməsi üçün müəllim ilk növbədə şagirdlərin diqqətini lazım olmayan informasiyalardan bir növ "təcrid etməyi" bacarmalı, onların diqqətini tələb olunan obyektə yönəldə bilməlidir.

Dərs prosesində inkişafetdirici mühit formalaşdıran müəllim şagirdləri ilə əməkdaşlıq edərkən onlara hörmətlə yanaşmaqla şagirdlərinin davranışını, onların təlim prosesinə, eyni zamanda özlərinə olan münasibətini izləməyi bacarmalı, bu sahədə öz ustalığını təkmilləşdirmək məqsədilə daima öz üzərində işləməlidir.

"Həyat bilgisi" fənninin tədrisində şagirdlərin idrak maraqlarının inkişaf etdirməsi müxtəlif metodlarla (müqayisə, sual-cavab, təkrar etmə, məntiqi, düşündürücü, yaradıcı tapşırıqların həll edilməsi, tədqiqatçılıq, təcrübə və s.) həyata keçirildiyindən və reallaşa bildiyindən müəllim dərs prosesində bunların fənnin təlim nəticələrini nəzərə almaqla idarə edilməsinə də xüsusi diqqət yetirməlidir. Şəxsiyyətyönlü, kompleks, interaktiv dərslərin hər birinin təhlilinin aparılması texnologiyasını alqoritmlərin ardıcıllığını, tədrisin texnoloji tərəflərini müəllim yaxşı bilməlidir. Bu baxımdan müəllimlər özünütəhlillə məşğul olarkən özünün peşəkarlıq keyfiyyətlərini, özünüqiymətləndirmə meyarlarını, şagirdlərin fəaliyyətinin məhsuldarlığını, dərsin təsirliyinin səviyyəsini, məqsədə nail olunmasının səviyyəsini qiymətləndirilməyi bacarmalıdır.

Dərsin hər bir mərhələsinin keyfiyyət səviyyəsi müəyyən meyarlarla müqayisə olunaraq qiymətləndirilməlidir. Məsələn: dərsin təchizatı; dərsin orijinallıq səviyyəsi; müvafiqlik; kifayət etmə; düşünmək imkanının olması; münasiblik və s.

Digər mərhələlər üçün də analoji şəkildə qiymətləndirilməni göstərmək olar: Məsələn: nümayişetdirici vəsait: onların keyfiyyəti; optimal say; dərsin mövzusuna, məzmununa uyğunluq; şagirdlərin dərsdə idrak fəaliyyətlərinin növlərinin uyğunluğu; asanlılıq və s.

Dərsin təşkili (motivasiya): davamlılıq, dinamika; dərsin mövzusu ilə əlaqə; orijinallıq.

Dərsin giriş hissəsi (mövzunun mahiyyətini açmaq): emosionallıq; fikirlərin orijinallığı və həyata keçirilməsi; müəllimin yaradıcılığı; dərsin mövzusunun təqdim edilməsi, şagirdin qarşısında tapşırığın qoyulması; şagirdlərin praktik işi, şagirdlərlə fərdi işin xarakteri, dərsin yekun hissəsi, təlim nəticələrini şərtləndirən məsələlər və s.

Göründüyü kimi dərs özü mürəkkəb bir proses olduğundan onun qiymətləndirilməsi də olduqca mürəkkəb əməliyyatlar sistemindən

ibarətdir. Buna görə də müəllim "Həyat bilgisi" fənninin tədrisində belə məsələləri diqqət mərkəzində saxlamaqla həm də dərsin inkişafetdirici imkanlarını reallaşdırmış olur ki, bu da belə bir mühitin olmasını zəruri edir.

İbtidai siniflərdə inkişafetdirici mühitin yaradılması şagirdlərin idrak fəaliyyətinin inkişafına bilavasitə təsir göstərdiyindən belə bir mühitdə kiçikyaşlı məktəblinin idrak fəaliyyətinin idarə edilməsi həm vacib, həm də mürəkkəb bir məsələyə çevrilir. Dərsin müxtəlif formalarda təşkil olunması kiçikyaşlı şagirdlərin təlim prosesinə marağını yüksəldir. Bu da öz növbəsində şagirdlərin yeni-yeni məsələləri öyrənmələrinə zəmin yaratmış olur.

İnkişasfetdirici təlim mühitinin yaradılması təlim maraqlarının yüksəldilməsi ilə birbaşa əlaqələnən bir hadisədir. Bu baxımdan dərsi təşkil edərkən ən mühüm məsələlərdən biri şagirdlərin təlim maraqlarının formalaşdırılmasıdır. Bu baxımdan müəllimin dərs prosesində təlimə maraq formalaşdırması üçün aşağıda göstərilən bir sıra tələblərə əməl etməsi vacib hesab edirik:

– dərsdə uşaqların diqqətini vacib olan məsələyə, əsas obyektə yönəltmək;

– dərsin bütün mərhələlərində inkişafetdirici mühit yaratmaq;

– dərsdə şagirdlərin daha fəal olmasını təmin etmək;

– dərs prosesində yeni biliklərin şagirdlərə hazır şəkildə verilməməsinin təmin etmək;

– şagirdləri tədqiqatçılığa, axtarıcılığa yönəltmək;

– dərsdə inteqrativliyin gözlənilməsi və əməl etmək;

– yeni keçilən mövzunun keçilmiş mövzu ilə varisliyini təmin etmək;

– təlim prosesini anlaşıqlı, maraqlı və şagirdlərin gücü çatan çətinlikdə qurmaq;

– dərsdə şagirdlərin fəaliyyətini obyektiv qiymətləndirmək və bunu stimullaşdırıcı səviyyədə reallaşdıra bilmək və s.

Apardığımız tədqiqat nəticəsində aydın olur ki, bu tələblərə əməl olunaraq təlim prosesinin təşkili elə bir mühit yaratmış olur ki, bu mühit şagirdə özünəməxsus potensialını reallaşdırmağa əlverişli imkan verir.

"Həyat bilgisi" fənninin xarakteri elədir ki, bu fənnin tədrisində başqa fənlərdə olduğu kimi, burada da müəllim şagirdlərlə səmimi qarşılıqlı münasibətdə olmalıdır. Yəni həyatı onlara öyrətməkdə şagirdlərlə düzgün ünsiyyət tərzi yarada bilməli, öyrətdiklərinə onlarda inam yaratmağı bacarmalıdır.

Müəllimin davranışında qəbul olunmuş ölçünü, ədəb qaydalarını, eyni zamanda Azərbaycan Respublikası Təhsil Nazirliyinin qəbul etdiyi "Müəllimlərin etik davranış Qaydaları"nı gözləməsi təlim-tərbiyə işində həmişə mühüm amil olmuş və olmaqdadır. Bu baxımdan müəllimin pedaqoji etikası onun pedaqoji əməyinin səviyyəsi və nəticəsinin yüksək olmasında mühüm amillərdən birinə çevrilir.

Təlim prosesində uşaqların idrak fəaliyyətinin idarə edilməsində başlıca amillərdən biri bütün dərs boyu uşaqların diqqətinin səfərbər edilməsi və təlim materialına yönəldilməsidir. K.D. Uşinski yazırdı: "*Diqqət şüurumuzun elə bir yeganə qapısıdır ki, şüurumuzda olan hər bir şey mütləq buradan keçir. Ona görə də şagirdləri təlim prosesində həmin qapını açıq saxlamağa alışdırmaq lazımdır*" [4, səh.37].

Təcrübə göstərir ki, müəllimin təlimə maraq yarada bilmək qabiliyyəti çox vaxt uşaqların peşəyönümünə, o cümlədən müəllimlik peşəsinə maraq göstərmələrinə də güclü təsir göstərir.

Müasir dövrün təlim prosesini xarakterizə edən ən mühüm məsələlərdən biri təlim fəaliyyətinin əsas subyektinin müəllimdən çox şagird olmasıdır. Belə təlim fəaliyyətində biliklərin mənimsənilməsi və fəaliyyət üsullarının formalaşdırılması inkişafetdirici təlim strukturunda uşağın fəaliyyət prosesi və nəticəsi kimi meydana çıxır. B.A. Suxomlinski yazırdı: "*Yaxşı oxumaq arzusu gözəl insani arzu mənə uşaq həyatının bütün mənasını, uşaq sevincləri aləmini şəfəqləndirən parlaq alov kimi görünür, uşaq bu zəif və müdafiəsiz alovu sizə, müəllimlərə hədsiz inamla gətirir, əgər siz uşaq arzusunu hiss etmirsinizsə, deməli öz şagirdlərinizin indisi və gələcəyi üçün həyəcanlandırıcı məsuliyyət hissi sizə müyəssər deyildir. Bu alovu uşaq qəlbinə ehtiyatsız toxunmaqla incikliyə səbəb olan kəskin sözlə və ya laqeydliklə asanlıqla söndürmək olar. Bilik ehtirasının zəif alovu üçün həyatverici hava uşağın yalnız təlimdə müvəffəqiyyətidir, yalnız belə bir fikri qürurla dərk etmək və hiss etməkdir ki, mən irəliyə addım atıram, idrakın dik cığırı ilə yuxarı qalxıram"* [2, s. 189]. Bizə belə gəlir ki, təlim prosesində müəllimin öz şagirdlərini məhz təlimin subyekti səviyyəsinə qaldırması ilə bu məsələni yerinə yetirmiş olar.

Müasir təhsil sistemimizdə ibtidai təhsilin qarşısında çox mühüm məqsəd və vəzifələr durur: "Təhsil Haqqında Azərbaycan Respublikasının Qanunu"nda bunlar aşağıdakı kimi təsbit olunmuşdur:

– *şagirdlərdə oxu, hesablama və yazı vərdişləri formalaşdırmaq;*

– *şagirdlərə insan, cəmiyyət, ətraf aləm barəsində ilkin biliyin öyrədilməsinə nail olmaq;*

– *şagirdlərdə məntiqi və yaradıcı təfəkkürü inkişaf etdirmək, məntiqi təfəkkür elementləri, estetik, bədii zövq və digər xüsusiyyətlər formalaşdırmaq* [3, s. 28].

Şagirdlərin gələcəkdə bir şəxsiyyət kimi formalaşmasında ibtidai təhsil müstəsna əhəmiyyət kəsb edir. Təhsilin bu səviyyədə düzgün aparılması, onun yüksək səviyyədə olması şagirdlərin nəinki gələcək təhsilləri üçün, eyni zamanda şəxsiyyət kimi formalaşmalarında da mühüm rol oynayır. Bu cəhəti nəzərə alsaq

ibtidai təhsilin yekununda şagirdlər "Həyat bilgisi" fənni üzrə kurikulum tələblərindən irəli gələn aşağıdakı ümumi təlim nəticələrinə malik olmalıdırlar:

– *öz hüquqlarını dərk etməsini, başqalarının hüquq və azadlıqlarına hörmətlə yanaşmasını, onu əhatə edən insanlara həssas münasibət bəsləməsini nümayiş etdirir, həmin məsələlərlə bağlı şəxsi fikirlərini bildirir;*

– *insan həyatı və sağlamlığının qorunması ilə bağlı ən zəruri təhlükəsizlik qaydalarını izah edir;*

– *düzlük, ədalətlilik, humanistlik, rəhmdillik nümayiş etdirir, bu mənəvi keyfiyyətlərin mahiyyəti barədə mülahizələrini şərh edir;*

– *iqtisadi biliklərdən məişətdə istifadə edir;*

– *təbiətə, ekologiyaya həssas və qayğıkeş yanaşmaqla təbiət hadisələri üzərində müşahidələr aparır və onlara münasibət bildirir;*

– *cəmiyyətdə baş verən hadisələri öz yaş səviyyəsinə uyğun şərh edir* [5, s.144-145].

"Həyat bilgisi" fənni üzrə "Məzmun standartları"nın təhlili göstərir ki, bu fənnin öyrənilməsilə ibtidai sinif şagirdləri bir çox həyati bilik və bacarıqlara yiyələnirlər ki, bunlar da öz növbəsində təlimin çox yüksək səviyyədə aparılmasını tələb edir. Məsələn, IV sinfin sonunda şagirdlər ətraf aləm hadisələrinin mahiyyətinə, sadə coğrafi bilik və bacarıqlara, canı və cansız təbiətə aid biliklərə, ekoloji, sadə iqtisadi biliklərə, hüquqi mədəniyyətə, insan hüquqlarına, ünsiyyətə, insan mənəviyyatına, insan sağlamlığına və təhlükəsizliyə, "Dövlət" məfhumunun mahiyyətinə və s. haqqında həyati biliklərə malik olduğunu nümayiş etdirir [5, s. 166].

"Həyat bilgisi" fənninin tədrisində şagirdlərə insan hüquqları, əxlaqi normalar, təhlükəsizlik, təbiət və insan sağlamlığı, insan-cəmiyyət əlaqələri haqqında lazımi məlumatlar verilir və onlarda obyekt və hadisələri mahiyyətinə görə seçmək, onlar haqqında fikir bildirmək, iqtisadi, ekoloji, kommunikativ fəaliyyətlər üzrə sadə bacarıqların formalaşdırılmasına nail olunur.

Müşahidələrimizdən aydın olur ki, ibtidai sinifdə inkişafetdirici təlim ənənəvi təlim tipindən fərqli olaraq, şagirdlərin qısa zaman kəsiyində inkişafını, başqa sözlə, fiziki və psixi parametrlərinin sadədən-mürəkkəbə doğru irəliləməsini təmin edə bilir. Bu da ondan irəli gəlir ki, inkişaf müxtəlif fəaliyyət növlərində aktiv surətdə iştirak etməklə, bacarıq və qabiliyyətlərə yiyələnmək prosesində baş verir. Şagirdlərdə də istək, maraq, şəxsi səy və müstəqil axtarıcılıq qabiliyyəti olmadan onların inkişafı mümkün olmadığından təlim prosesində şagirdlərin fəal iştirakının təmin olunması onlarda inkişafa geniş yol aça bilir. "Həyat bilgisi" fənni hər şeydən əvvəl *"fərdin özünü bioloji, sosial və mənəvi tərəfləri ilə bütöv bir varlıq kimi dərk etməsi və reallaşdırması üçün lazım olan bilik, bacarıq və dəyərlər sistemi formalaşdırmağa və onu təkmilləşdirməyə kömək edən inteqrativ fənn"* [5, s. 142] olduğundan təlim prosesi kiçikyaşlı məktəbliləri həyat hadisələri ilə dərindən silahlandırmağa, əqli və praktik fəaliyyətləri üçün bilik, bacarıq və vərdişlərə yiyələnmələrinə xidmət edir.

Tədqiqatımız göstərir ki, inkişafetdirici təlim mühitinin əsas fərqləndirici cəhətlərindən biri onun yaradıcı xarakter daşımasında özünü göstərir. Belə ki, şagirdlərin fərdi xüsusiyyətlərini inkişaf etdirməyə yönələn inkişafetdirici təlim mühiti şagirdlərin təlim prosesinə həm də müəyyən qədər yaradıcı yanaşmalarına istiqamətlənmiş olur ki, burada da müəllimin bu prosesi səriştəliliklə idarə edə bilməsi mühüm əhəmiyyət kəsb edir.

Deyilənləri ümumiləşdirərək belə nəticəyə gəlmək olur ki, təlim prosesində inkişafetdirici təlim mühitinin təmin olunması üçün onun düzgün təşkili və idarə olunması, təfəkkürü, müstəqil düşüncə tərzini inkişaf etdirən müasir pedaqoji texnologiyaların tətbiqi, "müəllim-şagird",

“şagird-şagird”, “müəllim-şagird-valideyn” münasibətlərinin düzgün qurulması böyük rol oynayır. Bu baxımdan “Həyat bilgisi” fənnindən təlim prosesində inkişafetdirici mühitin təşkil olunması zamanı aşağıdakı tələblərin nəzərə alınması məqsədəuyğun hesab edirik:

1) şagirdlərin fiziki, psixi və əqli hazırlığının nəzərə alınması;

2) şagirdlərin idrak, təfəkkür, yaradıcı fəaliyyətinin inkişaf etdirilməsi;

3) təlimin tərbiyələndirici və inkişafetdirici funksiyalarının nəzərə alınması.

Tədqiqatımız sübut edir ki, kiçikyaşlı məktəblilərin təlim fəaliyyətində səmərəli mühit yaradıldıqda onlarda əqlin müstəqilliyi və hadisə və proseslərə tənqidi yanaşma meyli lazımi səviyyədə inkişaf edə bilir, şagirdlər oradan müəyyən nəticə çıxarmağa, uyğunsuzluqları tapmağa, problemləri törədən səbəblər barədə müəyyən fikir və mülahizələr söyləməyə qabil olurlar.

Şagirdlərin inkişafında xüsusi yer tutan onların psixi inkişafın səviyyəsinin yüksəldilməsi üçün inkişafetdirici mühitin yaradılması təlimin optimallaşdırılması üçün əsas amillərdən biridir. Belə ki, kiçikyaşlı şagirdlərin qarşıya qoyulmuş problemin həllinə cəlb edilməsi onların təfəkkürünün inkişafını nəzərdə tutmaqla bilavasitə ona kömək edə bilir. Biliklərin mənimsənilməsinə nail olunması şagirdin fəallığının əsasını qoyur ki, bu da özünü idrak prosesini müstəqil qurmağı bacaran subyekt kimi iştirak etməyə şərait yaradır. Bu baxımdan şagirdlərin malik olduqları yaradıcı təfəkkür aşağıdakı qabiliyyətləri özündə əks etdirə bilir:

– yüksək nəticələrin əldə edilməsi;

– yaradılmış situasiyada əvvəlcədən məlum olmayan müxtəlif yollardan istifadə etmək imkanının olması;

– nəticənin əldə edilməsi üçün müxtəlif üsullardan istifadə;

– məqsədli surətdə müəyyən edilən vəzifələrin həll edilməsi üçün kifayət qədər təcrübənin olmaması;

– başqasının müdaxiləsi olmadan müstəqil fəaliyyət göstərməyin zəruriliyi və s.

Araşdırmalardan da aydın olur ki, motivin güclü olması fəaliyyətin məqsədinə çox təsir edir. Bu zaman motivin məqsədə doğru yönəlməsi baş verir.

Buradan belə qənaətə gəlmək olar ki, inkişafetdirici təlim mühitinin yaradılması davamlı idraki maraqlarının formalaşmasını, şagirdlərin fəallığını, təfəkkür müstəqilliyini, müəllimlərin təlim prosesinə kreativ yanaşmasını təmin etməklə şagirdlərin təlimdəki müvəffəqiyyətləri üçün daha güclü baza yaratmış olur.

Şagirdlərin təlim prosesində idraki inkişaf etdirən tapşırıqlar üzərində fəaliyyətə cəlb edilməsi inkişafetdirici təlim mühiti kimi xüsusi əhəmiyyət kəsb edir. Belə tapşırıqlar inkişafetdirici təlim mühiti funksiyası daşımaqla şagirdlərdə idraki marağın stimullaşdırılmasına güclü təsir göstərir. Bu zaman şagirdin iradəsi, məsuliyyət hissi də formalaşdırılmış olur ki, bu da şagirdlərdə öyrənmə motivlərinin güclənməsinə əsaslı təsir göstərə bilir. Şagirdlərdə özünə inamın yaradılması və təlim prosesində onlarda özünəgüvənlik hissinin olması bu prosesin daha müvəffəqiyyətlə həll edilməsini sürətləndirmiş olur.

“Həyat bilgisi” fənninin öyrədilməsi və bu prosesin bilavasitə inkişafetdirici təlim mühitinin yaradılması bazasında reallaşdırılması üçün tətbiq etdiyimiz metodika belə deməyə əsas verir ki, müəllimin təlim materialını şagirdlərə əvvəlcə ümumi, geniş formatda verməsi, şagirdlərdə mövzunun məzmununu tam mənimsəyə bilmələrinə imkan versə də, sonra onun tərkib hissələrinin konkret olaraq təhlilə cəlb etməsi şagirdlərin inkişafına daha əlverişli təsir göstərə bilir. Başqa sözlə desək, bu zaman təhlil-tərkib, təhlil-tərkib metodları şagirdlərin həm mövzunu aydın dərk etmələrinə, həm də ondan müəyyən nəticələr çıxarmalarına əlverişli dərəcədə yardım etmiş olur. İdraka əsaslanan, interaktiv metodların tətbiqi ilə həyata keçirilən belə öyrənmə prosesi pedaqoji-psixoloji qanunauyğunluqlarla tənzimlənərək müəllimin səriştəliliyi və peşəkarlığı ilə daha da səmərəli şəkildə oz həllini tapmış olur.

Təcrübə göstərir ki, təlim prosesində dərsin təşkilinin didaktik tələblər baxımından təkmilləşdirilməsi hazırda əsas məsələlərdəndir. Bu, eyni zamanda “Həyat bilgisi” fənninə də aiddir. Çünki dərsin təşkilinə verilən müasir həm didaktik, həm pedaqoji-psixoloji tələblərin nəzərə alınması, həm də yeni yanaşmaların tətbiq edilməsi təlim prosesində daha yüksək nailiyyətlərin əldə olunmasına şərait yaradır. Bu da onunla səciyyələnir ki, müəllim hər bir mövzunun, hər bir dərsin məzmununa müasir dövrün tələbləri ilə yanaşmaqla onu yaradıcı, maraqlı, şagird və şəxsiyyətyönlü edə bilər ki, bu da bilavasitə müəllimlərdən

pedaqoji prosesə səriştəli, yaradıcı münasibət tələb edir. Belə münasibətlərdən biri "Həyat bilgisi" fənninin tədrisində təlimin məzmununun informativ həcminin yüksəldilməsindən ibarətdir. Bu da bilavasitə müəyyən meyarların nəzərə alınmasını tələb edir. Bu meyarları əsasən aşağıdakılardan ibarət hesab etmək olar:

1. Təlimin kiçikyaşlı məktəblilərin yaş, psixoloji və fizioloji imkanına uyğun olması.

2. Verilən vaxtın və təlim materialı həcminin nəzərə alınması.

3. Təlim materialları bazasının olması və şagirdlərin yiyələnməli olduqları bilik, bacarıq və vərdişlərin ciddi seçiminin aparılması.

4. Şagirdlərin diqqətinin əsas anlayışların, bacarıq və vərdişlərin öyrədilməsinə yönəldilməsi və təlim materialı izah edilərkən onlara əsas arqumentin öyrədilməsi və s.

Apardığımız müşahidə və təhlillər göstərir ki, digər fənlərlə yanaşı, "Həyat bilgisi" fənninin də məzmununun və strukturunun yeni, daha müasir tələblər baxımından təkmilləşdirilməsinə müəyyən ehtiyac vardır. Bunun əsas istiqamətlərini aşağıdakı kimi səciyyələndirmək olar:

a) məzmunun üç əsas funksiyasının təhsil, tərbiyə və inkişafın kompleks həyata keçirilməsinə nail olunması;

b) hər bir dərsin informativ tutumunun yüksəldilməsi;

c) təlim prosesində ümumiləşdirmələrin rolunun artırılması, ümumiləşdirici dərslərə geniş yer verilməsi;

ç) təlim prosesində inteqrasiyadan geniş istifadə olunması;

d) inkişafetdirici mühitin kompleks şəkildə təşkil olunması;

e) təlim prosesində İKT-nin tətbiqinin genişləndirilməsi;

ə) təlimin məzmununun yüksəldilməsini onun həcmini (təlim materialını) artırmaqla deyil, dərsin intensivliyinin yüksəldilməsilə nail olunması və s.

Tədqiqatımız göstərir ki, inkişafetdirici mühit şəxsiyyətin inkişafı və ona məxsus fəaliyyət növlərin hərəkətverici qüvvəsini təşkil edir. O, şagirdlərdə müxtəlif qabiliyyətlərin, subyektiv keyfiyyətlərinin formalaşmasına əsaslı təsir edir, müxtəlif fəaliyyət növlərini stimullaşdırır, sinifdə əlverişli psixoloji iqlim yaradır, real və müxtəlif şərait yaratmaqla şagirdlərin müstəqilliyini artırır.

"Həyat bilgisi" fənninin xarakteri elədir ki, ibtidai sinifdə təlim prosesinin düzgün təşkili kiçikyaşlı məktəblilərin həyata hazırlıq səviyyəsinin yüksəldilməsinə bilavasitə təsir və kömək edir. Bu baxımdan onun tədrisində müasir pedaqoji texnologiyaların tətbiqi dərslərin səmərə və keyfiyyətinin yüksəldilməsinə əsaslı dərəcədə müsbət təsir göstərir. Bu da müəllimdən ilk növbədə səriştəlilik və sinifdə əlverişli yaradıcı mühit yarada bilməsini tələb edir.

İnkişafetdirici təlim mühiti müəllimdən dinləmək bacarığı, cavabların heç birini rədd etməməyi, şagirdlərin hər birinin mövqeyini dəstəkləməyi, mühakimələrin məntiqini başa düşməyi, tez-tez dəyişən situasiyalarda çıxış yolu tapmağı, cavabları, təklifləri təhlil etməyi, interaktiv metodlardan geniş istifadə etməyi və şagirdlərə hiss etdirmədən onları problemin həllinə yönəltməyi bacarmağı tələb edir. Pedaqoji prosesin və fəaliyyətin belə təşkili və keçirilməsi nəinki yeni biliklərin əldə edilməsinə, həmçinin şagirdlərdə kommunikativ bacarıqların inkişafına da mühüm təsir göstərir.

M. İlyasov inkişafetdirici təlim mühitinin innovasiyalarla zəngin olmasına vurğu edərək belə bir mühitin yaradılmasında aşağıdakı bir sıra şərtlərin gözlənilməsini məqbul hesab edir:

*1) yaradılan mühitin şagirdlər üçün cəlbedici olması;*

*2) pedaqoji prosesdə şagirdlərin müstəqil fəaliyyətinə daha çox vaxt və diqqətin ayrılması;*

*3) dərsdə inkulizivliyin təmin edilməsi və hər bir şagird üçün bərabər təhsil imkanının yaradılması;*

*4) innovasiyalara imkan verən və şərait yaradan müasir resurslarla təminatın olması və s.* [1, s. 46].

İnkişafetdirici mühitdə interaktiv iş formaları tərbiyəvi əhəmiyyət daşıyaraq, şagirdlərin sinifdə birgə əməkdaşlıq şəraitində çalışmasına, onlar arasında emosional münasibətlərin qurulmasına müsbət təsir göstərir. Bu zaman müəllim şagirdlərdə müstəqil düşünmək, yeni biliklər əldə etməyə təşəbbüs göstərmək, başqasının fikrinə münasibət bildirmək, sərbəst rəy söyləmək, öz fikrini əsaslandırmaq və s. bacarıqları da aşılamış olur. Şagirdlərin yaxın inkişaf zonasının, onların potensial imkanlarının, fərdi xüsusiyyətlərinin nəzərə alınması da bu zaman nəzərdən qaçırılmamalıdır.

Eksperiment apardığımız siniflərdə müşahidə etdiyimiz dərslərdə müəllimlərin sinif otağında mövzuya uyğun yaratdıqları inkişafetdirici mühitin kiçik yaşlı şagirdlərin emosional hisslərinə, onların praktiki fəaliyyətdə fəal iştirak etmələrinə, dərsin bütün mərhələlərində onların fəal olmalarına səbəb olduğunu gördük. Bu da onu göstərdi ki, inkişafetdirici mühitin düzgün təşkili pedaqoji prosesin inkişafetdirici xarakter daşımasına səbəb olmaqla, həm də şagirdlərin öyrənmə maraqlarının da yüksək olmasına əlverişli təsir göstərir. Müşahidələrimiz göstərdi ki, inkişafetdirici mühit şagirdlərin təlim marağını təmin edir, onun seçim etməyə, öz təşəbbüsünü irəli sürməyə, sərbəst qərar qəbul etməyə, yaradıcı bacarıqları inkişaf etdirməyə səbəb olur, həmçinin onların fərdi keyfiyyətlərini və həyat təcrübəsini formalaşdırmağa əlverişli təsir göstərir.

Beləliklə, eksperimentə cəlb olunmuş siniflərdə şagirdlərin təlim keyfiyyətinin inkişaf dinamikasının təhlili göstərdi ki:

– inkişafetdirici mühit – sosial-kommunikativ inkişafdır və bu, şagirdin mənəvi və fiziki inkişafının məzmunu, sosial və əşyavi vasitələrin vəhdətidir;

– inkişafetdirici mühit ibtidai təhsil proqramının reallaşdırılmasının əsasını təşkil edir;

– inkişafetdirici mühit şagirdlərin dolğun tədrisi və inkişafının təmin edilməsi məqsədi ilə məqsədyönlü şəkildə yaradılan şərtlərin birləşməsidir;

– inkişafetdirici mühit kiçikyaşlı məktəbliləri hərtərəfli inkişaf etdirən tədris mühitinin xüsusi təşkil olunmuş məkanda materiallar və avadanlıqlarla təqdim olunan bir hissəsidir.

Sinifdə təlim üçün yaradılmış bütün mühiti inkişafetdirici mühit adlandırmaq səhv olardı. Bu mühit özünün özünəməxsus bir sıra keyfiyyətləri ilə seçilir ki, bunun da yaradılmasına yaradıcılıqla yanaşılması tələb olunur. Bu baxımdan ibtidai təhsilin dövlət təhsil standartına uyğun olaraq “Həyat bilgisi” fənni üzrə formalaşdırılmış inkişafetdirici mühitin aşağıdakı xüsusiyyətlərə malik olmasını qeyd etmək olar:

– zənginlik materialların, avadanlığın müxtəlifliyi şagirdlərin yaş və fərdi xüsusiyyətlərinə, proqramın məzmununa uyğun olması. Zəngin inkişafetdirici mühit təbii, rahat, rasional şəkildə təşkil olunmuş, şagirdin orada idraki-yaradıcı fəaliyyətlə məşğul ola biləcəyi şərait olduğundan tədqiqat nəticəsində belə bir fikrin formalaşması özünü göstərir ki, sinif otağında zəngin inkişafetdirici mühitin yaradılması şagirdlərdə təlim marağının yüksəldilməsi və onların hərtərəfli inkişafı üçün mühüm şərtdir.

– dəyişkənlik şagirdlərin dəyişkən maraqlarından asılılıq olaraq inkişafetdirici mühiti dəyişdirə bilmək imkanının təmin edilməsi;

– vasitələrin müxtəlifliyi inkişafetdirici mühitdə olan müxtəlif vəsaitləri fərqli məqsədlərlə istifadə etmək imkanının yaradılması;

– yeniliyin olması inkişafetdirici mühitdə şagirdlərin azad seçimini təmin edən materialların və müxtəlif avadanlıqların olması, vəsaitlərin, materialların mütəmadi olaraq dəyişdirilməsi, məktəblilərin idraki və tədqiqatçı aktivliyini stimullaşdırmaq üçün yeni əşyaların əlavə olunmasının təmin edilməsi;

– əlçatanlılıq tədris fəaliyyətinin həyata keçirildiyi sinif otaqlarında bütün əyani vəsaitlərin, əşyaların şagirdlər üçün əlçatan olması, materiallardan və vəsaitlərdən asanlıqla istifadə edilə bilməsi və s.

Tədqiqatımız göstərir ki, kiçikyaşlı şagirdlərin təlim marağının yüksəldilməsində sinfin inkişafetdirici təhsil mühiti kimi təkmilləşdirilməsi müəllimlərin şəxsi və peşəkar inkişafı olmadan mümkün deyil. Burada müəllimin səriştəli olması, inkişafetdirici mühit yaratmaq bacarığına malik olması əsas şərtlərdəndir. Kiçikyaşlı şagirdlərin təlim marağının inkişafı müəllimin şagirdlərinin imkanlarını, güclü və zəif tərəflərini yaxşı bilməsi, yaradılan mühitdən bacarıqla istifadə edərək təlim prosesini onların inkişafına yönəldə bilməsi müəllimdən çox asılıdır. Müşahidələr göstərir ki, müəllimin peşəkarlığının aparıcı komponentlərindən olan hər bir şagird ilə işgüzar ünsiyyət qurmaq və münasibətlər yaratmaq bacarığı, o cümlədən müəllimlərin şagirdləri ilə yaradıcı əməkdaşlığı bu prosesin əlverişli şəkildə aparılmasına müsbət kömək edə bilir. Bunlarla yanaşı, inkişafetdirici mühitin fiziki mühit adlanan növündən istifadə olunması da olduqca vacibdir. Çünki mühitin inkişafetdirici olması onun həm də təhlükəsiz olması, estetik cəhətdən komfort olması, gigiyenik tələblərə cavab verməsi olduqca önəmlidir. Belə bir mühitin sosial mühitlə də əlaqəsini yaddan çıxarmaq olmaz. Bu baxımdan sosial mühit də inkişafetdirici mühitin növlərinə aiddir. Sosial aspekt şagirdlərin və müəllimlərin müxtəlif xüsu-

siyyətlərə fərq qoyulmadan gündəlik təlim-tərbiyə fəaliyyətinin uğurlu təşkilini şərtləndirdiyindən sosial mühit öyrənmə və kommunikasiya prosesinin formalaşmasında bütün şagirdlər üçün məqbul şəraitin yaradılmasını zəruri edir.

İnformasiya-kommunikasiya texnologiyaları, qarşılıqlı öyrənmə, müxtəlif təlim platformaları və s. texnoloji mühit amilinə daxildir. Müasir təhsili bunlarsız təsəvvür etmək mümkün olmadığından texnologiyaların tətbiqi sinif daxilində də yaradılan inkişafetdirici mühitə öz təsirini göstərmiş olur.

Didaktik mühitin müəyyən edilməsi inkişafetdirici təlim mühitinin əsasını təşkil edir və bu mühit şagirdlər üçün çox vacibdir. Didaktik mühit öyrənməni dəstəkləyən və məzmun əldə etməyi təmin edən resursları da əhatə etdiyi üçün belə bir mühitin yaradılması şagirdlərin inkişafının təmin olunmasında əvəzsiz rola və imkanlara malikdir.

Müşahidələrimiz göstərdi ki, müəllimlərin bir qisminin inkişafetdirici mühit növlərindən istifadədə müəyyən nöqsanlara yol verirlər. Onların bəziləri inkişafetdirici təlim mühiti yaradılarkən inkişafetdirici mühitin növlərindən yerli-yerində istifadə etmir, bəziləri isə hansısa mühit növündən daha çox istifadə etməklə digərlərini unudurlar. Bu da kiçikyaşlı məktəblinin təlim keyfiyyətinin yüksəldilməsinə mənfi təsir göstərməklə yanaşı, şagirdin tez yorulmasına, diqqətinin yayılmasına və təlim prosesinin yeknəsəkliyinə, yorucu olmasına gətirib çıxarır.

Tədqiqatımızın nəticələri belə bir fikri əsaslandırmağa imkan verir ki, inkişafetdirici mühitə kompleks mühitlər kimi, yəni bir çox mühitin məcmusu kimi baxılmalıdır. Yəni fiziki, didaktik, sosial, psixoloji, texnoloji, eyni zamanda kommunikativ-ünsiyyət və digər öyrədici və tərbiyəedici mühitlərin inteqrasiyası yaradılmalıdır. Bu zaman birtərəfliyə yol vermədən tədrisin təşkili və aparılması olmalıdır. Yəni, deyək ki, təkcə didaktik və ya sosial mühitə üstünlük verib, digərlərinə ikinci dərəcəli amillər kimi yanaşılması gözlənilən nəticələrin əldə edilməsinə səbəb olmayacaqdır. Peşəkar müəllim fiziki və didaktik mühit amillərini nəzarətdə saxlamaqla yanaşı, şagirdlərinin öyrənməsi üçün həm sosial mühiti, psixoloji münasibətləri və ünsiyyət prosesini, həm də təlim və texnoloji mühiti birlikdə yaratmağı bacarmalıdır.

Beləliklə, nəticə olaraq deyə bilərik ki, inkişafetdirici təlim mühiti kiçikyaşlı məktəblilərin inkişafı və formalaşmasında mühüm təsir imkanlarına malikdir. Bu mühit şagirdlərin təlim marağının yüksəldilməsində, mövzuların təlim nəticələrinin reallaşdırılmasında, şagird şəxsiyyətinin formalaşdırılmasında mühüm rolu və əhəmiyyəti vardır. Sinfin inkişafetdirici təhsil mühiti kimi təkmilləşdirilməsi həmçinin müəllimin peşə hazırlığı səviyyəsinə kifayət qədər yüksək tələblər qoyur ki, bu tələblərin də gözlənilməsi təhsilin şəxsiyyətin inkişafında əsas rolunun və hədəflərinin reallaşdırılmasına səbəb olur. İnkişafetdirici təlim mühiti şagirdin təlim prosesinin subyekti kimi inkişaf etməsini də reallaşdırıla bilir. Burada şagirdin pedaqoji prosesin subyekti kimi inkişafı fəaliyyət, ünsiyyət, şüur və davranışın vahidliyi kontekstində baş vermiş olur.

**Problemin elmi yeniliyi.** ibtidai təhsildə tədris mühitinin keyfiyyətinin artırılması istiqamətində aparılan bu tədqiqat, xüsusilə "Həyat bilgisi" fənnində inkişafetdirici təlim mühitinin şagirdlərin idrak marağının formalaşmasında və onların təlim fəaliyyətinə fəal cəlb olunmasında oynadığı rolu ilk dəfə olaraq sistemli şəkildə araşdırır. Tədqiqat, yalnız təlim metodları deyil, həmçinin fiziki, sosial, texnoloji və didaktik mühitlərin birgə təsirini nəzərə alaraq kompleks yanaşma təqdim edir. Müəllim səriştəliliyinin və pedaqoji etikanın bu mühitdə rolu da spesifik olaraq araşdırılmış, inkişafetdirici təlim mühitinin komponentləri və şagirdin təlimə subyekt kimi cəlb olunması dərin elmi əsaslandırma ilə ortaya qoyulmuşdur. Bu baxımdan tədqiqat mövcud elmi ədəbiyyatda yeni bir boşluğu doldurur.

**Problemin aktuallığı**. müasir informasiya cəmiyyətində kiçikyaşlı məktəblilər gündəlik olaraq çoxsaylı məlumatla qarşılaşırlar. Bu şəraitdə onların diqqətinin düzgün yönləndirilməsi, təlimə marağının yüksəldilməsi və təlim prosesində fəal iştiraklarının təmin olunması təhsilin keyfiyyəti üçün əsas şərtlərdən birinə çevrilmişdir. "Həyat bilgisi" fənni isə məhz şagirdlərin sosial, etik, ekoloji və təhlükəsizlik biliklərinin formalaşmasında mühüm yer tutur. Tədqiqat göstərir ki, belə bir fənnin tədrisində müasir pedaqoji yanaşmalarla formalaşdırılmış inkişafetdirici mühit, təhsil islahatlarının və şəxsiyyətyönlü yanaşmanın mərkəzində dayanır. Bu səbəbdən tədqiqat həm təhsil siyasəti, həm də pedaqoji praktika üçün aktuallıq kəsb edir.

**Problemin praktik əhəmiyyəti**. ibtidai sinif müəllimləri üçün konkret pedaqoji fəaliyyət modellərinin qurulmasına imkan verir. Müəllimlərin təlimdə inkişafetdirici mühit yaratmaq üçün hansı kompo-

nentlərə diqqət yetirməli olduqları, şagirdlərin maraq dairəsini necə istiqamətləndirməli olduqları, texnoloji və sosial mühitlə necə işləməli olduqları bu tədqiqatda aydın şəkildə müəyyənləşdirilib. Eyni zamanda, bu nəticələr təlim-tərbiyə prosesində uğurlu sinif idarəçiliyi, inklüziv və fərdiləşdirilmiş yanaşmaların tətbiqi üçün də əhəmiyyətli bir praktiki baza yaradır. Nəticədə, bu tədqiqat yalnız elmi deyil, eyni zamanda pedaqoji təcrübədə tətbiq üçün real imkanlar təqdim edir.

**Ədəbiyyat**


1. İlyasov, M.İ. İnnovasiyalı təhsil mühiti məktəbdə təlim müvəffəqiyyətinin yüksəldilməsi amili kimi // Azərbaycan Respublikasının Təhsil İnstitutunun Elmi əsərləri, 2024, № 6, -s. 41-47.
2. Suxomlinski, V.A. Ürəyimi uşaqlara verirəm // -Bakı: Maarif, -1979, -324 s.
3. "Təhsil haqqında" Azərbaycan Respublikasının Qanunu // -Bakı: Hüquq ədəbiyyatı,- 2010, -80 s.
4. Uşinski, K.D. Seçilmiş pedaqoji əsərləri // - Bakı: Azərnəşr, -1953, -314 s.
5. Ümumtəhsil məktəblərinin I-IV sinifləri üçün fənn kurikulumları // -Bakı: Təhsil, -2008. - 480 s.


**Redaksiyaya daxil olub:** 27.05.2025

*UOT 372.8*

***Sevil Mirhəsən qızı İsayeva***
*Mingəçevir Dövlət Universitetinin müəllimi*
*https://orcid.org/0000-0002-8918-7216*
*https://doi.org/10.69682/arti.2025.92(3).113-116*
*E-mail: sevil-hesenova57@mail.ru*

# DİLİN QRAMMATİK İMKANLARINDAN İSTİFADƏNİN ƏHƏMİYYƏTİ

***Sevil Mirgasan Isaeva***
*Lecturer of Mingachevir State University*

# IMPORTANCE OF USING GRAMMATICAL POSSIBILITIES OF LANGUAGE

***Севиль Миргасан гызы Исаева***
*преподаватель Мингечевирского Государственного Университета*

# ВАЖНОСТЬ ИСПОЛЬЗОВАНИЯ ГРАММАТИЧЕСКИХ ВОЗМОЖНОСТЕЙ ЯЗЫКА

**Xülasə**. Təlim prosesində istifadə edilən metodlar müəllim tərəfindən həyata keçirilir. Təlimin səmərəli olması təlim metodunun düzgün seçilməsindən, tətbiq edilməsindən, eləcə də öyrənənlərin bilik, bacarıq və vərdişlərindən asılıdır. Müvafiq metodların tətbiqi ilə öyrənilən nəzəri metodlar öyrənənlər tərəfindən dərk edilməsi üzrə onların müxtəlif idraki və təcrübi fəaliyyətini özündə birləşdirən iş sistemidir.

Məqalədə təlim metodları pedaqoji prosesdə dilimizin fonetik, leksik-semantik imkanlarından istifadənin əsas amili kimi təhlil olunur.
***Açar sözlər**: pedaqoji proses, pedaqoji texnologiya, öyrənmə, müvafiq metodların tətbiqi, dilin fonetik, leksik imkanlarından istifadə, nitqin zənginləşdirilməsi*

**Abstract.** The methods used in the training process are implemented by the teacher. The effectiveness of training depends on the correct choice and application of the training method, as well as the knowledge, skills and habits of the learners. Theoretical methods learned through the application of appropriate methods are a system of work that combines their various cognitive and practical activities to be understood by learners.

The article analyzes teaching methods as a key factor in the use of phonetic, lexical and semantic capabilities of our language in the pedagogical process.
***Key words:** Pedagogical process, pedagogical technology, learning, application of appropriate methods, use of phonetic and lexical possibilities of language, speech enrichment*

**Аннотация.** Методы, применяемые в учебном процессе, воплощает в жизнь учитель. Эффективность обучения зависит от правильного выбора и применения метода обучения, а также от знаний, умений и навыков обучающихся. Теоретические методы, изучаемые посредством применения соответствующих методов, представляют собой системную работу, сочетающую в себе различные познавательные и практические действия, которые должны быть освоены учащимися.

В статье анализируются методы обучения как ключевой фактор использования фонетических, лексических и семантических возможностей нашего языка в педагогическом процессе.
***Ключевые слова:** педагогический просес, педагогическая технология, обучение, применение соответствующих методов, использование фонетических, лексических возможностей языка, обогащение речи*

Ulu öndər Heydər Əliyevin uzaqgörən siyasətini uğurla davam etdirən, dilçiliyimizə böyük qayğı göstərən Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin "Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsinə və ölkədə dilçiliyin inkişafına dair Dövlət Proqramı haqqında" 23 may 2013-cü il sərəncamı yeni mərhələdə Azərbaycan dilinin inkişaf etdirilməsi və bu istiqamətdə məqsədyönlü tədbirlərin həyata keçirilməsi sahəsində təhsil müəssisələri və mütəxəssisləri qarşısında mühüm vəzifələr qoymuşdur. Müasir dövrün tələblərini, konkret olaraq qloballaşma prosesinin fəlsəfəsini nəzərə alan Dövlət Proqramının məqsədi "Azərbaycan dilinin istifadəsi və tədqiqinə dövlət qayğısının artırılmasını, Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsini, ölkədə dilçilik araşdırmalarının əsaslı surətdə yaxşılaşdırılmasını, dilçiliyin aparıcı istiqamətlərində fundamental və tətbiqi tədqiqatların inkişafına yönəldilmiş yaradıcılıq səylərinin birləşdirilməsini və dilçiliyin müasir cəmiyyətin aktual problemləri ilə əlaqələndirilməsini təmin etməlidir [1].

Əlbəttə, hər hansı bir dilin qorunması və inkişafına yönəlmiş əsas məsələlərdən ən başlıcası həmin dilin tədris olunması, öyrədilməsidir. Qloballaşan dünyada milli dillərin qorunması, onların perspektivliyinin müəyyənləşdirilməsində tədris prosesi mühüm rol oynayır. Dil tədris prosesində yalnız ünsiyyətə xidmət etmir, müxtəlif fənlərin mənimsənilməsi, şagirdlərin hərtərəfli inkişaf etmiş əsl vətəndaş kimi formalaşmasında ana faktor kimi çıxış edir. Görkəmli yazıçımız Y.V. Çəmənzəminli "Dil məsələsi" adlı məqaləsində yazırdı: "Dil çirklik sevməz, zor və güc də qəbul etməz. Dil öz kökü üstə bitər, qalxar, qol-qanad açar. V. Humbold dili xalq ruhunun sanki xarici təzahürü hesab edirdi. O yazmışdı: "Xalqın dili onun ruhudur və xalqın ruhu onun dilidir – bundan da güclü olan eynilik təsəvvür etmək çətindir" [6, s.5-21].

Dilin fərdlər (şagirdlər) tərəfindən mənimsənilməsi də obyektiv reallıqla, sözlə, mətnlə, faktlarla bağlı olmalıdır. Sözün yalnız məzmunla tamamlanması azdır, həm də qrammatik forma şagirdlər tərəfindən real hadisə və obyektiv varlığın münasibətləri kimi dərk edilməlidir. Nə qədər ki, idrak prosesi təcrübəyə qayıtma və idrakın nəticələrinin praktikada yoxlanması ilə başa çatır, dilin təlimi elə qurulmalıdır ki, onun vahidi ( söz, cümlə, mətn) həqiqətən şagirdlərin ictimai və fərdi təcrübəsində, əmək, oyun və digər yaradıcı fəaliyyətində işlədilsin. Fəaliyyətin bu növlərində yalnız dil üzrə bilik deyil, həm də şagirdlərin dil (nitq) bacarıq və vərdişlərindən istifadə olunmalıdır. Bütün dil məşğələləri – oxu və yazı təlimi, qrammatika və orfoqrafiyanın öyrədilməsi, lüğətin zənginləşdirilməsi və fəallaşdırılması, şifahi və yazılı nitqin inkişafı ona xidmət etməlidir. Şagirdlər təcrübədə dilin sosial rolunu və təbiətini dərk etməli, onun vasitələrinə yaxşı yiələnməlidirlər. Dil vasitələrinin öyrənilməsi təfəkkürün quruluşunun təkmilləşdirilməsi, fikrin yüksək səviyyədə dəqiq, obrazlı, məntiqi və rabitəli çatdırılması vasitəsi olmalıdır. Şagirdləri düşünmək, axtarmaq vəzifəsi ilə qarşılaşdıran metodlar onları qaydaları mexaniki əzbərləməyə deyil, şüurlu mənimsəməyə təhrik edir. Bunun üçün sinifdə canlı situasiyanın, şagirdlərin fəallığının təmin olunmasına çalışılmalıdır.

Dilin qrammatik quruluşunun mükəmməl öyrədilməsi üçün şagirdlərin cümlənin tərkibi ilə tanış olmaları vacibdir. Hələ ibtidai siniflərdə cümlənin qurulması üzrə işin aparılması, başqa sözlə, cümlənin təhlili və tərkibinin öyrədilməsi vacibdir. Bunun üçün şagirdlər dil üzərində müşahidə aparmağı, nitqin bir-birinin ardınca ayrı-ayrı sözlərdən ibarət olduğunu başa düşməlidirlər. Bu iş həm də şagirdlərin nitq inkişafı, əqli inkişafı baxımından faydalıdır [ 2, s.71].

Morfologiya və sintaksis üzrə biliklər qarşılıqlı əlaqədə öyrədilməlidir. Belə ki, morfologiyanın tədrisində sintaksisin mənimsənilməsinə zəmin hazırlanmalı, sintaksisin tədrisində isə şagirdlərin morfologiyadan aldıqları biliklər təkrarlanmalı, möhkəmləndirilməlidir. Başqa sözlə desək, bunlar sintaksisin mənimsənilməsi üçün əsas olmalıdır.

Dilçi alimlərdən Ə. Əfəndizadə, Ə. Kəlbəliyev, H. Əhmədov, S.A. Vahidov və V.T. Qurbanov yuxarı siniflərdə "Sintaksis", "Söz birləşməsi" və "Cümlə" anlayışlarının formalaşdırılması məsələlərini şərh edirlər. Bununla belə məktəb təcrübəsində sözlə cümlə, söz birləşməsi ilə cümlə arasındakı fərqin müqayisə əsasında şagirdlərə başa salınmasını göstərir, cümlədə sözlər arasındakı əlaqələri müəyyənləşdirir, cümlə üzvlərinin və eləcə də mürəkkəb cümlələrin tədrisi metodikasını verirlər [3, s.147].

Sintaksisin tədrisində nəzəri biliklərin verilməsi şagirdlərin idrak prosesində mücərrədləndirmənin əhəmiyyətini yüksəldir. Sintaksisdən anlayışların mənimsənilməsini intensivləşdirməklə, onların praktik çalışmalardan əqli nəticələr çıxarmaq bacarıqlarını inkişaf etdirir, təfəkkürünün ümumiləşdirmə imkanlarını genişləndirir.

Şagirdləri düşünmək, axtarmaq vəzifəsi ilə qarşılaşdıran metodlar onları qaydaları mexaniki əzbərləməyə deyil, şüurlu mənimsəməyə təhrik edir. Bunun üçün sinifdə canlı situasiyanın, şagirdlərin fəallığının təmin olunmasına çalışılmalıdır. Sintaksisin tədrisində problemli metoddan istifadə şagirdlərin idrak fəaliyyətini artırmaqla tədris materialının mənimsənilməsini intensivləşdirir. Azərbaycan dilindən sintaksis təliminin məzmununun, şagirdlərə veriləcək bilik, bacarıq və vərdişlərin, həmçinin və bu sahədə aparılacaq işlərin əsas istiqamətlərinin müəyyənləşdirilməsi metodik cəhətdən böyük əhəmiyyət kəsb edir.

Sintaksisin dərindən mənimsənilməsi tədris materiallarının düzgün seçilməsindən çox asılıdır. Ona görə də seçilən söz birləşmələri, cümlələr və mətnlər həm linqvistik, həm də pedaqoji (metodik) ədəbiyyatın tələblərinə müvafiq sürətdə sistemlə həyata keçirilməlidir.

Sintaksisin tədrisi Azərbaycan dilinin, demək olar ki, bütün sahələri (orfoepiya, leksika, morfologiya, üslubiyyat) ilə əlaqələndirilməlidir.

Sintaksisin morfologiya ilə əlaqəsi isə bütün mövzuların tədrisində yaddan çıxarıla bilməz. Sintaktik əlaqələri öyrənərkən şəxs, kəmiyyət və hal şəkilçiləri barədə bəzi məlumatları xatırlamadan iş görmək mümkün deyildir. Bütün cümlə üzvləri tədris edilərkən bunların ifadə vasitələrindən bəhs edilməlidir. Bunsuz cümlə üzvləri ilə nitq hissələri, cümlə üzvləri ilə cümlə üzvü olmayan sözlər öyrədilə bilməz. Köməkçi nitq hissələri isə əslində sintaksissiz mümkün deyildir. Bunlar cümlə ilə bilavasitə bağlıdır.

Sintaktik məfhumları çatdırarkən müəllim, ilk növbədə, çətinlikləri əvvəlcədən görməli və izahatını, praktik işlərini; əsasən, bu çətinliklərin açılmasına yönəltməlidir. Şagird nəyi qarışdıra bilər və nə üçün? Bu qarışmanın qarşısını almaqda şagirdə nə kömək edə bilər? Müəllim hər mövzunu tədris edərkən bu iki suala cavab verməyə hazır olduqdan sonra, sinfə daxil ola bilər. Əks təqdirdə o, 45 dəqiqədən səmərəli istifadə edə bilməyəcəkdir.

Gələcəkdə cümlənin üzvlərə ayrılmasında çətinliklə qarşılaşmamaq sintaktik əlaqələrin yaxşı öyrənilməsindən çox asılıdır. Əlbəttə, ilk növbədə, şagird cümlədəki sözlər arasında tabesizlik və tabelilik əlaqəsinin nə olduğunu anlatmalıdır. Lakin əsas çətinlik uzlaşma, idarə və yanaşma əlaqələrinin mahiyyətini çatdırmaqdan ibarətdir. Uzlaşma əlaqəsindən bəhs edən müəllim, ilk növbədə, uzlaşma-şəxsə və kəmiyyətə görə uzlaşma nə deməkdir və bu hansı sözlər arasında ola bilər? sualına əyani şəkildə cavab verməlidir. Müəllim burada istər–istəməz şagirdlərin morfologiyadan qazandıqları bilikləri yada salmalıdır. Şagirdlərin diqqəti xarakterik misallara cəlb edilir və onlara aşağıdakı kimi suallarla müraciət olunur: Tabeedici söz hansıdır? Bəs tabe söz hansıdır? Tabeedici söz hansı şəxsi bildirir? Bəs tabe söz hansı şəxsi və hansı kəmiyyəti bildirir? Burada şəxs və kəmiyyət nə ilə ifadə olunmuşdur? Nə üçün söz filan şəxsdə və filan kəmiyyətdə işlənmişdir? Bütün bu suallara cavablar aldıqdan sonra, şagirdlər uzlaşma əlaqəsinin tərifini özləri deyə bildikləri və bunun mahiyyətini şüurlu surətdə anladıqları üçün yaddan çıxarmazlar və uzlaşma əlaqəsi ilə bağlanmış sözləri seçməkdə çətinlik çəkməzlər.

İdarə əlaqəsindən danışarkən idarə etmək sözünün buradakı mənasının izahından işə başlamaq lazımdır. Burada idarə edən hansı sözdür? Bunlardan hansı tabeedici, hansı tabe söz sayılır? Burada idarə etmək dedikdə nə başa düşürsünüz? Bəs burada tabeedici sözün tələbi ilə tabe söz ismin hansı halında işlənmişdir? Bu söz başqa halla işlənə bilərdimi? Bəs, məsələn, “yazıram” sözü tabeedici söz olsa, tabe sözün hansı halda işlənməsini tələb edərdi? Şagirdlər müxtəlif variantlı cavablar verirlər. Bütün misallar təhlil edilir.

Bu baxımdan Azərbaycan dilinin sintaksisi sahəsində dəyərli tədqiqat əsərlərinin və dərsliklərin müəllifi kimi tanınan Qəzənfər Kazımovun fikirləri böyük maraq doğurur. O, aktual üzvlənmə və mətn məsələsindən bəhs edərək yazır ki, əgər dilin kommunikativlik imkanları, dil və nitq arasında mövcud olan sintaqmatik və paradiqmatik münasibətlər işlənərsə, müasir Azərbaycan ədəbi dilinin sintaksisi tamamilə yenidən işlənmiş olar. Professional sintaksis mütəxəssisinin bu fikrində böyük həqiqət var.

Q. Kazımovun gəldiyi son nəticə belədir: "Daim belə bir paradoks meydana çıxır: cümləni bu qədər mübtəda və xəbərə ayırmağın, heç bir praktik əhəmiyyəti olmayan, insanın maddi-mənəvi inkişafında heç bir əməli rolu olmayan baş və ikinci dərəcəli üzvlər bölgüsünün yaradılması və ikinci sinifdən başlayaraq şagirdlərə öyrədilməsi hansı məntiqi zəminlə bağlıdır? İnsan bunun faydasını harada və nə zaman görməlidir?

Lakin nitqin kommunikativ mahiyyəti nəzərə alındıqda dilin bütün elementləri hərəkətə gəlir və öz əhəmiyyətini göstərir. Bizim fikrimizcə, Azərbaycan dili sintaksisinə aid tədqiq və araşdırmaları, xüsusən sintaksis dərsliklərini bu istiqamətə yönəltməliyik" [5.s.7].

Sintaksis təlimi dilin yüksək səviyyələrindən olmaqla, Azərbaycan dilinin bütün sistemini, mürəkkəb və rəngarəng əlaqələrini və zahiri təbiətini mənimsəməyə imkan verir. Qrammatika üzrə məşğələlərin düzgün təşkili, qrammatik qayda və qanunların öyrənilməsi və müqayisəsi, ümumiləşdirilməsi üzrə aparılan işlər şagirdlərdə təlimedici, tərbiyələndirici və inkişafetdirici təsir göstərir.

**Problemin aktuallığı.** Tədris prosesində tələbələrin aktiv iştirakını təmin edir, passivliyi aradan qaldırır, nitqi zənginləşdirir, çevikliyi artırır.

**Problemin elmi yeniliyi.** Qrammatikanın imkanlarından istifadə auditoriyanı daha effektiv idarə edərək tələbələri dərsə cəlb etmək imkanı yaradır.

**Problemin praktik əhəmiyyəti**. Qrammatikanın imkanlarından düzgün istifadə tələbə və öyrənənlərin rabitəli nitq vərdişlərinə yiyələnməsi üçün praktik əhəmiyyət kəsb edir.

**Ədəbiyyat**


1. Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsinə və ölkədə dilçiliyin inkişafına dair Dövlət Proqramı // http:president.az/articles/7744.
2. Balıyev H. Azərbaycan dilinin tədrisi metodikasından mülahizələr. Bakı, 1978.
3. Əfəndizadə Ə., Kəlbəliyev. Ə, Əhmədov H., Vahidov S.A., Qurbanov V.T.. Orta məktəbdə Azərbaycan dilinin tədrisi metodikası. -Bakı: Maarif, - 1975.
4. Фомичева О.А. Работа под словосочетанием и предложением в начальных классах. -Москва: Просвещение, -1961.
5. Kazımov Q.Ş. Müasir Azərbaycan dili. -Bakı, 1998, 2004.
6. Звегинцев В.А. История языкознания XIX- XX веков в очерках и извлечениях, часть II, -Москва, 1965.


**Redaksiyaya daxil olub:**20.05.2025

*UOT 372.891*

***Mirvari İdris qızı Verdiyeva***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin Azərbaycan coğrafiyası və coğrafiyanın tədrisi texnologiyası kafedrasının dosenti, pedaqogika üzrə fəlsəfə doktoru*
*https://orcid.org/0000-0002-6724-0581*
*https://doi.org/10.69682/arti.2025.92(3).117-121*
*E-mail: mirvari.verdiyeva@ adpu.edu.az*

# COĞRAFİYANIN TƏDRİSİNDƏ DİYARŞÜNASLIQ İŞLƏRİNİN TƏŞKİLİNİN ƏHƏMİYYƏTİ

***Mirvari Idris Verdiyeva***
*doctor of philosophy in pedagogy*
*asociate professor of the department of Geography of Azerbaijan and technology of teaching ceography at the Azerbaijan State Pedagogical University*

# THE IMPORTANCE OF ORQANIZING REGIONAL STUDIES IN THE TEACHING OF GEOGRAPHY

***Мирвари Идрис гызы Вердиева***
*доцент кафедры географии Азербайджана и технологии преподавания Географии Азербайджанского Государственного Педагогического Университета, доктор философии по педагогике*

# ВАЖНОСТЬ ОРГАНИЗАЦИИ КРАЕВЕДЧЕСКИХ РАБОТ В ПРЕПОДАВАНИИ ГЕОГРАФИИ

**Xülasə.** Coğrafiya həyat elmi olduğundan bilik və bacarıqların müstəqil mənimsədilməsində diyarşünaslıq işlərinin əhəmiyyəti əvəzolunmazdır. Tədris zamanı istənilən mövzuya uyğun diyarşünaslıq işləri təşkil etmək mümkündür. Coğrafiya təbiəti öyrədir, müşahidə isə coğrafiyanın əsasını təşkil edir. Diyarşünaslıq işləri şagirdlərə mövcud olduğu təbiəti öyrənməyə, coğrafi müşahidələr aparmağa imkan verir. Mövzuların tədrisi zamanı yaradıcı təşkil olunmuş diyarşünaslıq işləri şagirdləri müşahidə aparmağa, coğrafi hadisə və prosesləri tədqiq etməyə əlverişli şərait yaradır.
***Açar sözlər:*** *diyarşünaslıq işləri, coğrafi müşahidə, müşahidənin təşkili, ekskursiya, coğrafi tədqiqat, kameral müşahidə, vizual müşahidə*

**Abstract.** Geography is a science of life, which is why the importance of local studies in the independent acquisition of knowledge and skills is invaluable. During the teaching process, it is possible to organize local studies relevant to any topic. Geography teaches about nature, and observation forms the foundation of geography. Local studies enable students to explore existing nature and conduct geographical observations. Creatively organized local studies during the teaching of topics create favorable conditions for students to carry out observations and investigate geographical phenomena and processes.
***Keywords:*** *local history, geographical observation, organization of observation, excursion, geographical research, chamber observation, visual observation*

**Аннотация.** География – это наука о жизни, поэтому значение краеведческих работ в самостоятельном освоении знаний и навыков неоценимо. Во время обучения можно организовать краеведческие работы, соответствующие любой теме. География учит природе, а наблюдение составляет основу географии. Краеведческие работы предоставляют учащимся возможность изучать существующую природу, проводить географические наблюдения. Творчески организованные краеведческие работы во время изучения тем создают благоприятные условия для того, чтобы учащиеся проводили наблюдения, исследовали географические явления и процессы.

***Ключевые слова:*** *краеведческие работы, географическое наблюдение, организация наблюдения, экскурсия, географическое исследование, камерное наблюдение, визуальное наблюдение*

Müasir dövrdə müəllimdən şagirdləri tədqiqatçıya çevirmək tələb olunur. Fəal təlimin əsas xüsusiyyəti təlim prosesində müəllimin fasilitator, şagirdin tədqiqatçı roludur. Coğrafiya fənn kurikulumunun fəaliyyət xətlərinin əksəriyyəti şagirdin tədqiqatçı olmasını tələb edir. [1, s.11-12] Coğrafiyanın tədrisi metodikası elmi də müstəqil mənimsəniləcək mövzuların və əldə ediləcək bacarıqların diyarşünaslıq prisniplərinə əməl etməklə təşkilini ön plana qoyur. Bu məqsədlə ümumtəhsil məktəblərində işləyən coğrafiya müəllimləri tərəfindən diyarşünaslıq işlərinin necə aparılmasını araşdırmaq üçün müsahibə, anket sorğusu, müqayisə, nəzəri təhlil metodlarından istifadə edilmişdir.

**Müzakirə və təhlil**

Ümumtəhsil orta məktəblərində diyarşünaslıq işlərinin təşkili və aparılmasının vəziyyətini öyrənmək və çatışmazlıqları aşkara çıxarmaq üçün coğrafiya müəllimləri arasında sorğu keçirmək lazım gəlirdi. Sorğu zamanı müəllimlər diyarşünaslıq işlərinin təşkilini və şagirdlərin coğrafi tədqiqat işlərinə cəlb olunmalarına və işin necə həyata keçirmələrinə aydınlıq gətirməli idilər. Sorğu pedaqoji təcrübələr keçirilən məktəblərdə və təlim zamanı coğrafiya müəllimləri arasında keçirilmişdir. Sorğu zamanı müəllimlərin fikirlərini şəhər və kənd müəllimləri olaraq qruplaşdırmağın daha düzgün olması qənaətinə gəlinmişdir. Çünki şəhər və kənd mühiti müxtəlif olduğundan, diyarşünaslıq işlərinin təşkili, məzmunu və istiqamətləri [4] də mühitə uyğun və şagirdlərin imkanları nəzərə alınmaqla təşkil olunmalıdır. Əldə olunan informasiyalar obyektiv və subyektiv olmaqla qruplaşdırıldı.

Obyektiv səbəblər:

– coğrafiya fənnindən diyarşünaslıq işlərinin həyata keçirilməsi coğrafiya fənn kurikulumunun fəaliyyət xətlərində və alt standartlarda öz əksini tapmış olsa da, şagirdləri dərs zamanı çöl işlərinə və tədqiqat aparmağa sövq etmək mümkün deyildir. Çöl tədqiqatı-diyarşünaslıq işlərinin aparılması üçün rəsmi olaraq texnologiyası işlənib hazırlanmamışdır. Bu səbəbdən də diyarşünaslıq işləri istər kənd və istərsə də şəhər məktəblərində sinif şəraitində kameral müşahidələr aparılmaqla kifayətlənir;

– şagirdlərin əksəriyyəti aşağı siniflərdən müxtəlif fənlərdən kurslara cəlb olunduğundan, dərsdənkənar vaxtlarda onları diyarşünaslıq işlərinə cəlb etmək mümkün deyildir, çünki şagirdlərin zaman baxımından imkanı məhduddur;

– bəzi siniflərin alt standartlarında ekskursiyaların təşkili tələbi qoyulmuş olsa da, şagirdlərin ekskursiyalara cəlb olunması mexanizmi işlənib hazırlanmamışdır. Şagirdləri bir yerdən başqa yerə aparmaq üçün nəqliyyat xərcləri, rəhbərliyin və valideynlərin icazəsi tələb olunur. Bu da əksər hallarda mümkün olmur.

– ali pedaqoji məktəblərdən coğrafiya müəllimliyi ixtisasında tədris olunan fənlərin təcrübi işləri ləğv edildiyindən, müəllimlərin peşə hazırlığında tədqiqat işlərinin aparılması yalnız nəzəri biliklərin verilməsi ilə sonlanır. Tələbələr diyarşünaslıq işlərinə cəlb olunmadıqlarından müəllimlərin peşə hazırlığında nöqsanlar yaranmış olur;

– mumtəhsil məktəblərinin müəllimləri diyarşünaslıq işlərinin aparılması texnologiyası sahəsində kifayət qədər bilik və bacarıqlara malik deyillər.

Subyektiv səbəblər:

– ümumtəhsil orta məktəbin coğrafiya müəllimlərinin diyarşünaslıq işlərinə məsuliyyətsiz yanaşması halları müşahidə olunur;

– müəllimlər diyarşünaslıq işlərinə aid bilik və bacarıqlarını təkmilləşdirəcək təlimlərə cəlb olunmurlar;

– valideynlər və uşaqlar əsasən coğrafiya fənninə nədənsə ikinci dərəcəli fənn kimi baxırlar və diyarşünaslıq işlərinə cəlb edilmənin əhəmiyyətli olduğunu lazım bilmirlər.

Bütün bu çatışmazlıqların aradan qaldırılmasının yeganə həlli yolları ondan ibarətdir ki,

dövlət səviyyəsində coğrafiyanın həyatı bir fənn olduğunu qəbul edərək, rəsmi şəkildə diyarşünaslıq işlərinin və ekskursiyaların təşkilinin məcburi olmasına və tətbiqi texnologiyasının işlənməsinə, keçirilməsinə güclü nəzarətin təşkilinə aid sənədlərin qəbul edilməsi və həyata keçirilməsidir.

Diyarşünaslıq işlərinin həyata keçirilməsi və ekskursiyaların təşkil edilməsi [7, s.314] şəhər və kənd məktəblərində müxtəlif anlam kəsb edir. Məsələn: şəhər məktəblərində müəllimlər şagirdləri görkəmli meydanlara və ya muzeylərə aparırlar. Bu zaman şagirdlər heç bir tapşırıqları icra etməyə cəlb edilmirlər. Yalnız gedib, baxış keçirib geri dönürlər. Kənd məktəblərində təbiətin qoynuna aparılan şagirdlər isə gəzintiyə gedirlər. Müəllim əvvəlcədən şagirdləri cütlərə və ya qruplara bölərək heç bir tapşırıq vermir. Şagirdlər təbiətin qoynunda sağlamlıq üçün əhəmiyyətli olan gəzintiyə cəlb edilirlər. Lakin şagirdlər şəhər və kənd mühitində diyarşünaslıq işləri deyə, mövzulara uyğun, bilik və bacarıq əldə etmək məqsədi ilə işləri həyata keçirmirlər. Halbuki şagirdlər əvvəlcədən bilməlidir ki, ekskursiya zamanı hansı əraziyə gedəcəklər, orda nə kimi işləri icra edəcəklər, geri dönəndə necə təqdimat hazırlayıb təqdim edəcəklər. [2] Bütün bunları bilməyən şagird getdiyi ərazini və ya məkanı yalnız bir mühit kimi yaddaşında saxlayacaq. Lakin əldə etdiyi coğrafi biliyi və bacarığı dərk etməyəcək.

Coğrafiya ixtisası müəllimliyinin peşə bacarıqları elə səviyyədə olmalıdır ki, müəllim diyarşünaslıq işlərini planlaşdırmağı və həyata keçirməyi yüksək səviyyədə icra edə bilsin. [5] Bu zaman müəllim tədris edəcəyi və reallaşdıracağı alt standartların təlim nəticələrini müəyyən edərkən diyarşünaslıq işlərinin məzmununu, vaxtını, şagirdlərin əldə edəcəyi bilik və bacarıqları və işin planını əvvəlcədən müəyyən etməlidir. İş zamanı şagird yaşadığı mühitdə mövcud olanların əhatəsində olduğunu əqli düşüncəsi ilə dərk etməlidir və təbiətə mühafizəkarcasına yanaşmağı bacaran vətəndaş kimi formalaşmalıdır. Diyarşünaslıq işlərini planlaşdıran zaman [3] müəllim gediləcək ərazidə şagirdlərin əməl edəcəkləri “təhlükəsizlik qaydaları”nı [6, s. 206] da tərtib edib, əvvəlcədən şagirdlərin maariflənməsini həyata keçirməlidir. Məsələn:

a) şəhər məktəbi üçün. “Tarix-diyarşünaslıq müzeyinə ekskursiya”.

Təhlükəsizlik qaydaları: – ekskursiya zamanı özünüzlə kənar şəxsləri gətirməyin!

– muzeyə daxil olarkən əməkdaşların məlumatlarına diqqətlə qulaq asın və təlimatlardan kənara çıxmayın!

– bələdçinin dediklərini diqqətlə dinləyin və qeydlərinizi aparın!

– eksponatlara əllə toxunmaq olmaz!

– muzeydə şəkil və ya video çəkərkən icazə alın və bir-birinizə mane olmayın!

– muzeyin salonlarında hərəkət edərkən qrupdan aralanmayın!

– muzeydən çıxarkən əməkdaşlara təşəkkür etməyi unutmayın!



***Şəkil 1. Nənələrin əl işlərindən ibarət müxtəlif eksponatlar***

Tapşırıq: Tarix-diyarşünaslıq muzeyini tədqiq edin!

Plan: – muzeyin tarixini öyrənin!

– muzeyin yaradılması məqsədlərini və əhəmiyyətini müəyyən edin!

– muzeyin eksponatlarının tarixi və əldə edilmə mənbələrini öyrənin!

– muzeyin eksponatlarının turizm baxımından əhəmiyyətini şərh edin!

– muzey haqqında təəssüratlarınızı qeyd edin!

b) kənd məktəbi üçün. “Bataqlıq əraziyə ekskursiya”.

– əraziyə müəllimdən əvvəl getmək olmaz, sinif yoldaşlarınızla birlikdə, müəllimin rəhbərliyi altında hərəkət edin!

– ekskursiya müddətində tanıdığınız bitkiləri yemək, böcəklərə əllə toxunmaq olmaz!

– müəllimin getdiyi cığırla gedin və kənara çıxmayın!

– sulu sahələrlə hərəkət etməyin, bataqlıq dərinləşə bilər və təhlükə yaranar!

– tədqiqat zamanı müəllimin göstərişlərinə diqqətlə əməl edin və həyatınızı qorumağı unutmayın!

– bataqlıq güllərini qoparmağa çalışmayın, bitkini çəkərkən sürüşüb bataqlığa düşə bilərsiniz!

– geri dönərkən müəllimdən ayrılmayın!

Tapşırıq: – Ətraf ərazidə yaranmış bataqlığı tədqiq edin!

Plan: – bataqlığın kəndin hansı ərazisində yerləşdiyini müəyyən edin və cəhətlə göstərin, məsafəni addımla ölçün!

– bataqlığın enini və uzunluğunu gözəyarı təyin edin!

– bataqlığın yerləşdiyi ərazinin coğrafi təsvirini verin!



*Şəkil 2. Heyvanat aləminin araşdırılması*

– bataqlığın yaranma səbəblərini müəyyənləşdirin!

– bataqlıqda bitən bitkilərin növlərini araşdırın və şəklini şəkin!

– gördüyünüz və səsini eşitdiyiniz bataqlıq heyvanlarını müəyyən edin!

– bataqlığın mövcudluğunu və ya otların, kolların basması nəticəsində quruyacağını proqnozlaşdıraraq perspektivlərini qeyd edin!

Müəllim çöl işləri zamanı işin uğurlu aparılması üçün şagirdləri cütlərə bölməlidir. Hər bir cütün bataqlığın hansı tərəfində dayanıb verilən tapşırığı icra etməsinə şərait yaratmalıdır. Çünki cütlərlə işləmək şagirdlər üçün darıxdırıcı olmur və çətinlik çəkərkən bir-birlərinə kömək edirlər, müqayisəli şəkildə işlərini yerinə yetirirlər. İş zamanı müəllim operativ olmaqla cütlərə yaxınlaşıb, işin gedişinə, şagirdlərin təhlükəsizliyinə nəzarət etməlidir, lazım gəldikdə onların suallarını cavablandırmalı və işin istiqamətini axara yönəldəcək göstərişlər verməlidir. İş bitdikdən sonra şagirdləri bir yerə toplayıb sağ-salamat geri dönmələrini təmin etməlidir.




*Şəkil 3. Toplanmış kolleksiyaların etiketləşdirilməsi*

Diyarşünaslıq işləri ilk növbədə şagirdlərə nəzəri biliklərini tədqiqat zamanı görəcəyi işlərə tətbiq etməsinə imkan verir. Şagirdlər dərslikdən əldə edə bilmədiyi yeni coğrafi informasiyaları şəxsi fəaliyyəti zamanı qazanır və tədqiqatçı bacarığı inkişaf edərək təkmilləşir. Yeni coğrafi bacarıqlar əldə edir. Ətraf mühiti daha mükəmməl dərk edir və şəxsiyyətyönlü formalaşır.

Yuxarıda deyilənlərə yekun vuraraq qeyd etmək olar ki, coğrafiyanın tədrisi zamanı mövzulara uyğun, şagirdlərin bilik və yaş səviyyəsini nəzərə almaqla, diyarşünaslıq işlərini həyata keçirmək olduqca vacibdir. Diyarşünaslıq işləri zamanı coğrafi bilik və bacarıq əldə etməklə yanaşı, şagirdlərin coğrafi dildə danışmasına, coğrafi mədəniyyətə sahib olmasına və coğrafi dünyagörüş qazanmasına əlverişli mühit yaradılır.

**Problemin aktuallığı.** Coğrafiyanın tədrisində diyarşünaslıq işlərinin aparılması mövzuların həyatla əlaqələndirilməsini və şagirdlərin tədqiqatçılıq qabiliyyətinin inkişafını təmin etdiyinə görə daima aktual olub. Bu gün də aktualdır.

**Problemin yeniliyi.** Məqalə coğrafi mövzularının həyatla əlaqələndirilməsinə həsr edildiyindən,

coğrafi bilik və bacarıqların müstəqil mənimsənilməsi üçün əhəmiyyətlidir.

**Problemin praktik əhəmiyyəti.** Məqalə coğrafiya müəllimlərinin, təcrübəçi müəllimlərin istifadəsi üçün faydalıdır.

**Ədəbiyyat**


1. Azərbaycan Respublikasının ümumtəhsil məktəbləri üçün coğrafiya fənni üzrə təhsil proqramı (kurikulumu) (VI-XI siniflər). -Bakı, 2013, -75 c. (Səh.11-12)
2. Долженко Г.П. Экскурсионное дело: Учебное пособие. - 3-е изд., испр. и доп. - М.; Ростов н/Д : Март, -2008.
3. Историческое краеведение/под ред. Г.Н. Манюшина. – М.: Просвещение, -2005. – 348 с.
4. Краеведение / Под ред. А.В. Даринского. – М.: Просвещение, -1987.
5. Кукушкина Е.И. Мировоззрение, понятие, практика / Е. И. Кукушкина, Е. Б. Логунова.–М.: Просвещение, -2007. – 251 с
6. Verdiyeva M.İ., Coğrafiyanın tədrisində diyarşünaslıq prinsipi, magistrantlar üçün dərs vəsaiti. -Bakı, ADPU-nun mətbəəsi, -2021. -241 s.
7. Verdiyeva M.İ., Coğrafiyanın tədrisi metodikası, ali pedaqoji məktəblər üçün dərslik / M.İ. Verdiyeva. -Bakı: ADPU-nun mətbəəsi, -2022. -366 s.


**Redaksiyaya daxil olub:** 02.05.2025.

# *FİZİKANIN TƏDRİSİ METODİKASI*
# *METHODOLOGY OF TEACHING PHYSICS*
# *МЕТОДИКА ПРЕПОДАВАНИЯ ФИЗИКИ*

*UOT 53*

***Vidadi Ömər oğlu Orucov***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosenti,*
*pedaqogika elmləri doktoru*
*https://orcid.org/0000-0002-8589-2364*
*https://doi.org/10.69682/arti.2025.92(3).122-125*
*E-mail: vidadi_orucov@mail.ru*

## FİZİKA TƏHSİLİNDƏ SÜNİ İNTELLEKTİN DİDAKTİKASI: YENİ YANAŞMALAR

***Vidadi Omar Orucov***
*associate professor*
*at Azerbaijan State Pedagogical University*
*deoctor of pedagogical sciences,*

## DIDACTICS OF ARTIFICIAL INTELLIGENCE IN PHYSICS EDUCATION: NEW APPROACHE

***Видади Омар оглы Оруджов***
*доцент*
*Азербайджанского Государственного Педагогического Университета,*
*доктор педагогических наук*

## ДИДАКТИКА ИСКУССТВЕННОГО ИНТЕЛЛЕКТА В ФИЗИЧЕСКОМ ОБРАЗОВАНИИ: НОВЫЕ ПОДХОДЫ

**Xülasə:** Məqalədə fizika təhsilində süni intellektin rolu və onun tədris prosesinə gətirə biləcəyi yeniliklər araşdırılır. Fizika təhsilinin 21-ci əsr bacarıqları ilə uyğunluğu, müəllimlərin dəyişən pedaqoji rolları və texnologiya ilə interaktiv, tədqiqat yönümlü təlimin təşviqi vurğulanır. Süni intellektin təhsildə gələcək perspektivləri və bu sahədə yeni tədqiqat istiqamətləri də təqdim olunur.
***Açar sözlər:*** *informasiya cəmiyyəti, süni intellekt, 21-ci əsr bacarıqları, fizika təlimi, yeni pedaqoji bacarıqlar.*

**Abstract.** The article explores the role of artificial intelligence (AI) in physics education and the innovations it can bring to the teaching process. It highlights the alignment of physics education with 21st-century skills, the evolving pedagogical roles of teachers, and the promotion of interactive, research-based learning through technology. Future perspectives on AI in education and new directions for research in this field are also discussed.
***Keywords:*** *information society, artificial intelligence, 21st-century skills, physics education, new pedagogical skills.*

**Аннотация.** В статье рассматривается роль искусственного интеллекта (ИИ) в преподавании физики и возможные инновации, которые он может привнести в учебный процесс. Отмечается соответствие физического образования навыкам XXI века, изменяющиеся педагогические роли учителей и продвижение интерактивного, исследовательского обучения с помощью технологий. Также обсуждаются перспективы ИИ в образовании и новые направления исследований в этой области.
***Ключевые слова:*** *информационное общество, искусственный интеллект, навыки XXI века, обучение физике, новые педагогические навыки.*

Fizika təhsilində süni intellektin tətbiqi tədris prinsiplərini və yanaşmalarını yeni səviyyəyə qaldırır. İnformasiya cəmiyyətində İKT-nin geniş yayılması təhsildə ciddi dəyişikliklərə səbəb olur. Süni intellekt ənənəvi metodları yeniləyərək fizika dərslərini daha interaktiv, fərdiləşdirilmiş və dərin öyrənmə imkanları ilə zənginləşdirir. Bu, təkcə tədris prosesini deyil, həm də təhsil iştirakçılarının öyrənməyə yanaşmasını köklü şəkildə dəyişir.

Azərbaycan Respublikasında informasiya cəmiyyətinin inkişafına dair Milli Strategiyanın həyata keçirilməsi üzrə 2016-2020-ci illər üçün Dövlət Proqramında da vurğulanan nəticələrdən biri: "informasiya cəmiyyəti şəraitində vətəndaşların informasiya əldə etmək hüquqlarının təmin olunmasına hərtərəfli şərait yaradılması"[1] idi. İnformasiya texnologiyaları cəmiyyətin bütün sahələrinə güclü təsir göstərir və təhsildə fundamental dəyişikliklər yaradır. İnsanların əksəriyyəti bu texnologiyalardan istifadə edərək sosial, iqtisadi və mədəni həyatlarını qurur. Bu isə təhsilin məqsəd və məzmununun yenilənməsini, yeni təhsil modellərinin yaradılmasını zəruri edir.

"Google"nın araşdırmalar departamentinin direktoru və məşhur futurist Rey Kursveyl (Ray Kurzweil) 2005-ci ildə yazdığı "The Singularity Is Near" adlı kitabında yazır: "Süni intellektin, insana bənzər şəkildə mətnlə ünsiyyət qurması üçün tələb olunan Turinq testini 2029-cu ilə qədər keçməsi gözlənilir."[5, s.9] Daha sonra o, qeyd edir: "2029-cu ildə gözlədiyim Turing testindən keçmək bizi Beşinci Epoxaya aparacaq."[5, s.9]. Bu, o deməkdir ki, Turinq testini keçən süni intellekt, insan intellektini aşaraq, insanlardan daha ağıllı bir hala gələcəkdir.

Futurist Rey Kursveyl və başqalarına görə, 2045-ci ilə qədər süni intellekt insan intellektini aşaraq "singulyarlıq" mərhələsinə çatacaq. Bu mərhələdə texnologiya özünü təkmilləşdirməyə başlayır və sürətlə nəzarətdən çıxaraq cəmiyyətə dərin təsir göstərir. Fizika təhsilində süni intellektin tətbiqi bu prosesi sürətləndirir, tədrisdə fərdiləşdirilmiş, interaktiv və effektiv yanaşmaların yayılmasına şərait yaradır.

2024-cü il aprelin 23-də Rusiya Elmlər Akademiyasının Fəlsəfə İnstitutunda keçirilən seminarda fəlsəfə elmləri doktoru Vladimir Budanov çıxışında belə bir proqnoz vermişdir: "2037-2047-ci illər arasında "Böyük antropoloji keçid" baş verəcədir." [6] Bu keçid insanlığın texnoloji inkişafla əlaqəli fundamental dəyişikliklər yaşaması və yeni sosial, mədəni və əqli mühitə keçidini nəzərdə tutur. V. Budanovun açıqlamasına görə, bu dövr ərzində insanın bədən və zehninin mövcud potensialı dəyişəcəkdir. Süni intellektin və digər texnologiyaların cəmiyyətə inteqrasiyası ilə bağlı yeni mədəni mərhələlər yaşanacaqdır.

Fizika təhsilində süni intellektin tətbiqi "Böyük antropoloji keçid"in bir hissəsi kimi dəyərləndirilə bilər. Bu texnologiya yalnız tədris metodlarını deyil, bütövlükdə öyrənmə və təlimə yanaşmanı dəyişir. Şagirdlərə fərdi ehtiyaclara uyğun dərslər təqdim olunması, təhsildə daha çevik, şəxsiyyətyönlü və texnologiyaya əsaslanan yeni bir mərhələnin əsasını qoyur. Bu dəyişikliklər "Böyük keçid"in təhsildəki başlanğıcı kimi qiymətləndirilə bilər.

Süni intellekt (AI) təhsildə əsaslı dəyişikliklər yaradaraq, xüsusilə fizika kimi sahələrdə fərdiləşdirilmiş, interaktiv və əlçatan tədris imkanları təmin edir. AI müəllimləri bilik ötürən kimi deyil, dəstəkçi və rəhbər kimi yeni rola yönəldir, tədrisi daha effektiv və nəticəyönümlü edir. Fizika isə elmi-texniki inkişafın əsas sahələrindən biri kimi orta məktəb təhsilində aktual qalır və şagirdlərə analitik düşüncə və praktiki bacarıqlar qazandırır. Süni intellektin inteqrasiyası fizika dərslərini daha anlaşılan, praktik və mültidissiplinar edir, virtual simulyasiyalar vasitəsilə mürəkkəb mövzuların öyrənilməsini asanlaşdırır. Nəticədə, AI fizika təhsilində tədris prosesini yeniləyir və şəxsiyyətyönlü, maraqlı təhsil təcrübəsi yaradır. Fizika təhsili şagirdlərə elmi biliklərlə yanaşı, 21-ci əsrin tələb etdiyi kritik düşünmə, problem həll etmə və yaradıcı yanaşma kimi bacarıqları qazandırır. "21-ci əsr bacarıqları, 21-ci əsrdə yaşayacaq insanların cəmiyyətdə və iş yerlərində uğur qazanmaları üçün təhsil, iş adamları, alimlər və hökumət orqanları tərəfindən vacib hesab edilən bacarıq, qabiliyyət və öyrənmə metodlarını əhatə edir."[8]

Fizika dərslərində mürəkkəb mövzuların öyrənilməsi çətin ola bilər. Süni intellekt (AI) bu problemi interaktiv, fərdiləşdirilmiş və effektiv tədrislə həll edir. Virtual laboratoriyalar və simulyasiyalar (PhET, Labster) təhlükəsiz mühitdə təcrübə aparmağa imkan verir. AI şagird-

lərin fərdi öyrənmə sürətini izləyərək uyğun dərs planları hazırlayır (Khan Academy, Socratic), dərhal qiymətləndirmə və geri bildirim verir. Algodoo və Gizmos kimi vizual alətlər fizika qanunlarının başa düşülməsini asanlaşdırır. Adaptiv platformalar (Smart Sparrow, Knewton) şagirdlərin güclü və zəif tərəflərinə uyğun tapşırıqlar təklif edir.

Ulu Öndər Heydər Əliyevin "Mən dünyada müəllimdən yüksək ad tanımıram."[2, s.4] sözləri müəllim peşəsinin xalq və dövlət üçün əhəmiyyətini vurğulayan dərin bir fikirdir. Bu fikirlər müəllimin yalnız bilik ötürən yox, həm də gələcəyin vətəndaşlarını formalaşdıran və cəmiyyətin inkişafına rəhbərlik edən təhsil lideri olduğunu vurğulayır. Müəllimlər akademik biliklərlə yanaşı, sosial, emosional və etik inkişafı da təmin edir, gələcəyin peşəkarlarını yetişdirərək cəmiyyətin inkişafına töhfə verirlər. Təhsil alanlara aşılanmış dəyərlər və bacarıqlar cəmiyyətin gələcəyini müəyyən edir. Azərbaycan Respublikasında fasiləsiz pedaqoji təhsil və müəllim hazırlığı Konsepsiyası və Strategiyasında: "Müəllim yenilikçi, yaradıcı düşüncəyə malik olması" nın vacibliyi vurğulanır[3]. Bu təhsil sahəsində keyfiyyətin artırılması üçün əsas şərtlərdən biridir.

Ənənəvi müəllim rolu əsasən məlumat ötürmək idisə, indi müəllimlər daha çox dəstəkçi və rəhbər funksiyasını yerinə yetirir. Süni intellekt və rəqəmsal texnologiyalar müəllimlərə şagirdlərin fərdi inkişafını izləmək, çətinliklərini müəyyənləşdirmək və onlara fərdi yardım göstərmək imkanı verir.

Müəllimlər interaktiv və maraqlı öyrənmə mühitləri yaradaraq, simulyasiyalar və virtual laboratoriyalar vasitəsilə şagirdlərin fəal iştirakını təmin edir. Süni intellekt isə bu prosesdə müəllimlərin işini asanlaşdırır və tədrisin keyfiyyətini yüksəldir. Fizika müəllimləri yeni texnologiyalardan istifadə edərək şagirdlərin fəal iştirakını artırır və dərsləri daha cəlbedici edir.

Simulyasiyalar və vizuallaşdırmalar mürəkkəb mövzuların anlaşılmasını asanlaşdırır. Süni intellekt əsaslı alətlər müəllimlərə fərdi dərs planları hazırlamağa kömək edir və dərsləri şagirdlərin ehtiyaclarına uyğunlaşdırır. "Müasir dünya sürətlə inkişaf edir və buna paralel olaraq təhsil sistemi də dəyişir. Süni intellektin (Sİ) müəllimlə birgə istifadəsi təhsilin gələcək istiqamətlərindən biridir." [7] Süni intellekt fərdi öyrənmə proqramları yaradır, təlimin effektivliyini artırır və müəllimlə əməkdaşlıq edərək tədrisi optimallaşdırır.

Müəllimlər şagirdlərin fərqli öyrənmə tərzlərinə uyğun çevik metodlar tətbiq etməli, texnologiyadan faydalı istifadə üçün onlara rəhbərlik etməlidirlər. Sİ şagirdlərə öz tempində öyrənmə və praktika imkanı verir, müəllimlər isə bu alətlərin düzgün istifadəsini təmin edir. Eyni zamanda, müəllimlərin peşəkar inkişafı, əmək haqlarının və sosial təminatlarının yaxşılaşdırılması vacibdir. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyasında nəzərdə tulan çox saylı Strateji hədəflər və tədbirlərdən biri də: "Müəllim peşəsinin nüfuzunun artırılması üzrə dövlət siyasətinin inkişafı" kimi nəzərdə tutulurdu. [4]

Süni intellekt (Sİ) təhsildə müəllimin tərəfdaşı olaraq fərdi öyrənmə proqramları yaradır, tədrisi optimallaşdırır və şagirdlərin inkişafını dəstəkləyir. Gələcək təhsil insan intellekti ilə Sİ-nin vəhdətindən ibarət olacaq.

- Müəllimlər problemlə öyrənmə metodları ilə şagirdləri fiziki məsələləri həll etməyə yönəldir, Sİ isə fərdi tapşırıqlar təqdim edərək onların müstəqil işləməsinə şərait yaradır və şagirdlər dərhal geri bildirim ala bilərlər.
- AI əsaslı təlim şagirdlərin fərdi öyrənmə tempinə uyğun resurslar təqdim edir, onları müstəqil tədqiqatlara təşviq edir.
- Müəllimlər texnologiya ilə daha fəal rol oynayaraq, fərdi yanaşmalar tətbiq edir, interaktiv öyrənmə mühiti yaradır və təhsil təcrübəsini zənginləşdirirlər.

"XXI əsrin əvvəlinə qədər süni intellekt (həmçinin onun bütün prototipləri) son bir neçə onillikdə insan tərəfindən müəyyən edilmiş alqoritmlərlə işləyirdi. Süni intellekt yalnız son zamanlarda sürətlə inkişaf edərək özünü öyrənən alətə çevrildi. Bu, internetin sürətli inkişafı, onun böyük məlumatlarla zənginləşməsi və neyron şəbəkələrinin dövrünün başlanması ilə mümkün oldu..."[9] Süni intellekt təhsildə geniş tətbiq olunur və gələcəkdə tədrisin strukturunu dəyişdirərək fərdiləşdirilmiş, interaktiv və səmərəli öyrənmə imkanları yaradacaq. Əsas tədqiqat istiqamətləri:

– Fərdiləşdirilmiş tədris və avtomatik qiymətləndirmə-şagirdlərin fərdi ehtiyaclarına uyğun proqramlar və dərhal geri bildirimlə müəllimlərin iş yükünün azaldılması.

– İnteraktiv və praktik təlim – simulyasiyalar, oyunlar, virtual laboratoriyalar və AI

əsaslı fərdi dərs planları vasitəsilə real dünya təcrübələrinin təmin edilməsi.

– Müəllimlərin peşəkar inkişafı və dəstəyi – AI platformaları ilə təlim və tədris prosesinin səmərəli idarə olunması.

– Analitik düşüncə və problem həll etmə bacarıqlarının inkişafı, eləcə də qlobal təhsil resurslarına geniş çıxış imkanları

Süni intellektin təhsildə rolu gələcəkdə daha da genişlənərək, sistemlərin şəffaf, uyğun və effektiv olmasına şərait yaradacaq.

**Problemin aktuallığı**: Müasir dövrdə süni intellektin təhsilə inteqrasiyası tədris metodlarını zənginləşdirir, xüsusən fizika kimi analitik fənlərdə şagirdlərin tədqiqatçı və yaradıcı potensialını artırır. 21-ci əsr bacarıqları çərçivəsində müəllimlər yeni pedaqoji rollar və texnoloji biliklərə yiyələnməlidir. Süni intellektin didaktik tərəflərinin araşdırılması gələcək təhsil modellərinin inkişafında əhəmiyyətlidir.

**Problemin elmi yeniliyi**: Məqalədə fizika təhsilində süni intellektin tətbiqi ilk dəfə didaktik aspektdən sistemli şəkildə təhlil edilir. Yeni pedaqoji rollar, interaktiv tədris mühiti və şagirdlərin fəal öyrənmə strategiyalarının stimullaşdırılması kimi SI imkanları elmi əsaslarla araşdırılır. Həmçinin, süni intellektin təlim-tərbiyə prosesinə inteqrasiyasına dair yeni yanaşmalar və gələcək tədqiqat istiqamətləri təqdim olunur.

**Problemin praktik əhəmiyyəti**: Tədqiqat fizika təhsilində süni intellektin tətbiqi ilə müəllimlərin pedaqoji fəaliyyətini yeniləyir, tədrisi daha interaktiv, fərdiləşdirilmiş və effektiv edir. Süni intellekt şagirdlərin marağını artırır, fərdi yanaşmaları gücləndirir və tədrisin keyfiyyətini yüksəldir. Bu yanaşmalar həmçinin müəllim hazırlığı və kurikulumların təkmilləşdirilməsi üçün praktiki əsaslar yaradır.

**Ədəbiyyat**

1. Azərbaycan Respublikası Prezidentinin 2016-cı il 20 sentyabr tarixli 2345 nömrəli Sərəncamı.
2. Azərbaycan müəllimi. 2010. 10 dekabr, səh. 4.
3. Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2007-ci il 25 iyun tarixli 102 nömrəli qərarı
4. Azərbaycan Respublikası Prezidentinin 2013-cü il 24 oktyabr tarixli nömrəli Sərəncamı
5. Ray Kurzweil, *The Singularity Is Nearer*, 2024 s.9. chrome-extension://efaidnbmnnnibpcajpcglclefindmkaj /https://cdn.penguin.co.uk/dam-assets/books/9781847928290/9781847928290-sample.pdf
6. https://rossaprimavera.ru/news/760939cf
7. https://intboard.ua/ru/press-sluzhba/blog-intboard/uchitel-iskusstvennyy-intellekt-eto-budushcheye-obrazovaniya/
8. https://en.wikipedia.org/wiki/21st_century_skills
9. iskusstvennyy-intellekt-v-universitetskoy-didaktike-kak-vyzov-filosofii-obrazovaniya-i-professionalnoy-etike.pdf

**Redaksiyaya daxil olub:** 29.04.2025.

UOT 372.853

***Севиндж Хазай гызы Джалилова***
*доцент*
*Азербайджанского Государственного Педагогического университета*
*доктор философии по педагогике,*
*https://orcid.org/0000-0002-4753- 2835*
*https://doi.org/10.69682/arti.2025.92(3).126-132*
*E-mail: sevinjjalilova@yahoo.com*

## ПЕДАГОГИЧЕСКАЯ СТРАТЕГИЯ ИНТЕГРИРОВАННОГО ОБУЧЕНИЯ СТУДЕНТОВ ПЕДАГОГИЧЕСКОГО НАПРАВЛЕНИЯ ФИЗИКЕ

***Sevinc Xazay qızı Cəlilova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosenti,*
*pedaqogika üzrə fəlsəfə doktoru*

## PEDAQOJİ İSTİQAMƏTDƏ TƏHSİL ALAN TƏLƏBƏLƏRƏ FİZİKANIN İNTEQRATİV TƏDRİSİNİN PEDAQOJİ STRATEGİYASI

***Sevinj Xazay Jalilova***
*associate professor*
*Azerbaijan State Pedagogical University,*
*doctor of philosophy in pedagogy*

## PEDAGOGICAL STRATEGY OF INTEGRATED TEACHING OF PHYSICS TO STUDENTS IN PEDAGOGICAL PROGRAMS

**Аннотация.** В статье представлены результаты исследования, цель которого заключается в теоретико-методологической обосновании возможности и эффективности интегрированного обучения физики студентов с педагогической направленностью подготовки. Новизна исследования заключается в формулировании требований реализации компетентностного подхода, построенного на принципе гуманитарности, благодаря которым установлены направления педагогической стратегии интегрированного обучения студентов физике. Результаты исследования позволили выстроить структурную последовательность декомпозиции графы упорядочения содержательных линий дисциплины, что помогло создать систему содержания обучения в виде преобразованной матричной формы, обозначив иерархически упорядоченную структуру системы содержания и взаимосвязей в дисциплине. В образовательной практике результаты исследования могут быть использованы при тематическом планировании дисциплин с целью составления содержания обучения.
***Ключевые слова:*** *физика, интеграция, интегрированная практика, педагогическая стратегия*

**Xülasə.** Məqalədə pedaqoji istiqamətdə təhsil alan tələbələrə fizikanın inteqrativ tədrisinin mümkünlüyünün və effektivliyinin nəzəri-metodoloji əsaslandırılmasına yönəlmiş tədqiqatın nəticələri təqdim olunur. Tədqiqatın yeniliyi humanistlik prinsipinə, kompetensiyaya əsaslanan yanaşmanın həyata keçirilməsi üçün tələblərin formalaşdırılmasındadır. Bu tələblər əsasında fizikanın inteqrativ tədrisi üzrə pedaqoji strategiyanın istiqamətləri müəyyən edilmişdir. Tədqiqat nəticələri fənnin məzmun xətlərinin ardıcıllıqla qraf şəklində dekompozisiya edilməsinə imkan yaratmışdır. Bu isə öz növbəsində, məzmunlararası əlaqələri və iyerarxik strukturlaşdırmanı əks etdirən çevrilmiş matris formasında tədris məzmunu sisteminin yaradılmasına şərait yaratmışdır. Tədqiqat nəticələri tədris məzmununun hazırlanması məqsədilə fənlərin tematik planlaşdırılmasında istifadə oluna bilər.
***Açar sözlər***: *fizika, inteqrasiya, inteqrativ təcrübə, pedaqoji strategiya*

**Abstract.** The article presents the results of a study aimed at the theoretical and methodological justification of the possibility and effectiveness of integrated teaching of physics to students in pedagogical training programs. The novelty of the research lies in the formulation of the requirements for implementing a compe-

tence-based approach based on the principle of humanism. These requirements helped identify the directions of the pedagogical strategy for integrated teaching of physics to students. The results of the study made it possible to build a structural sequence of decomposing a graph of ordered content lines of the discipline. This, in turn, enabled the creation of a learning content system in the form of a transformed matrix, highlighting a hierarchically ordered structure of content and interconnections within the discipline. In educational practice, the research results can be used in thematic planning of disciplines to develop the learning content.
***Keywords**: physics, integration, integrated practice, pedagogical strategy*

**Постановка проблемы.** Развивающее образование, цель которого заключается в формировании компетентности будущих специалистов для успешной работы в конкретной производственной среде, базируется на самостоятельном обучении [6] и ориентировано на становление у студентов навыков творческого и научного мышления, решения нестандартных задач и принятия решений в чрезвычайных ситуациях [14]. Развивающее обучение выступает актуальным направлением в теории и практике образования, которое предполагает развитие познавательных, нравственных, физических способностей обучающихся посредством активизации их потенциальных возможностей, реализации учебной деятельности [2].

Концепция развивающего обучения возникла во многом в ответ на недостатки традиционной системы образования, ориентированной на передачу знаний без должного учета индивидуальных особенностей и образовательных потребностей обучающихся. Если суммировать идеи разных педагогов о развивающем обучении [2], то можно сделать вывод, что развивающее обучение предполагает создание условий, в которых обучающиеся могут всесторонне развивать свои способности, самостоятельно приобретать знания, критически мыслить и решать возникающие проблемы нестандартными способами. Разумеется, в этом случае во главу угла ставится подбор подходящих методов обучения и формирование адаптивной образовательной среды, позволяющей применять на практике принцип активности: обучающиеся должны быть вовлечены в процесс обучения, а не получать готовые знания, транслируемые педагогами.

В рассматриваемом контексте основными требованиями реализации компетентностного подхода на принципе гуманитарности являются:

1) междисциплинарность, то есть заимствование методов одной области знаний другой с объединением научных картин мира, что раскрывается в разных учебных дисциплинах [7];

2) ставка на коммуникативные качества, позволяющие обучающемуся как субъекту действительности устанавливать социальные отношения на основании развития его личностных свойств;

3) индивидуализация (составление индивидуального образовательного маршрута с учетом интересов и свойств личности, когнитивных возможностей каждого обучающегося);

4) профессиональная мобильность, предполагающая умение подстраиваться под требования рынка труда [4].

Таким образом, концепция развивающего обучения в контексте реализации компетентностного подхода открывает новые перспективы внедрения в образовательный процесс межпредметных задач [12]. Исследовательская гипотеза в данном контексте заключается в предположении о том, что повышение качества обучения физике студентов педагогического вуза возможно через решение межпредметных задач.

Исследователи отмечают [15], что благодаря подобному синтезу подходов можно выделить три направления педагогической стратегии интегрированного обучения студентов физике:

1) репродуктивное (интерес к обучению поддерживается предоставлением подходящих уровню знаний задач, постепенно ликвидируются пробелы в знаниях, активизируется самостоятельная деятельность по имеющемуся образцу);

2) продуктивное (учебная мотивация поддерживается за счет решения заданий средней сложности, происходит повторение,

закрепление ранее изученного материала для актуализации знаний перед новой информацией, стимулируется умение самостоятельного решения задач, в т.ч. с использованием учебного программного средства);

3) творческое (делается ставка на формирование новых вариантов учебных действий, инициируется выполнение задач повышенной сложности и творческих заданий с нестандартным подходом к решению) [14].

Применение междисциплинарного подхода позволяет:

1) организовывать наблюдение и своевременно фиксировать показатели результативности процесса подготовки студентов – будущих учителей физики с учетом положений личностно-ориентированного подхода;

2) осуществлять целенаправленное планирование работы студента и преподавателя, используя ресурсы систем мониторинга качества подготовки педагогов по физике к профессиональной деятельности [3];

3) организовывать разветвленную структуру управления учебно-познавательной и научно-исследовательской деятельности студентов в вузе с учетом принципов гибкости и многоуровневости [11].

Педагогическими условиями обеспечения междисциплинарности в образовательном процессе выступают:

1) установление взаимосвязи и преемственности учебных дисциплин, а также междисциплинарных связей с содержанием дисциплин-пререквизитов и постреквизитов, которые в совокупности формируют компетенции, предусмотренные рабочими программами [13];

2) разработка фондов оценивания инструменты для дисциплины с точки зрения междисциплинарной интеграции;

3) установление междисциплинарных связей через выполнение студентами компетентностно-ориентированных заданий, приближенных к условиям профессиональной деятельности, требующих поисковой самостоятельности и проявления креативности [8];

4) широкое использование в образовательном процессе активных методов обучения в соответствии с формируемыми компетенциями, современных образовательных технологий и различных инновационных форм организации обучения;

5) интеграция учебной и научно-исследовательской деятельности студентов [5].

**Методологические подходы для решения исследовательской проблемы.** Теоретико-методологические основы развивающего обучения были обоснованы выдающимся отечественным психологом Л.С. Выготским. Последователи ученого А.Н. Леонтьев, П.Я. Гальперин разработали психологическую теорию деятельности, в которой идеи Л.С. Выготского получили дальнейшее развитие. Внедрение развивающего обучения в начальной школе было осуществлено Л.В. Занковым, а позднее Д.Б. Элькониным и В.В. Давыдовым в практике организации экспериментальных школ.

Технология развивающего обучения базируется на обозначенной концепциях развивающего обучения, которая была З.И. Калмыковой, Е.Н. Кабановой, Г.А. Цукеран, И.С. Якиманской, Г.К. Селевко и другими исследователями. Идея концепции базируется на различных аспектах развития человека и определенных мотивационных компонентах.

**Исследовательская часть.** Говоря об интеграции в обучении, закономерно встает вопрос междисциплинарности, межпредметных связей как эквивалента взаимодействия между разными науками и образовательными областями. Междисциплинарные (межпредметные) связи дают возможность обучающимся рассмотреть изучаемые темы или проблемы с разных сторон, это дидактический инструмент интеграции. Интеграция предполагает реализацию взаимосвязей дисциплин на высоком уровне, причем уровень взаимосвязи дисциплин предметов определяется поставленными педагогом дидактическими задачами. Цель преподавателя в этой связи – обеспечить переход от внутрипредметных внутридисциплинарных связей к межпредметным междисциплинарным [9].

Междисциплинарный (межпредметный) подход к обучению подразумевает под собой объединение научного аппарата, методологии, концепций двух и более дисциплин или синтез преподавания самостоятельных (в привычных условиях традиционного

обучения) учебных предметов дисциплин. Становление у обучающихся профессионально-значимых знаний, умений, навыков, применение полученных в рамках учебных предметов и дисциплин информации выступают результатами реализации данного подхода.

**Цель исследования** заключается в установлении теоретико-методологических обоснований применения инструментов интегрированного обучения физики студентов педагогического направления подготовки.

**Система доказательства и научного обоснования.** Моделирование методической системы обучения физике студентов педагогических направлений предусматривает построение иерархической структуры содержания исследуемого процесса с упорядочиванием базы данных. Относительно условно, моделирование предусматривает поэтапную реализацию трех частей:

1) установление автономных тем, которые не обладают взаимосвязью остальными темами;

2) построение на основе базовых тем иерархической структуры, предусматривающей переходы с уровня на уровень в массиве тем;

3) организация древовидной структуры содержания обучения с установлением последовательностей в освоении базовых элементов, предусматривающей пошагово-вертикальное наращивание тем [10].

Структурная декомпозиция содержания процесса обучения предполагает упорядочение каждой базовой темы в цепочке взаимосвязанных тем. Таким образом, осуществляется обособление модулей дисциплины и введение в них автономных тем, опираясь на матрицу смежности и семантических взаимосвязей между темами, обусловленных преимущественно тезаурусом. Непосредственно модель построения содержания обучения на уровне в рамках создания учебной программы и тематического планирования отражена на рисунке 1.



Рисунок 1 – Процесс моделирования содержания обучения физике студентов педагогических направлений на базе принципа модульности обучения (составлено автором)

В контексте исследовательской цели**,** требуется формализация задач с использованием математической модели. Сказанное предусматривает определение условий, в рамках которых предполагается, что цели обучения сформулированы, а содержание представлено в виде конечного множества тем $T = (t_i)$, содержащего n компонентов. Заданное множество в таком случае может быть представлено в виде отношений частичного порядка $R = (t_i, t_j)$ / $t_i$ , $t_j$ € T, в которых освоение студентами темы $t_i$ предшествует изучение темы $t_j$.

В этом случае содержание обучения может быть представлено в виде логической структуры взаимосвязей в тематическом материале учебной информации S=<T, R> и граф G (T, R), обладающих свойствами замкнутых контуров.

Обозначим: C – матрица смежности орграфа G(T,R):

$$t_i \rightarrow t_j <=> c_{ij} = 1,$$

иначе $c_{ij} = 0.$

Далее введем четыре типа элементов содержания обучения S=<T, R> [3], представив следующим образом:

Первый тип $t_i$ - автономный:

$$\forall j \in [1..n]: (c_{ij} = 0) \wedge (c_{ji} = 0).$$

Второй тип $t_i$ - базовый:

$$\exists j \in [1..n]: (c_{ij} = 1) \wedge \forall k \in [1..n]: (c_{ki} = 0).$$

Третий тип $t_i$ - промежуточный:

$$\exists k, j \in [1..n]: (c_{ki} = 1) \wedge (c_{ij} = 1).$$

Четвертый тип $t_i$ – завершающий:

$$\exists k \in [1..n]: (c_{ki} = 1) \wedge \forall j \in [1..n]: (c_{ij} = 0).$$

Обозначим:

$T_1$ – множество автономных тем;

$T_2$ – множество базовых тем;

$T_3$ – множество промежуточных тем;

$T_4$ – множество завершающих тем;

В этом случае в $T_1$ включены темы, рассматриваемые как резервные, в $T_2$ - базовые темы, составляющие содержательный базис дисциплины. При таком представлении формализация задачи принимает следующую форму:

$$T = T_1 \cup T_2 \cup T_3 \cup T_4,\ T_i \cap T_j = \varnothing,\ i \neq j,\ i,\ j = 1..4.,$$

(1) предусматривающую этапы: 1 – построение граф упорядочения, заданный отношением R; 2 – структурную декомпозицию графа во взаимосвязи с базовыми элементами; 3 – оптимизацию последовательности в соответствии с выдвинутыми требованиями.

В этом случае множество модулей дисциплины можно будет обозначить как M, отношение частичного порядка смены модулей дисциплины, как P, матрицу смежностей графа G (M, P), как A, порядковые номера модулей $M_i$, $M_j$, как $k_j$, $k_i$. Все это позволяет нам представить процесс моделирование учебной дисциплины с последовательностью смены моделей в ней в виде: $\Sigma$ $(k_j - k_i)$ = min, для всех $k_j \geq k_i+1$, в которых $A_{ij} = 1$. Далее, обозначим алгоритм последующих действий, позволяющих эффективно разрешить поставленную задачу моделирования (см. рисунок 2).

Рисунок 2 – Алгоритм процедур по решению задач моделирования содержания обучения физике студентов педагогических направлений (составлено автором)

Все включенные в структуру содержания учебной дисциплины графы, визуализированные нами, не могут быть использованы компьютерно-ориентированными способами, что обуславливает необходимость обращения к инструментарию, предоставляемому ***матрицей инцеденций,*** которая не гарантирует точность результатов анализа в виду большого объема информационного массива.




**Результаты исследования.** До настоящего времени содержание обучения устанавливается путем применения *экспертного метода* путем установления соответствия требований специальности выпускника с учебным планом. В этой связи качество обучения физики в вузе будет зависеть от *содержания образовательных программ*, разработанных в контексте единой методики определения содержания обучения. Доказательной базой для сформулированного нами вывода, являются результаты сравнительного анализа требований к обязательному минимуму содержания образовательной программы подготовки специалистов нескольких направлений в области изучения физики, математики и информатики.

Осуществленный анализ по зафиксированным в ходе него результатам демонстрируют отсутствие единства в требованиях, предъявляемых к обязательному минимуму содержания образовательной программы подготовки специалистов различных направлений профессиональной подготовки. Кроме того, обнаруживается слабая взаимосвязь между содержанием информационной компоненты и требованиями конкретной специальности, а также дублирование отдельных компонентов содержания.

Также, различия выявлены и в параметрах информационной компоненты, в частности в объеме (количество часов) и глубине освоения содержания. Причиной выявленных разногласий мы видим в присутствующем субъективизме вузов при разработке содержания обучения, требующем нивелирования в виду формализованного подхода к разработке атомарных требований к конкретным областям знаний по специальностям. Преодоление выявленных противоречий возможно путем поэтапного решения ряда задач алгоритмизации содержательного блока дисциплины.

Только при таком подходе, на наш взгляд, увеличивается диапазон возможностей по унифицированию ***системы методического обеспечения*** учебных дисциплин и адаптации программных образовательных, обеспечивающих повышение качества профессиональной подготовки.

**Актуальность проблемы.** Результаты исследования позволили выстроить структурную последовательность декомпозиции графа упорядочения содержательных линий дисциплины, тем самым решив проблему создания системы содержания обучения в виде преобразованной матричной формы, обозначив иерархически упорядоченную структуру системы содержания и взаимосвязей в дисциплине.

**Новизна проблемы.** Новизна исследования заключается в формулировании требований реализации компетентностного подхода на принципе гуманитарности, благодаря которым установлены направления педагогической стратегии интегрированного обучения студентов физике.

**Практическая значимость проблемы.** В образовательной практике результат исследования могут быть использованы при тематическом планировании дисциплин с целью составления содержания обучения.

### Литература


1. Макарова, Н. В. Информатика в системе непрерывного образования / Н. В. Макарова, А. Г. Степанов. – СПб: Издательство «Политехника», 2005. – 338 с. – ISBN 5-7422-0865-0. – EDN UVLXKT.
2. Шутикова, М. И. Цифровая образовательная среда - основа информационного инструментария в профессиональной деятельности педагогов / М. И. Шутикова, С. А. Бешенков, Т. И. Никифорова // Преподаватель XXI век. – 2023. – № 1-1. – С. 11-17.
3. Asrizal, & Festiyed. (2022). Effects of STEM-based learning materials on knowledge and literacy of students in science and physics learning: A metaanalysis. Journal of Physics: Conference Series, 2309, 012063. https://doi.org/10.1088/1742-6596/2309/ 1/012063
4. Bao, L., Koenig, K. (2019) Physics education research for 21st century learning. Discip Interdscip Sci Educ Res 1, 2. https://doi.org/10.1186/s43031-019-0007-8
5. Dranyuk O., Craft N., Baeva T., & Krylichevsky V. (2022). Interdisciplinary integration as a condition for the implementation of the competence-based approach in vocational education. Theory and Practice of Physical Culture. 10:55-58.
6. ElAdl, A., & Musawi, A. Al. (2020). Effects of students' attitudes towards using e-books on their selfefficacy and academic motivation. European Journal of Educational Research, 9(3), 1167-1176. https://doi.org/10.12973/EU-JER.9.3.1167
7. Graff, H. J. (2022). The new literacy studies and resurgent literacy myth. Literacy in Composition Studies, 9(1), 47-53. https://doi.org/10.21623/1.9.1.4
8. Maya, L., & Suseno, M. (2022). Investigating the incorporation of digital literacy and 21st-century skills into postgraduate students' learning activities. English Language Education (ELE) Reviews, 2(5), 13-27. https://doi.org/10.22515/elereviews. v2i1.5121
9. McGee, E. O. (2020). Interrogating structural racism in STEM higher education. Educational Researcher, 49(9), 633-644. https://doi.org/10.3102/0013189X 20972718
10. Melisa, M., Susilowati, E., & Dewantara, D. (2021). Development of electronic modules based on STEM to train students' creativity: Validity and practicality analysis. Berkala Ilmiah Pendidikan Fisika [Physics Education Scientific Periodical], 9(3), 335. https://doi.org/10.20527/bipf.v9i3.10440 N, A.,
11. Mueva A. V., Krupskaya Y. V., Sidorova L. V., Abeeva O. N., Krasnorutskaya N. G., Natyrova E. M. (2021). Interdisciplinary Integration In Professional Training Of Future Teacher. In D. K. Bataev, S. A. Gapurov, A. D. Osmaev, V. K. Akaev, L. M. Idigova, M. R. Ovhadov, A. R. Salgiriev, & M. M. Betilmerzaeva (Eds.). Social and Cultural Transformations in The Context of Modern Globalism. European Proceedings of Social and Behavioural Sciences. 117:1093-1099.
12. Niam, M. A., & Asikin, M. (2020). The development of science, technology, engineering, and mathematics (STEM)-based mathematics teaching materials to increase mathematical connection ability. MaPan, 8(1), 153. https://doi.org/10.24252/mapan.2018v8 n1a12
13. Niam, M. A., Asikin, M., Ainun, M., & Asikin, M. (2021). The importance of STEM aspects in teaching materials for mathematics learning. In Proceedings of the National Mathematics Seminar (pp. 329-335).
14. Tsybenko, E., Panferova, E., Volodina, M., Vartanova, N. (2023). Digitalization of Education and Distance Learning Technologies: Development Trends. In: Beskopylny, A., Shamtsyan, M., Artiukh, V. (eds) XV International Scientific Conference «Interagromash 2022». INTERAGROMASH 2022. Lecture Notes in Networks and Systems, vol 575. Springer, Cham. https://doi.org/10.1007/978-3-031-21219-2_335

*UOT 372.8*

***Turanə Fazil İsmayılova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin müəllimi,*
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun*
*fəlsəfə doktoru proqramı üzrə doktorantı*
*https://orcid.org//0000-0001-6462-7759*
*E-mail: turanaismayilova1122@gmail.com*

## TARİXİN TƏDRİSİ VƏ İNNOVATİV TEXNOLOGİYALAR

***Turana Fazil Ismayilova***
*tacher of the Azerbaijan State Pedagogical University,*
*dctoral student of the Institute of Education of the Republic of Azerbaijan*

## HISTORY TEACHING AND INNOVATIVE TECHNOLOGIES

***Турана Фазиль гызы Исмаилова***
*преподаватель Азербайджанского Государственного Педагогического Университета,*
*докторант Института Образования Азербайджанской Республики*

## ПРЕПОДАВАНИЕ ИСТОРИИ И ИННОВАЦИОННЫЕ ТЕХНОЛОГИИ

**Xülasə.** Məqalədə ilk növbədə Azərbaycan tarixinin tədrisində tələbələrin idrak fəallığının yüksəldilməsində innovativ texnologiyalardan istifadənin imkanlarından bəhs olunur. Elmi araşdırmalar və təcrübə göstərir ki, Azərbaycan tarixinin tədrisində idrak fəallığının yüksəldilməsində son dövrlərdə xüsusilə innovativ texnologiyalardan istifadə mühüm əhəmiyyət kəsb edir.

***Açar sözlər:*** *Ali məktəb, Azərbaycan tarixinin tədrisi, innovativ texnologiyalar, idrak fəallığı, rəqəmsallaşma*

**Abstract.** The article primarily discusses the possibilities of using innovative technologies in improving students' cognitive activity in teaching the history of Azerbaijan. Scientific research and experience show that the use of innovative technologies in recent times has been of particular importance in improving cognitive activity in teaching the history of Azerbaijan.

***Keywords:*** *Higher education, teaching of Azerbaijani history, innovative technologies, cognitive activity, digitalization*

**Резюме.** Автором статьи, в первую очередь, рассматриваются возможности использования инновационных технологий в повышении познавательной активности учащихся при преподавании истории Азербайджана. Научные исследования и опыт показывают, что применение инновационных технологий в последнее время имеет особое значение в повышении познавательной активности при преподавании истории Азербайджана.

***Ключевые слова:*** *высшая школа, преподавание истории Азербайджана, инновационные технологии, познавательная активность, цифровизация*

**İnnovativ texnologiyaların Azərbaycan tarixinin tədrisində rolu:**

İnnovativ texnologiyaların Azərbaycan tarixinin tədrisində rolu çoxşaxəli və əhəmiyyətlidir. Bu rolu əsas aspektlər üzrə izah etmək olar:

1. Vizual və interaktiv öyrənmə imkanı.

Virtual reallıq (VR) və Artırılmış Reallıq (AR): Bu inkişaf edən texnologiyalar öyrənənləri müxtəlif mühitlərə daşıya və ya mürəkkəb an-

layışları yeni şəkildə vizuallaşdıra bilən immersiv öyrənmə təcrübələri yaradır [5].

2. Tarixi məlumatların rəqəmsallaşdırılması və əlçatanlığı. Əlyazmalar, sənədlər və arxiv materialları rəqəmsal formata çevrilərək geniş auditoriyaya təqdim olunur. Elektron kitabxanalar və onlayn platformalar istənilən vaxt istifadəyə çıxış əldə edə bilirlər (məsələn, AMEA-nın resursları).

3. Tədris metodlarının fərdiləşdirilməsi. Rəqəmsal platformalar müəllimlərə müxtəlif səviyyələrdə olan uyğun materiallar hazırlamağa imkan verir.

4. Tarixi təhlilin inkişafı. Texnoloji prosesləri təhlil etmək mümkündür: müəyyən dərəcədə, müxtəlif dövrlərdə Azərbaycanın siyasi və iqtisadi vəziyyətini qrafik və diaqramlarla qurmaq mümkündür. Şagirdlər müstəqil şəkildə araşdırmalar apararaq təqdimatlar və layihələr hazırlaya bilirlər.

5. Beynəlxalq inteqrasiya. Onlayn platformalar üzərindən Azərbaycan üzərindən başqa yerlərdə mövcud olan birgə layihələr həyata keçirilir və tarixləri öyrənirlər. UNESCO və digər beynəlxalq təşkilatların rəqəmsal resurslarından istifadə imkanı yaranır. İnnovativ texnologiyalar tarixin tədrisində biliklərin daha effektiv və dinamik şəkildə mənimsənilməsinə kömək edir. Məsələn, virtual reallıq və simulyasiyalar tarixi hadisələrin yenidən canlandırılmasına şərait yaradır. Rəqəmsallaşma tarixin tədrisinin ənənəvi metodlarına alternativlər təqdim edərək dərslərin daha maraqlı və əlçatan olmasını təmin edir. Elektron kitablar, xəritələr və multimedia materialları dərslərin zənginləşdirilməsinə şərait yaradır. Moodle, Zoom, Google Classroom kimi onlayn platformalar vasitəsilə tələbələr dərslərə istənilən yerdən qoşula bilirlər [2, s.286].

Belinski təlimin məzmun və metodu haqqında bir sıra dəyərli və orijinal fikirlər irəli sürmüşdür. Tərbiyədə həqiqi mənada xəlqiliyə geniş yer verən, milli xüsusiyyətlər içərisində ümumbəşəri cəhətlər və fikirlər görən Belinski tarixin öyrənilməsinə də xüsusi əhəmiyyət vermişdir. Belinski təlimdə əyaniliyin mühüm rol oynadığını göstərirdi. O, təlimin əsas yolunu induktiv yol hesab edir və göstərirdi: "Təhlildən tərkibə keçmək, misallardan qanunlar çıxarmaq ən faydalı tədris sistemidir."

İnteraktiv təlim vasitələri tarixin daha dərindən və maraqla öyrənilməsini təmin edir [3, s.20].

**Tətbiq olunan texnologiyalardan yaranan problemlər:**

1. Texnoloji infrastrukturun qeyri-kafiliyi. Bir çox kənd və rayon məktəblərində kompüter otaqları, interaktiv panellər, proyektorlar və digər texniki avadanlıqlar yoxdur. Bir çox təhsil müəssisəsi texnoloji infrastruktura malik deyil, bu isə tələbələrin təhsildən yararlanmalarına mənfi təsir göstərir. Müasir təhsilin keyfiyyətini yüksəltmək üçün texnologiyanın rolu danılmazdır. Rəqəmsal resurslar, interaktiv platformalar, laboratoriyalar və onlayn öyrənmə vasitələri idrak aktivliyini gücləndirir, öyrənməni fərdi və təhsil prosesini daha əlçatan edir.

2. Zəif və qeyri-sabit internet bağlantısı. Onlayn dərslər, video materiallar və rəqəmsal platformalar üçün sabit və sürətli internet tələb olunur. İnternet bağlantısının zəifliyi və texniki avadanlıqların yetərsizliyi dərslərin keyfiyyətini aşağı sala bilər.

3. Müəllimlərin texnoloji bacarıqlarının yetərsizliyi. Müəllimlərin bir hissəsi rəqəmsal alətlərdən istifadə etmək üçün yetərli bilik və bacarığa sahib deyil.

4. Maliyyə vəsaitinin hesablanması. Təhsil sisteminin modernləşdirilməsi üçün böyük maddi vəsait tələb olunur.

5. Təhlükə və məxfiliyin təmin olunmaması. Onlayn platformalarda işçilərin şəxsi məlumatlarının qorunması və kiber təhlükəsizlik məsələləri də nəzərə alınmalıdır. Rəqəmsal savadsızlıq ucbatından zərərli təsirdən istifadə və ya kibertəhlükələrlə döyüşmə halları arta bilər.

A.V. Serikovun fikrincə, səmərəlilik səmərəliliyin əsas xüsusiyyətlərindən biridir:.[4]. Tələbənin təlim fəaliyyətinin səmərəliliyində ən vacib amillər daxili amillərdir, lakin onların mövcudluğu və gücü əsasən xarici amillərdən asılıdır. Tələbənin motivasiya səviyyəsi (daxili amil) onun müəllimindən və ya ailəsindən dəstək (xarici amil) daha da güclənə bilər. Araşdırma (daxili) çox zaman tədqiqat mühiti, resurslara çıxış və istiqamətləndirmə (xarici amil) ilə stimullaşdırılır. Tələbənin özünüqiymətləndirmə və inamı (daxili amil ) olan müəllim rəyi, təqdir və ya rəqabət ( xarici amil) ilə formalaşdırıla bilər. Universitetlər təkcə biliklərin yaradılması və ötürülməsi mərkəzləri deyil, həm də dövlət quruculuğu prosesində mühüm rol oynayırlar. Universitetlər cəmiyyətin ayrılmaz hissəsidir və onların daimi qarşılıqlı əlaqələri ölkədə ali təhsilin

trayektoriyasını formalaşdırır. İki varlıq arasındakı bu simbiotik əlaqə bilik istehsalının təbiətini birdən çox şəkildə formalaşdırır.

**Müəllimlərin texnoloji hazırlığı.** Texnologiyalardan effektiv istifadə etməmək, dərslərin monotonlaşmasına səbəb ola bilər. Dərs keçmək – bu, sanki bir bağbanın torpağa toxum səpininə bənzəyir. Əgər bağban hər gün eyni alətlə, eyni üsulla, eyni yerdə toxum səpərsə və torpaq dəyişməzsə, o toxumlar ya çıxmaz, ya da zəif çıxar. Təhsildə texnologiya da bu müasir bağçılıq alətləri kimidir. Onlardan istifadə etməmək – sanki torpağı yalnız əllə qazmaq kimidir. Monotonluq şagirdlərin marağını azaldır və passiv yaddaş (rote memorization) rejiminə salır. Beyin yeni informasiyanı mənimsəmək üçün fərqli kontekstlərə, stimul və əlaqəyə ehtiyac duyur. Texnologiya isə tədrisi interaktiv, vizual, tətbiqyönlü və maraqlı edir.

**Müəllimlərin peşəkar inkişafı.** Müəllimlərin davamlı təlimlərə cəlb edilməsi, onların texnoloji biliklərinin artırılmasına kömək edir [1, s.177].

Təlim və tədris prosesinin keyfiyyətinin artırılması üçün müəyyən təkliflər irəli sürürük: a) Müəllimlər, tələbələr və ali təhsilin bütün paydaşları arasında ünsiyyətin gücləndirilməsi; b) Təlim tədris üçün yenilikçi və nəticəyönümlü elektron tədris kurikulumlarının hazırlanması; c) Müəllimlərin, tələbələrin və ali təhsilin bütün iştirakçılarının İKT bacarıqlarının çoxaldılması üçün tədbirlər planının hazırlanması; ç) İnteraktiv təlim metodologiyasının elektron təhsildə istifadəsinin zəruriləşdirilməsi; d) Alternativ təlim vasitələrinin fəaliyyətinin çoxaldılması və mümkünsə ali təhsil müəssisələrində təhsil televiziyası və radiosunun formalaşdırılması e) Sosial həssas qrupa aid müəllim və tələbələrin maddi resurslarla təmin edilməsi üçün yeni addımların atılması; f) Yenilikçi, şəffaf və nəticəyönlü qiymətləndirmə meyarlarının və metodlarının hazırlanması və təlim tədris prosesində tətbiqi;

**Problemin elmi yeniliyi.** Səmərəli fikirlər irəli sürülmüş, aparılan araşdırmalar və tədqiqatlar məqalədə öz əksini tapmışdır.

**Problemin aktuallığı.** Ali məktəblərdə Azərbaycan tarixinin tədrisində tələbələrin idrak fəallığının yüksəldilməsində innovativ texnologiyalardan istifadənin imkanlarının araşdırılması mühüm əhəmiyyət kəsb edir. Problem baxımından aktuallıq təşkil edir.

**Problemin praktik əhəmiyyəti.** Bir çox pedaqoqlar bu mövzu ilə bağlı tədqiqatlarında materialdan istifadə edə bilərlər.

**Ədəbiyyat**


1. İsmayılova, M.C. Psixologiyanın tədrisi metodikası. Bakalavr hazırlığı üçün dərs vəsaiti / M.C. İsmayılova. -Bakı: ADPU-nun mətbəəsi, - 2012, -446 s.
2. İsmayılova, T.F. Kurikulum. Yeni təlim texnologiyaları. Dərs vəsaiti. / T.F. İsmayılova. -Bakı : Mütərcim, - 2020, -296 s.
3. Musayev, D.M. Tarixin tədrisində interaktiv metodlardan istifadənin imkanları .Monoqrafiya. / -Bakı : ADPU-nun mətbəəsi, -2022, - 228 s.
4. Сериков, А.В. Эффективность хозяйственной деятельности: определение, измерение, синергетическое управление / А.В. Сериков // Економічний вісник Донбасу .-2011.-№2.-с.-212-219
5. Sarker, Md Nazirul Islam & Wu, Min & Qian, Cao & Alam, G.M. & Li, Dan. (2019). Using Digital Technologies for Better Learning and Education: A Systematic Literature Review. International Journal of Information and Educational Technology,9.453-461.10.18178/ijet.2019.9.71246


**Redaksiyaya daxil olub:** 01.05.2025.

*UOT 796:37.02(075.8).*

***Maya Zahir qızı Heydərova,***
*Azərbaycan İdman Akademiyasının dosenti,*
*pedaqogika üzrə fəlsəfə doktoru*
*https://orcid.orq/0009-0006-3642-4894*
*https://doi.org/10.69682/arti.2025.92(3).136-140*
*E-mail:qeydarova.maya@ mail.ru*

***Nicat Mustafa oğlu Mustafayev,***
*Azərbaycan İdman Akademiyası*
*https://orcid.orq 0009-0009-0218-306X*
*E-mail. mnicat9696@gmail.com*

***Süleyman Həsən oğlu Muradlı***
*Azərbaycan İdman Akademiyası*
*https://orcid.org/0009-0004-6136*
*E-mail. suleymanmuradli9797gmail.com*

# X-XI SİNİF ŞAGİRDLƏRİNİN QÜVVƏ QABİLİYYƏTLƏRİNİN İNKİŞAF ETDİRİLMƏSİ

***Maya Zahir Heydarova,***
*associate professor at the Azerbaijan Sports Academy,*
*doctor of philosophy in pedagogy*

***Nicat Mustafa Mustafayev,***
*Azerbaijan Sports Academy*

***Suleiman Hasan Muradli***
*Azerbaijan Sports Academy*

# INVESTIGATION OF THE DEVELOPMENT OF STRENGTH ABILITIES IN 10-11th GRADE STUDENTS

***Мая Загир гызы Гейдарова,***
*Доцент Азербайджанской Академии Спорта,*
*доктор философии по педагогике*

***Ниджат Мустафа оглы Мустафаев,***
*Азербайджанская Академия Спорта*

***Сулейман Гасан оглы Мурадлы***
*Азербайджанская Академия Спорта*

# РАЗВИТИЕ СИЛОВЫХ СПОСОБНОСТЕЙ УЧАЩИХСЯ X-XI КЛАССОВ

**Xülasə.** Məqalədə qeyd edilir ki, müstəqillik əldə etmiş bir ölkə, o cümlədən bir xalq üçün şagirdlərin sağlamlığı, fiziki inkişafı bu gün vacib şərtlərdən biridir. Yaşadığımız hazırki dövrdə xalqımıza vətənin müdafiəsinə hazır olan sağlam, güclü, dözümlü, çevik gənclər lazımdır. Bu baxımdan böyüməkdə olan nəslin fiziki inkişafı, onların sağlamlığı, şəxsiyyət kimi formalaşması dövlətimizin diqqət mərkəzindədir. Həmçinin məqalədə qeyd edilir ki, fiziki tərbiyə insanın sağlamlığına möhkəm zəmin yaradır və güc qabiliyyətinin inkişafına müsbət təsir göstərir. O, cəmiyyətdə yaranan ümumtərbiyənin mühüm tərkib hissəsi olmaqla insanların iradəsini, hiss və fikirlərini birləşdirir, onlara sevinc və fərəh bəxş etməklə bərabər zərərli vərdişlərə qarşı nifrət yaradır. Bu o deməkdir ki, məktəbli gənc başa düşməlidir ki, xalqımıza, ordumuza sağlam, fiziki cəhətdən güclü, çevik, mübariz, iradəli, qorxmaz düşmənə layiqincə cavab verə biləcək oğullar lazımdır. Ona görə də orta ümumtəhsil məktəblərində şagirdlərin, xüsusən də oğlanların sağlam, hərəki qabiliyyətlərə yüksək səviyyədə yiyələnmiş gənclər kimi yetişməsində fiziki tərbiyə dərslərinin xüsusi rolu vardır.

Məqalədə fiziki tərbiyə dərslərində müəllimlərin güc qabiliyyətlərinin formalaşdırılmasında istifadə olunan metodlara aydınlıq gətirir və dəyərli tövsiyələr verilir.

***Açar sözlər:*** *fiziki tərbiyə, idman, fiziki qabiliyyətlər, güc qabiliyyətləri, hərəki bacarıqlar, fiziki inkişaf*

**Abstract.** The article states that for an independent country and its people, the health and physical development of students are among the crucial factors today. In the present era, our nation needs healthy, strong, resilient, and agile young individuals who are ready to defend their homeland. In this regard, the physical development of the younger generation, their health, and their formation as individuals are at the center of our state's attention.

Additionally, the article emphasizes that physical education provides a strong foundation for human health and has a positive impact on the development of strength abilities. As an essential component of general education in society, it unites people's will, emotions, and thoughts, bringing them joy and happiness while fostering a strong aversion to harmful habits. This means that young students must understand that our nation and our army need healthy, physically strong, agile, determined, and fearless individuals who can respond to the enemy adequately.

Therefore, physical education classes play a significant role in ensuring that students, especially boys, grow into healthy and highly skilled individuals with strong physical abilities. The article also clarifies the methods used by teachers in physical education lessons to develop strength abilities and provides valuable recommendations.

***Keywords:*** *Physical education, sports, physical abilities, strength ability, motor skills, physical development*

**Аннотация.** В статье отмечается, что здоровье, физическое развитие школьников, а так же всей молодежи, является приоритетом для всей страны. Так как, в настоящее время нашей стране нужны здоровые, сильные, выносливые, ловкие защитники. С этой точки зрения физическое развитие, здоровье, формирование их как личности является главным вопросом, стоящим перед государством. В статье так же отмечается, что физическое воспитание способствует укреплению здоровья человека, оказывает благотворное влияние на развитие силовых спрсобностей. Будучи важной составной частью всеобщего воспитания, оно объединяет волю, чувства и мысли людей, одаряя их радостью и счастьем, и побуждает в них отвращение к вредным привычкам. Это значит, что молодежь должна понять, что родине, армии нужны здоровые, физически сильные, ловкие, боевые, волевые, бесстрашные сыны, умеющие дать врагу достойный отпор. Вот почему уроки физической культуры имеют особую роль в общеобразовательных школах в воспитании здоровых, на высоком уровне овладеющих двигательной способностью молодежи.

В статье разъясняются методы, используемые учителями на уроках физической культуры в процессе формирования силовых способностей учащихся и даются нужные рекомендации.

***Ключевые слова:*** *физическое воспитание, спорт, физические способности, силовые способности, двигательные умения, физическое развитие*

Xalqımız bütün tarix boyu gənclərin güclü, çevik, mərd, igid və cəsarətli olmasını vacib hesab etmişdir. Müstəqillik əldə etmiş bir ölkə üçün onların sağlamlığı, fiziki inkişafı bu gün vacib şərtlərdən biridir. Yaşadığımız hazırki dövrdə xalqımıza vətənin müdafiəsinə hazır olan sağlam, güclü, dözümlü, çevik gənclər lazımdır. Bu baxımdan böyüməkdə olan nəslin fiziki inkişafı, onların sağlamlığı, şəxsiyyət kimi formalaşması dövlətimizin diqqət mərkəzindədir.

Həyata bir fərd kimi atılmağa hazırlaşan hər bir yeniyetmə gənc vətənini, torpağını sevməli, doğma yurdunu qorumağa hazır olmalıdır.

Bu baxımdan məktəblilərin o cümlədən X-XI sinif şagirdlərinin fiziki inkişafında mühüm rol oynayan fiziki tərbiyə və idmanın xüsusi əhəmiyyəti vardır.

Apardığımız araşdırmalar göstərir ki, fiziki tərbiyə cəmiyyətdə yaranan ümumtərbiyənin mühüm tərkib hissəsi olmaqla insanların iradəsini, hiss və fikirlərini birləşdirir, onlara sevinc və fərəh bəxş etməklə bərabər zərərli vərdişlərə qarşı nifrət yaradır.

Fiziki tərbiyə pedaqoji prosesə xas olan bütün ümumi əlamətləri özündə ehtiva edir.

Fiziki tərbiyənin fərqli cəhətləri ondan ibarətdir ki, bu hərəki vərdişlər insanın fiziki iş qabiliyyətini müəyyən edən hərəki qabiliyyətlərin, o cümlədən, qüvvə qabiliyyətinin formalaşdırılmasına yönəldilmiş bir prosesdir.

Fiziki tərbiyədə iki spesifik cəhət mövcuddur. Onlardan biri hərəkətlərin təlimi, ikincisi isə fiziki keyfiyyətlərin, yəni qabiliyyətlərin inkişafıdır.

Hərəkətlərin öyrədilməsinin əsas məzmununu fiziki təhsil təşkil edir, yəni insanın xüsusi təlim prosesində öz hərəkətlərinin idarə olunmasının rasional üsullarının sistemli şəkildə mənimsənilməsidir və bu yolla həyatda zəruri olan hərəki, vərdişlər bacarıqlar və onlarla bağlı biliklər fondundan əldə olunmasıdır. Fiziki tərbiyənin təhsilləndirici cəhəti isə ondan ibarətdir ki, o, insanın həyat təcrübəsində hərəki imkanlarından rasional istifadə etməsi üçün birinci dərəcəli əhəmiyyət kəsb edir.

Beləliklə, fiziki tərbiyə cəmiyyətin yaranan ümumi tərbiyənin bir növüdür və onun spesifikası hərəkətlərin öyrədilməsindən və insanın hərəki qabiliyyətlərinin, o cümlədən güc qabiliyyətlərinin tərbiyəsindən ibarətdir. Fiziki tərbiyə bilavasitə şəxsiyyətlə bağlıdır. Bu istiqamətdə şəxsiyyətdə aşılanması lazım gələn hərəki qabiliyyətlərin və eyni zamanda güc qabiliyyətinin məcmusu nəzərdə tutulur. Fikrimizin daha aydın olması üçün aşağıdakı sitata diqqət edək:

"Fiziki tərbiyə ümumi tərbiyənin tərkib hissəsi; insanın sağlamlaşdırılmasına, fiziki cəhətdən düzgün inkişafına, iradəsinin möhkəmləndirilməsinə, zəruri hərəkət, bacarıq və vərdişlərinin təkmilləşdirilməsinə yönəldilmiş sosial pedaqoji prosesdir. Fiziki tərbiyə əqli, mənəvi, estetik, əmək tərbiyəsi və politexnik təhsillə vəhdətdə kompleks şəkildə həyata keçirilir. Fiziki tərbiyə də ümumi tərbiyə kimi cəmiyyətin ümumi və daimi kateqoriyasıdır. Onun da məqsəd və vəzifələri, məzmun və forması ictimai-iqtisadi formasiyaların tələblərinə uyğun olaraq dəyişilir" [1, s.53].

Belə əhatəli ensiklopedik izah ilk baxışdan böyük maraq doğurur və fiziki tərbiyənin digər tərbiyə sahələri ilə üzvi əlaqəsini göstərir. Bu şərh öz mahiyyəti etibarilə "fiziki tərbiyə" anlayışı ilə sıx bağlıdır. Çünki cəmiyyətdə yaranan tərbiyəvi təsirlər, digər tərbiyə sahələrinin vəhdətdə götürülməsi aid olduğu sahənin inkişaf səviyyəsini göstərir.

Prof. N. Məcidov "Bədən tərbiyəsinin nəzəriyyəsi və metodikası" kitabında fiziki tərbiyə haqqında öz fikirlərini belə söyləmişdir. "Fiziki tərbiyə ümum tərbiyənin bir hissəsidir. O, hərəkət vərdişlərinin formalaşmasına və insanların fiziki qabiliyyətlərinin inkişafına yönəldilmiş pedaqoji prosesdir. Fiziki tərbiyə insanın hərtərəfli inkişafında əsas yerlərdən birini tutur ...." [2. s. 9].

Burda çox yerində deyilmişdir. Fiziki tərbiyə insanların fiziki qabiliyyətlərinin inkişafına yönəldilmiş pedaqoji prosesdir.

O, eyni zamanda həmən ədəbiyyatda qeyd edir ki, fiziki tərbiyə prosesində fiziki qabiliyyətlərdən biri olan qüvvə qabiliyyətinin inkişaf etdirilməsi günümüzün aktual problemlərindən biridir.

Yaxud elə həmin bölmədə verilən digər bir fikrə diqqət edək: "Qüvvə əzələlərin təxəllüsü ilə xarici müqaviməti dəf etmək və ya ona qarşı müqavimət göstərmək qabiliyyəti kimi qəbul olunmuşdur" [2, s.34].

Yuxarıda göstərdiyimiz sitatlardan da belə qənaətə gəlmək olar ki, fiziki tərbiyə insanın sağlamlığına möhkəm zəmin yaradır və güc qabiliyyətinin inkişafına müsbət təsir göstərir.

Burada əsas diqqət fiziki tərbiyənin yuxarı sinif şagirdlərinin güc keyfiyyətlərinin inkişaf etdirilməsi istiqamətləri üzrə görülən işin, həyata keçirilən təlim-tərbiyə məşğələlərinin səviyyəsinin yüksəlməsinə, ən səmərəli cəhətlərinə yönəldilməsidir. Bu o deməkdir ki, məktəbli gənc başa düşməlidir ki, xalqımıza, ordumuza sağlam, fiziki cəhətdən güclü, çevik, mübariz, iradəli, qorxmaz düşmənə layiqincə cavab verə biləcək oğullar lazımdır. Orta ümumtəhsil məktəblərində şagirdlərin, xüsusən də oğlanların sağlam, hərəki qabiliyyətlərə yüksək səviyyədə yiyələnmiş gənclər kimi yetişməsində fiziki tərbiyə dərslərinin xüsusi rolu vardır.

Fiziki tərbiyə prosesində gücü inkişaf etdirmək üçün müxtəlif çəkili əşyalardan (doldurulmuş toplardan, daşlardan), sallanma hərəkətlərindən, dayaq hərəkətlərindən, atmalardan,

yadronun itələnməsindən, tullanmalardan, dartınma oyunlarından, kəndirə dırmanmadan və s. hərəkətlərdən istifadə olunur.

Yuxarı məktəbyaşlı şagirdlərdə gücü inkişaf etdirmək üçün statik xarakterli hərəkətlərdən, dinamik mahiyyətli və xüsusi güc hərəkətlərindən istifadə etmək tövsiyə edilir. Həmin hərəkətlərin idman əşyaları – vasitələri ilə icrası daha faydalı olur.

Güc qabiliyyəti dərsdənkənar bədən tərbiyəsi məşğələlərində, gəzinti, yürüş və ekskursiyalarda, müxtəlif cür əyləncələr təşkil etməklə, həmçinin müxtəlif şəraitdə hərəkətlərin, oyunların icra olunması, eləcə də çətinləşdirilmiş maneələrin qət edilməsi yolu ilə də inkişaf etdirmək mümkündür. Bu şərtlə ki, hərəkət və oyunlar düzgün təşkil olunsun və lazımi səviyyədə keçirilsin.

Bütün bunlar onu deməyə əsas verir ki, fiziki tərbiyənin əsas komponentləri yuxarı sinif şagirdlərə çatdırmaq üçün, müvafiq iş, məşğələ formalarından metod və vasitələrdən sistemli olaraq istifadə olunarsa X-XI sinif şagirdlərinin güc qabiliyyətlərin inkişafına nail olmaq olar. Məqsədimizə nail olmaqdan ötrü biz Bakı şəhərində yerləşən bir neçə məktəbdə müşahidələr apardıq. Hətta yuxarı sinif şagirdlərlə anket sorğuları apardıq. Onların fiziki tərbiyə, fiziki qabiliyyətlər və güc haqqında nəzəri biliklərini yoxladıq. Anket sorğularına cavablarından belə nəticəyə gəldik ki, şagirdlərin bu sahədə nəzəri biliklər zəifdir. Və sonra biz şagirdlərin proqramda nəzərdə tutulmuş bir neçə idman növü üzrə güc qabiliyyətlərini yoxladıq. Götürdüyümüz normativlərdən gördük ki, yuxarı sinif şagirdlərin güc qabiliyyətləri heç də ürək açan deyil. Bakı şəhəri 167 saylı X[a] sinif şagirdlərdən götürdüyümüz normativləri sizin nəzərinizə çatdırmaq istəyirik.

***X[a] sinif oğlanların normativ göstəriciləri. Cədvəl. 1***

| Sıra sayı | Ad və soy ad | Hündür turnikdən sallanmış vəziyyətdən dartınmaq (dəfə) | Ayaqların köməyi ilə kəndirə dırmanmaq | Uzanaraq dayaqdan əllərinin bükülüb açılması (dəfə) | Bir əllə dayaqda oturub durmaq (dəfə) |
|---|---|---|---|---|---|
| 1 | A-ev V.A | 3 | 6 | 7 | 8 |
| 2 | A-ov R.Z. | 5 | 7 | 6 | 7 |
| 3 | A-ov İ. F | 3 | 6 | 8 | 8 |
| 4 | C-ev A.E | 2 | 7 | 2 | 9 |
| 5 | A-ev B.A | 6 | 12 | 4 | 8 |
| 6 | A-li B.R | 5 | 4 | 5 | 10 |
| 7 | N-ov A.Q | 4 | 5 | 4 | 11 |
| 8 | N-ov S.Y | 3 | 7 | 5 | 12 |
| 9 | S-lı X.Y | 7 | 8 | 3 | 4 |
| 10 | B-ov B.Q | 4 | 5 | 2 | 7 |
| 11 | S-ov A.M | 6 | 8 | 4 | 9 |
| 12 | N-ev C.N | 7 | 24 | 7 | 6 |

Normativləri götürməkdə məqsəd yuxarı sinif şagirdlərinin güc qabiliyyətlərinin inkişaf etdirilməsindən ötrü hazırladığımız metodikanı dərsdə tətbiq etməkdən ibarətdir. Bundan ötrü məktəbin fiziki müəllimi Həsənov Hüseyn və Fərəcov Atəşdən xahiş etdik ki, yuxarı siniflərdə fiziki tərbiyə dərsləri təklif etdiyimiz metodikaya uyğun keçsinlər.

Təklif etdiyimiz metodikanı qısaca olaraq nəzərinizə çatdırırıq.

1. Hər bir fiziki keyfiyyətlər haqqında ayrı-ayrı məlumat vermək;
2. Hər dərsdə fiziki tərbiyənin əhəmiyyəti haqqında şagirdləri məlumatlandırmaq;
3. Təkrar metodlardan çox istifadə etmək;
4. Əyani metoddan istifadə etmək;
5. Hər bir çalışmanın texnikası tam öyrətmək;
6. Güc qabiliyyətlərin çalışmalarını öz inkişaf etdirmək;

7. Hər bir şagirdə hərəkətlərin qanunauyğunluqları tam mənimsətmək.

***$X^a$ sinif oğlanların normativ cədvəli. Cədvəl 2.***

| Sıra sayı | Ad və soy ad | Hündür turnikdən sallanmış vəziyyətdən dartınmaq (dəfə) | Ayaqların köməyi ilə kəndirə dırmanmaq m) | Uzanaraq dayaqdan əllərinin bükülüb açılması (dəfə | Bir əllə dayaqda oturub durmaq |
|---|---|---|---|---|---|
| 1 | A-ev V.A | 4 | 7 | 6 | 8 |
| 2 | A-ov R.Z. | 6 | 6 | 7 | 9 |
| 3 | A-ov İ. F | 5 | 3 | 5 | 10 |
| 4 | C-ev A.E | 5 | 7 | 6 | 12 |
| 5 | A-ev B.A | 6 | 12 | 8 | 14 |
| 6 | A-li B.R | 6 | 8 | 5 | 10 |
| 7 | N-ov A.Q | 4 | 6 | 6 | 10 |
| 8 | N-ov S.Y | 5 | 7 | 5 | 13 |
| 9 | S-lı X.Y | 7 | 11 | 6 | 8 |
| 10 | B-ov B.Q | 6 | 10 | 5 | 8 |
| 11 | S-ov A.M | 7 | 8 | 8 | 12 |
| 12 | N-ev C.N | 7 | 4 | 10 | 10 |

***$X^a$ sinifdən götürdüyümüz normativlərin orta hesabla və faiz göstəriciləri. Cədvəl 3.***

| Sıra sayı | Sinif | ŞşagirdSayı | Orta və faiz göstəriciləri | Hündür turnikdən sallanmış vəziyyətdən dartınmaq (d) | Ayaqların köməyi ilə kəndirə dırmanmaq (m) | Uzanaraq dayaqdan əllərini bükülüb açılması (dəfə) | Bir əllə dayaqda oturub durmaq |
|---|---|---|---|---|---|---|---|
| 1 | $X^a$ oğlanlar | 12 | lkin/g | 4.5 | 3.6 | 4.7 | 4.6 |
| | | | Son/g | 5.2 | 6.5 | 7.4 | 8.2 |
| | | | Faiz/g | 22% | 13.8% | 36% | 10.4% |

Cədvəllərdən görünür ki, verdiyimiz metodikadan sonra yuxarı sinif şagirdlərinin qüvvə qabiliyyət göstəriciləri bir qədər yüksək olmuşdur.

**Nəticə** etibarı ilə deyə bilərik ki, fiziki tərbiyə dərslərində müəllimlər təlim metodlarından, pedaqoji prinsiplərdən düzgün istifadə edərlərsə fiziki tərbiyə dərsləri və məşğələləri günün tələblərinə uyğun səviyyədə qurarlarsa şagirdlərin qüvvə qabiliyyət göstəricilərini yüksəltmək olar.

**Problemin elmi yeniliyi** X-XI sinif şagirdlərinin güc qabiliyyətlərinin inkişafına nail olmaq üçün fiziki tərbiyənin əsas komponentləri olan müvafiq iş formaları, metod və vasitələri sistemə salınmışdır.

**Problemin praktik-tətbiqi** əhəmiyyəti ondan ibarətdir ki, fiziki tərbiyə yuxarı sinif şagirdlərinin güc qabiliyyətlərinin inkişafı sahəsində alınan nəticələr, müəyyənləşdirilən səmərəli iş formaları və metodları, irəli sürülən təkliflər bu sahədə çalışan müəllimlərə, idman təlimatçılarına istiqamət verəcək.

**Ədəbiyyat**


1. Azərbaycan Sovet Ensiklopediyası. IX cild, -Bakı: 1986. -551 s.
2. Nazim Məcidov. Bədən tərbiyəsinin nəzəriyyəsi və metodikası. II hissə. -Bakı: Müəllim, -2020. -222 s.
3. Firad Hüseynov və s. Fiziki tərbiyə. //Metodik vəsait. -Bakı: Müəllim, -2018. -207 s.
4. Firad Hüseynov. Müasir təlim texnologiyaları idmanda yaradıcı komponentlərin inkişaf vasitələri kimi. ADBTİA //Elmi xəbərlər. -Bakı: Müəllim, -2020. – s.38.
5. Maya Heydərova. Bədən tərbiyəsi və idmanın müasir problemləri. //dərs vəsaiti. -Bakı: Mütərcim, -2023. -127 s.

**Redaksiyaya daxil olub:** 16.05.2025

*UOT 796:37.02(075.8).*

***Arzu Elşad qızı Cəfərova***
*Azərbaycan İdman Akademiyasının fəlsəfə doktoru proqramı üzrə doktorantı*
*https://orcid.org/*0009-0009-8328-8495
*E-mail: cafarova_arzu@inbox.ru*
*https://doi.org/10.69682/arti.2025.92(3).141-144*

## QADIN VOLEYBOLÇULAR ÜÇÜN İDMAN MOTİVASİYASININ FORMALAŞDIRILMASINDA ÖZÜNÜ MÜƏYYƏNETMƏ NƏZƏRİYYƏSİNİN ROLU

**Arzu Elshad Jafarova**
*doctorial student in the program of doctor of philosophy*
*at the Azerbaijan Sports Academy*

## THE ROLE OF SELF-DETERMINATION THEORY IN SHAPING SPORT MOTIVATION AMONG FEMALE VOLLEYBALL PLAYERS

***Арзу Эльшад гызы Джафарова***
*докторант по программе доктора философии*
*Азербайджанской Академии Спорта*

## РОЛЬ ТЕОРИИ САМОДЕТЕРМИНАЦИИ В ФОРМИРОВАНИИ СПОРТИВНОЙ МОТИВАЦИИ У ВОЛЕЙБОЛИСТОК

**Xülasə.** Məqalə, qadın voleybolçuların motivasiya səviyyəsinin artırılmasında Özünü Müəyyənetmə Nəzəriyyəsinin rolundan bəhs edir. Məqalədə, idmançıların daxili və xarici motivasiyalarını müəyyənləşdirilərək onların psixoloji ehtiyaclarının qarşılanmasının idman fəaliyyətinə necə təsir etdiyi təhlil olunur. Məqalədə, həmçinin idman motivasiyasının inkişafı üçün təklif olunan praktiki strategiyalarının tətbiqi üsulları təqdim olunur və qadın voleybolçuların idman performansını eyni zamanda psixoloji rifahını artırmaq üçün nəzəri yanaşmanın effektivliyi də vurğulanır.
***Açar sözlər:*** *idman motivasiyası, voleybol oyunu, voleybolçu qızlar, xarici motivasiya, daxili motivasiya, psixoloji amillər, özünü müəyyənetmə nəzəriyyəsi, kompetensiyalara əsaslanma*

**Abstract.** The article examines the role of self-determination theory in enhancing the motivation of female volleyball players. It analyzes how the satisfaction of athletes' psychological needs affects their sports performance by identifying their intrinsic and extrinsic motivations. The article also presents practical strategies aimed at developing sports motivation and methods for their application. The effectiveness of the theoretical approach in improving both sports performance and psychological well-being of female volleyball players is emphasized.
***Keywords:*** *sports motivation, volleyball game, female volleyball players, extrinsic motivation, intrinsic motivation, psychological factors, self-determination theory, competence-based approach*

**Аннотация.** Статья рассматривает роль теории самодетерминации в повышении уровня мотивации у волейболисток. В статье анализируется, как удовлетворение психологических потребностей спортсменов влияет на их спортивную деятельность, путем определения их внутренних и внешних мотиваций. Также в статье представлены практические стратегии, направленные на развитие спортивной мотивации, и методы их применения. Подчеркивается эффективность теоретического подхода для повышения как спортивных результатов, так и психологического благополучия волейболисток.
***Ключевые слова:*** *спортивная мотивация, игра волейбол, волейболистки, внешняя мотивация, внутренняя мотивация, психологические факторы, теория самодетерминации, компетентностный подход*

Azərbaycan Respublikasının Prezidenti Müzəffər Ali Baş Komandanımız İlham Əliyev Cənabları demək olar ki, bütün çıxışlarında yetişən nəslin fiziki cəhətdən sağlam olmaları ilə bağlı dəyərli fikirlər söyləyir və faydalı tövsiyələrini irəli sürür. Onun irəli sürdüyü faydalı tövsiyələr içərisində ölkəmizdə qadın voleybolunun beynəlxalq normalara uyğun inkişaf etdirilərək təkmilləşdirilməsi əsas yer tutur. Qadın voleybolunun beynəlxalq normalara uyğunlaşdırılmasında, voleybolçuların idman motivasiyasının formalaşdırılmasında müxtəlif nəzəriyyələrə istinad olunması mühüm əhəmiyyət kəsb edir. Hansı ki, bu nəzəriyyələrdən biri də Özünümüəyyənləşdirmə nəzəriyyəsi hesab olunur.

Yeri gəlmişkən qeyd etmək vacibdir ki idman motivasiyası, idmançıların psixoloji və fiziki inkişafını təmin edən vacib amillərdəndir. Voleybolçu qızların motivasiya səviyyəsinin artırılması, onların performansını və ümumi idman maraqlarını yüksəltmək üçün çox əhəmiyyətlidir. Edward Deci və Richard Ryanın Özünü Müəyyənetmə nəzəriyyəsi, motivasiyanın daxili və xarici amillərini balanslaşdıraraq fərdlərin psixoloji ehtiyaclarını – muxtariyyət, kompetensiya və əlaqə – qarşılamağa yönəldiyini vurğulayır. Nəzəriyyənin idmançılara tətbiqi, onların özlərini daha güclü, müstəqil və sosial bağlara rəğmən yaxşı hiss etmələrinə, nəticə olaraq motivasiya səviyyələrinin yüksəlməsinə səbəb ola bilər. Bu yanaşma, voleybolçu qızların idman fəaliyyətlərinə daha dərin həvəs və bağlılıq nümayiş etdirmələrini təmin etməyi hədəfləyir.

Qeyd etdiyimiz kimi idman motivasiyası, hər şeydən əvvəl idmançıların hərtərəfli inkişafını təmin edən ən başlıca amillərdən biridir. Voleybolçu qızların motivasiya səviyyəsinin artırılması, onların idman fəaliyyətində daha yüksək nəticələr əldə etməsinə və psixoloji rifahlarının inkişafına müsbət təsir göstərə bilər. Məhz bu baxımdan idman motivasiyasının gücləndirilməsi və bu sahədə müvafiq nəzəri yanaşmaların tətbiqi, həm fiziki, həm də psixoloji cəhətdən mühüm əhəmiyyət kəsb edir.

Beynəlxalq arenada məşhur olan Edward Deci və Richard Ryan tərəfindən inkişaf etdirilən Özünü Müəyyənetmə nəzəriyyəsi insan davranışının motivasiya, ehtiyacların ödənilməsi və inkişaf baxımından necə idarə olunduğunu izah edir. Bu nəzəriyyə fərdin daxili və xarici motivasiya arasında balans yaradaraq psixoloji rifahına təsir edən əsas prinsipləri özündə ehtiva edir. Özünü Müəyyənetmə Nəzəriyyəsi insanın psixoloji inkişafını və motivasiyasını təmin edən üç ən əsas ehtiyacı qeyd edir: muxtariyyət, kompetensiya və əlaqə.

Muxtariyyət (autonomy) fərdin öz qərarlarını müstəqil şəkildə qəbul etmək və fəaliyyətlərində özünü idarə etmək bacarığıdır. İnsanlar hər hansı bir fəaliyyətlə məşğul olduqda, onu öz seçimləri və daxili motivləri əsasında yerinə yetirmək istədikdə daha yüksək səviyyədə motivasiya hiss edirlər. Məsələn voleybolçu qızın öz məşq planını seçməsi və qərar vermə prosesində iştirak etməsi, məşqlərini fərdi olaraq planlaşdırmaq və ya oyun strategiyalarında bəzi seçimlər etmək imkanı vermək, hər məşqdə öz güclü tərəflərini təkmilləşdirməyə və ya zəif tərəflərində xüsusi fokuslanmağa imkan yaratmaq onun daxili motivasiyasını artırır. Voleybol məşqçiləri, idmançılara daha çox seçim və müstəqillik verərək onların motivasiyasını artırmaq üçün bu prinsipdən istifadə edə bilərlər. Məşqçilər voleybolçu qızlarla birlikdə şəxsi hədəflər müəyyən edə bilərlər ki, bu da onların daxili motivasiyasını artırmağa kömək edər.

Səriştə (competence) fərdin bir fəaliyyətdə bacarıqlı olduğunu hiss etməsi və həmin fəaliyyətdə uğur qazanacağına dair özünə inamıdır. İnsanlar öz bacarıqlarını inkişaf etdirdikdə və onları səmərəli şəkildə tətbiq etdikdə özlərini daha motivasiyalı hiss edirlər. Məsələn məşq zamanı texniki bacarıqlarını təkmilləşdirən və oyunda üstünlük əldə edən bir voleybolçu qız, səriştə hissini artıraraq motivasiyasını yüksəldə bilər. Məşqçilər məşq zamanı voleybolçuların texniki bacarıqlarının təkmilləşdirilməsinə diqqət yetirməli və idmançılara fərdi yanaşmalı. Voleybolçu qızlar üçün kiçik məqsədlər qoymaq və həmin məqsədlərə çatdıqları zaman mükafatlandırmaq da onlarda motivasiyanın səviyyəsinin artırılmasına müsbət təsir göstərmiş olur.

Əlaqə (relatedness) fərdin başqaları ilə bağlılıq və sosial münasibətlər qura bilməsi, cəmiyyətin bir hissəsi olduğunu dərk etməsidir. İnsanlar dəstəkləndiklərini və cəmiyyətin bir hissəsi olduqlarını hiss etdikdə daha güclü motivasiya nümayiş etdirirlər. Komanda yoldaşları

ilə sıx ünsiyyət və dəstək hissi voleybolçu qızların motivasiyasını artırır, onları daha çox məşq etməyə və oyuna bağlı olmağa həvəsləndirir. Məşqçilər voleybolçu qızlar arasında komanda ruhunun inkişaf etdirilməsinə, qrup fəaliyyətləri təşkil edilməsinə və komanda yoldaşları arasında qarşılıqlı dəstək və əməkdaşlıq hissinin gücləndirilməsinə diqqət yetirməlidirlər.

Belə olan təqdirdə məşqçi və idmançı əlaqəsinə xüsusi diqqət yetirilməlidir. Yəni məşqçilər idmançılarla yaxın münasibət qurmalı və onların ehtiyaclarını dinləməlidir. Bu, voleybolçu qızların özlərini dəyərli hiss etmələrinə və daha çox təşəbbüs göstərmələrinə səbəb olacaqdır.

Onu da xüsusi qeyd etmək lazımdır ki Özünü Müəyyənetmə nəzəriyyəsi iki əsas motivasiya növünü fərqləndirir.

Onlardan birincisi daxili motivasiya (Intrinsic motivation) adlanır. Daxili motivasiya fərdin fəaliyyətə öz marağı və həvəsi ilə qoşulmasıdır. Bu zaman şəxs həzz almaq, öyrənmək və ya yeni təcrübə qazanmaq üçün fəaliyyətlə məşğul olur. Bir voleybolçu qızın oyunu sadəcə sevinc və həzz üçün oynaması daxili motivasiyaya nümunədir.

İkincisi xarici motivasiya (extrinsic motivation) hesab olunur. Xarici motivasiya fərdin fəaliyyətini mükafat qazanmağa və ya cəzalardan qaçmağa yönəldilən motivasiyasıdır. Bir voleybolçu qızın komanda üçün mükafat qazanmaq və ya məşqçinin tənqidindən qaçmaq üçün oyunda iştirak etməsi xarici motivasiyaya nümunədir.

Özünümüəyyənetmə nəzəriyyəsi, daxili (intrinsic) və xarici (extrinsic) motivasiya arasındakı balansın qorunmasına da diqqət yetirir. Voleybolçu qızların oyunda və məşqlərdə əsas məqsədlərinə uyğun olan vəzifələri müvəffəqiyyətlə yerinə yetirdikləri halda, idmançılara mükafatlar və təşəkkürlər təqdim etmək onların xarici motivasiya səviyyəsini artırır.

Özünümüəyyənetmə nəzəriyyəsi (Self-Determination Theory), voleybolçu qızların motivasiyasını artırmaq üçün mühüm bir yanaşmadır və idmançının daxili və xarici motivasiyalarının balanslaşdırılması üzərində dayanır. Bu nəzəriyyənin tətbiqi, voleybolçu qızların məşq və yarışlarda daha yüksək performans sərgiləmələri üçün psixoloji təsirləri gücləndirir və onların həm fiziki, həm də psixoloji inkişaflarını dəstəkləyir. Nəzəriyyənin üç əsas komponenti – muxtariyyət (autonomy), səriştə (competence) və əlaqə (relatedness) – voleybol məşqlərinə və yarışlarına çoxsaylı faydalar gətirə bilər.

Muxtariyyətin təmin edilməsi idmançılara öz məşq planlarını və strategiyalarını seçmək imkanı verərək, onların daha müstəqil və motivasiya olunmuş olmalarını təmin edir. Voleybolçu qızlar, öz məqsədlərinə çatmaq üçün birbaşa iştirak edərək, məşq və oyunlarda daha çox təşəbbüs və enerjiyə sahib olurlar. Bu, özlərinə inamlarını artırır və onları daha yüksək motivasiya səviyyəsində saxlayır.

Səriştə voleybolçu qızların öz bacarıqlarına olan etimadlarını və güvənlərini artırır. İdmançılar öz bacarıqlarını inkişaf etdirərək, yeni nailiyyətlər əldə etdikcə, motivasiya səviyyələri yüksəlir. Hər bir voleybolçu, öz təlimatlarını, texnikasını və oyun performansını təkmilləşdirərək, nəticədə öz potensialını daha yaxşı hiss edir və motivasiyasını artırır. Məşqçilər bu komponenti nəzərə alaraq, şəxsi bacarıqları inkişaf etdirən fərdi məşqlər və hədəflər təyin etməlidirlər.

Əlaqə isə voleybolçu qızlar arasında həm komanda ruhunun inkişafına, həm də məşqçi-idmançı münasibətinin möhkəmləndirilməsinə gətirib çıxarır. Komanda daxilində qarşılıqlı dəstək və əməkdaşlıq təbliğ edildikcə, idmançılar özlərini daha yaxşı hiss edir və bu, onların kollektiv performansını yüksəldir. Məşqçilər, voleybolçu qızlar arasında pozitiv münasibətləri gücləndirmək üçün komanda ruhu yarada bilərlər, bu da oyun performansına müsbət təsir edir.

Özünümüəyyənetmə nəzəriyyəsinin tətbiqi həmçinin voleybolçu qızların daxili motivasiyasını artıraraq onların idmana olan maraqlarını daha da artırmış olur. Daxili motivasiya, idmançıların sadəcə mükafatlar və nəticələr üçün deyil, öz inkişafları və şəxsi hədəfləri uğrunda çalışdıqları zaman ən yüksək nəticələri əldə etmələrini təmin edir. Daxili motivasiya ilə yanaşı, xarici motivasiya vasitəsilə qazanılan mükafatlar və tanınma, idmançıların əlavə təşviq olunmasını təmin edər, amma əsas odur ki, bu mükafatlar idmançının şəxsi hədəflərinə və daxili motivasiyasına xidmət etsin.

Bu nəzəriyyənin voleybolçu qızlar üçün tətbiqi yalnız fiziki hazırlığı artırmaqla qalmır, həm də onların psixoloji sağlamlığını gücləndirir. İdmançılar özlərini daha güclü və müstəqil hiss etdikdə, onlarda stressin idarə olunması və mental dözümlülük səviyyələri yüksəlir, bu da onların oyun zamanı yüksək performans göstər-

mələrini təmin edir. Nəticədə, voleybolçu qızların motivasiya səviyyələrinin artırılması onların peşəkar idman karyeralarında müvəffəqiyyət qazanmalarına səbəb olur.

Son olaraq, Özünümüəyyənetmə nəzəriyyəsi voleybol məşqlərində və yarışlarında tətbiq edilərkən, məşqçilərin və idman mütəxəssislərinin diqqət etməli olduqları əsas amillərdən biri, motivasiya səviyyələrinin müxtəlifliyi və hər bir idmançının fərdi ehtiyaclarının qarşılanmasıdır. Hər bir idmançının unikal psixoloji vəziyyəti və motivasiya mənbələri olduğuna görə, məşqçilər və mütəxəssislər bu nəzəriyyənin komponentlərini fərdi olaraq tətbiq etməli və idmançıların ehtiyaclarına uyğun təlim və dəstək metodları seçməlidirlər. Beləliklə, voleybolçu qızların motivasiyası artırılaraq, onların idman həyatlarında uğurlarını davamlı şəkildə yüksəltmək mümkündür.

**Problemin elmi yeniliyi.** Bu məqalə, Özünümüəyyənetmə nəzəriyyəsi ilə voleybolçu qızların motivasiya səviyyələrini artırmağa dair mövcud ədəbiyyata yeni töhfə verir və nəzəriyyənin voleybol idmanında konkret tətbiqini aydınlaşdıraraq, idmançıların psixoloji inkişafına və performanslarına müsbət təsir göstərəcək yeni praktik metodları təqdim edir.

**Problemin praktik əhəmiyyəti.** Məqalədən İdman Akademiyasında voleybol idman növü üzrə təhsil alan qızlar, voleybol üzrə çalışan məşqçilər, ölkə birinciliyi yarışlarında iştirak edən komandaların, üzvləri, məşqçiləri və bu sahədə tədqiqat aparanlar istifadə edə bilərlər.

**Nəticə:** Qadın voleybolçular üçün idman motivasiyasının formalaşdırılmasında Özünü Müəyyənetmə nəzəriyyəsinin müddəalarından, habelə praktik fəaliyyət istiqamətlərindən yararlanan qızların psixoloji hazırlıqları yüksəlir, onların qələbəyə olan inamları artır və şəxsiyyətyönlülük səviyyələri ilə yanaşı hərtərəfli inkişafları üçün yüksək zəmin yaranmış olur.

**Ədəbiyyat**


1. Ağayev O.M., Qədəşov E.N. Voleybol. -Bakı: İKF, -2003. -260 s.
2. Ağayev O.M., İsmayılov T.M. Voleybolçuların psixoloji hazırlığı. –Bakı: Maarif, -2004. -89s.
3. Sadıqov F.B. Ümumi pedaqogika (fiziki tərbiyə bölməsi). -Bakı: Maarif, -2023. -841 s.
4. Salamova K.B. Ümumi psixologiya (Dərs vəsaiti). –Sumqayıt: SDU, -2016. -448 s.
5. Qədəşov E.N., Sultanova S.O., Axundov S.R., Əliyev S.Y. Voleybol (ibtidai hazırlıq qrupları üçün dərslik). –Bakı: Nərgiz nəşriyyatı, -2008. -229 s.
6. Hacıyev Z.C., Əliyev S.Y. Liberonun hazırlığı. –Bakı: Ecoprint, -2019. -34 s.


**Redaksiyaya daxil olub:**20.05.2025

*UOT 376.167.1*

***Səbinə Ramiz qızı Aslanova***
*pedaqogika üzrə fəlsəfə doktoru,*
*Azərbaycan Dövlət Pedaqoji Universitetiti*
*https://orcid.org/0009-0001-4052-1631*
*https://doi.org/10.69682/arti.2025.92(3).145-149*

# AĞIR NİTQ POZULMASI OLAN ŞAGİRDLƏRİN İNKLÜZİV TƏHSİLİNİN SPESİFİKLİYİ

***Sabina Ramiz Aslanova***
*doctor of philosophy in pedagogy of*
*Azerbaijan State Pedagogical University*

# SPECIFICS OF INCLUSIVE EDUCATION FOR STUDENTS WITH SEVERE SPEECH DISORDERS

***Сабина Рамиз гызы Асланова***
*доктор философии по педагогике*
*Азербайджанский Государственный Педагогический Университет*

# СПЕЦИФИКА ИНКЛЮЗИВНОГО ОБРАЗОВАНИЯ УЧАЩИХСЯ С ТЯЖЁЛЫМИ НАРУШЕНИЯМИ РЕЧИ

**Xülasə.** Məqalə inklüziv şəraitdə ağır nitq pozulması olan uşaqların məktəbdə təhsil alması ilə bağlı aktual problemlərə, nitq pozulması olan uşaqlar üçün loqopedik dəstəyin xüsusiyyətlərinə həsr olunmuşdur. Məhdud imkanları olan uşaqların, o cümlədən ağır nitq pozulması yaşayan uşaqların müasir təhsil sisteminin yenidən qurulması onların səmərəli təlim və tərbiyə metodlarının axtarışını, inklüziv təhsil şəraitində yeni yanaşmaların yaradılmasını qarşısına məqsəd qoyur.

***Açar sözlər:*** *İnklüziv təhsil, məhdud imkanlar, ağır nitq pozulmaları, loqopedik dəstək, adaptiv əsas təhsil proqramı*

**Abstrct**. The article is devoted to the current issues related to the education of children with severe speech disorders in an inclusive environment and the specifics of speech therapy support for such children. The restructuring of the modern education system for children with disabilities, including those with severe speech disorders, aims to find effective methods of teaching and upbringing, as well as to develop new approaches within inclusive education.

***Keywords****: inclusive education, children with disabilities or limited abilities, severe, speech disorders, speech therapy support, adaptive general education program*

**Аннотация.** Статья посвящена актуальным проблемам обучения детей с тяжёлыми речевыми нарушениями в инклюзивной среде и особенностям логопедической поддержки таких детей. Реструктуризация современной системы образования для детей с ограниченными возможностями, включая детей с тяжёлыми нарушениями речи, ставит своей целью поиск эффективных методов обучения и воспитания, а также разработку новых подходов в условиях инклюзивного образования.
***Ключевые слова**: инклюзивное образование, дети с ограниченными возможностями или ограниченными возможностями здоровья, тяжёлые речевые нарушения, логопедическая поддержка, адаптивная общеобразовательная программа*

M.M. Semaqo və N.Y. Semaqoya görə, inklüziv təhsil ümumi təhsilin inkişaf prosesi olub, bütün uşaqların ehtiyaclarına uyğunlaşdırılmasını nəzərdə tutur ki, bu da məhdud imkanları olan uşaqlar üçün təhsilə çıxış imkanı yaradır [7]. İnklüziv təhsil – müxtəlif imkanlara malik uşaqların istisnasız olaraq bütün xüsusiyyətlərini nəzərə almaqla, təhsil müəssisəsinin məkanına və tələblərinə uyğunlaşdırılmasını tələb edən tam bərabərhüquqlu iştirakını nəzərdə tutur.

Ağır nitq pozulmaları dedikdə, ekspressiv (xarici) nitqin pozulduğu hallar başa düşülür ki, bu da uşağın ətraf mühitlə qarşılıqlı əlaqəsini çətinləşdirir. Loqopediya tədqiqatları göstərir ki, ağır nitq pozulması olan uşaqlarda psixoloji proseslərin inkişafında ikinci dərəcəli pozulmalar müşahidə olunur ki, bu da hafizənin həcminin azalması, diqqətin sabit olmaması, düşüncənin inkişafının geridə qalması və psixoloji proseslərin könüllü inkişafının zəifləməsi ilə xarakterizə olunur. Ağır nitq pozulmaları olan uşaqların kifayət qədər linqvistik təcrübəyə malik olmamaları onlara dərslik mövzularını əlavə hazırlıq (xüsusi dərslər, loqopedik məşğələlər) olmadan mənimsəməyə imkan vermir və buna görə də xüsusi şəraitlərin yaradılması, nitq çatışmazlığını aşmağa və müxtəlif nitq fəaliyyətləri ilə təcrübəsini zənginləşdirməyə yönəldilmişdir. İnklüziv təhsilin aşagıdaki variantları seçilir:

- Əsas təhsil proqramı üzrə təhsil, texniki və mənalı yazılı nitqin pozulması olan şagirdlər üçün korreksiya iş proqramının məcburi daxil edilməsidir (oxuma və yazma). Bunlar əsasən nitq və zəka inkişafı normal olan yeniyetmələrdə bu mexanizmlərin və əməliyyatların inkişafının yetərli olmaması ilə əlaqədardır: nitqin tempo-ritmik tərəflərinin pozulması, o cümlədən ahəngliyinin, intonasiyanın ciddi pozulması ilə; səs pozulmaları ilə;
- İlk genetik inkişaf pozulmasına məruz qalan, bütün nitq vasitələrinin formalaşmaması ilə özünü göstərən, loqopedik müdaxiləyə davamlı nitq inkişafı pozulması olan uşaqlar üçün adaptasiya olunmuş təhsil proqramı üzrə təhsil; yazılı nitq (oxuma və yazma) proseslərinin aşağı inkişaf səviyyəsi ilə, bu isə bütün nitq tərəflərinin inkişafındakı çatışmazlıqlarla əlaqədardır;
- Əsas təhsil proqramı üzrə təlim və ya adaptasiya edilmiş təhsil proqramı üzrə təlim, şagirdlərin danışıq və yazılı nitqinin müxtəlif patogenezi ilə əlaqəli pozulmalardı (ağır diksiyon pozğunluqları, səs və nitq əlamətləri ilə). Bunlar xəstəliklər, əməliyyat müdaxilələri, travmalar və s. səbəbindən meydana çıxır və bütün nitq tərəflərində və ya fərdi komponentlərində pozulmalarla təzahür edir ki, bu da uğurlu təhsil və sosiallaşmaya mane olur, əgər zəka normaldırsa [1].

Müəllim-loqopedin fəaliyyətinin məqsədi – nitq inkişafı pozulmalarını aşkar etmək və aradan qaldırmaq üçün şəraitin yaradılması, həmçinin ağır nitq pozulmaları olan uşaqların şifahi və yazılı nitqinin inkişafını, onların kommunikasiyasını təkmilləşdirmək, akademik təhsil proqramını uğurla mənimsəmələrini təmin etməkdir.

Bu məqsədə nail olmaq üçün loqopedin peşə fəaliyyətində aşağıdakı vəzifələr həll olunur:

1. Nitq pozulmalarının strukturu və dərəcəsini müəyyən etmək məqsədilə loqopedik müayinə aparmaq.
2. Loqopedik yardıma ehtiyacı olan uşaqlarla fərdi inkişaf proqramı hazırlamaq.
3. Ağır nitq pozulması olan uşağa loqopedik yardım göstərilməsi, bu, yaşı və inkişaf xüsusiyyətlərini nəzərə alaraq fərdiyönlü proqramların hazırlanması və həyata keçirilməsini əhatə edir. Həmçinin pedaqoji kollektivə yardım göstərilməsini də nəzərdə tutur. Nitq inkişafı pozğunluqlarını düzəltmək üçün loqopedik işin istiqamətləri, metodları və üsullarının müəyyən edilməsi, didaktik və metodik materialların seçilməsi.
4. Ağır nitq pozulması olan uşağın nitq inkişafının dinamikasını təhsil proqramını mənimsəmə prosesində öyrənmək, bu mövcud fərdi korreksiya-loqopedik proqramı düzəltməyə

Yadda saxlama dil öyrənmənin əsas komponentidir. Uşaqlar yeni sözləri, ifadələri, qrammatik qaydaları və tələffüzləri əzbərləyirlər. Bu daimi əzbərləmə prosesi onların yaddaşını inkişaf etdirir, onu daha güclü və etibarlı edir. Bu cür təlim yalnız qısamüddətli yaddaşı deyil, həm də uzunmüddətli yaddaşı yaxşılaşdıra bilər. Yaddaşın daimi istifadəsi onun elastikliyini qorumağa və yaxın gələcəkdə yaşa bağlı deqradasiyanın qarşısını almağa kömək edir. Müxtəlif dilləri başa düşmək və istifadə etmək, həmçinin ümumi intellektual inkişafa töhfə verən beyin fəaliyyətini aktivləşdirir.

3. Təfəkkürün inkişafı

İkinci dili öyrənməklə inkişaf etdirilən təfəkkür digər müxtəlif fənlərdə öz bəhrəsini verir. Məsələn, riyaziyyat və məntiqi təfəkkür tez-tez mücərrəd düşünmə qabiliyyətini və ikidilli təcrübə ilə bilavasitə dəstəklənən bacarıqları tələb edir. Uşaqlar yeni bir dil öyrənəndə qaydaları müəyyən etməyi və tətbiq etməyi öyrənirlər ki, bu da onların məntiqi və əyani-əməli təfəkkürünü inkişaf etdirir. Bu bacarıqlar mürəkkəb anlayışların başa düşülməsini və məlumatların təhlili və sintezi əsasında həll yollarının tapılmasını tələb edən riyazi məsələlərin həlli zamanı xüsusilə faydalı olur. [3]

4. Yaradıcılıq qabiliyyətinin inkişaf etdirilməsi

Yeni bir dil öyrənmək sadəcə sözləri və qrammatik strukturları yadda saxlamaqdan prosesi deyildir. Bu, mahiyyətcə stimullaşdırıcı və yaradıcı olan yeni ideyalara, mədəniyyətlərə və ifadə üsullarına səyahətdir. Yaradıcılığın inkişafının əsas aspektlərindən biri dil məhdudiyyətlərinə uyğunlaşmaq və düşüncələrinizi çatdırmaq üçün yaradıcı yollar tapmaq ehtiyacıdır.

Uşaqlar yeni bir dil öyrənəndə tez-tez söz ehtiyatlarının fikirlərini tam və dəqiq ifadə etmək üçün hələ kifayət etmədiyi vəziyyətlərlə qarşılaşırlar. Belə hallarda onlar ixtiraçı olmağa və alternativ ünsiyyət yollarını tapmağa məcbur olurlar. Bu, bənzətmə, təsvir və ya hətta şifahi olmayan jestlərdən istifadə ola bilər. Belə bir mühitdə uşaqlar tək bir ifadə formasına bağlanmadan çevik və yaradıcı düşünməyi öyrənirlər. Onlar anlamağa başlayırlar ki, mesajlarını çatdırmağın bir çox yolu var və bu dərketmə yaradıcı düşünmə qabiliyyətinə səbəb olur.

5. Beynin qocalma prosesini ləngidir

İki dil bilmək beynin qocalma prosesinə müsbət təsir göstərir. Edinburq Universiteti tərəfindən aparılan bir araşdırmada, ikidilli insanların beyinlərinin daha yavaş qocaldığını, buna görə də daha uzun, daha aktiv yaşadıqları qeyd olunur. Bilinqual insanlar beynin yaşlanmasını gecikdirə və nevroloji xəstəliklərə qarşı daha davamlı ola bilərlər. Alzheimer və demansı gecikdirir. Elmi tədqiqatlar göstərib ki, iki və ya daha çox dil bilən insanlarda Alzheimer xəstəliyinin simptomları orta hesabla 4-5 il gec ortaya çıxır. Beyin daim iki dil arasında keçid etdiyi üçün daha çox məşq edir. Aparılan araşdırmaların nəticəsində sübut olunmuşdur ki, iki dil bilən insanlar insultdan daha sürətli sağalırlar.

6. Analitik və məntiqi düşünmə qabiliyyətinin inkişafı

İkidilliliyin məntiqi və analitik düşüncəyə təsiri beynin dil, diqqət və qərarvermə proseslərini necə idarə etməsi ilə bağlıdır. Araşdırmalar göstərir ki, ikidilli insanlar müxtəlif dillər arasında keçid edərkən beyinlərinin icraedici funksiyalarını daha çox işlədirlər. Bu, onların məntiqi və analitik düşünmə bacarıqlarını gücləndirir. Bilinqual insanlar dillərin fərqli qrammatik və leksik strukturlarını müqayisə edərək daha dərin qavrama bacarığı inkişaf etdirirlər. Bu, onların səbəb-nəticə əlaqələrini daha dəqiq analiz etmələrinə kömək edir. İkidillilər daim dillər arasında keçid etməyə məcbur olduqları üçün onların diqqət idarəetməsi daha yaxşı inkişaf edir. Bu da onlara eyni anda bir neçə amili nəzərə almağı və daha sürətli təhlil aparmağı asanlaşdırır. [1]

Bütün bunlardan əlavə iki dil bilmənin bir çox sosial, psixoloji və həyati faydaları olduğu sübut edilmişdir. Bunlara biz qeyd edə bilərik:

1. Sosial imkanların genişliyi
2. Özünüifadənin inkişaf etdirir
3. İkidilli insanların əmək bazarında rəqabət qabiliyyəti artır
4. Multitasking (eyni anda bir neçə tapşırığı həll etmək)
5. Empatiya hissinin artırır
6. Müxtəlif mədəniyyətlərlə tanış olmaq
7. Şəxsi inkişaf

Bəs iki dil bilmənin mənfi cəhətləri varmı? İki dil bilmək bizə necə mənfi təsir göstərir? İkidilliyin insan beyninə göstərdiyi mənfi cəhətlər aşağıdakı kimi xarakterizə edə bilərik:

1. Nitqin gec formalaşması

İkidilli uşaqlar daha gec danışmağa başlayırlar. Bu, uşağın eyni vaxtda iki dildə lazımi lüğət toplamalı olması ilə izah olunur və bunun üçün vaxt lazımdır. İkidilli uşaqların valideynləri övladı ilə daha çox vaxt keçirməli və onunla iki dildə danışmalıdırlar.

2. Müxtəlif nitq pozulmalarının olması

Daima iki dil arasında keçid etmək, nitqdə gecikmələrə və ya tələsməyə, həyəcanlamağa, düzgün sözü tapa bilməməyə, özünü ifadədə çətinliyə səbəb olur. Bu da öz növbəsində bir sıra nitq pozulmalarının yaranmasına gətirib çıxarır:

- Dislaliya – hər bir dilin özünəməxsus fonemlər sistemi, qrammatikası və aksenti olduğu üçün danışıq zamanı sözlərin və səslərin tələffüzündə təhrif olunmalar müşahidə olunur.
- Kəkələmə – ikidilli insanlar danışarkən bir dildən digərinə keçid etməkdə təbii olaraq daha çox rast gəlirlər. Bu keçidlər bəzən nitqdə kəkələməyə səbəb ola bilər, çünki beyin hər iki dili paralel işlətməyə çalışır və bir dilin strukturu digərinə təsir edir. Keçid edən zaman bəzən "düşüncə fasilələri" yaranır ki, bu da kəkələmə ilə nəticələnə bilər.
- Bradilaliya – ikidilli insanlarda müəyyən bir sözü tapmaqda çətinliklər yarana bilər. Hər iki dilin paralel olaraq işlənməsi nəticəsində, bəzən bir dilin sözləri digərindən daha sürətli tapıla bilər, amma digər dilin sözlərini tapmaq üçün beyin əlavə vaxt sərf etməli olur. Bu çətinliklər, nitqin axıcılığını və sürətini azalda bilər.

3. Dillərin qarışdırılması

Bu problem adətən uşaq yaşlarda, xüsusilə 3-4 yaşlarında nitqin formalaşdığı dövrdə müşahidə olunur.

4. Dil bacarıqlarının qeyri-bərabər inkişaf etməsi

Problem ondan ibarətdir ki, uşaq yazı və oxumaq üçün öz ana dilindən istifadə edə, danışıq dili kimi isə başqa dildən istifadə edə bilər. [5]

Sadalanan bütün bu mənfi cəhətləri o qədər də ciddi hesab etmək olmaz. Bir neçə tövsiyəyə əməl etməklə, onları aradan qaldırmaq mümkündür.

- Birincisi, kiçik səhvləri düzəltmək ehtiyacını aradan qaldırmaq və uşağın fikrini özü bitirməsinə icazə vermək.
- İkincisi, uşaqların dil mədəniyyəti haqqında biliklərini genişləndirmək, onları ölkənin tarixi və adət-ənənələri ilə tanış etmək.
- Üçüncüsü, uyğun tədris üsullarını seçmək.

**Problemin aktuallığı.** Müasir dövrdə qloballaşma və multikulturalizm şəraitində bir neçə dili bilmək – yəni bilinqualizm – getdikcə daha çox əhəmiyyət kəsb edir. Təhsil sistemləri, iş bazarları və beynəlxalq əlaqələr insanların bir neçə dildə sərbəst ünsiyyət qurmasını tələb edir. Bu səbəbdən bilinqualizmin insanın zehni və psixoloji inkişafına təsiri məsələsi aktuallaşır. Xüsusilə, bilinqualizmin insan beynində yaddaş, diqqət, qərarvermə və dil emalı kimi funksiyalara necə təsir etdiyi həm elmi, həm də praktik baxımdan ciddi maraq doğurur. Eyni zamanda, bir neçə dili eyni anda öyrənməyin və istifadə etməyin potensial mənfi tərəfləri – məsələn, kod qarışması, gecikmiş dil inkişafı və ya zehni yüklənmə – araşdırma obyektinə çevrilmişdir. Bütün bunlar göstərir ki, bilinqualizmin insan beyninə olan təsirlərinin öyrənilməsi hazırkı dövrdə mühüm elmi və sosial əhəmiyyət daşıyır.

**Problemin yeniliyi.** Bilinqualizmin insan beyninə təsiri uzun illərdir araşdırılsa da, bu sahədə aparılan tədqiqatlar son dövrlərdə daha dərinə enmiş və neyrobiologiya, psixolinqvistika, funksional MRT texnologiyaları kimi sahələrin imkanlarından istifadə edilməklə daha dəqiq nəticələr əldə edilməyə başlanmışdır. Yeni elmi yanaşmalar göstərir ki, bilinqualizmin beyində neyroplastiklik, icraedici funksiyalar və kognitiv ehtiyatlara təsiri daha əvvəl düşündüyümüzdən daha mürəkkəb və fərdi xarakter daşıyır.

Bu problemin yeniliyi həm də onunla izah olunur ki, müasir dövrdə bilinqualizm yalnız dil bilmək bacarığı kimi deyil, həm də insan beyninin struktur və funksional dəyişikliklərinə səbəb olan bir faktor kimi qiymətləndirilir. Müxtəlif yaş qruplarında bilinqualizmin təsirlərinin fərqli şəkildə özünü göstərməsi, erkən yaşda bilinqual mühitə düşənlərlə sonradan ikinci dili öyrənənlərin beyin reaksiyalarının fərqliliyi tədqiqatları daha da aktuallaşdırır.

**Problemin praktiki əhəmiyyəti.** Bilinqualizmin insan beyninə təsirinin öyrənilməsi yalnız elmi cəhətdən deyil, həm də praktik baxımdan mühüm əhəmiyyət daşıyır. Müasir dövrdə çoxdilli mühitdə yaşayan uşaqların və gənclərin psixoloji və zehni inkişafını düzgün istiqamətləndirmək üçün bilinqualizmin yaratdığı dəyişikliklərin dərindən anlaşılması vacibdir.

Tədqiqat nəticələrinin təhsil sahəsində tətbiqi müəllimlərə və valideynlərə bilinqual uşaqlarla işləməkdə daha effektiv metodların seçilməsində kömək edə bilər. Məsələn, iki dilli tədris proqramlarının tərtibi, dil balansının qorunması, kod qarışmasının qarşısının alınması və ya hər iki dilin inkişafına dəstək verən strategiyalar bu araşdırmaların nəticələri əsasında müəyyən edilə bilər.

**Ədəbiyyat**


1. Vereşçaqin, E.M. (1973) "İkidilliliyin psixoloji və metodoloji xüsusiyyətləri" -Moskva, -s. 67-91
2. Baker, C "İkinci dilin mənimsənilməsi və öyrənilməsi". İkidilli təhsilin və ikidilliliyin əsasları.- London, 2001. -s.109-134.
3. Baker, C. "İkidilliliyin inkişafı". İkidilli təhsilin və ikidilliliyin əsasları. -London, -s. 85-109.
4. Baker, C. "İkidillilik və idrak". İkidilli təhsilin və ikidilliliyin əsasları. -London, 2001-s. 134-162.
5. İmedadze, N.V. "İkinci dildə mənimsənilmə və biliyin eksperimental psixoloji tədqiqi" -Tbilisi, -1979 s. 28-44



**Redaksiyaya daxil olub:** 05.05.2025

*UOT 159.9.*

***Novruz İsa oğlu Musayev,***
*Azərbaycan Tibb Universiteti*
*pedaqogika elmləri doktoru, professor*
*https://orcid.org/0009-0003-0849-6856*
*E-mail: fizikaelmi@gmail.com*
*https://doi.org/10.69682/arti.2025.92(3).164-169*

***Elşad Novruz oğlu Musayev,***
*respublika xəstəxanasının şöbə müdiri*

***Aypara İbrahim qızı Həsənova***
*fizika-riyaziyyat üzrə fəlsəfə doktoru*
*orcıd: https://orcid.orq/0009-0007-4008-2580*

# ORQANİZMİN STASİONAR HALININ (HOMEOSTAZ) TƏNZİMLƏNMƏSİNİN FİZİKİ ƏSASLARI

***Novruz Isa Musaev,***
*doctor of pedagogical sciences, professor*
*Azerbaijan Medical University*

***Elshad Novruz Musaev,***
*head of the department of the Republican Hospital*

***Aypara Ibrahim Gasanova***
*doctor of philosophy in physical and mathematicals sciences*

# PHYSICAL GROUNDS OF REGULATING THE STABLE STATUS (HOMEOSTASIS) OF AN ORGANISM

***Новруз Иса оглы Мусаев,***
*доктор педагогических наук, профессор*
*Азербайджанский Медицинский Университет*

***Эльшад Новруз оглы Мусаев,***
*заведующий отделением Республиканской больницы*

***Айпара Ибрагим гызы Гасанова***
*доктор философии по физико-математическим наукам*

# ФИЗИЧЕСКИЕ ОСНОВЫ РЕГУЛИРОВАНИЯ СТАЦИОНАРНОГО СОСТОЯНИЯ (ГОМЕОСТАЗА) ОРГАНИЗМА

**Xülasə.** Müasir tibbin nailiyyətləri, kifayət dərəcədə dəqiq elmlərin, texniki və tibbi cihaz qayırmanın inkişafı ilə əlaqədardır. Xəstəliyin təbiəti və sağalmanın mexanizmi bu elm sahələrinin köməyi ilə öyrənilir və aradan qaldırılır.

Orqanizm ətraf mühitlə qarşılıqlı təsirdə, maddə və enerji mübadiləsində olmaqla öz mövcudluğunu təmin edir. Bu qarşılıqlı təsir vasitəsilə orqanizm özünü tənzimləyir, təzələyir, xarici mühitə uyğunlaşır (ya da mühiti özünün tələblərinə uyğunlaşdırır). Maddə və enerji mübadiləsi orqanismin qomeostazını (stasionar halını) təmin edir.
***Açar sözlər:*** *Orqanizm, sistem, mübadilə, qradient, stasionar, maddə, enerji*

**Abstract.** Achievements of the modern scient are substantially related to the development of precise sciences, technology and production of medical equipment. The nature of diseases is studied and they are treated with the help of these sciences.

The organism is constantly interacting with the surrounding environment and ensures its existence through the exchange of energy. This interaction provides for self-regulation, renovation and adaptation (either of the organism to the environment or vice-verse) of the organisms. Substance and energy exchange ensures the homestasis of the organism.
***Keywords:*** *Organism, system, exchange, gradient, stable, matter, energy*

**Аннотация.** Достижения современной медицины значительно связаны с развитие точных наук, техники и производства медицинского оборудования. Изучение природы болезней и их излечение проводится с их помощью.

Организм обеспечивает свое существование посредством взаимодействия с окружающей средой и обмена веществами и энергией. При помощи данного взаимодействия организм саморегулируется и адаптируется (адаптируя себе к среде или наоборот). Обмен веществ и энергии обеспечивает гомеостаз (стационарное состояние) организма.
***Ключевые слова:*** *организм, система, обмен, градиент, стационарный, материя, энергия*

Müasir tibbin əldə etdiyi nailiyyətlər kifayət dərəcədə dəqiq elmlərin, texniki və tibbi cihazqayırmanın inkişafı ilə əlaqəlidir. Xəstəliyin təbiəti və sağalmanın mexanizmi bu elmlər vasitəsilə ilə öyrənilir və aradan qaldırılır. Canlı orqanizmlərdə makroproseslərlə bərabər molekulyar proseslər də baş verir və bu mikro proseslər yekunda bioloji sistemlərin təbiətini müəyyən edir. Belə mikro prosesləri bilmək, orqanizmin vəziyyətini qiymətləndirməyə, bəzi xəstəliklərin təbiətini müəyyən etməyə, dərman maddələrindən düzgün istifadəni tənzimləməyə və s. imkan verir.

İ. P. Pavlov yazmışdır: "... İnsan, əlbəttə ki, bütün təbiət üçün qaçılmaz və yeganə olan sistemdir (kobud desək maşındır), lakin bizim müasir dünyagörüşümüzdə yüksək dərəcədə özünü tənzimləməyə qabil yeganə sistemdir. .......orqanizmlərdə bütün təşkiledicilər incə və dəqiq şəkildə biri-biri ilə əlaqəlidir, öz aralarında və ətraf mühitlə tarazlıqdadır". Bu tarazlıq daim pozulur və özünü tənzimləmə mexanizmləri ilə bərpa edilir. Ən yüngül ziyansız nasazlıqlar və dözülməz dərəcədə ağır olan xəstəliklər insan orqanizminin fəaliyyətində mövcud olan uyğunlaşdırılmış tarazlığı bu və ya başqa dərəcədə pozur. Ona görə də bu pozğunluqları bilmək və vaxtında aradan qaldırmaq üçün, mürəkkəb nəzarət edici qurğular və daimi nəzarət lazımdır.

F. Engelsin qeyd etdiyi kimi, "Orqanizm heç şübhəsiz, mexanika, fizika və kimyanı, bir tam kimi özündə birləşdirən ali varlıqdır" (K. Marks və F. Engels. Əsərləri 20 c., s.566, rus dilində). Bu varlığın vəziyyəti parametr adlanan fiziki kəmiyyətlərlə (həcm, təzyiq, temperatur, sıxlıq və s.) xarakterizə olunur. Sistem ətraf mühit maddələri ilə qarşılıqlı təsirdə olarkən, zaman keçdikcə sistemin parametrləri dəyişmirsə, sistemin belə halına stasionar (qərarlaşmış) hal deyilir. Stasionar halda sistemin müxtəlif hissələrində onun parametrlərinin qiyməti fərqli olur. Nəticədə, parametrlərin qradienti əmələ gəlir və bu qradient sistemin mövcudluğu dövründə daim sabit saxlanılır. Belə sistemlərdə kimyəvi reaksiyalar da sabit sürətlə baş verir. Sistemin qərarlaşmış halı, ətraf mühitlə qarşılıqlı təsir vasitəsilə, sistemdən keçən maddə və enerji selinin qiyməti hesabına yerinə yetirilir. Bu qarşılıqlı təsir zamanı orqanizm özünü tənzimləyir, təzələyir və mövcudluğunu təmin edir. İ. M. Seçenovun qeyd etdiyi kimi, "orqanizm, onun varlığını təmin edən xarici mühitsiz mövcud ola bilməz".

Müxtəlif funksiyaları yerinə yetirən canlı orqanizm xarici mühitə uyğunlaşır və ya mühiti özünün tələblərinə uyğunlaşdırır. Istənilən hüceyrə, toxuma, orqan və ya orqanizmin bütün fizioloji funksiyaları, bu canlı varlığın tarixi əlamətlərinin və fərdi inkişafının nəticəsidir. İnki-

şaf prosesində bu canlı quruluşun müəyyən funksiyaları meydana gəlir və onun keyfiyyət və kəmiyyət dəyişiklikləri baş verir. Ona görə də elmin əsas vəzifəsi o dəyişiklikləri araşdırmaq və meydana çıxan funksiyaları öyrənməkdir.

Canlı orqanizm ətraf mühitlə daim maddə və enerji mübadiləsində olur. Bu proses, həm bütöv orqanizmdə və həmdə onun bütün təşkil-edicilərində baş verən fiziki və fiziki-kimyəvi dəyişikliklərdən, maddə və enerji çevrilmələrindən ibarətdir. Maddə mübadiləsi və ya *metobolizm*, həyat üçün vacib olan əsas şərtdir. O, canlıları cansızlardan, canlı aləmi, qeyri üzvi aləmdən fərqləndirir. Maddə dəyişikliyi və enerji çevrilmələri qeyri üzvi aləmdə də baş verir. Lakin, canlı orqanizmlərdə və qeyri üzvi aləmdə baş verən belə proseslər arasında prinsipial fərqlər mövcuddur. Bu fərqlərin mahiyyətini F. Engels "Təbiətin dialektika"sı əsərində belə formalaşdırmışdır: "Qeyri üzvi cisimlərdə də analoji maddə mübadiləsi baş verir, hansı ki, faktiki olaraq hər yerdə baş verir, çünki hər yerdə çox yavaş da olsa kimyəvi proseslər baş verir. Lakin, fərq ondan ibarətdir ki, qeyri üzvi cisimlərdə belə mübadilə onları dağıdır, parçalayır. Canlılarda isə, bu mübadilə onların yaşaması (mövcudluğu) üçün vacib, lazımlı şərt sayılır". Yaşamaq, fəaliyyət göstərmək, o vaxta qədər mümkündür ki, nə vaxta qədər ki, maddələr mübadiləsi onları mühafizə edir və onun özünü təzələməsini təmin edir. Maddə mübadiləsinin kəsilməsinin nəticəsi, ölüm, protoplazmanın dağılması və onun üçün xarakterik olan kimyəvi birləşmələrin, birinci növbədə zülali birləşmələrin parçalanmasıdır.

Açıq termodinamik sistem olan canlı orqanizm, ətraf mühit maddələri ilə qarşılıqlı təsirdə olmasına baxmayaraq, onun vəziyyətini xarakterizə edən parametrlər zaman keçdikcə dəyişmir. Sistemlərin belə vəziyyətinə stasionar hal (qomeostaz) deyilir. Stasionar halda sistemin müxtəlif hissələrində, sistemi xarakterizə edən parametrlərin qiymətləri (orqanizmin müxtəlif hissələrinin temperaturu, hüceyrə membranının müxtəlif tərəflərində diffuziya edən hissəciklərin konsentrasiyası və s.) biri-birindən fərqlənir, onların qiymətlərinin qradienti əmələ gəlir, bu qradientlər biri-birindən fərqlənir və orqanizmin normal vəziyyətində daim sabit qalır. Bu sistemlərdə kimyəvi reaksiyalar da sabit sürətlə baş verir. Belə sistemlərin stasionar halı, sistemdən keçən maddə və enerji sellərinin hesabına əldə edilir.

Təcrid olunmuş sistemlər müəyyən vaxt keçdikdən sonra termodinamik tarazlıq halına keçir. Bu halda, qərarlaşmış halda olduğu kimi, sistemin parametrləri zamandan asılı olaraq dəyişmir və sistemin müxtəlif nöqtələrində biri-birinə bərabər olur. Sistemin bu vəziyyətinə termodinamik tarazlıq halı deyilir. Klassik fizikada belə hesab edilirdi ki, termodinamik sistemlərdə ancaq enerjinin səpələnməsi və sərbəst enerjinin azalması ilə bağlı proseslər baş verə bilər. Bu proseslər qradientlərin azalmasına, sistemin iş görmə qabiliyyətinin aşağı düşməsinə və son nəticədə termodinamik tarazlığın yaranmasına səbəb olur. Lakin, canlı orqanizmlərdə qradientlə əlaqəli proseslərin baş verməsindən başqa (məsələn, maddələrin passiv transportu), əks qradient proseslər də (məsələn, maddələrin aktiv transportu) baş verir. Bioloji sistemlərin iş görmə qabiliyyəti də zaman keçdikcə azalmır, onların həyat fəaliyyəti isə illərlə və on illərlə davam edir.

Klassik termodinamikaya görə, bütün sistemlərdə baş verən proseslər, sistemi termodinamik tarazlıq halına yaxınlaşdırmalıdır. Onun canlı sistemlərə tətbiqi isə o deməkdir ki, onları ölümə yaxınlaşdırmalıdır. Lakin, bütün bunlar ancaq məsələnin görünən, zahiri əlamətlərdir. Bu onunla izah olunur ki, klassik termodinamikanın qanunları təcrid olunmuş sistemlər üçün tərtib edilmişdir, canlı orqanizmlər isə açıq termodinamik sistemlərdir. Ona görə də, canlı orqanizmlərin termodinamikasına, açıq sistemlərin termodinamikası kimi baxılmalıdır. Açıq termodinmik sistemlərdə sərbəst enerjinin dF və entropiyanın dS ümumi dəyişmələri iki cəmdən ibarətdir: sərbəst enerjinin $dF_i$ və entropiyanın $dS_i$ dəyişmələri, sistem daxilində baş verən biokimyəvi və biofiziki proseslərin getməsi ilə, sərbəst enerjinin $dF_e$ və entropiyanın $dS_e$ dəyişmələri isə, sistemin ətraf mühitlə qarşılıqlı təsiri nəticəsində baş verən dəyişmələridir:

$dF = dF_i + dF_e$ (1)

$dS = dS_i + dS_e$ (2)

Orqanizmlərdə bütün biokimyəvi və biofiziki proseslər dönməyən proseslərdir və onlar enerjinin bir hissəsinin istiliyə çevrilməsi ilə baş verirlər. Ona görə də, sistemin sərbəst enerjisi arası kəsilmədən azalır, entropiyası isə arası kəsilmədən artır. Lakin canlı orqanizmlərdə sərbəst enerjinin artmasına səbəb olan əksqradient

prosesləri də baş verir: məsələn, maddələrin konsentrasiya qradientinin əksinə, transportu (aktiv transport), müxtəlif yüksək molekullu birləşmələrin sintezi və s. əks qradient prosesləridir. Belə proseslər lokal (yerli) xarakter daşıyır və qradientin əmələ gəlmə prosesləri ilə əlaqəli şəkildə baş verirlər. Əks qradient prosesləri sərbəst enerjinin əmələ gəlməsinə səbəb olur, sistemin ümumi termodinamik potensialı (sərbəst enerjisi) azalmır və prosesin gedişının ümumi qanunauyğunluğu pozulmur. Əgər orqanizm, ətraf mühitlə maddə və enerji mübadiləsində olmasaydı, onda o mütləq termodinamik tarazlığa yaxınlaşardı. Lakin, bu baş vermir, sistemin sərbəst enerjisi, arası kəsilmədən xaricdən sistemə daxil olan maddə və enerji hesabına bərpa olunur, orqanizm daxilində hasil olunan entropiya isə daim, orqanizmdən xaric olunur. Sərbəst enerjinin bərpası yeyinti məhsullarının orqanizmə daxil olması hesabına, entropiyanın azalması isə, orqanizmdən xaric edilən maddə və istilik hesabına həyata keçirilir. Orqanizm əlavə sərbəst enerji ehtiyatı qəbul edir və özünün mövcudluğunu, yaşama qabiliyyətini təmin edir. Yeyinti məhsullarının qəbulu hesabına orqanizm öz irsi məlumatları əsasında özünün irsi zülalını hazırlayır və mövcudluğunu təmin edir.

Canlı orqanizm üçün enerjinin saxlanması qanunu belə ifadə edilir: yeyinti məhsullarının həzmi nəticəsində əmələ gələn enerji U: ətraf mühitə verilən istiliyin Q və orqanizmin fəaliyyəti zamanı gördüyü işlərin A kompensasiyasına sərf olunur:

$$U = Q + A \quad (3)$$

(3) insan orqanizminin enerji balansı tənliyidir və bunun əsasında da insanların qəbul edəcəyi yeyinti məhsullarının kalorilik dərəcəsi müəyyənləşdirilir. Çevrilən enerji ilə, ayrılan istiliyin ekvivalentliyi 1781-ci ildə A. L. Lavuaze və P. S. Laplas tərəfindən müəyyən edilmişdir.

Tam bir sutka (gecə və gündüz) ərzində insanın enerji balansı: orta hesabla aşağıdakı cədvəldə göstərilmişdir (Cədvəl 1)

***Cədvəl 1.***
***Bir sutka ərzində insanın enerji balansı***

| Daxil olma (kkal) | Sərfiyyat (xaric olma) kkal |
|---|---|
| Qida maddələri | Dəridən xaric olan istilik 1374 |
| 56,8 q. zülal 237 | Nəfəs vermə ilə xaric olan qaz 43 |
| 140 q. yağ 1307 | Nəcis və sidik 23 |
| 79,9 q. qarbohidrat 335 | Nəfəs vermə vasitəsilə buxarlanma 181 |
| | Dəridən buxarlanma 227 |
| | Düzəliş 11 |
| Yekun ... 1879 | Yekun ... 1859 |

Orqanizmin qidasını təşkil edən yağlar, karbohidratlar və zülali maddələr yanma prosesində müxtəlif miqdarda enerji hasil edirlər. Məsələn 1 q karbohidratın son məhsula qədər parçalanması zamanı 4180 kalori, 1 q yağ son məhsula qədər parçalanan zaman 9460 kalori və 1 q zulal son məhsula qədər parçalanan zaman 4360 kalori istilik verir.

Yanma prosesində 100q yağın verdiyi istiliyi, 215q zülal və 230q karbohidratın yanmasından almaq olar. Lakin qeyd edilən izodinamiki uyğunluğun olmasına baxmayaraq, qida normasından istənilən üzvi maddəni çıxarıb, başqası ilə əvəz etmək olmaz. Çünki, qidalanma prosesində qida maddələrindən yağlar, zülallar və karbohidratlı maddələr ayrı-ayrılıqda zəruridirlər və müxtəlif funksiyaları yerinə yetirirlər.

Hesablamalar göstərir ki, istirahət zamanı, insan orqanizmi tam bir sutka ərzində 75q zülal, 82q yağ və 204q karbohidrat istifadə edir.

Açıq termodinamik sistemlərin araşdırılması sayəsində müəyyən edilmişdir ki, bu **sistemlərdə dönməyən proseslərin baş verməsi nəticəsində, entropiyanın artımı həmişə müsbət və mümkün qiymətlərdən ən minimumuna bərabər olur.** Entopiya sərbəst enerjinin səpələnmə ölçüsü olduğu üçün deyə bilərik ki, sistemin stasionar halında sərbəst enerjinin səpələnməsi minimal olur. Sistem, özünün dayanıqlı vəziyyətini saxlamaq üçün, sistemə daxil olan sərbəst enerjilərdən ən minimumunun daxil olmasını tələb edir. Bu xassə, stsionar vəziyyəti dayanıqlı saxlamaq üçün çox böyük əhəmiyyətə malikdir. Əgər sistem hər hansı səbəbdənsə, stasionar vəziyyətdən kənara çıxırsa, onda sistemin

minimum entropiya əmələ gətirmək xassəsinə uyğun daxili dəyişiklik baş verir və bu xassəyə görə, baş verən dəyişiklik sistemi stasionar vəziyyətə qaytarmağa çalışır. Stasionar halın bu xassəsi **autotənzimləmə, deyilən anlayış isə, Le – Şateiye - Braun prinsipi adlanır.**

Entropiya, sərbəst enerjinin səpələnməsi ölçüsü olduğu üçün, deyə bilərik ki, sistemin stasionar halında sərbəst enerjinin səpələnməsi minimal olur. Deməli, sistem stasionar halını saxlaması üçün, sistemə daxil olan sərbəst enerjinin bütün mümkün qiymətlərindən ən minimumunu seçməlidir. Ona görə də orqanizm çalışır ki, ən əhəmiyyətli energetik səviyyədə (rejimdə) işləsin. Bu xassə, stasionar halın saxlanılması üçün çox böyük əhəmiyyətə malikdir. Əgər sistem hər hansı bir səbəbdənsə stasionar haldan kənara çıxırsa, onda entropiya artımının minumum olmasını təmin etmək təşəbbüsü sayəsində sistemdə daxili dəyişikliklər baş verir və bu dəyişikliklər sistemi stasionar vəziyyətə qaytarır. (Bəzi xəstəliklərdə, məsələ xərçəng xəstəliyinin axırıncı etapında bu çətin başa gəlir).

İzole edilmiş sistemlərdə termodinamiki proseslər istiqamətlənmiş xarakter daşıyır və baş verən proseslər sistemi termodinamik tarazlıq halına gətirir. Bioloji obyektlər açıq termodinamik sistemlərdir, ətraf mühitlə enerji və maddə mübadiləsində olurlar. Ümumiyyətlə desək, canlı orqanizmlər inkişaf edən sistemlərdir. Əslində inkişaf edən sistemlər stasionar vəziyyətdə olmurlar. Lakin, hər hansı kiçik zaman intervalında belə sistemin halını stasionar hal kimi qəbul etmək olar.

Canlı sistemlərin (hüceyrələrin, orqanların, orqanizmlərin) – mövcudluğunun (yaşamasının) əsası – diffuzion proseslərin, biokimyəvi reaksiyaların, osmotik hadisələrin və s. yerinə yetirilməsi sayəsində, yəni, orqanizmin stasionar halının qorunub saxlanması hesabına əldə edilir. Ətraf mühit amillərinin dəyişməsi zamanı, orqanizmdə baş verən proseslər elə cərəyan edirlər ki, orqanizmlər əvvəlki stasionar halda qalmırlar. Lakin, orqanizmlər autotənzimləmə mexanizmləri vasitəsilə orqanizmi stasionar halda saxlamağa çalışırlar.

Orqanizmlərin (bioloji sistemlərin), xarici dəyişmələrə uyğunlaşmasının (adaptasiya) bir neçə meyarını göstərmək olar. Əgər xarici şərait dəyişərkən (temperatur artır və ya azalır, rütubət, havanın tərkibi və s. dəyişirsə), orqanizm stasionar halını saxlaya bilirsə, orqanizm bu dəyişikliyə adaptasiya olur və yaşayır. Əgər xarici şəraitinin dəyişməsi zamanı, orqanizm öz stasionar halını saxlaya bilmirsə, onda bu şəraitdən çıxır və bu proses onu ölümə aparır.

Orqanizmə, onun tarazlıq halını pozmağa yönəlmiş kənar qüvvə təsir etdikdə, sistem elə vəziyyətə keçir ki, bu halda xarici təsir effekti zəifləyir. Məsələn, ətraf mühitdə temperatur yüksəldikdə, orqanizmin tarazlıq halı istiliyin daha effektiv udulmasını təmin edən reaksiya vəziyyətinə keçir, təzyiq yüksəldikdə isə, orqanizm elə vəziyyətə keçir ki, bu vəziyyətdə orqanizmdə gedən reaksiyalar, həcmin azalmasını təmin etsin; nəticədə hər iki halda orqanizmdə temperatur və təzyiqin artımı gözləniləndən daha az olur.

Belə hallarda, orqanizmlərin stasionar vəziyyətləri, mənfi əks rabitəyə malik olan avtotənzimləmə mexanizmlərinin köməyi ilə təmin edilir. Məsələn, məməlilərdə belə mexanizmlərin yerinə yetirilməsinin gedişatı məlumdur. Belə ki, ətraf mühitin temperaturunun yüksəlməsi, istilik tənzimləyici mexanizmlərə təsir edərək, orqanizmin istilik yaratma qabiliyyətini zəiflədir və istilikvermə (istilik ifrazı) qabiliyyətini artırır. Bununla da, belə tənzimləmə nəticəsində, ətraf mühitin temperaturunun geniş intervalda dəyişməsi zamanı, istiqanlı canlıların bədəninin temperaturu, ətraf mühitin temperaturunun geniş intervalda dəyişməsi zamanı sabit saxlanılır. Başqa bir misal: ətraf mühitdə karbon qazının miqdarı artdıqda, yüksək miqdarda karbon qazı olan havanın udulması nəticəsində, qanda karbon qazının təzyiqinin (gərginliyinin) dayanıqlı artmasının qarşısının alınması üçün, autotənzimləmə mexanizmlərindən istifadə olunur. Karbon qazı, kimyəvi reseptorlara təsir edir, tənəffüs mərkəzinin qıcıqlanmasını və qaz mübadiləsinin intensivliyi güclənir ki, bu da, qanda karbon qazının gərginliyinin normaya qədər azalmasına səbəb olur. Digər misal, yeyinti məhsulları ilə orqanizmə çox miqdarda duzun daxil olması, qanda osmotik təzyiqi hiss ediləcək dərəcədə dəyişmir, Belə ki, bu vaxt böyrəklər hipertonik sidiyin ifrazatını sürətləndirir və artıq duzun daxil olmasını kompensasiya edir.

Əgər bioloji sistem çox da böyük olmayan xarici təsirə məruz qalırsa, onda avtotənzimləmə mexanizmləri sayəsində, orqanizm stasionar vəziyyətdə saxlanılır. Qıcıqlanma təsir etdikdə sistem bir stasionar səviyyədən digərinə, yeni, daha

sərfəli olan stasionar səviyyəyə keçir. Bu zaman, kənara çıxmaların bütün səviyyələri fizioloji normada qalır. Şəkil 1-də sistemin bir stasionar haldan digərinə keçərkən alınan tipik əyrilər göstərilmişdir. Şəkil "a"-da bir stasionar haldan digərinə keçidin sadə eksponensial əyrisi verilmişdir.




***Şəkil 1. Stasionar vəziyyət səviyyələri arasında keçid əyriləri verilmişdir.***
***x – stasionar vəziyyəti xarakterizə edən parametrin qiyməti; t-zamandır***
***a – eksponensial yaxınlaşma; b – eksponensial meyl etmə ilə keçid.***

a) keçidi, məsələn, fiziki əmək fəaliyyəti intensivliyinin bərabər sürətli dəyişməsi zamanı, insanın nəfəs alma tezliyinin və ürək döyüntülərinin dəyişməsi halı üçün xarakterikdir.

b) keçidi, məsələn, insanın fiziki iş görməsinin intensivliyinin kəskin dəyişməsi zamanı, onun arterial qan təzyiqinin dəyişməsini xarakterizə edir.

Qeyd etmək lazımdır ki, göstərilən əyrilər stasionar halların keçid proseslərini ancaq ilk yaxınlaşmada, təxmini xarakterizə edir. Diqqətlə yanaşılsa, həm keçid prosesləri, həm də stasionar proseslər rəqsi xarakter daşıyır, dəyişkən olurlar. Stasionar halın pozulması zamanı, stasionar halın tənzimlənməsi, orqanizmin stasionar haldan kənara çıxma dərəcəsindən və autotənzimləmə mexanizmlərinin təkmilləşmə dərəcəsindən asılıdır.

**Problemin aktuallığı.** Canlı orqanizmlərdə baş verən fiziki və fiziki-kimyəvi proseslərin dəqiq elmlərlə araşdırılması dövrün aktual problemlərindəndir.

**Problemin elmi yeniliyi.** Orqanizmin izotermiyasının fiziki və fiziki-kimyəvi proseslərinin araşdırılması, problemin elmi araşdırılmasıdır.

**Problemin praktik əhəmiyyəti.** Canlı orqanizmlərin stasionar halının (stabilliyinin) bilinməsi bütün tibb işçiləri, tələbə kollektivi və praktik həkimlər üçün böyük praktiki əhəmiyyətə malikdir.

**Ədəbiyyat**

1. Musayev N. İ. Tibbi və bioloji Fizikanın ixtisas fənləri ilə əlaqəli tədrisinin elmi-metodiki əsasları. Monoqrafiya. -Bakı: Hüquq ədəbiyyatı, -2010. -509 s.
2. Musayev N. İ. Tibbi təhsil müəssisələrində fizika elminin tədrisinə verilən müasir tələblər.// Azərbaycan Milli Elmlər Akademiyasının məruzələri, -Bakı, 2010. № 4. -s.127-131.
3. Бабский Е. Б., Зубков А. А., Косицкий Г. И., Ходоров Б.. И. Физиология человека «Издательство медицина» -Москва,1966. - 656 с.
4. Ремизов А. Н., Максина А. Г., Потапенко А.Я. Медицинская и биологическая физика-М.: «Геотар-Медиа» .
5. Губанов Н. И., УтепбергеновА. А. Медицинская биофизика. -Москва: «Медицина» -1978, -335 с.

**Redaksiyaya daxil olub:** 05.05.2025

UOT 159.9.

***Məhərrəm Sabir oğlu Əliyev***
*Azərbaycan Dillər Universitetinin elmlər doktoru proqramı üzrə qiyabi doktorantı,*
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin Ümumi psixologiya*
*kafedrasının dosenti, psixologiya üzrə fəlsəfə doktoru*
*https://orcid.org/0000-0002-3762-8745*
*E-mail: dos.m.aliyev@gmail.com*
*https://doi.org/10.69682/arti.2025.92(3).170-176*

## GƏNCLƏR ARASINDA SUİSİDAL RİSK AMİLLƏRİNİN PSİXOLOJİ TƏHLİLİ

***Maharram Sabir Aliyev***
*part-time doctoral student of the doctor of science program at*
*Azerbaijan University of Languages,*
*associate professor of the department of General psychology*
*at Azerbaijan State Pedagogical University,*
*doctor of philosophy in psychology*

## PSYCHOLOGICAL ANALYSIS OF SUICIDE RISK FACTORS AMONG YOUTH

***Магеррам Сабир оглы Алиев***
*докторант-заочник по программе доктора наук*
*Азербайджанского Университета Языков,*
*доцент кафедры Общей психологии*
*Азербайджанского Государственного Педагогического Университета,*
*доктор философии по психологии*

## ПСИХОЛОГИЧЕСКИЙ АНАЛИЗ ФАКТОРОВ РИСКА СУИЦИДА СРЕДИ МОЛОДЕЖИ

**Xülasə.** Gənclər arasında intihar hallarının olması aktual qlobal problemdir və onun göstəriciləri müxtəlif cəmiyyətlərdə durmadan artır. Gənclik onu suisidal düşüncələrə və davranışa qarşı xüsusilə həssas edən əhəmiyyətli psixoloji, emosional və sosial dəyişikliklərlə xarakterizə olunan kritik dövrdür. Bu məqalədə gənclər arasında intiharın riskinin psixoloji amilləri nəzərdən keçirilir, bu problemin anlaşılması və həlli üçün hərtərəfli əsasın təmin edilməsi məqsədilə nəzəri perspektivlər və empirik tədqiqatlar əlaqələndirilir.
***Açar sözlər:*** *intihar, intihar enerjisi, gənclik yaşı, suisidal risk amilləri, Qeyri-tarazlıq psixologiyası*

**Abstract.** Youth suicide is a pressing global issue, with rates steadily increasing across various societies. Youth is a critical development period characterized by significant psychological, emotional, and social changes, often making youth particularly vulnerable to suicidal ideation and behavior. This essay delves deeply into the psychological risk factors for youth suicide, integrating theoretical perspectives and empirical studies to provide a comprehensive framework for understanding and addressing this issue.
***Key words:*** *suicide, suicidal energy, youth, suicidal risk factors, Non-equilibrium psychology*

**Аннотация.** Самоубийство среди молодежи является актуальной глобальной проблемой, и ее показатели неуклонно растут в различных обществах. Юность является критическим периодом развития, характеризующимися значительными психологическими, эмоциональными и социальными изменениями, которые часто делают молодежь особенно уязвимой к суицидальным мыслям и поведению. В этом эссе подробно рассматриваются

психологические факторы риска самоубийства среди молодежи, объединяются теоретические перспективы и эмпирические исследования, чтобы обеспечить всеобъемлющую основу для понимания и решения этой проблемы.

***Ключевые слова:*** *самоубийство, суицидальная энергия, молодежь, факторы риска суицида, Неравновесная психология*

***Giriş***

Ümumdünya Səhiyyə Təşkilatının (ÜST) məlumatına görə, "İntiharlar bütün yaşam boyu baş verir və 2021-ci ildə bütün dünyada 15–29 yaş aralığında olan insanlar arasında aparıcı ölüm səbəbinə görə üçüncü olmuşdur" (1). Bu anlamda, gənclik yaşı xüsusilə suisidal risk amillərinin təsirinə daha həssasdır.

Qeyd etmək lazım ki, müasir dövrdə gənclər bir çox xüsusiyyətləri ilə öncəki nəsil gənclərdən fərqlənir. Bu fərqləri həm müsbət, həm də mənfi çalarları ilə təsnif etmək öyrənilən məsələyə adekvat yanaşmağa daha geniş imkanlar yaradır. Çünki intihar mürəkkəb proses olduğu üçün gənclərin suisidal risk ehtimalını artıran amillər müxtəlifdir. Ona görə də, birincisi, müxtəlif müəlliflərin gənclik haqqında fikirləri, onları spesifik şəkildə xarakterizə etməsi diqqətimizdən yayına bilməz.

İkincisi, intiharın sadəcə bir səbəbi olduğunu düşünmək yanıldıcı ola bilər. Qəbul etməliyik ki, intihara cəhd edən gənclər və ya suisidal risk ehtimalı daşıyan gənclər şəxsi həyatlarında bir neçə səbəb və amilin təsirinə məruz qalır. Aşağıdakı cədvəl 1-də intihara şərait yaradan amillər – risk amilləri və müdafiə amilləri – əks olunur (2):

***Cədvəl 1.***

| **Risk amilləri** | | | **Müdafiə amilləri** |
|---|---|---|---|
| *Fərdi amillər* | *Qarşılıqlı münasibət amilləri* | *İctimai və sosial amillər* | |
| Öncəki intihar cəhdləri | Xoşagəlməz uşaqlıq təcrübəsi | Tibbi yardımın alınmasına maneə | Problemlərin dəf edilməsi və həlli vərdişləri |
| Psixi xəstəliklər (depressiya) | Bullinq | Stiqma (psixi sağlamlıq yaxud yardım axtarışı ilə əlaqəli) | Ailə, dost və birliklə əlaqələr |
| Sosial təcridilik | Ailədə intihar tarixçəsi | Ölümcül vasitələrin əlçatanlığı | Baxıcılarla dəstəkləyici əlaqələr |
| Psixoaktiv maddələrin qəbulu | Ailədə yaxud həmyaşıdlarla konflikt | KİV-lərdə intiharların təhlükəli təsviri | Tibbi yardımın əlçatanlığı |
| | | Sistemli travma yaxud marginal təcrübə (sosial-iqtisadi amillərə, irqi-etnik mənsubiyyətə yaxud gender-seksual identikliyə əsaslanan) | Ölümcül vasitələrə əlçatanlığa məhdudiyyət |

İntihar riski səviyyələrini və onların meyarlarını qeyd etməyi məqsədəuyğun sayırıq:

*Aşağı risk* aydın intihar düşüncələrinin olmaması ilə, məhdud tezlikli, intensivlikli və davamlılığa malik intihar düşüncələri ilə, identifikasiya olunan plan yaxud planların olmaması ilə, aydın niyyətin olmaması ilə, risk amillərinin az sayda miqdarı və bir neçə müdafiə amilləri ilə müəyyən edilir.

*Orta risk* məhdud intensivlikli və davamlılığa malik intihar düşüncələrinin tez-tez olması ilə, 3 aydan daha əvvəl olmuş intihar cəhdləri ilə, məhdud yaxud qeyri-müəyyən plan və ya planlarla, aydın niyyətin olmaması ilə, ölümcül vasitələrə məhdud əlçatanlığın olması ilə, bəzi risk amilləri və bəzi müdafiə amilləri ilə müəyyən edilir.

*Yüksək/qaçılmaz risk* tez-tez baş verən, intensiv və sabit intihar düşüncələrinin olması ilə, son 3 ayda baş vermiş və ya cari olan intihar cəhdləri ilə, konkret plan yaxud planlarla, hərəkət etmək niyyəti, məşq davranışı yaxud hazırlıq

davranışı ilə, ölümcül vasitələrə əlçatanlığın olması ilə, ağır stresslə, kəskin təhrikedici hadisənin olması ilə, çoxlu sayda risk amilləri və varsa əgər müdafiə amillərinin azsaylı miqdarı ilə müəyyən olunur (3).

Üçüncüsü, gənclərdə suisidal risk amillərinin müəyyən edilməsi intiharların profilaktikası üzrə tədbirlər planının hazırlanması baxımından böyük önəm kəsb edir.

Araşdırmada predmetlə bağlı mövcud elmi-psixoloji ədəbiyyatların təhlilindən, müxtəlif psixoloqların yanaşmalarından, Azərbaycanda ilk dəfə inkişaf etdirilən Qeyri-tarazlıq psixologiyasının müddəalarından (4; 5), həmçinin intiharın 7-li (7 addımlı) preventiv modelindən (6) istifadə edilmişdir.

***Nəticə***

Müasir gənclərin psixoloji xüsusiyyətləri ilə bağlı müxtəlif tədqiqatçıların çoxsaylı düşüncələri və təsnifatları vardır. Məsələn, N.E. Simonoviç müasir gənclərin aşağıdakı psixoloji əlamətlərini ayırd edir:

- *Gənclərin ətraf aləmə münasibəti.* Müasir gənclik istənilən qadağanı, məhdudiyyəti və davranış qaydalarını inkar edir.
- *Gənclərin başqa insanlara münasibəti.* Müasir gənclik qarşılıqlı qayğı və diqqətə söykənən yaxın və dərin ünsiyyəti qəbul etmir.
- *Gənclərin özlərinə münasibəti.* Müasir gənclər televiziyanın, KİV-lərin, kinonun, hətta cizgi filmlərinin, dinin, internetin təsiri altında məşhur insanların davranış üslubunu təqlid etməyə cəhd edir.
- *Gənclərin işə və asudə vaxta münasibəti.* Müasir gənclərdən bir qismi karyeranı düşünür, digər qrup gənclər isə asudə vaxta və istehlakçı davranışına önəm verir. Müasir gənclik hedonistik (həzz əsaslı) davranışa meyllidir.
- *Gənclərin təhsilə və özünüinkişafa münasibəti.* Müasir gənclər özünütəhsilə və səriştənin artırılmasına xeyli zaman ayırır və ona görə də, müxtəlif tipli kurslara, təlimlərə gedir, konfranslarda, simpoziumlarda iştirak edir. Tədqiqat deməyə əsas verir ki, özünütəhsilə yönəlmə maddi durumdan daha çox, həmin gəncin ətrafında olan insanların özünüinkişafa münasibəti ilə bağlıdır.
- *Müasir gənclərin həyat üslubu.* Müasir gənclərin gözəllik qavrayışı özünəməxsus çalarlara malikdir. Məsələn, bu gün bəzi gənclər özlərini ifadə etmə şəklini cırıq paltarlar geyərək ifadə edə bilirlər. Bu, onların gözəllik anlayışını qavrama şəkilləridir.
- *Gənclərin ictimai və şəxsi dəyərləri.* Müasir gənclərin öz dəyərlər sistemi formalaşır. Gənclər onların dəyərlər sistemi haqqında təsəvvürlərinə kənar müdaxiləni xoşlamırlar.
- *Gənclərin ətraf gerçəkliyi qavraması və dərk etməsi.* Müasir gənclər daima adrenalin axtarır, onları ancaq kəskin və güclü duyğular cəlb edir.
- *Gənclərin nöqteyi-nəzərindən sosial xarakterin produktivliyi.* Gənclər mövcud texniki vasitələrin köməyilə öz qüvvələrini optimallaşdırmaq yerinə, həmin vasitələrlə yaradılmış gerçəkliyin özünə daxil olurlar (7).

E.N. Narxova qeyd edir ki, tələbə gənclərin müsbət və mənfi əlamətlərini müqayisə etsək, paradoks əmələ gələcək: onlara eyni vaxtda aqressivlik və humanizm, avaraçılıq və məqsədyönlülük, apatiklik və təşəbbüskarlıq, eqoizm və altruizm, mənəviyyatsızlıq və intellektuallıq, zənginlik istəyi və bilik istəyi, ümumilikdə, insanlığa məlum olan bütün pisliklər və fəzilətlər xasdır (8).

Beləliklə, E.N. Narxovaya görə, postsovet gənclərinin intellektual-əxlaqi təbəqələşməsini aşağıdakı kimi təsəvvür etmək olar:

1. İntellektual elita o tələbələr qrupudur ki, ali təhsilə şüurlu və enerjili şəkildə can atır, belə ki, onu həyati vacib olan həm terminal, həm də instrumental dəyər sayır. Elita etik cəhətdən müxtəlif formada istiqamətlənmiş iki altqrupa parçalanmışdır: a) intellektuallara, б) intelligentlərə.
2. Qeyri-intellektual gənclik kütləsi, hansı ki, yüksək təhsilə, inkişaf etmiş mənəvi maraqlara malik deyil və onlara can atmır. Bu gənclər kütlə mədəniyyətinin insanlarıdır. Lakin onlardan bəziləri, xüsusilə həqiqi dindarlar intellektual elitanın nümayəndələrini etik inkişafda ötüb keçə bilərlər (8).

Təhlillər göstərir ki, gənclərdə suisidal risk amillərinin vahid təsnifatı yoxdur. Müxtəlif müəlliflər və tədqiqatçılar öz araşdırmaları kontekstində doğru bildikləri amilləri qeyd və təhlil edirlər. Bu məsələdə, hər bir tərəfin öz doğruları və yanlışları ola bilər. Araşdırma mövzumuz, əsasən, suisidal risk amilləri ilə bağlı olsa da, ilk olaraq, suisidal davranışın aşağıdakı əsas səbəblərinin fərqləndirildiyini qeyd edək:

– *depressiv pozuntu; ətrafdakılarla konfliktlər; şəxsiyyəti onun dostlarının yanında al-*

*çaltmaq; təcrid, tənhalıqda həyat, ailə üzvləri və yaxın adamlar tərəfindən dəstəyin itirilməsi; şəxsiyyətin özünün dəyərsizləşdirilməsi; iqtisadi problemlər; işdə problemlər; əks cinslə problemlər; stress və stress faktorları; aqressiya və qıcıqlandırıcılıq; fiziki ağrı* (9).

O.S. Kovşovanın fikrincə, gənclik mühitində suisidal riskin əsas amilləri nümayişkarlıq, affektivlik, unikallıq, iflas, sosial pessimizm, zaman perspektivinin pozulmasıdır (10). Suisidal riskin əlavə amillərinə hipotimiya (əhvalın sabit düşməsi), həyəcanlılıq, kənara çıxan davranış, həmçinin psixoaktiv maddələrdən sui-istifadə daxildir. Onun apardığı tədqiqatın nəticələri göstərmişdir ki, suisidal riskli gənc adamlara şizoid əlamətlər, xarakterin astenik-nevrotik əlamətləri, həmçinin emansipasiyanın (müxtəlif növ sosial asılılıqlardan imtina) yüksək reaksiyası, depressiyaya meyl, həqiqi suisidal istiqamətlilik xasdır.

Suisidal riskli gənclərdə sosial-psixoloji adaptasiyanın, özünü və başqalarını qəbuletməyin, emosional komfortluğun, internallığın səviyyəsinin azalması və eskapizmin (həyatda xoş olmayan şeydən qaçmaq) yüksək göstəriciləri qeyd olunur. Suisidal davranışa meylliliyin psixoloji amillərinin reqressiya analizi üç təsdiqlənmiş önəmli faktoru aşkar etmişdir:

- *sosial-psixoloji adaptasiyanın səviyyəsinin azalması,*
- *eskapizmin göstəricilərinin yüksəlməsi,*
- *hipotimiyanın göstəricilərinin yüksəlməsi* (10).

N.V. Surquçevanın fikrincə, gənclərlə iş zamanı suisidal riskin növbəti amillərini nəzərə almaq lazımdır:

- *ünsiyyətin yüksək konfliktliliyi, gəncin cəmiyyətdə təcrid olunması, xoşagəlməz ailə mühiti, irsi faktor, qeyri-adekvat özünüqiymətləndirmə, konfliktli, yaxud psixotravmatik situasiya, gəncin davranışında kəskin dəyişiklik, asosial həyat obrazı, eqosentrizm (gənclərin əsas sosial-psixoloji xüsusiyyətlərindən biri), ailə üzvlərinin, yaxud yaxın, sevimli insanların itirilməsi* (11).

Yuxarıda deyilənləri nəzərə alsaq, düşünürük ki, sadalanan amillər problemin masştabını anlaya bilmək nöqtəsində bizə xeyli ölçüdə önəmli material verir, lakin sadalanan bütün amillər onları riyazi ölçmə meyarlarına sığmadığından dolayı bizim işimizi asanlaşdırmadığı üçün çox da yararlı ola bilmir. Ona görə də, ölçülə bilən amilləri müəyyən etmək hədəfilə yola çıxaraq, belə nəticəyə gələ bilərik ki, gənclərdə (ümumən hər bir insanda) suisidal risk amilləri aşağıdakılardır:

1. ***Üzücü problemin sayı (ölçüləbiləndir);***
2. ***Problemin tezliyi (ölçüləbiləndir);***
3. ***Problemin dəyəri və ona münasibət (ölçüləbiləndir)*** (12).

Sadaladığımız risk amillərini əsas götürərək, əvvəl təklif etdiyimiz işçi düsturu (12) aşağıda göstərilmiş şəkildə müəyyən qədər yenidən işləmiş oluruq:

$$E_i = f\,(M_d, T_p, S_p)$$

Burada E – enerji, *f* – funksiya, i – intihar, M – dəyərli olan problemə münasibət, d – dəyər, T – problemin tezliyi, p – problem və S – problemin sayıdır.

Ehtimal edirik ki, intihar enerjisi lazımi həddə çatdıqda, istənilən insan özünü öldürə bilər. Başqa sözlə, bizim iddiamıza görə, hər bir insan doğuşdan intihar etmə gücünə və imkanına malik olur. Sadəcə hamı özünü öldürəcək enerji həddinə çata bilmir. Həmin hədd təklif etdiyimiz düsturla ölçülə bilər.

Gənclərdə suisidal risk amillərinin profilaktikası üzrə tədbirlər planı haqda danışmamışdan öncə, bir məsələ ilə də bağlı fikir bildirmək önəmlidir. Məsələ ondadır ki, intihar nəticəsində ölən gənclərin davranışında xəbərdaredici əlamətlər və dəyişikliklər özünü təzahür etdirə bilər (2). Lakin təhlillərdə o da qeyd olunur ki, suisidal riskli bütün gənclərdə bu əlamətlər özünü göstərməyə bilər, necə ki, müvafiq davranışı sərgiləyən bütün gənclər də suisidal risk ehtimalı daşımır. Bu xəbərdaredici əlamətlər aşağıdakılardır:

- *İntihar haqqında söhbətlər, ümidsizlik hissi, özünü yük kimi hiss etmək yaxud yaşamağın anlamsız olması*
- *Əhvalın dəyişkənliyi* (depressiyanı, narahatlığı və oyanmanı daxil etməklə)
- *Davranışın dəyişməsi:* psixoaktiv maddələrdən istifadənin artması, fəaliyyətdən imtina, ailədən və dostlardan təcridilik, yuxunun olmaması yaxud hədsiz çox olması, dəyərli əşyaların paylanması, qıcıqlandırıcılıq (2).

Bizim təklif etdiyimiz tədbirlər planını müzakirə etmədən öncə, elmi ədəbiyyatda sözü keçən tədbirlərin qısa analizini verməyi məqsədəuyğun sayırıq.

S.V. Vaulinə görə, gənclər arasında intiharların öncədən ehtimal edilməsinin ilkin şərti şəxsi xarakteristikaları suisidin artan riskini yaradan gənc insanların hərtərəfli psixoloji-pedaqoji üzə çıxarılması, bu kateqoriya gənclərlə fərdi iş, profilaktik tədbirlər sisteminin işlənilməsi və ailələrlə geniş maarifləndirmə işidir (13).

Suisidin ilkin profilaktikası risk qrupuna daxil olan gənc adamlara münasibətdə həyata keçirilir (14). Müəllifin fikrincə, iddia etmək olmaz ki, bu gənc adamlar mütləq şəkildə suisidal niyyəti həyata keçirəcəklər, lakin suisidal faktorların kompleksini nəzərə alsaq, bu qrupa münasibətdə profilaktik işlər həyata keçirmək zəruridir. Birinci növbədə, müəssisələrin psixoloji xidmət işçilərinin kompleks tədbirlər həyata keçirməsi zəruridir, hansılar ki, pedaqoqların suisidal risk meyarlarının tanınması üzrə səriştəliliyinin artırılmasına şərait yaradacaq və mürəkkəb həyati situasiyaya düşən gənc adamlara dəstək olacaq.

Suisidal davranışın ikinci profilaktikası mürəkkəb həyati şərtlər daxilində yaşayan və birbaşa və ya dolayı yolla (yazılar, gündəliklər, rəsmlər, sosial şəbəkələrdə ünsiyyət və s. vasitəsilə) suisidal niyyətləri təzahür etdirən gənc adamlar qrupuna münasibətdə həyata keçirilir. Onun əsas hədəfi – suisidal niyyətlərin üzə çıxarılması və qarşısının alınmasıdır. İlk növbədə, praktik psixoloq intihar riskini qəymətləndirməlidir.

Suisidin üçüncü profilaktikası o tədbirləri nəzərdə tutur ki, hansılar ki, parasuisid ehtimalının, suisidentin sosial və psixoloji reabilitasiyasının və onun sosial mühitinin nəticələrini aşağı salsın və onu azaltsın. Bu tədbirlər suisid cəhdi həyata keçirmiş gənc adamlarla həyata keçirilir, belə ki, ağrı mənbəyinin hifz olunması zamanı adam problemdən ikinci "qaçış" cəhdini həyata keçirə bilər.

Risk qrupuna daxil olan gənc adamların daha dərin və detallı diaqnostik müayinəsinə ehtiyacı vardır. İ.B. Bovinaya görə, aşağıdakı metodikaları istifadə etmək olar:

- patoxarakteroloji sorğu (Liçko); frustrasiya tolerantlığı test (Rozensveyq); suisidal risk sorğusu (SRS); sosial-psixoloji adaptasiya sorğusu (Rocers-Daymond); həyəcan səviyyəsinin özünüqiymətləndirilməsi şkalası (Spilberq-Xanin); aqressivlik sorğusu (Bass-Dark) (15).

V.A. Soldatkin, A.V. Dyaçenko və K.S. Merkuryevanın fikrincə, gənclərlə şəxsiyyətin dəyəri və həyatın anlamı haqqında ardıcıl söhbətlər, "Mən – bu "Mən"əm", "Mənim hiss etmək və öz hisslərimi ifadə etmək hüququm var", "Özünəinamsızlıq", "Konfliktlər", "Yeniyetmə və böyük", "Əks cinslə ünsiyyət", "Stress və depressiya" və b. mövzularda disputlar keçirilməlidir. Profilaktik işin ikinci elementi təlim müəssisəsində və ailədə müsbət psixoloji iqlimin yaradılmasıdır – gənclərin ictimai fəaliyyətə, mədəni-tərbiyəvi tədbirlərə cəlb olunması (idman yarışları, klublar, cəmiyyətlər və s.), hansılar ki, gənclərin və pedaqoqların müsbət vətəndaşlıq, estetik hislərinin, mənəviyyatının formalaşmasına şərait yaradır (16).

Suisidal meyllərin psixoloji korreksiyası emosiyaları idarəetmə texnikalarının öyrənilməsinə, problem situasiyalarda konstruktiv davranış reaksiyalarına yiyələnməyə, şəxsiyyətin dəyərinin, onun qrupda sosial statusunun müsbət özünüqiymətləndirməsinin inkişaf etdirilməsinə, şəxsi inkişaf təlimlərinə istiqamətlənmişdir; valideynlərlə, pedaqoqlarla, gənclərlə suisidə təkan verən faktorların aradan qaldırılmasına istiqamətlənmiş konsultativ iş.

Suisidal niyyətli gənclərin aşkarlanması zamanı verilən davranışa qarşı effektiv profilaktik işlər kimi növbəti şərtlər çıxış edə bilər: *müxtəlif ictimai fəaliyyətdə iştirak* (idman yarışları, eyni düşünən klubların toplantısı); *qohumlar tərəfindən dəstək*, *həmyaşıdları ilə etibaredici və pozitiv münasibətlər*; *böyüklərlə mütəhərrik münasibətlər*.

Bizim təklif etdiyimiz profilaktik tədbirlər isə aşağıdakıları nəzərdə tutur:

***1. Gənclərin yaşadığı problemlərin sayı vaxtında müəyyən edilməli;***

***2. Gənclərin problemi yaşama tezliyi aşkar olunmalı;***

***3. Gənclərin yaşadıqları problem(lər)ə münasibəti və həmin problem(lər)in onlar üçün dəyəri dəqiqləşdirilməlidir.***

Ehtimal edirik ki, adı çəkilən üç istiqamətdə işlər vaxtında və düzgün görüldüyü zaman gənclərdə suisidal riski aradan qaldırmış ola bilərik.

Gənclər arasında suisidal risk amillərinin anlaşılması və aradan qaldırılması nəzəri perspektivlərlə praktik müdaxiləni əlaqələndirməklə, psixoloji, sosial və mədəni dinamikanı nəzərə alan çoxölçülü yanaşmanı tələb edir. Bu məqsədlə münbit mühit formalaşdırıla bilər, hansı ki, davamlılığa və gənclər arasında intihar riski-

nin azalmasına şərait yaradar. Gənclərdə suisidal risk amillərinin təsnifatı məqsədli müdaxilə və profilaktika strategiyalarının müəyyən edilməsinə kömək edir. Bu istiqamətdə tədqiqatların davam etdirilməsi, gənclərin təhsillənməsi və cəmiyyətin həyatında aktiv iştirakı gələcək nəsillərin psixi rifahının təmin edilməsi baxımından həyati əhəmiyyət daşıyır.

**Problemin aktuallığı.** Müasir dövrdə gənclər arasında intihar hallarının artması suisidal riski artıran amillərin müəyyən edilməsini, təsnifləndirilməsini və işlənilməsini yenidən aktual edir.

**Problemin elmi yeniliyi.** Gənclərdə suisidal risk amillərinin təsnif və Qeyri-tarazlıq psixologiyası kontekstində ölçüləbilən risk amillərinin təsvir edilməsi ilə yanaşı, ilk dəfə məqalədə gənclərin psixoloji keyfiyyətləri, suisidal risk amilləri və bu istiqamətdə profilaktik tədbirlər planı əlaqəli şəkildə işlənmişdir.

**Problemin praktik əhəmiyyəti.** Gənclərdə suisidal risk amillərinin psixoloji təhlili gənclər arasında maarifləndirici işlərin aparılması, həmçinin mümkün intihar hallarının aradan qaldırılması istiqamətində tövsiyələrin hazırlanmasına imkan yaradır.

**Ədəbiyyat**


1. Suicide: [Electronic resource] / URL:https://www.who.int/news-room/fact-sheets/detail/suicide
2. Risk Factors, Protective Factors, Warning Signs of Youth Suicide: [Electronic resource] / American Academy of Pediatrics. – Washington: – 02.04.2022. URL: https://www.aap.org/en/patient-care/blueprint-for-youth-suicide-prevention/risk-factors-protective-factors-warning-signs-of-youth-suicide/?srsltid=AfmBOoobzfHRy9pPgNxbiqNBpw0dVguuII8Warowqd_bhwJghkDExdng
3. Suicide Risk Level Criteria Provincial: [Electronic resource] / AMH – Clinical Business Initiatives. March, 2022
URL:https://www.albertahealthservices.ca/assets/info/amh/if-amh-suicide-risk-level-criteria.pdf
4. Əliyev, M.S. Qeyri-tarazlıq psixologiyası: sahə nəzəriyyəsinə yeni baxış: [Electronic resource] // – Bakı: Bakı Qızlar Universitetinin Elmi əsərləri, – 2018, № 3, s.220-225 URL: https://bqu.edu.az/storage/fe543256-491b-44f2-82d0-9c3eb5c0182c.pdf
5. Əliyev, M.S. Qeyri-tarazlıq psixologiyasının metodoloji əsasları: [Electronic resource] // "Psixologiya Zirvəsi: Problemlər, perspektivlər və yeni yanaşmalar" adlı beynəlxalq elmi-praktik konfransın materialları (tezislər). – Bakı: ADPU nəşriyyatı, 25 iyul – 26 iyul 2019, – 2020, – s. 14-17 URL: https://www.facebook.com/psixologiyainstitutu/posts/açar-sözl%C9%99r-qeyri-tarazlıq-psixologiyası-metodologiya-fizioloji-şok-sosial-şok-p/784640408970128/
6. Əliyev, M.S. İntiharın qarşısının alınmasında yeni yanaşma: intiharın 7-li preventiv modeli: [Electronic resource] // – Bakı: Azərbaycan Respublikasının Təhsil İnstitutunun Elmi əsərləri, – 2017. Cild 84, № 4, – s. 192-198 URL: https://www.arti.edu.az/noduploads/book/elmi-eserler-2017-4.pdf
7. Симонович, Н.Е. Психологические черты современной молодежи: [Electronic resource] // NovaInfo, 2016. – № 55 – С. 393-396
URL:https://novainfo.ru/article/9037
8. Нархова, Е.Н. Социология культуры и студенческого досуга: учебное пособие: [Electronic resource] / Е.Н.Нархова, Т.А.Чегодаева, Е.В.Дорофеева, Н.О.Южакова. – Екатеринбург: УрФУ, – 2013. – 280 с.
URL: https://elar.urfu.ru/bitstream/10995/37393/1/978-5-321-02278-8_2013.pdf
9. Ефремов, В.С. Основы суицидологии: монография: [Electronic resource] / В.С.Ефремов. – СПб.: Издательство Диалект, – 2014. – 480 с.
URL:https://studfile.net/preview/400835/
10. Ковшова, О.С. Выявление и коррекция риска суицидального поведения в молодежной среде: [Electronic resource] // IV Международный съезд Ассоциации когнитивно-поведенческой психотерапии, 26-29 апреля 2018 года: сборник научных статей / [Ассоциация когнитивно-поведенческой психотерапии]. – Санкт-Петербург: СИНЭЛ, 2018. – 148 с. – s. 67-75 URL: http://associationcbt.ru/wp-content/uploads/2018/04/sborn6ik.indd_.pdf
11. Сургучева, Н.В. Профилактика суицидального поведения молодежи в современном мире: [Electronic resource] / Н. В. Сургучева. – Текст: непосредственный // Молодой ученый. – 2018. – № 13 (199). – С. 286-289. URL:https://moluch.ru/archive/199/49020/
12. Əliyev, M.S. İntihar üsulu ilə düşüncə və zodiak bürclərinin əlaqəsi (Qeyri-tarazlıq psixologiyası kontekstində təhlil): [Electronic resource] // – Bakı: Bakı Qızlar Universitetinin Elmi əsərləri, – 2021. Cild 12, № 4, səh.432-439 URL: https://bqu.edu.az/storage/533c0105-941d-45b2-990a-bed7781401a9.pdf

13. Ваулин, С.В. Суицидальные попытки и незавершенные суициды (госпитальная диагностика, оптимизация терапии, профилактика): автореферат диссертации на соискание ученой степени доктора медицинских наук: [Electronic resource] / С.В. Ваулин. – М.: – 2012, – 46 с. URL:https://www.dissercat.com/content/suitsidalnye-popytki-i-nezavershennye-suitsidy-gospitalnaya-diagnostika-optimizatsiya-terapi
14. Тарасевич, О.Н. Тенденции суицидального поведения современной российской молодежи: [Electronic resource] / О.Н.Тарасевич // Вестник Иркутского Государственного Технического Университета. 2007, № 1 (29), с. 213–215 URL:https://cyberleninka.ru/article/n/tendentsii-suitsidalnogo-povedeniya-sovremennoy-rossiyskoy-molodezhi
15. Бовина, И.Б. Профилактика суицида в подростковой и молодежной среде: размышляя над опытом западных моделей: [Electronic resource] // «Психологическая наука и образование». 2013, № 2, с. 214-227 URL:https://psyjournals.ru/journals/psyedu/archive/2013_n2/psyedu_2013_n2_61355.pdf
16. Солдаткин, В.А., Дьяченко, А.В., Меркурьева, К.С. Исследование суицидологической и аддиктологической обстановки в студенческой среде г. Ростова-на-Дону: [Electronic resource] // Суицидология. 2012, № 4, с. 60-64. URL:https://cyberleninka.ru/article/n/issledovanie-suitsidologicheskoy-i-addiktologicheskoy-obstanovki-v-studencheskoy-srede-g-rostova-na-donu

**Redaksiyaya daxil olub:** 02.05.2025.

*UOT 159.9.*

***Solmaz Qüdrət qızı Həsənli***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosenti,*
*pedaqogika üzrə fəlsəfə doktoru*
*https://orcid.org/0000-0001-5931-482X*
*E-mail: solmazhasanli @hotmail.com*
*https://doi.org/10.69682/arti.2025.92(3).177-181*

# SOSİALLAŞMA İLƏ BAĞLI NƏZƏRİYYƏLƏR

***Solmaz Gudrat Hasanly***
*associate professor of*
*Azerbaijan State Pedagogical University,*
*doctor of philosophy in pedagogy*

# THEORIES ABOUT SOCIALIZATION

***Солмаз Гудрат гызы Гасанлы***
*доцент*
*Азербайджанского Государственного Педагогического Университета,*
*доктор философии по педагогике,*

# ТЕОРИИ О СОЦИАЛИЗАЦИИ

**Xülasə.** Sosiallaşma insanın toplumda digər insanlarla, sosial qruplarla sosial münasibətlərə daxil olaraq sosial təcrübəyə yiyələnməsi prosesidir. Təbii ki, bu proseslə bağlı olaraq tarixən müxtəlif yanaşmalar olmuşdur. Məqalədə sosiallaşma prosesi ilə bağlı nəzəriyyələrdən bəhs olunmuş və bu nəzəriyyələrin yanaşmaları təhlil edilmişdir.
***Açar sözlər:*** *sosiallaşma, sosiallaşma nəzəriyyələri, sosial mənlik, sosial inkişaf, sosiallaşma mərhələləri*

**Abstract.** Socialization is the process by which a person acquires social experience by entering into social relationships with other people and social groups in society. Naturally, there have been various approaches to this process throughout history. The article discusses theories related to the socialization process and analyzes the approaches of these theories.
***Keywords:*** *socialization, theories of socialization, social self, social development, stages of socialization*

**Аннотация.** Социализация- это процесс, посредством которого человек приобретает социальный опыт, вступая в социальные отношения с другими людьми и социальными группами в обществе. Естественно, на протяжении истории существовали разные подходы к этому процессу. В статье рассматриваются теории, связанные с процессом социализации, и анализируются подходы этих теорий.
***Ключевые слова:*** *социализация, теории социализации, социальное Я, социальное развитие, стадии социализации*

Psixoloji baxımdan sosiallaşma şəxsiyyətin inkişafı prosesidir. Bu proses vasitəsilə sahib olduğumuz toplumun dəyərləri ideallarımızı, məqsədlərimizi formalaşdırır və davranışlarımızı müəyyən bir yönə istiqamətləndirir. Sosiallaşma ilə bağlı bir neçə elmi nəzəriyyələr vardır. Bu nəzəriyyələr əsasən aşağıdakılardır.

Amerikalı sosial psixoloq Carles Horton Kuli sosial qarşılıqlı münasibətlər vasitəsilə şəxsiyyətin formalaşması nəzəriyyəsini irəli sürmüşdür. Kuli qeyd edirdi, "toplum" və "fərdlər" ayrı-ayrı fenomen deyil, aspektləri eyni fenomendir (3, 94-95). Fərdi toplumdan ayırmaq olmaz, çünki "Mən" digər insanlarla qarşılıqlı əlaqədə formalaşır.

Kulinin sosiallaşma nəzəriyyəsi "Güzgü mən" konsepsiyasına əsaslanır. Bu nəzəriyyəyə görə, fərdin mənlik şüuru digər insanların bu

şəxsi necə qəbul etdiyini və ya ona necə göründüyünü əks etdirir. Kuliyə görə, dostlarımız zarafatlarımıza güldüyü üçün özümüzü hazırcavab hesab edirik, müəllimlərimiz bizi tərifədiyi üçün özümüzü istedadlı hesab edirik, valideynlərimiz bizə görə narahat olduğu üçün özümüzü önəmli hesab edirik. Biz başqalarının fikirləri ilə bir "Mən" yaratmağa meylliyik və onların kim olduğumuza dair fikirləri şəxsiyyətimizi formalaşdırır. Beləliklə, mənliyimiz sosial qarşılıqlı münasibətdə inkişaf edir və biz bu münasibətlərlə sosiallaşırıq.

20-ci əsrin əvvəllərində amerikalı sosial psixoloq Georgi Herbart Mid C.H.Kuli kimi, toplumdan ayrı bir "mənliyin" ola bilməyəcəyi ideyasını irəli sürürdü. Uşaqlar başqalarının rollarını qəbul etməyi və öz davranışlarını digər insanların gözü ilə görməyi öyrəndikcə özlərini inkişaf etdirirlər. Midə görə bu, iki mərhələdə baş verir. Oyun mərhələsində uşaq özünü yanğınsöndürən, ana və ya ata kimi göstərə bilər. Mid bu oyunu "başqasının rolunu almaq" adlandırır. Xüsusilə rol modellər "önəmli başqalarıdır". Beləliklə, xüsusən də ana və atalar uşaqlarına böyüklərin necə davranmalı olduqlarını nümayiş etdirirlər.

Yuxarı yaşlarda uşaqlar oyunun qaydalarını rəhbər tutaraq müəyyən dərəcədə digər iştirakçıların davranışlarını proqnozlaşdıra bilirlər. Sonucda uşaq "ümumiləşdirilmiş başqası" rolunu qəbul edir, bu da onun toplumun münasibətini nəzərə alması deməkdir. Oyun qaydaları və digər insanların gözlənilən reaksiyaları uşağa fərdi davranış üçün göstərişlər verir. Beləliklə, sosial nəzarət sosiallaşmış insanın özünüidarəsinə çevrilir.

Midin konsepsiyasına görə, insanın "Mən"i onun subyektiv təcrübələrinin sahib olduğu toplum baxımından qiymətləndirməsi əsasında formalaşır. İnsan "Mən"inin qaynaqları toplumdan qaynaqlansa da, Mid hesab edirdi ki, hər bir fərd sosial proseslərin unikal aktyorudur. Beləliklə, Kulinin "güzgü mənliyi" və Midin "ümumiləşdirilmiş başqası" anlayışları insanların başqalarının onlar haqqında düşündüklərinə necə önəm verdiyini açıqlayır.

Avstriyalı psixiatr Ziqmund Freyd ən məşhur sosiallaşma nəzəriyyələrindən birinin yaradıcısıdır. O, insanın sosiallaşmasına yeni bir perspektivdən baxmağı təklif etdi. Z. Freydin sosiallaşma nəzəriyyəsi bu ideyaya əsaslanır ki, insanların sosial vəziyyətlərə reaksiyaları onlar tərəfindən şüursuz, irrasional və idarəolunmazdır.

Freydin fikrincə, uşaq doğulduqdan sonra onun davranışında ilkin olaraq bioloji impulslar üstünlük təşkil edir, onu aqressiv və yalnız öz tələbatlarının daima ödənilməsinə can atan, eqoist bir varlığa çevirir. Freyd bioloji əsası olan bu antisosial impulsların şüursuz komponentini "İd" adlandırdı. Valideynlər vasitəsilə uşağa təsir edən toplum "İd"in impulsiv tələblərinin qarşısını alır.

Freydə görə, uşaq böyüdükcə oral, anal və fallik dövrlərdən keçir və bu dövrlərdə qazandığı təcrübələr onun şəxsiyyətinə önəmli dərəcədə təsir göstərir. "Freyd göstərir ki, uşaq şəxsiyyətinin formalaşmasında onun bu mərhələləri necə keçməsi və valideynlərin onlara təsiri önəmli rol oynayır. Bu yaşına qədər valideynin uşaqla ünsiyyəti düzgün qurulmazsa, onların sosial və psixi inkişafında fəsadlar yaranır və bu fəsadlar özünü xeyli sonralar da təzahür etdirə bilər" (2, 288).

Bu kritik dövrlər sosiallaşma prosesinin mərhələlərini təmsil edir. Uşaq öz bioloji istəklərini aktiv şəkildə təmin etməyə çalışdıqca, davranışına görə valideynləri tərəfindən mükafatlandırılır və ya cəzalandırılır. Bu yolla uşaq öz impulslarını idarə etməyi və başqalarının istəklərinə tabe olmağı öyrənir. Başqa sözlə, uşaq sosial normaları yerinə yetirməyi onun üçün vacib olan insanlarla qarşılıqlı əlaqədə öyrənir. Uşaq valideynlərinin dəyərlərini və münasibətlərini mənimsədikcə, onda "süpereqo" inkişaf edir. Bu, sosial cəhətdən qəbuledilməz impulsları boğmağa kömək edir və onlar şüursuzluğun bir hissəsinə çevrilirlər. Artıq uşaqlıqda insan öz libidosunu və aqressiv enerjisini valideynlərinin bəyənəcəyi istiqamətə yönəltməyə çalışır. Sosiallaşma prosesində, Freydin fikrincə, "eqo"ya daha çox yer verilir. "Mən"in rasional, şüurlu komponenti "Eqo" "İd" və "supereqo" arasındakı münaqişəni həll etməyə çalışır.

Bununla belə, "İd"in şüursuz istəkləri şüur sferasından zorla çıxarılaraq, sosial cəhətdən qəbul edilən istiqamətə yönəldilməsinə baxmayaraq, istəklərin reallaşdırılması tələb edilir. Uşaqların qadağan olunmuş həzzlərə görə cəza qorxusu yuxularda və ya irrasional davranışlarda yenidən üzə çıxır. Əgər supereqo çox tələbkardırsa və həddən artıq çox istək basdırılırsa, bu gərginlik və qorxular həddən artıq güclənir və insanın özünə psixoloji olaraq mənfi təsir göstə-

rir. Freyd, həmçinin insan fiziologiyası ilə toplum arasında uzlaşmanın heç vaxt tam uğurlu olmayacağına inanırdı. Onun fikrincə, şüursuz istəklər ilə sivil insanın yerinə yetirməli olduğu sosial tələblər arasında həmişə qarşıdurma olacaq (Freud, 2004).

İsveçrəli psixoloq J.Piaje həyatının önəmli bir hissəsini uşaqların sosial mühiti qavraması və onlara reaksiya vermə yollarını araşdırmağa həsr etmişdir. Onun eksperimentləri zehni inkişafın müəyyən mərhələlərində uşağın həyata keçirə biləcəyi müəyyən zehni əməliyyatlarla səciyyələnir.

Həyatın ilk iki ilində uşaqlar mühit haqqında bilgi əldə edirlər. İki yaşdan altı yaşa qədər uşaqlar konkret düşüncəyə və intuitiv əməliyyatları yerinə yetirmə bacarığına sahibdirlər. Onlar əsasən simvolların, xüsusən də linqvistik simvolların manipulyasiyası ilə məşğul olurlar. Bu mərhələdə oyunlar çox vaxt fantaziyaya əsaslanır və müxtəlif xəyali xarakter daşıyır. Beş-altı yaşda uşaqlar məntiqi düşünməyə və davranışlarını digər insanlarla əlaqələndirməyə başlayırlar. Piaje bu dövrü konkret əməliyyatlar mərhələsi adlandırdı. 12-15 yaş arası yeniyetmələr digər insanların fikirləri ilə razılaşmaq əvəzinə, bir sıra məsələlərdə öz fikirlərini formalaşdırır, məntiqi təfəkkürünü inkişaf etdirirlər və onlarda mücərrəd düşünmə qabiliyyəti meydana çıxır. Bu, formal əməliyyat mərhələsidir.

Beləliklə, Piajeyə görə, uşağın idrak qabiliyyətləri bir sıra mərhələlərdən keçdikcə inkişaf edir və bu mərhələlərin hər biri sosial mühiti, dünyanı dərk etmək üçün yeni bacarıqların əldə edilməsi ilə xarakterizə olunur.

Amerikalı psixoloq L. Kohlberq ABŞ, Böyük Britaniya, Meksika, Türkiyə və Tayvanda apardığı araşdırmalar onu bu nəticəyə gətirdi ki, dünyada hər mədəniyyətdə uşaqlara eyni əxlaqi dəyərlər öyrədilir. O, aşkar etdi ki, müxtəlif toplumlar nəyin pis olduğuna dair müxtəlif inanclara malik ola bilər, lakin onların hamısı empatiya, başqalarına qayğı və ədalət, bərabərlik və qarşılıqlılı anlayış kimi eyni fundamental əxlaqi prinsipləri bölüşürlər. Kohlberqə görə, insanlar yetkinliyin müxtəlif mərhələlərində olduqları üçün əxlaqi mühakimələrdə fərqlənirlər.

Piaje əxlaqi inkişafın üç əsas səviyyəsini (premoral, heteronom və avtonom) müəyyən etdiyi halda, Kohlberq bu təhlil modelindən istifadə edərək, bu üç səviyyəyə uyğun gələn əxlaqi mühakimələrin 6 mərhələsini müəyyən etdi.

Kohlberq nəzəriyyəsi üç əsas səviyyəyə bölünür. Mənəvi inkişafın hər bir səviyyəsində iki mərhələ fərqlənir. Piaje bütün insanların koqnitiv inkişafın ən yüksək səviyyələrinə çatmadığına inandığı kimi, Kohlberq də hər kəsin əxlaqi inkişafın ən yüksək pillələrinə qalxa bilmədiyinə inanırdı.

***Səviyyə 1. Prekonvensial səviyyə.*** Ənənəvi mənəvi inkişafın ən erkən dövrüdür. Bu dövrdə uşaqların qərarları əsasən böyüklərin gözləntiləri və qaydaların pozulmasının nəticələri ilə formalaşır. Bu səviyyədə iki mərhələ var:

*Mərhələ 1 (İtaət və cəza):* Əxlaqi inkişafın ən erkən mərhələləri – itaət və cəza xüsusilə kiçik uşaqlar üçün xarakterikdir, lakin böyüklər də bu tip yanaşmalara sahib ola bilərlər. Kohlberqə görə, bu mərhələdə insanlar qaydaları sabit və mütləq hesab edirlər. Qaydalara yerinə yetirmək vacibdir, çünki bu, cəzadan yayınmağın bir yoludur.

*Mərhələ 2 (İndividualizm):* Əxlaqi inkişafın fərdilik və mübadilə mərhələlərində uşaqlar öz davranışları haqqında mühakimə yürüdürlər. Əxlaqi inkişafın bu mərhələsində məqsədin reallaşması ancaq o halda mümkündür ki, o, şəxsi mənafeyə xidmət etsin.

***Səviyyə 2. Konvensial səviyyə.*** Mənəvi inkişafın növbəti dövrü nəyin doğru və əxlaqi olduğuna dair ictimai qaydaların qəbulu ilə xarakterizə olunur. Bu müddət ərzində yeniyetmə və gənclər əxlaq normalarını onlar üçün rol-model rolunu oynayan, özlərindən yaşca daha böyük olan və dəyər verdikləri yetkin insanlardan, həmçinin yaşadıqları toplumdan öyrənirlər. Bu dövr həm də səlahiyyətləri qəbul etməyə və qrupun normalarına uyğunlaşmağa yönəlib. Bu əxlaq səviyyəsində iki mərhələ fərqlənir:

*Mərhələ 3 (Qəbulolunma):* Bu mərhələdə olanlar başqalarının fikirlərinə əsasən davranır, stereotiplərə uyğunlaşmağa çalışır və hansısa hadisə ilə bağlı fikir yürüdərkən sosial gözləntini nəzərə alırlar. Mənəvi inkişafın bu mərhələsi sosial gözləntilərin və rolların qarşılanmasına yönəlir. Bu mərhələdə uyğunluğa, müsbət davranışa və seçimlərin insanlarla münasibətlərə təsirinin nəzərə alınmasına xüsusi diqqət yetirilir. Burada digərlərinin yeniyetmə və gənc haqqında nə düşünməsi onlar üçün hər şeydən üstündür və bu cür yanaşma da onların mənəvi dəyərlərini müəyyən edir.

*Mərhələ 4 (Səlahiyyət və sosial nizamı qoruma):* Bu mərhələdə sosial asayişin təmin edilməsinə daha çox diqqət yetirilir. Əxlaqi inkişafın bu mərhələsində insanlar mühakimə yürüdərkən toplumu bütöv olaraq görürlər. Əsas diqqət qaydalara əməl etməklə, öz vəzifəsini yerinə yetirməklə qanunun və asayişin qorunmasına yönəlib.

***Səviyyə 3. Postkonvensional səviyyə***. Mənəvi inkişafın bu səviyyəsində insanlarda əxlaqın mücərrəd prinsipləri haqqında anlayış formalaşır. Bu səviyyədə iki mərhələ özünü bu şəkildə göstərir:

*Mərhələ 5 (Sosial müqavilə/Razılıq):* Bu mərhələdə insanlar digərlərinin fərqli dəyərlərini, fikir və inanclarını nəzərə almağa başlayırlar. Belə bir fikir formalaşır ki, hüquq qaydaları toplum üçün gərəklidir və toplumun hər bir üzvü bu standartlarla razılaşmalıdır.

*Mərhələ 6 (Universal etik prinsiplər):* Kohlberqin əxlaqi düşüncələrinin son səviyyəsi universal etik prinsiplərə və mücərrəd düşüncələrə əsaslanır. Bu mərhələ mənəvi inkişafın ən ali həddidir. Mənəvi inkişafın bu mərhələsində olan şəxslər üçün insanların davranışı məntiqə və ədalətə əsaslanan etik normalardan çıxış edərək vicdanlı və ədalətli seçimlərdən ibarət olmalıdır. Kohlberq hesab edirdi ki, insanların yalnız kiçik bir hissəsi (təxminən 10-15%-i) postkonvensional mərhələyə çatır.

Keçən əsrin 30-cu illərdə Avropadan ABŞ-a mühacirət edən Erikson dövrünün aparıcı psixoanalitiklərindən biri idi. O, insanın həyat boyu davam edən sosiallaşma konsepsiyası ilə çıxış etmişdir. Erikson inkişafın səkkiz mərhələsini müəyyən etmişdir. Bunların hər biri böhran və ya inkişaf ilə xarakterizə olunur, əgər hər şey düzgün gedirsə, inkişaf edən insan həyatın hər mərhələsində öz problemlərinə müsbət həll yolu tapır. Əgər insan yeni sosial tələblərə uyğunlaşa bilmirsə, onda psixiatrik əlamətlər yaranır.

***Güvən və güvənsizlik (doğumla 1 yaş arasında).*** Uşaqların bu dönəmdə yardıma ehtiyacları olduğu üçün onlara baxan şəxsin körpəyə güvən hissini aşılaması lazımdır. Bu periodu yaxşı keçirən uşaqlar özlərini güvəndə hiss edəcəklər. Əks halda isə güvənsizlik hissi yaşayacaqlar.

***Utanma və şübhəyə qarşı azadlıq (erkən uşaqlıq).*** Bu dövr Freydin anal mərhələsinə uyğun gəlir. Uşaq öz hərəkətlərinə nəzarətdən qaynaqlanan konflikt ilə üzləşir. O, aqressiv impulslarını boğmağı öyrənməli, eyni zamanda özünə nəzarəti itirdikdə utanma və şübhə hisslərindən qorunmalıdır. Bu mərhələ məhəbbət və nifrət, əməkdaşlıq və barışmazlıq, özünü idarə etməklə qürur duymaq və onu itirməkdən utanmaq və ya başqaları tərəfindən həddindən artıq idarə olunmaqdan utanmaq arasında tarazlığı qorumaq üçün çox vacibdir.

***Təşəbbüskarlıq və günahkarlıq.*** 4-5 yaşda uşaq fiziki və zehni gücünü sınamaqdan həzz alır. Mid və Piajenin də göstərdiyi kimi, uşaqlar öz oyunlarında təxəyyüldən istifadə edir, fantaziyaya bürünürlər. Uşaq yeni rollar sınadıqca, onun təşəbbüslərinə görə tənbeh və ya cəzalanma riski yaranır. Bu mərhələnin təhlükəsi ondan ibarətdir ki, uşaq yeni şeylər sınadığı üçün özünü günahkar hiss edə bilər. Onun bəzi fantaziyalarının qarşısı alındıqca o, davranışını müəyyən sərhədlərə sığdırmağı öyrənir və xəyallarını böyüklərin hamı tərəfindən qəbul edilmiş məqsədləri ilə bağlamağa başlayır.

***Çalışqanlıq və aşağılıq (6-11 yaşlar).*** Bu yaşda uşaq müəyyən alətlərdən istifadə etməkdən, yeni bacarıqlara yiyələnməkdən və digər insanlarla əməkdaşlıq etməkdən həzz alırlar. Bu mərhələdə uşağı gözləyən təhlükə, uğursuzluqdan sonra yaranan qeyri-adekvatlıq və aşağılıq hissidir. Ailələri və müəllimləri tərəfindən dəstəklənən uşaqlarda özgüvən hissi formalaşır. Bu dəstəyi görməyən uşaqlarda isə aşağılıq hissi yaranır.

***Kimlik qazanmaq və dəyərsizlik (12-18 yaşlar).*** Eriksonun ən məşhur fikirlərindən biri onun yeniyetməlik və ilk gənclik dövründə şəxsiyyət böhranı ilə bağlı mövqeyidir. Bu mərhələdə intensiv fiziki inkişaf və yetkinlik yaşayan yeniyetmə və gənclər özlərini başqaları ilə müqayisə edirlər. Onlar həmçinin öz rollarını və bacarıqlarını böyüklərin peşəkar fəaliyyəti ilə necə əlaqələndirəcəkləri ilə maraqlanırlar. Rolların qarışıqlığı və ya şəxsiyyəti müəyyənləşdirə bilməmək həll edilməmiş problemlərin nəticəsidir. Bu mərhələnin təhlükəsi məhz Eriksonun hesab etdiyi kimi, rolların qarışdırılmasındadır.

***Yaxınlıq və yalnızlaşdırma. (19-40 yaşlar).*** Bu mərhələ ilkin münasibətlərin yarandığı dövrə təsadüf edir. Erikson düşünür ki, insanların başqaları ilə münasibət qurması çox ciddi mövzudur. Bu mərhələni uğurla keçən insanlar gələcəkdə sağlam və möhkəm əlaqələr quracaqlar. Burada hər mərhələ öncəki mərhələnin davamıdır. Əgər əvvəlki mərhələdə yaxşı nəticə göstərmişsə, növbəti mərhələ də uğurla tamam-

lanacaqdır. Güclü şəxsiyyəti formalaşmış insanın münasibətləri də möhkəm olacaq. Əks halda o, depressiyaya, yalnızlığa qapılacaqdır.

***Yaradıcılıq və durğunluq (40-65 yaşlar).*** Yetkinlik dövründə karyera və ailə həyatı ilə öz yaşamını qurmağa çalışan şəxs aktiv şəkildə çalışaraq özünün işəyarayan olduğunu sübut edir. Bu bacarıqları əldə edə bilməyənlər durğun və aktiv həyata kənardan baxırlar.

***Eqo bütövlüyü və ümidsizlik (qocalıq- 65 yaşdan ölənədək).*** Bu period insanların yaşlılıq dövrüdür. Bu mərhələdə uğursuz olanlar həyatlarının boşa keçirdiyini düşünürlər və bunun peşmançılığını yaşayırlar. Ancaq həyatını mənalı keçirdiyini düşünən insanlar geridə qoyduqları həyatdan razıdırlar.

**Problemin aktuallığı.** Sosiallaşma ilə bağlı fərqli yanaşmaların elmi təhlili hər zaman aktual bir mövzu olan sosiallaşma prosesinə fərqli rakursdan baxmağa və real sosial-tarixi şərait baxımından analiz etməyə imkan verir.

**Problemin elmi yeniliyi** məqalədə sosiallaşma prosesi ilə bağlı müxtəlif nəzəriyyələr təhlil edilmiş, elmi mənbələrə əsasən ümumiləşdirmələr aparılmışdır.

**Problemin praktik əhəmiyyəti.** Məqalədə analiz edilən elmi yanaşmalardan psixoloqlar, pedaqoqlar, ümumiyyətlə toplum faydalanaraq sosiallaşma prosesinin uğurla nəticələnməsi üçün praktik fəaliyyətlərdə nəzərə almaq imkanı vardır.

**Ədəbiyyat**


1. Bayramov Ə.S., Əlizadə Ə.Ə. Sosial psixologiya. -Bakı, 2003.
2. Əliyev R.İ. Psixologiya tarixi. -Bakı, 2006.
3. Şavran G., S., Ayşın F., Turhanoğlu K., Gökalp E. Modern sosyoloji tarihi. -Eskişehir, 2019.
4. Freud S. Bilinçdışının keşfi. -Ankara, 2004.
5. Алтунина, И.Р. Социальная психология: -Люберцы: Юрайт, -2015.
6. Белинская, Е.П. Социальная психология личности. -М., 2015.
7. https://elib.belstu.by/bitstream/123456789/26192/1/Koleda_Socializacija.pdf
8. file:///C:/Users/USER/Downloads/sotsializatsiya-lichnosti.pdf



**Redaksiyaya daxil olub:** 20.05.2025

UOT 159.9.

**Nicat Ramiz oğlu Əliyev**
*psixologiya üzrə fəlsəfə doktoru*
*https://orcid.org/0009-0002-1116-058X*
*E- mail:nicat.aliyev@socar.az*
*https://doi.org/10.69682/arti.2025.92(3).182-189*

# ŞƏXSİYYƏTİN FORMALAŞMASINDA İQTİSADİ TƏRBİYƏNİN ROLU

**Nijat Ramiz Aliyev**
*doctor of philosophy in psychology*

# THE ROLE OF ECONOMIC UPBRINGING IN THE FORMATION OF PERSONALITY

**Ниджат Рамиз оглы Алиев**
*доктор философии по психологии*

# РОЛЬ ЭКОНОМИЧЕСКОГО ВОСПИТАНИЯ В ФОРМИРОВАНИИ ЛИЧНОСТИ

**Xülasə.** Məqalədə uşaqların gələcək iqtisadi həyatlarını düzgün qurmaları üçün onların iqtisadi tərbiyəsinin lap erkən yaşlardan başlanmasının vacibliyi vurğulanmışdır. Göstərilir ki, əgər erkən yaşlardan etibarən uşaqlarda düzgün iqtisadi tərbiyə işi aparılsa, gələcəkdə onlar əsl kişi, əsl xanım kimi öz ailə təsərrüfatlarını və şəxsi iqtisadi işlərini çox ustalıqla idarə edə biləcəklər. Uşaqlarda iqtisadi mədəniyyəti lap erkən yaşlardan formalaşdırmaqla onlarda qənaətcillik, əməksevərlik, məsuliyyətlilik, dürüstlük, qayğıkeşlik, fəallıq, müstəqillik, təşəbbüskarlıq, tədbirlilik, tələbkarlıq kimi şəxsiyyətyönümlü keyfiyyətlərin formalaşdırılmasının mümkünlüyü izah olunur. Qeyd olunur ki, uşaqların iqtisadi tərbiyəsinin daha səmərəli olması üçün onlarda iqtisadiyyata idraki marağın yaradılması çox vacibdir. Sosial-iqtisadi həyatın müsbət norma və dəyərlərinə idraki marağın formalaşdırılması şəxsiyyətin formalaşmasında iqtisadi tərbiyənin rolunu göstərir. İqtisadi tərbiyə nəticəsində uşaqlarda bir çox keyfiyyətlər üzə çıxarılır, inkişaf etdirilir və bununla da uşaqlar müxtəlif situasiyalarda adekvat hərəkət etmək və davranmaq bacarıqlarına sahib olurlar. Nəzəri tədqiqatlara və praktiki təcrübəyə əsaslanan meyar və göstəricilərin iqtisadi tərbiyə prosesində yeri və təsirləri araşdırılır, iqtisadi tərbiyənin metod və üsulları göstərilir, mövzular təklif olunur. İqtisadi tərbiyədə layihə, hekayələr, söhbətlər, dialoqlar, didaktik oyunlar, modelləşdirmə kimi üsullardan istifadə olunur. Vurğulanır ki, süjetli didaktik oyunlar əmək fəaliyyətini dərk etməyə və hər hansı bir mühitdə qaydalara düzgün riayət etməyə kömək edir. Uşaqlarda iqtisadi təfəkkürün inkişaf etdirilməsi, ətraf mühitə qayğıkeş münasibətin formalaşdırılmasında ailənin, valideynlərin rolu çox vacibdir.
***Açar sözlər:*** *iqtisadi tərbiyə, idraki maraq, uşaq təfəkkürü, pul, iqtisadi mədəniyyət*

**Abstract.** The article emphasizes the importance of starting children's economic upbringing from the early ages in order to properly build their future economic lives. It is shown that if children are properly educated from the early ages, they will be able to manage their household and personal economic affairs skillfully in the future like real men and women. It is explained that it is possible to form such personality-oriented qualities as thrift, hard work, responsibility, honesty, caring, activity, independence, initiative, prudence and demandingness in children by forming economic culture in them from the early ages. In order for children's economic upbringing to be more effective, it is very important to create a cognitive interest in economics in them. The formation of a cognitive interest in the positive norms and values of socio-economic life shows the role of economic education in the formation of personality. As a result of economic upbringing, many qualities are revealed and developed in children and thus children acquire the skills to act and behave adequately in various situations. The place and effects of criteria and indicators based on theoretical research and practical experience in the process of economic upbringing are examined, methods and techniques of economic education are shown and topics are proposed. Methods such as projects, stories, conversations, dialogues, didactic games and modeling are used in economic upbringing. It is emphasized that plot-based didactic games help to understand labor activity and correctly follow the rules in any environment. The role of the family and parents is very important in developing economic mentality in children and forming a caring attitude towards the environment.

***Keywords:*** *economic upbringing, cognitive interest, child mentality, money, economic culture*

**Аннотация.** В статье подчеркивается, важность начала экономического воспитания детей с самого раннего возраста для правильного построения их будущей экономической жизни. Показано, что если правильно воспитывать детей экономически с раннего возраста, то в будущем они смогут весьма умело вести хозяйство своей семьи и личные экономические дела как настоящие мужчины и женщины. Объясняется, что, формируя у детей экономическую культуру с самого раннего возраста можно сформировать у них такие личностно-ориентированные качества как бережливость, трудолюбие, ответственность, честность, заботливость, активность, самостоятельность, инициативность, рассудительность, требовательность и т.д. Отмечено, что для того, чтобы экономическое воспитание детей было более эффективным, очень важно сформировать у них познавательный интерес к экономике. Формирование познавательного интереса к позитивным нормам и ценностям социально-экономической жизни показывает роль экономического воспитания в формировании личности. В результате экономического воспитания у детей раскрываются и развиваются многие качества, и таким образом дети приобретают навыки адекватного поведения и поступков в различных ситуациях. Рассматриваются место и влияние критериев и показателей, основанных на теоретических исследованиях и практическом опыте в процессе экономического воспитания, показываются методы и приемы экономического воспитания, предлагаются темы. В экономическом воспитании используются такие методы как проекты, рассказы, беседы, диалоги, дидактические игры, моделирование и др. Подчеркивается, что сюжетные дидактические игры помогают осмыслить трудовую деятельность и правильно соблюдать правила в любой обстановке. Роль семьи и родителей очень важна в развитии экономического мышления у детей и формировании бережного отношения к окружающей среде.

***Ключевые слова:*** *экономическое воспитание, познавательный интерес, детское мышление, деньги, экономическая культура*

"Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda göstərilir: "Təhsil insanlara texnologiyaları çevik mənimsəmək, əmək bazarında layiqli yer tutmaq və ömür boyu təhsil prosesinə qoşulmaq, sağlam həyat tərzi, ətraf mühitə münasibətdə düzgün mövqe seçmək imkanı verir".

İnsanın psixi inkişafı, şəxsiyyət kimi formalaşması fərdin ictimai həyat şəraiti, aldığı təlim və tərbiyədən, fəaliyyət sahəsindən çox asılıdır. Şəxsiyyətin formalaşması yaş artdıqca yalnız keyfiyyət dəyişmələrindən ibarət deyil. Hər bir yaş dövrünün özünəməxsus qanunauyğunluqları var və biri sadəcə digərinin davamı deyil. Uşağın bir yaş dövründə öyrəndikləri, qazandığı bilik və bacarıqlar sonrakı yaş dövründə inkişaf edir, zənginləşir. Deməli, şəxsiyyətin formalaşmasında hər yaş dövrünün xüsusi rolu var.

Qloballaşma, inkişaf etmiş dünya dövlətlərinə inteqrasiya insanlarda, xüsusən böyüyən nəsildə yeni keyfiyyətlərin formalaşdırılmasını tələb edir. Burada diqqəti cəlb edən cəhətlərdən biri də ondan ibarətdir ki, bir çox hallarda valideyn və müəllimlərin uşaqlarda formalaşdırmaq istədikləri keyfiyyətlərlə real həyatın tələbləri arasında ziddiyyət meydana çıxır. Bunların sırasında uşaqların iqtisadi tərbiyəsi problemi xüsusilə aktualdır.

Azad bazar iqtisadiyyatına əsaslanan sistemlə ictimai mülkiyyətə əsaslanan sistem arasında kəskin fərq var. İndi insanlardan rəqabətqabiliyyətlilik, çevik və düzgün qərar qəbul etmək, risk etməyi bacarmaq və s. keyfiyyətlər tələb olunur. Həyatın tələb etdiyi keyfiyyətlər isə uşaq yaşlarından tərbiyə edilməli, öyrədilməlidir.

Birləşmiş Millətlər Təşkilatının **"Uşaq hüquqları bəyannaməsi"**ndə deyilir: *"Bəşəriyyət uşağa əlində olan ən yaxşı şeyləri verməyə borcludur!"*.

Mövcud sosial-iqtisadi vəziyyət ailələrdən və təhsil müəssisələrindən uşaqları mütləq iqtisadi dəyərlər dünyası ilə tanış etməyi tələb edir. Hər bir insanın həyatı iqtisadiyyatla bağlıdır: istər müəllim olsun, istər həkim, istər mühəndis, istər tələbə, istərsə də şagird. Xüsusən uşaqlara həyatı, onun qayda və normalarını, iqtisadiyyatın ibtidai şərtlərini öyrətmək xüsusi aktuallıq təşkil edir.

Uşaqların iqtisadi tərbiyəsi nə üçün vacibdir? Çünki uşaq özü iqtisadiyyatın ən vacib tərkib hissələrindən biridir. Çünki cəmiyyətin siyasi, sosial və mədəni həyatında çətinliklərin öhdəsindən gəlmək daha çox iqtisadi mədəniyyətdən asılıdır. Uşaqlarda iqtisadi mədəniyyəti formalaşdırmaq ilk növbədə uşaqlara erkən yaşda bazar iqtisadiyyatı və onun qanunları haqqında təsəvvür yaratmaq ehtiyacıdır. Uşaqlarda forma-

laşdırılan iqtisadi mədəniyyət dövlətin iqtisadi siyasətinə, cəmiyyətdə əməyin səmərəliliyinə, ailənin iqtisadi rifahına müsbət təsir göstərir. Tərbiyə sayəsində sosial təcrübə nəsildən-nəslə ötürülür və hər bir sonrakı nəsil əvvəlkindən daha savadlı olur. Əməksevərlik, qənaətcillik, müstəqillik gələcəkdə mədəni insanın özünütərbiyəsinə əsas kimi xidmət edəcəkdir. Təcrübə göstərir ki, gələcək iqtisadi fəaliyyət üçün bir çox ilkin şərtlər çox erkən formalaşır və onlar vaxtında formalaşmasa, uşaqların davranışında mənfi xüsusiyyətlər yarana bilər: səhlənkarlıq, səliqəsizlik, zədələnmiş əşyalara, kitablara laqeydlik. Eyni zamanda əsassız ehtiyaclar meydana çıxa və düzgün dəyərləndirmə prosesi pozula bilər. Buna görə də müasir dövrdə elm və praktikada şəxsiyyətin formalaşmasında iqtisadi tərbiyənin roluna xüsusi diqqət yetirilir.

Şəxsiyyət bir vətəndaş kimi ölkənin ictimai, siyasi və iqtisadi həyatında iştirak etmək üçün intellektual cəhətdən inkişaf etməli, kommunikativ əlaqələr qurmağı bacarmalı, müstəqil və təşəbbüskar olmalı, baş verən dəyişiklikləri dərk etmə qabiliyyətinə malik olmalı, digər insanlara qarşı dözümlü olmalı, müvafiq qərarlar qəbul etməyi bacarmalıdır. Buna görə də ən əsas həyati sahələrdən biri kimi iqtisadiyyat uşaqlıqdan öyrənilməli, iqtisadi fəaliyyət lap erkən yaşlardan tərbiyə olunmalıdır. Bu, uşağın həyata hazırlanmasının vacibliyi, onun baş verən iqtisadi hadisələrə düzgün istiqamətləndirilməsi, eləcə də iqtisadiyyatın öyrənilməsinin davamlılığının zəruriliyi ilə bağlıdır. Artıq uşaqlıq dövründən etibarən iqtisadi anlayış yaratmaq üçün uşaqlar üzərində aşağıdakı tərbiyə işləri aparılır:

- ✓ Birgə yaşayış qaydalarını öyrətmək;
- ✓ Əmək alətləri, materiallar, resurslar və onların mənşəyi haqqında anlayış yaratmaq;
- ✓ İnsanların ümumi ehtiyaclarını bilmək: yemək, su, mənzil, istirahət, pul;
- ✓ İnsanlar arasında fərqləri bilmək: sosial fərq, iqtisadi vəziyyət, xarici görünüş, adət-ənənələr, dəyərlər;
- ✓ Dünyada hər şeyin tədricən dəyişməsinə və ümumiyyətlə dəyişikliklərə hazırlıq (adaptasiya);
- ✓ Seçim imkanlarında ən optimalını seçmək və doğru qərar qəbul etmək bacarığı;
- ✓ İnsanların təbii sərvətlərdən istifadəetmə münasibətlərini başa düşmək.

Bəzən uşaqların nitqində çox vaxt mənasını bilmədikləri sözləri eşidirik: “kredit kartı”, “kredit”, “reklamlar”, “bank”, “varlı”, “kasıb” və s. Uşaqların oyun fəaliyyətini müşahidə edərkən verilən sualları təhlil etdikdə görürük ki, onları iqtisadi məzmunlu problemlər də maraqlandırır. Məsələn: “Niyə eyni malların qiymətləri fərqlidir?”, “Niyə hamı fərqli maaş alır?”, “Pulla hər şeyi almaq olarmı?”, “Pul olmayanda nə etməli?”, “Niyə anam istədiyim oyuncaqları mənə almır?” və s. Uşaqların bu cür “iqtisadi” maraqlarını necə izah etmək olar? Səbəb iqtisadiyyatın insanların həyatının bütün sahələrinə, xüsusən ailələrə nüfuz etməsidir. Çünki uşaqlar burada iqtisadi problemlərin mütəmadi olaraq ailə üzvləri tərəfindən müzakirə olunmasını müşahidə edirlər.

“Müasir dövrdə insanların fəallığı, o cümlədən koqnitiv fəallığı durmadan artır. Təbii ki, insan fəallığı bütün dövrlərdə olmuşdur. Lakin müasir dövrdə həyatın özünün ritmi, sürəti artdığından insanlar özünütəsdiq və özünü reallaşdırmaq üçün həyatın tələb etdiyi sürətə uyğunlaşmaq məcburiyyətindədir” (Əliyev R.İ. 2007).

Cəmiyyətin intensiv transformasiyası şəraitində iqtisadi tərbiyə getdikcə aktuallaşır, insan cəmiyyətə uyğunlaşmağa, özünü reallaşdırmağa və müəyyən fəaliyyət sahəsində uğur qazanmağa can atır. Baş verən dəyişikliklər təbii və qaçılmaz olaraq gənc nəslin təlim-tərbiyə prinsiplərində dəyişikliklərə səbəb olur. Sosial cəhətdən fəal, təşəbbüskar, yeni şeylər öyrənməyə hazır, eləcə də uşaq yaşlarından iqtisadiyyatı öyrənməyə başlayan şəxsiyyət formalaşdırmaq təhsil müəssisələrinin qarşısına məqsəd kimi qoyulur. Bu şəraitdə uşağın sosiallaşmasının ən mühüm institutları kimi fərdin təməl mədəniyyətinin əsaslarının qoyulduğu təlim-tərbiyə sisteminə xüsusi diqqət yetirilir. Bu yaşda olan uşaqlar üçün iqtisadi təhsilin əlçatanlığı və zəruriliyini artıq psixoloqların apardıqları tədqiqatların nəticələri də təsdiqləyir.

Fərdin şəxsiyyət kimi yetişdirilməsi üçün onun gələcək həyatının əsasını təşkil edən dövrdən – uşaqlıq dövründən etibarən onun müstəqil, fəal, əməksevər, iqtisadi savadlı, yüksək əxlaqlı, humanist insan kimi yetişdirilməsi zəruridir. Bununla bir çox pedaqoji şərtlər tətbiq olunur ki, uşaqların iqtisadi tərbiyəsi üçün çox vacib komponentlərdir:

- ✓ Təhsil prosesində uşaqların iqtisadi tərbiyəsinin vahid modelinin tətbiq olunması;

✓ Uşaqlarda qənaətcillik, məsuliyyətlilik, operativlik, işgüzarlıq kimi mənəvi-iqtisadi keyfiyyətlərin formalaşmasına yönəlmiş tərbiyə mühitinin yaradılması;

✓ Fəaliyyət növlərinin (oyun, iş, idrak) təşkili əsasında sosial-iqtisadi həyatın müsbət norma və dəyərlərinə idraki marağın formalaşdırılması;

✓ Uşaqların iqtisadi tərbiyəsində ailənin rolunun artırılması.

Çex pedaqoqu Yan Amos Komenski yazır: *"Uşaqlarınıza həyat üçün lazım olan hər şeyi öyrədin ki, böyüyəndə əsl kişi və ya əsl xanım olsunlar və öz işlərini ağıllı idarə etsinlər!"*.

A.S. Makarenko bildirirdi ki, ailə mühitində uşaqlarda dürüstlük, qayğıkeşlik, qənaətcillik, məsuliyyətlilik kimi keyfiyyətlər lap erkən yaşlardan etibarən tərbiyə olunmaqla onlar gələcək təsərrüfat fəaliyyətinə hazırlanırlar.

İqtisadi tərbiyə sistemli, aksioloji və fəaliyyət yanaşmalarına əsaslanır. Məhz bu yanaşmaların birləşməsi uşaqların yaradıcılıq fəallığının artmasına kömək edir, təxəyyülünü inkişaf etdirir, uşaqlarda kollektivçilik, qənaətcillik, məsuliyyət, səmərəlilik, işgüzarlıq hisslərinin səfərbər edilməsinə şərait yaradır. Bir çox ölkələrdə tətbiq olunan iqtisadi tərbiyə proqram modeli bir neçə prinsipə əsaslanır:

*İqtisadi tərbiyə prinsipləri*

- İqtisadi mədəniyyətin harmonik qavranılması;
- Tərbiyədə iqtisadiyönlülük;
- Dəyər münasibətlərinə məqsədyönlü diqqət.

*Fəaliyyət prinsipləri*

- Etik söhbətlər, rol oyunları, şifahi xalq yaradıcılığı, uşaq bədii ədəbiyyatı;
- Məişət işi, əl əməyi, təbiət;

*Formal prinsiplər*

- Dərslər, ekskursiyalar, müsabiqələr, viktorinalar, sərgilər, ədəbi-bədii oyunlar;
- Asudə vaxt, tematik axşamlar, iqtisadi dərnəklər, maraqlı insanlarla görüşlər.

*Metodik prinsiplər*

- Dialoq, inandırma, nümunə, situasiyalar, şəxsi təcrübəyə müraciət, məşğələ.

İqtisadi tərbiyənin əsas vəzifələrindən biri də uşaqlarda mənəvi-iqtisadi keyfiyyətlərin formalaşdırılmasıdır:

✓ **Qənaətcillik** – şəxsi, ictimai, ailə və ya dövlət əmlakına münasibətdə material və vasitələrdən qənaətlə istifadə ilə ifadə olunan müsbət şəxsi keyfiyyətdir. Qənaətcillik başqalarının nəticələrinə və öz əməyinə, şəxsi əmlakına, əşyalara və təbiətə hörmət münasibətidir.

✓ **Məsuliyyət** – bir insanın mənəvi keyfiyyəti o insanın öz hərəkətlərinə cavabdeh olmaq qabiliyyətində əks olunur. Məsuliyyət azad seçim imkanı şəraitində həyata keçirilən bütün ictimai əhəmiyyətli fəaliyyətə şamil edilir. Məsuliyyət şəxsiyyətə qoyulan tələblər nəticəsində formalaşır və uşağın davranışı üçün motivasiyanın daxili əsasına çevrilir.

✓ **Səmərəlilik** – ortaya çıxan praktik problemlərin həllinin ən rasional yollarını tapmaq bacarığı. Çətinliklərin öhdəsindən gəlməkdə və qarşıya qoyulan məqsədlərə çatmaqda əzmkarlıq xüsusiyyəti.

✓ **Təşəbbüskarlıq** – insanın işgüzar keyfiyyəti, ixtiraçılıq. Praktik bacarıq və tapşırıqların həllində özünü göstərir. Rasional qərar seçimində, rasional fəaliyyət metodunun seçilməsində özünü göstərir.

İqtisadi tərbiyənin başqa bir şərti uşaqların fəaliyyətinin təşkili və onların cəmiyyətin iqtisadi həyatı haqqında məlumatlarla zənginləşdirilməsi və bu əsasda müsbət dəyərlərə idraki marağın artırılmasıdır. İqtisadi tərbiyə üçün fəaliyyət növlərinin seçilməsi tərbiyənin məqsədlərindən, vəzifələrindən və uşaqların yaşından asılıdır. Oyun fəaliyyətinin uşağın şəxsiyyətinin inkişafında aktivləşdirici amil olduğunu nəzərə alsaq, uşaqların fəaliyyətinin oyun məzmunlu olması çox vacibdir.

Uşaqlarda iqtisadi hadisələr haqqında təsəvvürlər yaratmaq, insanların iqtisadi həyatı haqqında yeni biliklər əldə etmək, uşağın əldə etdiyi biliklərə uyğun münasibət, bölgənin iqtisadiyyatı və peşələr haqqında biliklərə yiyələnmək uşaqları iqtisadiyyata stimullaşdırır və idraki marağı inkişaf etdirir. Maraqlar biliyin dərinləşməsinə və güclənməsinə kömək edir, zehni fəaliyyətin keyfiyyətini artırır, uşağın ümumi inkişafına təsir edir. Bununla da qabiliyyətlərin formalaşmasına yol açır və müxtəlif fəaliyyət növlərinə yaradıcı yanaşmanı təşviq edir. Nəticədə şəxsiyyətin formalaşmasına əhəmiyyətli dərəcədə təsir göstərir.

Uşaq yalnız stimullaşdırıcı mühitə idraki maraq göstərir. İqtisadiyyata idraki marağın əsasını həm də uşağın aktiv zehni fəaliyyəti təşkil edir. İdrak marağı onun oyunlarında, hekayələrində, rəsmlərində, əl əməyi dərslərində və digər məhsuldar fəaliyyət növlərində əks olunur. Uşa-

ğın koqnitiv marağını inkişaf etdirmək üçün pedaqoq uşaqlar üçün emosional cəhətdən dəyərli olan vəziyyətlər yaratmalıdır. Məsələn, müstəqil alış-veriş etmək, ailə üzvlərinə qayğı göstərmək, uşağa mağazanın xidmət işçiləri və satıcıları ilə əlaqə qurmağın düzgün yolunu göstərmək və s. Uşaqlarla ünsiyyət zamanı tərbiyəçi tərəfindən stimullaşdırılan fəaliyyət emosional olaraq təşkil olunur və uşaqların ehtiyac və maraqlarına cavab verir və iqtisadiyyata, təsərrüfata maraq yaranır.

"Şəxsiyyətin formalaşması prosesi azadlıqdan və özünənəzarətdən keçir. Özünənəzarəti isə həm xarici mühit (obyektiv səbəblər), həm də daxili mühit (subyektiv səbəblər) vəhdətdə formalaşdırır. Hədsiz ciddi obyektiv səbəblər, kənar nəzarət şəxsiyyətin yaradıcılıq imkanlarını, məsuliyyət hissini məhdudlaşdırır" (Əliyev R.İ. 2006).

İdrak materialının mürəkkəbliyindən və yeniliyindən asılı olaraq uşaqlarla işləməkdə müxtəlif tərbiyə üsullarından istifadə olunur. Məsələn: Arqumentlər: "Pul insanlara nə üçün lazımdır?", "Hər bir insan iqtisadiyyatın qanunlarına əməl etməlidir", "Uğurlu gələcək üçün yaxşı təhsil almaq vacibdir" və s. Bəzən qeyri-ənənəvi üsullardan da istifadə olunur: "Ailə büdcəsi" modelindən istifadə etmək, "Şəhərimizin müəssisələri", "Ölkəmizin təbii sərvətləri" xəritəsi ilə işləmək. Bu üsullardan istifadə iqtisadiyyata idraki marağın yaranmasına kömək edir. Belə ki, uşaq ilkin iqtisadi bilikləri ailədə alır və onun daha da genişlənməsi təhsil müəssisəsində baş verir. Məktəbə gedərkən yeni şəxsi keyfiyyətləri nümayiş etdirməyə ehtiyac yaranır: Nizam-intizam, şüur, təşkilatçılıq, özünə və başqalarına qarşı tələbkarlıq, qənaətcillik, məsuliyyət, səmərəlilik tərbiyəsi uğurlu təhsil fəaliyyəti və aktiv məktəb həyatı üçün zəruri şərtdir. Yaradılmış zəruri pedaqoji şərait, ibtidai iqtisadi mühit və təhsil müəssisəsi ilə ailənin qarşılıqlı əlaqəsi uşaqların iqtisadi tərbiyəsinin müvəffəqiyyətini təmin edir və uşaqların iqtisadi tərbiyəsinin mümkünlüyünü göstərir.

Təhsilin, eləcə də valideynlərin qarşısında duran mühüm vəzifələrdən biri də şagirdlərin davranış qaydalarını öyrənmələri, ona əməl etmələrinin təşkil olunmasıdır. Bu, digər amillərlə müqayisədə daha mürəkkəb və çətindir. Çünki inteqrasiya, qloballaşma sahəsində tələb olunanlar və adət-ənənələrdən gələn tələblər başqadır. Bizdə uşaqlara qəyyumluq, böyüklərin tələbini qeyd-şərtsiz yerinə yetirmək tələb olunursa, Qərbdə tərbiyədə əməkdaşlıq, bərabərlik, sərbəstlik kimi keyfiyyətlər tələb olunur. Fikrimizi nümunəyə əsasən şərh edək:

ABŞ-də öz valideyni ilə oyuncaq mağazasına daxil olan beş yaşlı uşağa deyilir:

- Al, 20 dollar. Get, istədiyin, bəyəndiyin oyuncağı al.

Uşaq istədiyini aldıqdan sonra valideyn heç vaxt uşağın səhv etdiyini demir, ona nəsihət vermir. Beləliklə, ABŞ-də uşaqlar, məktəblilər hələ erkən yaşlarından real həyata, rəqabətə alışdırılırlar.

Nəzəri tədqiqatlara və praktiki təcrübəyə əsaslanaraq bir-biri ilə əlaqəli və bir-birindən asılı olan meyar və göstəricilər iqtisadi tərbiyənin əsas komponentlərinin tərkib hissələridir:

**Uşaqlarda insanların iqtisadi həyatı haqqında bilik və fikirlərin olması (Koqnitiv komponent) meyarı üzrə göstəricilər:**

• Uşağın ailənin ehtiyaclarını bilməsi;

• Valideynlərin işi haqqında fikirlər;

• İqtisadi anlayışlar haqqında təsəvvürlər;

• Ətrafdakı sosial hadisələrə maraq göstərmək.

**İqtisadi bacarıqlar (Davranış-fəaliyyət komponenti) meyarı üzrə göstəricilər:**

• Mövcud biliklərin oyunda, işdə əks olunması;

• Biliyi davranışda tətbiq etmək bacarığı;

• Həmyaşıdlarla və böyüklərlə ünsiyyət bacarığı;

• Optimal yolu seçmək bacarığı;

• Əməkdaşlıq və qarşılıqlı yardım;

• Ümumi işdə öz yerini tapmaq bacarığı;

• Qarşıya qoyulan məqsədə çatmaq bacarığı.

**Mənəvi və iqtisadi keyfiyyətlər (Emosional dəyər komponenti) meyarı üzrə göstəricilər:**

• Qənaətcillik, məsuliyyət, işgüzarlıq, yaradıcılıq (nümayiş olunmalıdır);

• Həmyaşıdlarında bu keyfiyyətləri tərifləmək, təqdir etmək və qiymətləndirmək.

Təqdim olunan meyarlara cavab verən göstəricilərə əsasən iqtisadi tərbiyənin səviyyələri müəyyən olunur: yüksək, orta, aşağı.

**Yüksək səviyyə.**

Uşaqlar iqtisadi anlayışların elementar mənasını izah edə bilir, valideynlərinin işinə açıq və davamlı maraq göstərir, ata və ananın peşəsi haqqında təsəvvürə malik olur, iqtisadi söz və ifadələrdən istifadə edir;

Tədbirlərin fəal iştirakçıları mövqeyində olurlar və əldə etdikləri bilikləri oyunlarda əks etdirməyi bacarırlar;

Böyüklər və həmyaşıdları ilə ünsiyyət qurmağa, çoxlu suallar verməyə və müstəqil olaraq onlara cavab tapmağa hazırdırlar;

Böyüklərə və həmyaşıdlarına işdə kömək etmək, əmək fəaliyyətinin icrası ilə şüurlu şəkildə əlaqə qurmaq, iş obyektlərinə, onun nəticələrinə diqqət göstərmək, başladığı işi sona çatdırmaq, öz işinin nəticələrini və yoldaşlarını düzgün qiymətləndirməyi bacarırlar;

Materiallardan rasional istifadə etməyi, göstərişləri vaxtında yerinə yetirməyi, öz hərəkətlərinə nəzarət etməyi, fəaliyyətinin nəticələrini qiymətləndirməyi bacarırlar;

Məhsuldar fəaliyyət prosesində işgüzar, bacarıqlı, ixtiraçı olur, həmyaşıdlarının yaradıcı axtarışlarını fəal şəkildə dəstəkləyir və inkişaf etdirirlər;

Təşəbbüs göstərməyi, tapşırıqları enerjili şəkildə yerinə yetirməyi və başladıqları işi sona çatdırmağı bacarırlar.

**Orta səviyyə.**

Uşaqlar iqtisadi anlayışları başa düşürlər, lakin onları həmişə izah edə bilmirlər;

Onlar öz ailələrinin ehtiyaclarına və valideynlərinin işinə qeyri-sabit maraq göstərirlər;

Malik olduqları biliklər qeyri-səlis, qeyri-spesifik, səthidir. Uşaqlar yalnız tərbiyəçi tərəfindən təşkil olunan oyun situasiyaları, məşqlər və yaradıcı tapşırıqlar vasitəsilə idraki maraq aktivləşdirildikdən sonra ətrafdakı hadisələr haqqında suallar verirlər;

Onların ətraf-aləm haqqında kifayət qədər təsəvvürləri var, lakin oyunda mövcud biliklərindən necə istifadə edəcəklərini bilmirlər;

Böyüklərin rəhbərliyi altında öz fəaliyyətlərini təşkil edə və verilən tapşırıqları vaxtında yerinə yetirə bilirlər;

Maddi dəyərlərə vicdanla yanaşır, lakin şəxsi istifadəyə daha çox diqqət yetirirlər;

Enerjili, təşəbbüskar, işə yaradıcılıqla yanaşmağı bacaran, lakin tapşırılan işi yalnız böyüklərin rəhbərliyi altında vaxtında yerinə yetirirlər;

Onlar həmişə aktiv deyillər, lakin məqsədlərinə çatmaqda əzmkarlıq göstərməyi bacarırlar.

**Aşağı səviyyə.**

Uşaqlar iqtisadi anlayışların mənasını izah edə bilmirlər, ailələrinin ehtiyaclarına, valideynlərinin işinə, müasir cəmiyyətin ətrafdakı hadisələrinə maraq göstərmirlər, nitqdə iqtisadi sözlərdən istifadə etmirlər;

Məhsuldar fəaliyyətə maraq göstərmirlər, özünü yalnız kənar müşahidəçi kimi aparırlar;

Başladıqları işi başa çatdırmırlar, müştərək işlərin görülməsi prosesində danışıq aparmağı bacarmırlar;

İşə olan marağı tez itir və işini tərk edərək oyunlara qayıdır;

Şəxsi və ictimai əmlaka qayğı ilə baxmağa meylli deyillər;

İşi yerinə yetirərkən onun nəticələrinə maraq göstərmirlər;

Məsuliyyətsizdirlər, təşəbbüskarlıqları yoxdur, məqsədlərə çatmaqda əzmkarlıq göstərmirlər.

İqtisadi tərbiyənin əsas metodu kimi, mövcud biliklərin tətbiqinə deyil, yenilərinin əldə edilməsinə yönəlmiş, yəni cari və yaxın inkişaf zonasına yönəldilmiş **layihə metodu**ndan istifadə olunur. Bu metod ilə uşaqlarda nəticəni planlaşdırmaq və ona nail olmaq bacarığı inkişaf edir, onlar mülahizə yürütmək bacarığına yiyələnirlər. Öz maraqlarından xəbərdar olur, məqsəd qoyur, ona nail olmaq üçün vasitələr seçir və nəticələrini qiymətləndirirlər. Bundan əlavə, layihə üzərində birgə işləmək bir-biri ilə ünsiyyətdə olan uşaqlar arasında təcrübə mübadiləsini təmin edir və uşağı özü və başqaları qarşısında məsuliyyətli edir. Eyni zamanda danışıqlar aparmaq, başqasının nöqteyi-nəzərini qəbul etmək, başqalarının irəli sürdüyü fikirlərə cavab vermək, əməkdaşlıq etmək və kömək göstərmək bacarığını inkişaf etdirir. Layihə metodundan istifadə dürüstlük, müstəqillik, əzmkarlıq, məsuliyyətlilik, dəqiqlik, qənaətcillik kimi keyfiyyətlərin inkişafına kömək edir ki, bu da iqtisadi savadlı şəxsiyyətin formalaşmasına kömək edir. Bunlar həm də tərbiyənin digər üsulları vasitəsilə də uşaqların idrak fəaliyyətini inkişaf etdirir.

Layihə metodu hər kəsə fərdi yanaşmaya imkan verir. Özünü ifadə etmək, öz qabiliyyətlərini müəyyən etmək üçün imkanlar açır, özünütərbiyə üçün müsbət motivasiya yaradır. Metod vasitəsilə yaşıdları ilə ünsiyyət və digər birgə fəaliyyətlər nəticəsində sosial təcrübə toplanılır, özünü idarəetmə, özünə hörmət və müstəqillik kimi keyfiyyətlər inkişaf edir.

Göstərilən metodlarla yanaşı digər üsullardan da istifadə olunur:

**Şəxsiyyət şüurunun formalaşdırılması üsulları:** hekayə, söhbət, tərbiyəvi dialoq, vəziyyətlərin təhlili;

**Davranış və fəaliyyətin təşkili üsulları:** məşqlər, oyunlar, yaradıcı tapşırıqlar, modelləşdirmə;

**Pedaqoji stimullaşdırma üsulları:** həvəsləndirmə, uğur situasiyasının yaradılması;

**Nəzarət və özünənəzarət üsulları:** söhbətlər, icra nəticələrinin təhlili, pedaqoji müşahidə, nəzarət vəziyyətlərinin yaradılması;

**Həvəskar ifa üsulları:** yaradıcı layihələrin nümayişi, qısa çıxışların hazırlanması.

Bazar iqtisadiyyatı, kapitalizm ənənələri yeni dəyərlər yaratmaqla uşaqların da iqtisadi tərbiyə almasını zəruri hala gətirmişdir. Uşaqlar valideynləri ilə mağazaya gedir. Bəzən hətta alış-verişi uşaqlar edir, valideynlər baxır. Bununla da uşaq istər-istəməz iqtisadi təcrübə qazanır. Belə vəziyyətlərdə valideynlər uşaqlara iqtisadi bilikləri düzgün istifadə etməyi öyrətməli, onları ekonomist, iqtisadçı kimi yetişdirməlidirlər.

Ailə mühiti uşağın şəxsiyyətinin inkişafına əhəmiyyətli təsir göstərən və fərdin iqtisadi davranışına təsir edən əsas mühitdir. **A**.A. Mayer hesab edir ki, iqtisadi tərbiyə prosesində ailənin və valideynlərin iştirakı intensivləşdirilməli və valideynlərin subyektiv mövqeyi gücləndirilməlidir. Valideynlər uşaqlarla rollu didaktik oyunlarda, ekskursiyalarda, yaradıcı insanlarla görüşlərin təşkilində, iqtisadi krossvordların həllində birlikdə iştirak etməlidirlər. Bu, uşağa bu və ya digər iqtisadi davranış növünü təyin etmək üçün ilkin psixoloji şərtlər yaradır.

Uşaqlara iqtisadi münasibətlərlə etik qaydalar arasında əlaqə izah olunmalıdır: Bir tərəfdən pul, dəyər, zəhmət, qiymət, digər tərəfdən qənaətcillik, dürüstlük, ləyaqət, səxavətlilik.

İqtisadi tərbiyənin nəticələri uşaqların öz işinə, valideynlərinə, ümumiyyətlə, hər hansı bir işə şüurlu münasibətdə, resursların xərclənməsinin səmərəliliyinə qərar verərkən davranışlarında özünü göstərəcəkdir. Bununla uşaqlarda doğmalarına sahiblənmək hissi, ailə üzvlərinə məsuliyyətli münasibət, dostlarına məsuliyyətlə davranmaq, tərbiyəçi və müəllimlərə hörmət münasibəti, təsərrüfat fəaliyyətində düzgün seçim bacarığı formalaşır. Pul, geyim, işıq, su, qida, tullantılar, vaxt və sağlamlıq anlayışlarını düzgün qiymətləndirmək vərdişləri yaranır ki, iqtisadi tərbiyə çərçivəsində uşaqların indiki və gələcək iqtisadi inkişafına zəmin yaradır.

**Nəticə**

Yuxarıda deyilənlərdən belə bir nəticəyə gəlmək olar ki, şəxsiyyətin formalaşdırılmasında digər amillərlə yanaşı iqtisadi tərbiyə də mühüm əhəmiyyət kəsb edir.

Ailədə əsası qoyulan, məktəbə daxil olandan sonra sistemli şəkildə davam etdirilən iqtisadi tərbiyə şəxsiyyətin formalaşmasında müsbət rol oynayır.

Müəyyənləşdirildi ki, kiçik məktəb yaş dövründə oyun fəaliyyəti ilə təlim fəaliyyəti vəhdət təşkil etdikdə biri digərinin inkişafına təkan verir. Şagirddə özünə qarşı tələbkarlıq, məsuliyyətlilik, iradəlilik kimi keyfiyyətlər təşəkkül tapır.

Düzgün təşkil olunan iqtisadi tərbiyə hələ erkən yaşlarından uşaqlarda iqtisadi mədəniyyətin formalaşmasına, onun sosiallaşmasına şərait yaradır. Eyni zamanda uşaqların psixi inkişafına, xüsusilə məntiqi təfəkkürün inkişafına səbəb olur.

Kiçik məktəb yaş dövründən formalaşdırılan iqtisadi tərbiyə uşaqlarda əməkdaşlıq, ünsiyyət qura bilmək, tolerantlıq, müstəqillik kimi keyfiyyətləri inkişaf etdirir.

**Problemin aktuallığı.** Cəmiyyət həyatında gedən proseslər, inkişaf etmiş dünya dövlətlərinə inteqrasiya böyüməkdə olan gənc nəsildə dövrün tələblərinə uyğun keyfiyyətlərin formalaşdırılmasını zəruri edir. Uşaqların iqtisadi tərbiyəsi, iqtisadi biliklərə yiyələnməsi onların iqtisadi mədəniyyətinə, psixi inkişafına, həyati reallıqları dərk etmələrinə, şəxsiyyətlərarası münasibətlərdə düzgün mövqe tuta bilmələrinə müsbət təsir göstərir. İqtisadi tərbiyə şagirdlərin təlim maraqlarına, təlim-tərbiyə işinin səmərəliliyinə şərait yaradır.

**Problemin elmi yeniliyi** ondan ibarətdir ki, uşaqların iqtisadi tərbiyəsi problemi psixoloji baxımdan ilk dəfə öyrənilir. Ümumi tərbiyənin tərkib hissəsi olan iqtisadi tərbiyənin həyata keçirilməsinin üsul və metodları araşdırılır. Müəllim və valideynlərin şagirdlərlə əməkdaşlığı, ailə təsərrüfatı, ailədaxili münasibətlərin qurulmasında, təlim-tərbiyə işində iqtisadi tərbiyənin rolu öyrənilir.

**Problemin praktik əhəmiyyəti.** Tədqiqatdan alınan nəticələrdən ali və orta ixtisas məktəbi müəllimlərinin dərslərində, orta məktəb müəllimlərinin təlim-tərbiyə ilə bağlı işlərində istifadə oluna bilər. Məqalədə irəli sürülən elmi yanaşmalardan eyni za-

manda valideynlərin maarifləndirilməsində istifadə edilə bilər.

Məqalədə müəllim və məktəb rəhbərlərinə kiçik məktəblilərin iqtisadi tərbiyəsi ilə bağlı pedaqoji-psixoloji tövsiyələr verilmiş, praktik işlərin həyata keçirilməsi yolları müəyyənləşdirilmişdir.

**Ədəbiyyat**


1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. / "Azərbaycan müəllimi" qəz., / 2013, 25 oktyabr.
2. Əliyev R.İ. / Etnopsixologiya: qloballaşma və millilik. / -Bakı: Nurlan, -2007. - 180 s.
3. Əliyev R.İ. / Tərbiyə psixologiyası. / -Bakı: Nurlan, -2006. -200 s.
4. Əlizadə Ə.Ə. / Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. / -Bakı: Ozan, -1998. - 368 s.
5. Qədirov Ə.Ə. / Yaş psixologiyası. / -Bakı: Maarif, -2002,. -386 s.
6. Berti A.E. & Bombi A.S. / The child's construction of economics. / Cambridge University Press, 1988. p.264
7. Fox K.F.A. & Kehret-Ward T. / NaoEve theories of price: A developmental model. / Psychology and Marketing, 1990. p. 311
8. Furnham A. / Children's understanding of the economic world. / Australian Journal of Education. 1986. p. 144
9. Furnham A. & Thomas P. / Adults' perception of economic socialization of children. / Journal of Adolescence, 1984. pg.217
10. Jahoda G. / The development of thinking about economic institutions: The bank. / Cahiers de Psychologie Cognitive, 1981. p5 5
11. Mischel W. & Metzner R. / Preference for delayed reward as a function of age, intelligence and length of delay interval. / Journal of Abnormal and Social Psychology, 1962. p. 425


**Redaksiyaya daxil olub:** 05.05.2025

*UOT 159.9.*

***Könül Məmməd qızı Haqverdiyeva***
*Azərbaycan Dillər Universitetinin baş müəllimi,*
*psixologiya üzrə fəlsəfə doktoru*
*https://orcid.org/0009-0003-0644-3873*
*E-mail: sevinc224@rambler.ru*
*https://doi.org/10.69682/arti.2025.92(3).190-197*

# HUMANİST PEDAQOGİKANIN GƏNC NƏSLİN MƏNƏVİ TƏRBİYƏSİNDƏ ROLU

***Konul Mammad Hagverdiyeva***
*senior lecturer*
*of Azerbaijan University of Languages,*
*doctor of philosophy in psychology*

# THE ROLE OF HUMANISTIC PEDAGOGY IN THE SPIRITUAL EDUCATION OF THE YOUNG GENERATION

***Кенуль Мамед гызы Ахвердиева***
*доктор философии по психологии, старший преподаватель*
*Азербайджанского Университета Языков*

# РОЛЬ ГУМАНИСТИЧЕСКОЙ ПЕДАГОГИКИ В НРАВСТВЕННОМ ВОСПИТАНИЕ МОЛОДОГО ПОКОЛЕНИЯ

**Xülasə.** Məqalədə problemin tədqiqinin təhlili açıqlanır. Belə ki, "humanist psixologiya" anlayışı, o baxışın tərəfdarları, güclü və zəif tərəfləri, o cümlədən yanaşma metodları, prinsipləri haqqında fikirlər öz əksini tapmışdır. Bundan əlavə, məqalənin sonunda bu yanaşma əsasında formalaşmış məktəblər və beynəlxalq mərkəzlər və onların uğurları haqqında məlumat verilmişdir.
***Açar sözlər:*** *Humanist psixologiya, neyro-linqvistik proqramlaşdırma, subyektiv anlayış, biheviorizm, bütövlük prinsipi, azad seçim, Mən konsepsiya*

**Abstract.** The article describes the analysis of the study of the problem. Thus, ideas about the concept of "humanistic psychology", the proponents of that view, its strengths and weaknesses, including the approach methods and principles have been reflected. In addition, at the end of the article there is information about schools and international centers formed based on this approach and their successes.
***Key words**: Humanistic psychology, neuro-linguistic programming, subjective understanding, behaviorism, principle of integrity, free choice, I concept*

**Аннотация.** В статье описан анализ исследования проблемы. Отражены представления о понятии "гуманистическая психология", о сторонниках этой точки зрения, ее сильных и слабых сторонах, в том числе о методах и принципах подхода. Кроме того, в заключении статьи предоставляется информация о школах и международных центрах, созданных на основе этого подхода, и их успехах.
***Ключевые слова:*** *гуманистическая психология, нейролингвистическое программирование, субъективное понимание, бихевиоризм, принцип целостности, свободный выбор, Я-концепция*

*"Azərbaycan dövləti möhkəm milli-mənəvi dayaqlar üzərində qurulubdur. Biz öz mədəniyyətimizi, incəsənətimizi, ana dilimizi, bayramlarımızı qoruyuruq, yaşadırıq. İyirmi beş illik müstəqillik dövrü onu göstərir ki, ancaq milli köklər üzərində qurulmuş dövlətlər uğur qazana bilər və o dövlətlərin gələcəyi var. Azərbaycan dəyərləri, milli-mənəvi dəyərlərimiz bizim üçün hər şeydən üstündür"* (1).

Humanist Psixologiya əsasında Humanist pedaqogikanın və Psixoterapiyanın bəzi istiqamətləri qurulur.

*"Humanist psixologiya (ingiliscədən humanistic psychology) 1960-cı illərdə formalaşmış Qərb, əsasən Amerika psixologiyasında bir istiqamətdir. XX əsr humanist yanaşma çərçivəsində. Humanist yanaşma XX əsrin əvvəllərində insana qarşı hakim olan inzibati-avtoritar, şəxsiyyətsiz yanaşmaya cavab və müxalifət kimi meydana çıxdı"* (1).

Bu dövrdə öz sosial dəyərlərinə əmin olmayan, insanların ən mənəvi-sosial fərqliliyinə, onların soyuqluğuna səbəb olan çoxsaylı ictimai, iqtisadi böhran keçirirdi.

Humanist psixologiya ötən əsrin 40-cı illərində ekzistensialist fəlsəfi məktəbin əsasında ABŞ-də yarandı. Onun ilk yaradıcılarından biri Q. Olport qeyd edirdi ki, *"Amerika psixologiyası Seçenov, Bine, Freyd və digər alimlərin yaratdıqlarını inkişaf etdirib, yayıb, sintez edib humanist psixologiyanı formalaşdırdı. 30-50-ci illərdə aparılan tədqiqatlar göstərdi ki, insanın yalnız mühitə uyğunlaşdırılması motivasiyası kifayət etmir. Situasiyanın təzyiqini aradan qaldırmaq imkanları insanlarda deyildiyindən daha çoxdur. İnsanların mənəvi tərəflərinin inkişafı problemlərini ənənəvi təbii-elmi determinantlarla izah etmək mümkün deyildi. Deməli, yeni fəlsəfi yanaşmalar da tələb olunurdu"* [3].

Bir çox alimlərin fikrincə, dehumanizə olunmuş psixologiya fonunda (klassik bihevriorizm və psixoanaliz) insan şəxsiyyəti haqqında bir çox yazıçılar, şairlər, dramaturqlar, ideya və təsəvvürləri elmi baxışlardan üstün olan, daha düşüncəli və dərin psixoloqlar olmuşlar.

Bu istiqamətə Abraham Maslou, Karl Rocers, Qordon Olport, Viktor Frankl, Şarlotta Byuler, Rollo May, Sidni Curard, Ceyms Byucental, Everet Şostrom, Xans-Verner Qessman, Frederik Perlz və s. aid etmək olar. Humanist psixologiyaya insan psixikasının müsbət aspektlərinin tədqiqi ilə məşğul olan pozitiv psixologiya cərəyanı aiddir. Humanist psixologiya öz fəlsəfi bazası kimi ekzistensializmə dayanır. Humanist psixologiyanın manifesti Rollo Mayanın redaktorluğu ilə "Eksiztensial psixologiya" – məruzələr toplusu kitabı olmuşdur. Bu kitab 1959-cu ilin sentyabrında Amerika Psixologiya Assosiasiyasının hər il keçirilən qurultayı çərçivəsində Sinsinnati simpoziumunda təqdim olunmuşdur.

Humanist psixologiya elmi biliklərin nizama salınmış sahəsi deyildir. Bu elm deyil, daha çox metafizik konsepsiyalar toplusudur ki, ekzistensial təcrübənin köməyi ilə insan problemlərinin açıqlanması üçün yol göstərir.

Demək olar ki, bu ideyalar kitab halında nəşrlərə yol açaraq, tədricən humanist psixologiyanın metodların analizinin axtarışı və şəxsiyyətin tam, hissi varlıq kimi öyrənilməsinə təkan verdi. Məsələn, Humanist psixologiyanın banisi Karl Rocersin şəxsi inkişafa və özünü həyata keçirməyə yanaşmasının əsas prinsiplərini əks etdirən "On Becoming A Person: A Therapist's View of Psychotherapy", Avstriyalı nevropsixiatr və humanist psixologiyanın aparıcı nümayəndəsi Viktor Franklın, Nasist Almaniyasının konsentrasiya düşərgələrində sağ qalan təcrübələri və hədsiz çətinliklər qarşısında "həyatın mənası" ideyası haqqında danışdığı "Man's Search for Meaning", Məşhur amerikalı psixoterapevt və yazıçı İrvin Yalomun humanist psixologiya nöqteyi-nəzərindən klinik təcrübələri və terapiyaya yanaşmaları haqqında yazdığı "Love's Executioner and Other Tales of Psychotherapy", Alman əsilli amerikalı psixoanalitik və filosof Erix Frommun sevgi anlayışını insan həyatının müxtəlif sahələrində oynadığı rolu təhlil edərək humanist nöqteyi-nəzərdən araşdırdığı "The Art of Loving", Ehtiyaclar iyerarxiyası konsepsiyasının yaradıcısı və humanist psixologiyanın banilərindən biri olan Abraham Maslou öz kitabında insan təbiətinin ən yüksək ehtiyaclarını və potensialını təsvirini verdiyi "The Farther Reaches of Human Nature" və s. kitablar.

Humanist psixologiyanın bütün əsas nümayəndələri bu cür təcrübədən keçmişlər. Psixologiyada humanistik yanaşma dəqiq şəkildə praktik məsələlərə istiqamətlənmişdir. Onun əsas anlayışları şəxsi inkişaf (qurulma) və insan imkanlarıdır. O, təsdiq edir ki, adamlar öz üzərlərində işləyərək, dəyişə bilərlər ideyalarına (ilk növbədə "azadlıq", "seçim", "məsuliyyət").

Humanist psixologiyanın ən çox məlum metodları bunlardır: Art terapiya – üzünü rəsm, musiqi, hərəkət vasitəsilə dərk etmək; İ. Şulsun metodu ilə autotreninq – özünə yüklənmə, öz daxili məni ilə ünsiyyət; K. Simontona görə, vizuallaşma – istəklərin dərk edilməsi, visual təsəvvürlərdən (vasitəsilə) məqsədlərin qurulması; Meditasiya, yoqa, xatka-yoqa, taytsizitsiyuan,

tantrizim və s.; V.Rayxa görə, vegetoterapiya – hansının ki, xroniki xəstəliklərin əsasında stressin yaratdığı əzələ gərginliyinin nəticəsi olduğu kimi təsəvvürlər dayanır; Baniləri C.Qinder və R.Bendler sayılan, neyro-linqvistik proqramlaşdırma (NLP).

Humanist məktəb təcrübəsi bir neçə konkret metod hazırlamışdır. Bunlar innovasiya fəaliyyəti ilə bağlıdır və aşağıdakılardır:

1. Təlim-tərbiyə fəaliyyətinin diferensiallaşması;

2. Təlim və tərbiyə prosesinin fərdiləşdirilməsi;

3. Hər bir təhsil alanın meyl və bacarıqlarını inkişaf etdirmək üçün lazımi şəraitin yaradılması;

4. Homogen (eyni yaşa, eyni inkişaf səviyyəsinə, eyni maraqlara malik və s.) sinif və paralellərin formalaşdırılması;

5. Psixoloji təhlükəsizlik, şagirdlərin müdafiəsi;

6. Şagirdlərin öz gücünə və imkanlarına inam;

7. Şagirdi olduğu kimi qəbul etmə;

8. Təlim və tərbiyənin müvəffəqiyyətini təmin etmə;

9. Məktəbin məqsədlərinin dəyişilməsi;

10. Hər bir şagirdin inkişaf səviyyəsinin konkret şəkildə müəyyənləşdirilməsi;

11. Müəllimin şəxsiyyətin daxili imkanlarının üzə çıxarması;

12. Humanitar təhsilin gücləndirilməsi;

13. Humanist pedaqogika manifesti.

Onlar insan psixikasına təsir etməyə qadir olan sözlərlə düzgün ifadə etməyə xüsusi diqqət ayırırdılar.

Dünyada bütün yaradılışın iki tərəfi olduğu kimi, Humanist Psixologiyanın da zəif və güclü tərəfləri vardır. Birinci tərəfə aiddir: Biologiyanı inkar edir; Qeyri⁄elmi – subyektiv anlayış (Məsələn, özünüreallaşdırmanı obyektiv ölçmək olmaz); Humanizm şüuraltını inkar edir; Biheviorizm – insan və heyvan davranışı qarşı-qarşıya qoyula bilər; Etnosentrik – (Qərb mədəniyyətinə tərəf qarışmışdır); Onların iradə azadlığına inamı elmin müəyyən edilmiş qanunlarına qarşı müxalif mövqedə dayanır.

İkinci – güclü tərəfə isə, daxildir: Şüuraltıya deyil, ayrı-ayrı adamların və bütün insanın bütövlükdə davranışına fokusu dəyişir; Humanist psixologiya insan olmağın nə anlam verməsi haqqında əksər adamların ideyalarını təmin edir; Keyfiyyətli məlumatlar əsl anlayış və davranışda daha dolğun informasiya verir; Tədqiqatın daha individual və ideoqrafik metodlarının əhəmiyyətini qeyd edir.

Psixologiyada dəyərli olan bütün təcrübələri ümumiləşdirib və şəxsiyyətin öyrənilməsində psixoanalizin və biheviorizmin çatışmazlıqlarını nəzərə alaraq, Humanist psixologiya insanın təbiətinə, onun inkişafına və digər adamlarla qarşılıqlı münasibətlərinə öz yeni baxışlarını təklif etdi. Bu baxışın əsasında aşağıdakı prinsiplər yatır:

1) *Bütövlük prinsipi.* Şəxsiyyət tam yaranışdır, öz tərkibinə enmir. Tamın istənilən hissəsində nə baş verirsə, bütün şəxsiyyətə təsir edir. Mən tamlığı hər bir insanın duyğusunun (yaşantısının) nadir xarakterinin yaradır. Məhz buna görə öyrənmə predmeti şəxsiyyətin istiqaməti, mənaları, özünəmünasibəti, özünüqavrama olmalıdır.

2) *Pozitivlik prinsipi.* İnsan təbiəti xeyirxah və konstruktivdir ki, bununla əlaqədar vurğu (aksent) problemi olan, lakin onların həlli üçün olduqca böyük daxili ehtiyatlara malik sağlam, yaradıcı adamların öyrənilməsinə keçir. İnsan fəaliyyəti təbiət qanunları ilə sərt (qəti) şəkildə təyin edilən deyil. O, təbiətə üstün gəlir və özünün xüsusi ruhi aləmini yaradır.

Humanist psixologiya bəşəriyyət tarixində mövcud olan ənənələrə qarşı çıxırdı və insan həyatının təkrarsız xüsusiyyətini, əsaslı insan fenomenləri: sevgi, özünüdərk, özünütəyin, hakimiyyət hərisliyi, qəddarlığı öyrənməyə cəhd edən İntibah mütəfəkkirlərinin, qədim Yunan filosoflarının və digər dövrün alimlərinin ideyaları ilə çıxış edirdi.

Beləliklə humanist psixologiyanın formalaşmasının 3 əsas səbəbi mövcuddur: 1) Humanist psixologiyanın ideyalarına ehtiyac duyulan ictimai şərait; 2) Ekzistensializmin geniş yayılması; 3) Sosial elmlərin, o cümlədən "insanlaşmanı" tələb edən psixologiyanın inkişaf məntiqi. Hər bir psixoloji yönümün əsasında şəxsiyyətə müəyyən baxış durur: insan təbiəti, onun inkişafı və digər insanlarla qarşılıqlı əlaqəsi. Klassik psixoanalizin və biheviorizmin fərqliliyinə və qarşı-qarşı qoyulmasına baxmayaraq, bu istiqamətlərin şəxsiyyətə baxışda ümumi cəhətləri çoxdur – insan ruhsuz varlıq kimi çıxış edir, belə ki, hər iki cərəyanı tam şəkildə dəyərlər, insan mövcudluğunun mənası maraqlandırmır.

Bundan savayı, bu cərəyan çərçivəsində insanın öz keçmişindən asılılığı ("qul determinizmi") yatırdı.

1963-cü ildə Humanist Psixologiya Assosiasiyasının ilk prezidenti Ceyms Byucental bu yanaşmanın 5 əsas tərəflərini formalaşdırmışdır: 1) İnsan, tam bir varlıq kimi, öyrənilməlidir, yəni insan onun ayrı-ayrı funksiyalarının elmi öyrənilməsi nəticəsində izah oluna bilməz; 2) İnsan varlığı insan münasibətləri kontekstində inkişaf etdirilir; 3) İnsan özü-özünü dərk edir və onun arasıkəsilməz, çoxdərəcəli özünüdərkini nəzərə almayan psixologiya ilə qavranıla bilməz; 4) İnsan seçimə malikdir, yəni passiv müşahidəçi deyil, özü öz təcrübəsini yaradır; 5) İnsan səmərəverəndir. Başqa sözlə, insan gələcəyə yönələn həyatında məqsəd var: dəyərlər və məna.

*"Humanist məktəbi şagirdi həyatın subyekti kimi diqqət mərkəzində saxlayır, onun azad şəxsiyyət kimi özünüinkişafa yönəlməsini təmin edir... Heç şübhəsiz ki, uşağın ümumi inkişafı (əqli, mənəvi, fiziki, estetik) məktəbin başlıca vəzifəsi olmalıdır. Humanist yanaşması çərçivəsinində fəaliyyət göstərən hər bir təhsil sistemi yaradıcı axtarışlar aparır və öz məzmununu, metodunu, tərbiyə və təlimin müvafiq vasitələrini axtarıb tapır. Bu istiqamət eyni zamanda şagirdin və eləcə də pedaqoqun azadlığını, yaradıcılığını nəzərdə tutur. Onun nüvəsində şagirdə insani yanaşma, onun həyata hazırlığı, cəmiyyətə adaptasiya edilməsi nəzərdə tutulur. Mərkəzdə şagirdin inkişafı, onun intellektual tələbləri, şəxsiyyətlərarası münasibətləri durur. İnkişaf və özünüinkişaf, şagirdin özünüreallaşdırması, onun yaradıcılığı, subyektliyi humanizmin əsasıdır. Müəllim subyekt şagird subyekt münasibətləri məhz belədir. İnkişaf, burada, şagirdin daha yüksək pilləyə, fəallığa və qarşıda qoyulmuş vəzifələrin yerinə yetirilməsinə can atması deməkdir.*

*Görkəmli alim, psixoloq L.S. Vıqotskiyə görə, inkişaf elə bir kömək ölçüsü ilə müəyyənləşir ki, o, uşağa təlim aldığı vaxtda lazım olur. Burada ümumi inkişaf (universal bacarıqlar), sosial (istedadlılıq) və mədəni inkişaf fərqləndirilir.*

*Humanist nəzəriyyəsinin mərkəzində hazır bilikləri mənimsəyən şagird yox, həqiqəti dərk edən insan durur. Pedaqoq və şagirdlər arasındakı münasibətdə dialoq, əməkdaşlıq, qarşılıqlı yaradıcılıq və öz mövqeyini azad şəkildə seçmək məsuliyyəti dayanır. Pedaqoji prosesin diqqət mərkəzində fərdilik, şagirdin daxili aləmi, mənəvi dəyərlər mübadiləsi yolu ilə dünyanı dərk etməsi dayanır"* (2, s.94).

Dünyada xüsusi təlim konsepsiyası yaradan azsaylı psixoloqlardan biri kimi Amerika psixoloqu Karl Rocersin didaktik konsepsiyasının əsasını insana və onun şəxsiyyətinə inam təşkil edir. Onun zəngin pedaqoji-psixoloji irsi vardır.

Məktəbdə qabiliyyətsiz şagird kimi son dərəcə tez-tez müəllimlər tərəfindən kobudluq və təzyiqlərə məruz qalan Rocers gələcəkdə özünü pedaqoji fəaliyyətə həsr etməyə can atmışdır və müəllimlərin ona olan münasibəti onun bu fikrini daha da möhkəmləndirmişdir. O, böyük dahi Con Dyuinin şagirdi olmuşdur. Sonralar müəllim işləyəndə müəllimlərinin əksi olaraq, Rocers şagirdləri tərəfindən çox sevilmiş və sanki onların həyatı ilə yaşamışdır.

K. Rocers öyrənmənin iki tipini fərqləndirirdi: birinci tipə – biliklərin ötürülməsi, məlumatların verilməsi aiddir. Bu tipə görə, təlimdə öyrənmə məcburidir. O, şəxsiyyətin deyil, intellektin inkişafına istiqamətlənir və qiymətləndirmə müəllim tərəfindən aparılır. O, belə düşünürdü ki, xeyirxahlıq daim qalib gəlir.

İkinci tip öyrənmədə isə müstəqillik, könüllülük hökm sürür, inkişafın bütün xətlərinin mühümlüyünü nəzərə almaqla şəxsiyyətyönlü olur və tam funksionallaşmanı nəzərdə tutur. Bu tip öyrənmə, ilk növbədə, adekvat, çevik və sağlam "mən" konsepsiyasının inkişafına xidmət edir.

Karl Rocersə görə, hətta ən ilkin tələbat və cəhd insana o şəraitdə təsir göstərə bilər ki, onlar müvafiq normalara uyğun olsun. Onun fikrincə *"tələbat müsbət qiymətləndirildikdə şəxsiyyətin inkişafı ilə yanaşı həmin tələbatlar daha da əsaslı olmağa başlayır və son nəticədə insan öz orqanizminin tələbatlarının ödənilməsindən daha çox, başqa adamların onu bəyənməsinə və ona hörmət etməsinə ehtiyac duyur. Hörmət əsasında özünəhörmət baş verir ki, bu da fərdin mühüm tələbatlarından birinə çevrilir"* (7, s.176-177].

Humanist pedaqogika çərçivəsində tərbiyəçi şagirdlərdə mənəvi seçim, təhlil və araşdırmalar üçün materiallar təqdim edir. Tərbiyə metodları diskussiya, rollu oyun, situasiyaların müzakirəsi, ziddiyyətlərin təhlili və həll olunması vasitəsilə həyata keçirilə bilər. Humanist məktəbinin alimləri valideynlər və pedaqoqlara uşaqla

ünsiyyətdə olduqda, dinləmə, sevgi göstərmə, diqqət yetirmə kimi priyomlardan istifadə etməyi təklif edirlər.

Təlim-tərbiyə prosesinin humanistləşdirilməsini şəxsiyyətə təzyiq göstərən, müəllim və şagird arasında əməkdaşlıq münasibətlərini qəbul etməyən avtoritar pedaqogikadan şəxsiyyətin fəaliyyət və şəxsi azadlığına böyük əhəmiyyət verən şəxsiyyətyönümlü pedaqogikaya keçid kimi qəbul etmək olar. Qadağa və cəzalar insanı şəxsiyyətə deyil, robota, qula çevirir, bir sözlə, sosiallaşmada idarəetmədə insan fərdləşir.

Təlim-tərbiyə prosesinin humanistləşdirilməsi elə şəraitin yaradılması deməkdir ki, burada şagird prosesin müşahidəçisi deyil, tam hüquqlu iştirakçısıdır. Humanist pedaqogika məktəbin şagirdlərə uyğunlaşdırılmasını tələb edir və onlar üçün psixoloji təhlükəsizlik mühitinin təmin olunmasını nəzərdə tutur.

Beləliklə, Humanist məktəb insan şəxsiyyətinə bütövlükdə aşağıdakı aspektlərdə baxır: 1) İnsan – tərkib hissələrindən toplu deyil, bütöv şəxsiyyətdir; 2) Hər şəxsiyyət nadirdir, ona görə də daha düzgün olardı ki, hər bir konkret hadisəyə onun individuallığı nəzər nöqtəsindən yanaşılsın; 3) İnsan həyatı – varlığın insana çevrilməsinin yeganə prosesidir; 4) İnsan- inkişafı labüd olan aktiv varlıqdır; 5) Əsas psixoloji reallıq – insan duyğusudur (yaşantısıdır); 6) İnsan öz prinsip və dəyərlərinə rəhbər ola bilər (əsaslana bilər) ki, ona xarici səbəblərdən müəyyən dərəcədə asılı olmamağa kömək edir.

Nəhayət, humanist psixoloqlar iddia edirlər ki, *“insanın öz vəziyyətlərinə və motivlərinə diqqət yetirilməsi özünü aldatmaqdan qaçmağa imkan verir və həqiqi mənliyin kəşfini asanlaşdırır. Bu, nəzəri və tətbiqi ifadəsində humanist psixologiyanın bir növ devizidir”* [9, s.17].

Rusiya Federasiyasının Krasnodar diyarındakı Tekos kəndində məşhur Şetinin məktəbi onlardan biridir. Mixail Petroviç Şetininin adı mətbuat və televiziya sayəsində cəmiyyətin böyük heyranlıqla və sevinclə kəşf etdiyi yenilikçi-pedaqoqların sırasına aiddir.

Bütün bu dediklərimizə baxmayaraq, humanist pedaqogika ideyalarının məhsuldarlığını və maraqlılığını hələ də kütləvi şəkildə praktikada tətbiq etmək mümkün olmamışdır. İnsani dəyərləri ən ali dəyərlər elan edən dövlətimiz hazırda humanist ideyaların bütün həyatımıza geniş yayılması üçün şərait yaratmaqdadır. Bu dövlətimizin təhsil sahəsində həyata keçirdiyi islahat proqramı çərçivəsində qəbul olunmuş sənədlərin məzmununda da özünü göstərmişdir. Belə ki, “Ümumi təhsil pilləsinin dövlət standartı və proqramları (kurikulumları)" sənədində şagirdyönlülük, şəxsiyyətyönlülük, inkişafyönlülük müasir təhsilin əsas prinsipləri kimi qəbul olunmuşdur. Bu isə, öz növbəsində, tədricən innovasiya proseslərinə qoşulmağı, onun tətbiqini və məktəbdə təlim-tərbiyə prosesinin humanistləşdirilməsini mümkün edəcəkdir (8).

Akad. Ş. Amonaşvilinin geniş mündəricəli maarifləndirici iş prosesində humanist pedaqogikanın nəzəri sistemi ilə tanışlığın özü də göstərdi ki, *“tədqiqat bazası olaraq orta ümumtəhsil müəssisələrində yeni yaradılan humanist pedaqogika mərkəzlərinin mövcudluğu, assosiasiya mərkəzlərinin yaradılması istiqamətində ilkin addımlar çox uğurlu təsir bağışlayır. Xüsusən, Təhsil İnstitutu əməkdaşlarının humanist pedaqogika ideyalarının təbliği yolunda təşkil etdikləri elmi-praktik konfransların, nəzəri seminarların, praktik görüşlərin keçirilməsinə verdikləri töhfə böyükdür...”* (6).

Sevindirici haldır ki, müasir dövrümüzdə Azərbaycanda müxtəlif illərdə müxtəlif başlıqlar altında humanist pedaqogika üzrə beynəlxalq oxular, beynəlxalq konfrans-seminarlar keçirilir. Ölkəmizdə humanist pedaqogika ideyalarının və bütövlükdə ümumbəşəri dəyərlərin pedaqoji ictimaiyyət arasında geniş yayılması istiqamətində xeyli işlər görmüşdür. Bu işlərin müqabilində maddi mənfəət deyil, daha böyük nailiyyət olan insan kapitalı, pedaqoji və elmi ictimaiyyət arasında etibar və hörmət qazanılıb.

“Azərbaycan Respublikasında Təhsilin İnkişafı üzrə Dövlət Strategiyası”na uyğun olaraq təhsilin yeni məzmununun reallaşdırılması və mənəvi-əxlaqi dəyərlərin məzmuna tətbiqi üçün bir sıra tədbirlər həyata keçirilmişdir. 2014-cü ilin 05-06 dekabr tarixlərində Təhsil Nazirliyinin dəstəyi ilə Azərbaycan Respublikasının Təhsil Problemləri İnstitutu tərəfindən “Mənəvi-əxlaqi tərbiyə şəxsiyyətin hərtərəfli inkişafının əsasıdır” mövzusunda birinci beynəlxalq elmi-praktik konfrans və seminar keçirilmişdir.

2014-ci il dekabrın 1-dən 4-dək Bakıda institutun təşəbbüsü ilə “Təhsil sistemində uşaqlara humanist şəxsiyyət kimi yanaşma” adlı seminar təşkil olunmuşdur. Ş.A. Amonaşvili 4 günlük müəllif seminarında III və V sinif şa-

girdləri ilə açıq dərs tipli ustad dərsləri keçirmiş, maraqlı formada öz bilik və bacarıqlarında, təcrübələrində uşaqlara olan dərin sevgisini bölüşmüşdür. Belə seminarlar humanist pedaqogikanın irəli sürdüyü ideyalarla yaxından tanış olmağa kömək edir.

2015-ci ilin aprelində Humanist Pedaqogika üzrə "Zəngi" liseyində, Sumqayıtın 11 nömrəli məktəbində, M.Ə. Sabir adına Bakı Pedaqoji kollecində humanist pedaqogika laboratoriyası yaradılmışdır.

2015-ci ilin iyulunda isə ümumbəşəri dəyərlər mövzusunda Avropa institutunun təşkilatçılığı ilə seminar keçirilmişdir.

Mərkəzin Azərbaycan üzrə idarə heyətinin üzvü olaraq, mən də Humanist Pedaqogika Beynəlxalq Mərkəzi tərəfindən 25-27 mart 2016-cı ildə Tiflis şəhərində keçirilən XV beynəlxalq pedaqoji oxularda fəal iştiraka görə rəsmi sertifikat və təşəkkürnamə almışam.

Bu tədbirin davamı olaraq 21-25 dekabr 2016-cı il tarixində Azərbaycan Dövlət Pedaqoji Universitetinin, ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecinin və Humanist Pedaqogika Mərkəzinin təşkilatçılığı ilə "Təhsildə mənəvi-əxlaqi dəyərlər: harmonik şəxsiyyətin inkişafı" mövzusunda II beynəlxalq konfrans-seminar və I respublika oxuları həyata keçirilmişdir.

2017-ci ilin aprelində Azərbaycan Dövlət Pedaqoji Universitetinin, ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecinin və Respublika Humanist Pedaqogika Mərkəzinin birgə təşkilatçılığı ilə universitetdə Tailand Texnoloji Elmi-Tədqiqat İnstitutunun direktoru, NASA-nın əməkdaşı, professor Art Onq Djumsai "Mənəvi-əxlaqi dəyərlərin təhsilə tətbiqi" mövzusunda ikigünlük beynəlxalq təlimlər keçirib. Beynəlxalq təlimlərdə ADPU-nun rəhbərliyi, professor-müəllim heyəti, Milli Məclisin Elm və təhsil komitəsinin sədr müavini, AMEA-nın müxbir üzvü, professor Bəxtiyar Əliyev, ADPK-nin rəhbərliyi və müəllimləri, filialların direktorları və müəllimləri, ümumi təhsil məktəblərinin direktorları və mütəxəssisləri, təhsil ekspertləri, Sankt-Peterburqdakı Ümuminsan Dəyərləri İnstitutunun filial direktoru Valeriy Voşinin iştirak ediblər.

2018-ci il martın 23-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Beynəlxalq Assosiasiya" İctimai Birliyinin Humanist Pedaqogika Beynəlxalq Mərkəzinin, ADPU-nun və Azərbaycan Respublikasının Humanist Pedaqogika Mərkəzinin birgə təşkilatçılığı və oxuların müəllifi prof. Ş.A. Amonaşvilinin iştirakı ilə "Ailə insan mədəniyyətinin beşiyidir" mövzusunda 3 günlük XVII beynəlxalq oxuları keçirilmişdir. Qeyd edək ki, oxularda respublikamızın və xarici ölkələrin humanist pedaqogika sahəsində çalışan tanınmış və nüfuzlu 320 nəfər alim-mütəxəssis, gənc müəllimlər iştirak etmiş və bu oxuları yüksək qiymətləndirmişlər. 2 iyun 2018-ci ildə ADPU-nun Şamaxı filialında 8 regiondan 250 nəfər pedaqoji kadrının cəlb olunduğu Humanist Pedaqogika üzrə II respublika pedaqoji oxuları keçirilmişdir (5).

Azərbaycan Dövlət Pedaqoji Universitetinin və Respublika Humanist Pedaqogika Mərkəzinin təşkilatçılığı ilə "Saf düşüncə möcüzə yaradır" adlı III respublika oxuları da keçirilib.

2021-ci il martın 10-da və 2022-ci il martın 4-də Bakı Dövlət Universitetinin (BDU) Filologiya fakültəsində "Müəllim, məni öz içimdə alicənab və nəcib insan yaratmağa ruhlandır" adlı növbəti elmi-pedaqoji seminar təşkil olunub.

2022-ci il iyunun 21-də "Müəllim sevinc və dəyər daşıyıcısıdır" mövzusunda IV respublika pedaqoji oxuları keçirilib. Tədbirdə iştirak edən təhsil naziri Emin Əmrullayev cəmiyyətdə müəllimin rolundan, bu peşənin özəlliklərindən danışıb. Nazir çıxışı zamanı gənc nəslin savadlı yetişməsində təhsil işçilərinin əməyini xüsusi vurğulayaraq, pedaqoji oxuların təhsil işçiləri üçün səmərəli olacağına əminliyini bildirib,

Bunlarla yanaşı, bizim beynəlxalq mövqelərimiz də möhkəmlənir. Tailandın eksperimental məktəbi və Ümumbəşəri dəyərlər üzrə Avropa ESSE İnstitutu ilə fəal əməkdaşlıq edirik.

Məlumdur ki, müasir təhsil sistemi qarşısında duran ən mühüm vəzifələrdən biri hərtərəfli inkişaf edən, milli-mənəvi dəyərlərə sadiq, yüksək əxlaqlı vətəndaşlar yetişdirilməsidir. Son illər ölkəmizdə təhsilin məzmununun müasirləşdirilməsi istiqamətində ardıcıl layihələr, tədbirlər keçirilir ki, bu da qarşıda duran hədəflərə çatmaq üçün həyati əhəmiyyət kəsb edir.

Bu mənada iyunun 29-da ölkəmizdə pedaqoji müəllim hazırlığında xüsusi rolu olan Azərbaycan Dövlət Pedaqoji Universiteti və Ümumbəşəri dəyərlər və humanist pedaqogika mərkəzinin birgə təşkil etdiyi "Saf düşüncə möcüzə yaradır" mövzusunda Humanist pedaqogika üz-

rə III respublika oxuları müəllimlərimiz, pedaqoji ictimaiyyət tərəfindən maraqla qarşılandı.

Mərkəzimiz “Planetə xidmət et” layihəsi çərçivəsində ağac əkməkdə fəal iştirak edir. Bununla yanaşı, Ekologiya və Təbii Sərvətlər Nazirliyi ilə fəal əməkdaşlıq edirik. Humanist pedaqogikanın prinsipləri əsas götürməklə təhsilə tamamilə fərqli yanaşırıq. Söhbət məhz mənəviyyatdan, şagirdin şəxsi inkişafından, onun yaradıcı potensialının aşkar edilməsindən gedir. Savad və elmi biliklərə yiyələnməklə yanaşı, uşaqlarda ictimai münasibətlər, ətrafdakı insanlar, öz ölkəsi haqqında düzgün anlayışları formalaşdırmaq lazımdır. Müstəqil düşünməyi bacaran, öz fərdi əqli imkanlarını və qabiliyyətlərini tam açıqlamış uşaqlar ictimai baxımdan daha fəaldır və ölkəsinin gələcəyinə töhfə verməyə qadirdir. Bu bacarıqlar inkişaf etdirilməsi indiki dövrdə böyük əhəmiyyət kəsb edir. Mərkəzimiz Azərbaycan Təhsil Nazirliyi ilə yanaşı, humanist pedaqogikanın prinsiplərini təbliğ edən və uyğun təhsil metodikalarını yaradan beynəlxalq qurumlarla da əməkdaşlıq edir.

Hal-hazırda Respublika Humanist Pedaqogika Mərkəzi Qazaxıstanın “Bobek” Milli elmi-praktik təhsil və sağlamlıq mərkəzi, Rusiya Təhsil Akademiyasının akademiki, UNESCO-nun 200 məktəbindən biri olan M.P. Şetinin məktəbi, həmçinin professor Art Onq Cumsainin (Tailand) dünyanın bir çox ölkələrində tanınan eksperimental məktəbi ilə sıx əməkdaşlıq edir.

Qabaqcıl təcrübənin həyata keçirilməsində hər bir müəllimdən təşəbbüskarlıq, elmə maraq tələb olunur. Bu sahədə Sumqayıt şəhərindəki 11 nömrəli orta məktəb başqalarından fərqlənir. Burada müxtəlif tədbirlərin keçirilməsi üçün lazımi texniki avadanlıqlar, kartotekalar, şagirdlər üçün video-filmlər, mədəniyyətimizin və ədəbiyyatımızın korifeyləri haqqında kifayət qədər məlumatlar toplanılmışdır.

Mərkəz öz fəaliyyətini bu gün də uğurla davam etdirir.

**Nəticə.**

Humanist psixologiya şəxsi inkişafın, özünü həyata keçirməyin və hər bir fərdin unikallığının vacibliyini vurğulayaraq insan təbiəti haqqında anlayışımızın genişləndirilməsinə mühüm töhfələr vermişdir. Onun müsbət keyfiyyətlərə və insan potensialına, eləcə də subyektiv təcrübəyə və seçim azadlığına vurğu etməsi uzun müddətdir davranış (biheviorizm) və psixoanalizdən təsirlənmiş psixologiyaya yeni bir perspektiv gətirdi.

Humanist psixologiyanın özünü aktuallaşdırma, şəxsiyyətyönlü yanaşma və ekzistensial mövzular kimi əsas konsepsiyaları fərdin şəxsi inkişaf istəyini, məna axtarışını və öz dəyərlərinə, inanclarına və daxili hisslərinə uyğun yaşamaq istəyini vurğulayır. Müştəri mərkəzli terapiya, ekzistensial terapiya və Gestalt terapiyası kimi bu ənənədən irəli gələn terapevtik üsullar insanın özünü kəşf etməsi, özünü qəbul etməsi və daxili potensialının açılması üçün əlverişli şəraitin yaradılmasına kömək edir.

Subyektivliyin tənqidinə və empirik tədqiqatların olmamasına baxmayaraq, humanist psixologiya müasir psixoloji nəzəriyyə və təcrübəyə təsirini davam etdirir. Onun ideyaları koqnitiv davranış terapiyası və psixodinamik nəzəriyyələr kimi digər yanaşmalarla birləşdirilərək psixoterapiya və məsləhətləşməyə daha vahid və səmərəli yanaşmalar yaradır.

Ümumiyyətlə, humanist psixologiya insanı özünü dərk etməyə və həyatın mənası axtarışına can atan bütöv və unikal fərd kimi baxmağın zəruriliyini xatırladır. İnsan potensialına və hər bir fərdin dəyərinə verilən bu vurğu günümüzün sürətlə dəyişən dünyasında aktual və vacib olaraq qalır.

**Problemin aktuallığı.** Müasir dövrdə yaşanan böhranlar təəssüf ki, həyatın bütün: iqtisadi, siyasi, mənəvi, sosial və s sahələrinə təsir göstərir. Lakin dünya fəlsəfəsi, pedaqogikası, ədəbi irsi, milli adət-ənənə özündə əbədi müdriklik və həqiqət xəzinəsi daşıyır. Bu da öz növbəsində cəmiyyətimizin mənəvi potensialının təşəkkülünə ümid verir.

Bir psixoloq kimi, demək istədim ki, 11-22 noyabr 2024-cü il tarixlərində Bakıda keçirilən BMT-nin İqlim Dəyişmələri üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransı və ya qısaca COP29 – BMT-nin iqlim dəyişmələri konfransların irəli sürdüyü tələblər fonunda bu məqalənin çapa hazırlanması təsadüfi deyil. Bildiyiniz kimi, “Azərbaycan Respublikasında Təhsilin İnkişafı üzrə Dövlət Strategiyası”na uyğun olaraq təhsilin yeni məzmununun reallaşdırılması və mənəvi-əxlaqi dəyərlərin məzmuna tətbiqi üçün bir sıra tədbirlər, beynəlxalq elmi-praktik konfrans və seminar həyata keçirilmişdir. Məqalədə problemin tədqiqi və bu sahədə görülən işlərin təhlili açıqlanır.

**Problemin elmi yeniliyi.** Müasir dövrdə geniş yayılan və ehtiyac duyulan şəxsiyyətyönlü təhsil siyasəti üçün humanistləşmə amalı daşıyan müasir məktəblərin fəaliyyəti haqqında məlumat bazası ola bilər.

**Problemin nəzəri və praktik əhəmiyyəti.** Məqalədə bir çox alimlərin müqayisəli fikirlərinə aydınlıq kimi reallıqda əksini tapmış ənənəvi, yoxsa humanist məktəblərin nə dərəcədə səmərəli fəaliyyəti təsvir olunmuşdur. Hal-hazırda cəmiyyətin həyatında insan kapitalının yetişdirilməsi işinin səmərəli təşkilinə əsaslı yardımçı ola bilər.

### Ədəbiyyat


1. Bəşirov, V. Humanist pedaqogika həyatın tələbidir // Azərbaycan müəllimi. – 2018. – 21 sentyabr. – s.10. http://www.anl.az/down/meqale/az_muellimi/2018/sentyabr/608525.htm
2. Əhmədov, H. Pedaqogika / H. Əhmədov, N. Zeynalova. – Bakı: Elm və təhsil, – 2016. – 454 s.
3. Əliyev, R.İ. Hümanist psixologiya. Seçilmiş əsərləri: Şəxsiyyət və onun formalaşmasının etnopsixoloji əsasları. Monoqrafiya / R.İ. Əliyev. – Bakı: Araz, – 2000.
4. Əliyev, R. Psixologiya tarixi / R. Əlyev. – Bakı: – 2006.
5. Humanist Pedaqogika üzrə XVII Beynəlxalq Oxu // https://www.facebook.com/adpueduaz/videos/t%C9%99hsil-tv-humanist-pedaqogika-%C3%BCzr%C9%99-xvii-beyn%C9%99lxalq-oxu/419766481807348/?locale=es_ES
6. Prezident İlham Əliyevin Novruz bayramı ümumxalq şənliyində söylədiyi nitqdən (18.03.2017) // https://president.az/az/articles/view/23218
7. Psixologiya / red. S.İ. Seyidov, M. Həmzəyev. – Bakı: Nurlan, – 2007. – 692 s.
8. Козлова, Н.И. Границы гуманистической психологии и требования реалистической психологии // http://www.all-tests.ru/granicy-gumanisticheskoj-psihologii-i-trebovanija.htm
9. Роменець, В.А. История психологии XX века / В.А. Роменець, И.П. Маноха. – Киев: Лыбидь, – 2003.
10. http://ichp.org.ru/wp-content/uploads/2019/03/manifest_az.pdf
11. https://e-qanun.az/framework/46052


**Redaksiyaya daxil olub:** 25.04.2025.

*UOT 373.2.*

***Sona İbrahim qızı Əliyeva***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin baş müəllimi*
*https://orcid.org/0000-0002-2696-4292*
*E-mail: sonasi83@mail.ru*
*https://doi.org/10.69682/arti.2025.92(3).198-203*

# KİÇİKYAŞLI MƏKTƏBLİLƏRDƏ TƏFƏKKÜRÜN TƏNQİDİLİYİNİ MÜƏYYƏN ETMƏYƏ İMKAN VERƏN KEYFİYYƏTLƏR

***Sona Ibrahim Aliyeva***
*senior lecturer of Azerbaijan State Pedagogical University*

# QUALITIES FACILITATING THE EVALUATION OF CRITICAL THINKING AMONG YOUNGER SCHOOL CHILDREN

***Сона Ибрагим гызы Алиева***
*старший преподаватель*
*Азербайджанского Государственного Педагогического Университета*

# КАЧЕСТВА, ПОЗВОЛЯЮЩИЕ ОПРЕДЕЛЯТЬ КРИТИЧЕСКОЕ МЫШЛЕНИЕ У ШКОЛЬНИКОВ МЛАДШЕГО ВОЗРАСТА

**Xülasə.** Təlim-tərbiyə, təhsil sistemi gənc nəsildə tənqidi təfəkkürü inkişaf etdirə və yaxud müvafiq vərdişlər formalaşdıra bilər. Lakin fərdin tənqidi təfəkküründən istifadə etməsi, yəni o vərdişləri gündəlik həyatında gerçəkləşdirə bilməsi və yaxud istifadə etməsi artıq mövcud sosial şəraitdən, tənqidi təfəkkürə olan münasibətdən asılıdır. Ona görə gənc nəsildə tənqidi təfəkkürün inkişaf etdirilməsi ilk növbədə tənqidi təfəkkürün gerçəkləşdirilməsi üçün zəruri olan demokratik sosial şəraitdən və ya tənqidi təfəkkürə olan sosial tələbatdan asılıdır.

Təfəkkürün tənqidilik xüsusiyyətinin inkişafı təhsil sistemində mövcud olan təhsil, inkişaf və tərbiyə taksonları ilə şərtlənir. Təlim tərbiyə prosesi vasitəsilə yaradılan sosial inkişaf şəraitinin olması məktəblilərdə təfəkkürün tənqidilik xüsusiyyətinin inkişafı üçün münbit mühitdir. İnteraktiv şəraiti biz təfəkkürün tənqidilik xüsusiyyətinin inkişafı üçün daha münbit sosial şərait hesab edirik.
***Açar sözlər**: təfəkkürün tənqidiliyi, inkişaf, müqayisə, məntiqi mühakimə, eksperiment*

**Abstract.** The educational and training system can cultivate critical thinking skills of the younger generation and/or foster the formation of appropriate habits. However, an individual's ability to use critical thinking – i.e. to actualize or utilize those habits in daily life – ultimately depends on the prevailing social context and societal attitudes toward critical thinking. Therefore, the development of critical thinking of the younger generation depends primarily on the democratic social conditions which are necessary for the realization of critical thinking or the social demand for critical thinking.

The development of critical thinking is conditioned by the categories of education, development, and upbringing existence in the education system. The existence of social development conditions created through the educational process can be very successful for the development of critical thinking of schoolchildren. We consider that interactive environments can be much more reasonable for the development of critical thinking.
***Key words:** Critical thinking, development, comparison, logical reasoning, experimentation*

**Аннотация.** Система образования может развивать критическое мышление или формировать соответствующие навыки у молодого поколения. Однако способность человека использовать критическое мышление, то есть его умение применять или использовать эти навыки в повседневной жизни, зависит от существующих социальных условий и отношения к критическому мышлению. Поэтому развитие критического мышления у молодого поколения зависит прежде всего от

демократических общественных условий, необходимых для реализации критического мышления или общественного спроса на критическое мышление.

Развитие критичности мышления обусловлено существующими в системе образования таксонами обучения, развития и воспитания. Наличие условий социального развития, создаваемых в процессе обучения, является благоприятной средой для развития критичности мышления школьников. Мы считаем, что интерактивная среда является более благоприятной социальной средой для развития критического мышления.

***Ключевые слова:*** *критическое мышление, развитие, сравнение, логическое рассуждение, эксперимент*

Müasir mədəniyyət dialoji mədəniyyətdir: yeni pedaqoji təfəkkür üçün bu anlam konseptual əhəmiyyətə malikdir. Yeni pedaqoji təfəkkür deyəndə, məktəbin, təlim-tərbiyə prosesinə və onun problemlərinə yeni aspektdən yanaşılması başa düşülür. Cəmiyyətin inkişafının hər bir mərhələsində özünəməxsus pedaqoji təfəkkür formalaşır və bu pedaqoji təfəkkür təkcə uşaqların təlim-tərbiyəsi barəsində cəmiyyətin pedaqoji dəyərlərini deyil, ilk növbədə fəlsəfi-psixoloji dəyərlərini əks etdirir. Cəmiyyət inkişaf etdikcə onun təhsil siyasətində də yeni cəhətlər meydana çıxır, pedaqoji nəzəriyyədə əvvəllər bərqərar olmuş stereotiplər tədricən köhnəlir, onların köhnəldiyi dərk olunanda artıq yeni pedaqoji təfəkkür formalaşır.

Yeni pedaqoji təfəkkür şagirdin bir şəxsiyyət kimi formalaşdırılmasını və tərbiyəsini təhsil sisteminin başlıca vəzifəsi sayır. Belə bir önəmli vəzifənin icrası isə dialoji mədəniyyət müstəvisində həll oluna bilər. Hesab edirik ki, yeni pedaqoji təfəkkürün Azərbaycan məktəblərində bərqərar olması, o cümlədən şagirdin bir şəxsiyyət kimi formalaşdırılmasını və tərbiyəsini təhsil sisteminin başlıca vəzifəsi hesab olunması, şagirdin təfəkkürünün, xüsusilə onun tənqidilik xüsusiyyətinin inkişaf etdirilməsinə əlverişli psixopedaqoji mühit yaradır.

Azərbaycanın müasir təhsil konsepsiyası təfəkkürün inkişafını, xüsusilə onun müstəqillik və tənqidilik keyfiyyətlərinin inkişafını şagirdlərin əqli inkişafının başlıca məqsədi hesab edir və təlim, tədris və tərbiyə prosesinin həm də həmin məqsədlərə nail olmasını əsas sayır. Müasir təhsil konsepsiyası təfəkkürün inkişafını şagirdlərin əqli inkişafının başlıca məqsədi sayır. Təfəkkürün, o cümlədən tənqidilik keyfiyyətinin inkişafının ana xəttini fikri əməliyyatların formalaşması təşkil edir.

Azərbaycan Respublikası müstəqilliyə nail olduqdan sonra təhsildə apardığı islahatlar, müəyyən etdiyi dövlət standartları, kurikulumlar və qəbul etdiyi qanunlar birbaşa və dolayı yolla şagirdlərdə təfəkkürün inkişafını prioritet istiqamət kimi müəyyən etmiş və ona nail olmağı təhsil sisteminin qarşısında əsas vəzifə hesab edir.

Pedaqoji fəaliyyətdə tənqidi təfəkkürün inkişaf etdirilməsi texnologiyasının tətbiqi yalnız təfəkkürü inkişaf etdirmir, həm də idraki qabiliyyətləri, xüsusilə də hafizəni yaxşılaşdırır, qavrayışı təzələyir. Diqqətin mərkəzləşməsini təmin edir. Həmçinin təfəkkürün tənqidiliyinin inkişaf etdirilmə metodikaları şəxsiyyətin özünüifadə, özünəhörmət və özünütəsdiq, ünsiyyət, oyun, yaradıcılıq tələbatlarının ödənməsinə şərait yaradır. Emosional diskomfortdan azad olmuş şagird hadisələrə və təlim materiallarına daha aydın zəka ilə yanaşmağı öyrənir.

Təfəkkürün tənqidiliyinin inkişaf texnologiyası şagirdlərdə informasiyanın qavranılmasının effektivliyini artırır, öyrənilən materiala marağı genişləndirir, tənqidi düşünmə qabiliyyətini inkişaf etdirir, özünün yaratdığı məhsula məsuliyyətlə yanaşmağa imkan verir, başqaları ilə ünsiyyət qurmağa, işgüzar münasibətləri tənzimləməyə zəmin yaradır.

Tənqidi təfəkkürü inkişaf etdirmək üçün aşağıdakıların nəzərə alınması məqsədəuyğun hesab edilmişdir.

1. Öyrənilən materialla, tədqiq edilən problemlə, lətifələr və atalar sözləri ilə bağlı şagirdlərə öz fikirlərini söyləmək imkanının verilməsi, səhv etmək qorxusunun aradan qaldırılması və qiymətləndirmənin olmaması.

2. Şagirdlərin öz fikirlərini ifadə edərkən bütün fikirlərin qeydə alınması, onların gələcək iş üçün istifadəsi, "düzgün və yanlış" cavabların olmaması fikrinin aşılanması.

3. Qrup və fərdi işi uyğunlaşdırmaq və onların bir-birini tamamlamasına şərait yaratmaq. Hər bir şagirdə öz potensial imkanlarını aktuallaşdırmaq imkanının verilməsi və səhv etməkdən qorxmadan mülahizənin söylənməsi, intellektual gərginlik situasiyasının yaradılması.

Kiçik məktəblilərdə tənqidi təfəkkürün inkişaf etdirilməsi texnologiyasının həqiqiliyini yoxlamaq üçün uşaqlarla eksperiment keçirildi. Tədqiqat iki mərhələdə aparılmışdır. Birinci mərhələdə kiçik məktəblilərdə tənqidi təfəkkürün inkişaf səviyyəsi ölçülmüşdür.

Tədqiqatda tənqidi təfəkkürün inkişaf istiqamətlərinin və səviyyələrinin müəyyən edilməsi Ə.S. Bayramovun metodoloji yanaşması əsasında tərtib olunmuş 6 mətndən istifadə edilmişdir.

Təfəkkürün tənqidiliyinin inkişaf texnologiyası mərhələləri və priyomları aşağıdakı kimidir:

| Texnoloji mərhələlər | Müəllimin fəaliyyəti | Şagirdin fəaliyyəti | Mümkün olan metodlar və üsullar |
|---|---|---|---|
| I mərhələ -fəallaşdırma və ya cağırış; -mövcud biliklərin aktuallaşdırılması; -yeni informasiya almağa marağın yaradılması; - şagird qarşısında şəxsi məqsədlərin qoyulması. | Şagirdlərdə mövcud olan biliklərin qarşıya qoyulan məqsədə uyğun olaraq istiqamətləndirilməsi və fəallaşdırılması. Onlarda həll ediləcək məsələyə motivasiya yaradılması, onlara məqsədyönlü şəkildə düşünmək imkanı vermək, öz fikirlərini öz sözləri ilə ifadə etməyə şərait yaratmaq. Öyrənilən materialın strukturunu qurmağa şərait yaratmaq . | Şagird öyrənilən materiala aid nə kimi biliklərə malik olduğunu “xatırlayır” (təklif irəli sürür), yeni materialın öyrənilməsinə qədər mövcud bilikləri qruplaşdırır, cavab almaq istədiyi sualları verir. | “Tanış olan” informasiyanın siyahısını tərtib etmək; “ip uclarına” uyğun ehtimallar irəli sürmək; materialın sistemləşdirilməsi; həqiqi və yanlış mühakimələr; yanlış məntiqi mühakimələr; beyin həmləsi; problem suallar və s. |
| İlkin mərhələdə alınan informasiya eşidilir, yazılır və müzakirə edilir. İş şagirdlərlə qrup halında aparılır. | | | |
| II mərhələ Məzmunun mənalandırılması - yeni informasiyanın alınması; -təlim məqsədlərinin şagirdlər tərəfindən təsis edilməsiı. | Yeni informasiya ilə işləmə müddətində mövzuya marağın qorunub saxlanması, “köhnə” biliklərdən, “yeni” biliklərə tədricən keçmə | Şagird müəllim tərəfindən təqdim edilən fəal qiraət metodu vasitəsilə mətn oxuyur (eşidir) , müəyyən yerlərdə qeydlər edir və yeni informasiyanın mənalandırılması üçün qeydlər aparır. | Aktiv qiraət metodları: “insert”; “ flaşboum”; “ideal”; biblioterapiya”. Dərsin birinci hissəsində qoyulmuş suallara fəal cavab axtarışı |
| Məzmunun mənalandırılması mərhələsində yeni informasiya ilə vasitəli əlaqə həyata keçirilir (mətn, film, mühazirə, slaydlar və s.). İş qrup halında və ya fərdi aparılır. Qrup işində bir sıra elementlər zəruridir – fərdi axtarış, ideyaların mübadiləsi, mövcud fikirlərin qarşılaşdırılması. | | | |
| III mərhələ. Refleksiya. -fikirləşmək, yeni biliyin yaranması; -şagird tərəfindən yeni təlim məqsədlərinin qarşıya qoyulması. | Müəllim nəzərə almalıdır: Şagirdlərin ilkin qeydlərinə nəzər salmağa çağırış etmək; dəyişikliklər etmək; yeni öyrənilmiş informasiya əsasında yaradıcı və ya düşündürücü – praktik məsələlər vermək. | Şagirdlər məzmununun mənalandırılması mərhələsində aldıqları informasiya əsasında köhnə məlumatlarla yeni məlumatları qarşılaşdırırlar. | Cədvəllərin və ya işin tamamlanması. İnformasiya blokları arasında səbəb – nəticə əlaqəsinin qurulması. Yanlış və həqiqi mühakimələr və açar sözlərə qayıtmaq. Qoyulmuş suallara cavab vermək. Müxtəlif növ diskussiyaların təşkili. Yaradıcı inşa yazmaq. Ayrı-ayrı sualları, mövzuları tədqiq etmək. |
| Refleksiya mərhələsində təhlil aparılır, informasiyanın yaradıcı işlənməsi baş verir, alınmış məlumatların | | | |

işlənməsi həyata keçirilir.

Cədvəldən göründüyü kimi, pedaqoji fəaliyyətdə tənqidi təfəkkürün inkişaf etdirilməsi texnologiyasının tətbiqi yalnız təfəkkürü inkişaf etdirmir, həm də idraki qabiliyyətləri, xüsusilə də hafizəni yaxşılaşdırır, qavrayışı təzələyir. Diqqətin mərkəzləşməsini təmin edir. Həmçinin təfəkkürün tənqidiliyinin inkişaf etdirilmə metodikaları şəxsiyyətin özünüifadə, özünəhörmət və özünütəsdiq, ünsiyyət, oyun, yaradıcılıq tələbatlarının ödənməsinə şərait yaradır. Emosional diskomfortdan azad olmuş şagird hadisələrə və təlim materiallarına daha aydın zəka ilə yanaşmağı öyrənir.

Kiçik məktəblilərdə təfəkkürün tənqidiliyini müəyyən etməyə imkan verən keyfiyyətlər – müqayisə qabiliyyəti, məntiqi mühakimə qabiliyyəti və proqnozlaşdırma qabiliyyətinin müəyyən edilməsinə çalışılmışdır.

Tədqiqatın gedişindən məlum oldu ki, eksperimental materialın məzmunu şagirdlərdə təfəkkürün tənqidiliyinin səviyyəsinin dəyişməsinə zəmin yaradır. Materialın çətinləşməsinə baxmayaraq şagirdlər daha çox fəallıq göstərmiş, səhvləri düzəltməyə çalışmış, hadisənin təsvirində buraxılmış səhvləri və ya yanlış mühakimələri üzə çıxara bilmişlər. Lakin onlar daha çox güzəran səviyyəsində təcrübələrinə əsaslanmalarına baxmayaraq, fikirlərinin həqiqiliyini sübut etməyə çalışmışlar. Doğrudur belə hallarda generalizasiya hadisəsi baş verir. Ancaq öz mühakimələrini əsaslandırmağı bacarmaq təfəkkürün tənqidiliyinin inkişafından xəbər verir.

Şagirdlərdə təfəkkürün tənqidiliyinə spontan proses kimi yanaşmaq olmaz. Bu prosesin inkişafı müxtəlif amillərdən asılıdır.

Təfəkkürün tənqidiliyinin inkişaf səviyyəsinin yüksəlməsi həll prosesində "ipucu verməkdən" və eksperimental materialın şagird tərəfindən müəyyən struktura salınmasından, eləcə də mətnlərin onların inkişaf səviyyəsinə uyğunluğundan çox asılıdır.

Müxtəlif tədqiqatlarda olduğu kimi bizim apardığımız tədqiqat da göstərdi ki, kiçik məktəblilərdə təfəkkürün tənqidiliyinin təzahürü təqdim edilən məsələnin xarakterindən çox asılıdır. Uşaqlar müstəqil şəkildə mətnlərdə verilmiş səhvləri düzəldir və çox zaman onun belə olmadığını əsaslandırmağa çalışırlar. Və əksər hallarda verilmiş yanlış məsələnin qoyuluşunun necə ola biləcəyi haqqında mühakimələri də irəli sürürlər.

Bununla belə tədqiqat göstərdi ki, uşaqlarda o zaman tənqidilik özünü göstərir ki, onlar problemin həllinə fəal yanaşırlar və dərketmədə ziddiyyətlər mövcuddur. Hesab edirik ki, təlimdə idraki ziddiyyətlərin yaradılması təfəkkürün tənqidiliyinin inkişafına əhəmiyyətli dərəcədə təsir göstərir.

Məktəblilərdə sosial qruplara məxsus xüsusiyyətlər, sinir sisteminin xüsusiyyətləri və fərdi xüsusiyyətlər bütöv bir sistemi yaradır. Eyni yaş dövründə olan uşaqlar öz temperament və koqnitiv xüsusiyyətlərinə görə bir-birindən fərqlənir. Belə olan halda fərdi yanaşma problemdən çıxış yolu kimi götürülə və ya əlverişli təhsil mühiti yaratmaqla bu məsələləri həll etmək olar.

Nəzərə almaq lazımdır ki, təlim aparılan siniflər müxtəlif inkişaf səviyyəsinə, təlimə qabilliyinə, müxtəlif hazırlıq dərəcələri ilə, o cümlədən fərqli xarakterə və temperamentə malikdirlər. Onların qavrama imkanları və hafizəsi də eyni deyildir. Belə bir şəraitdə müəllim təlimi orta səviyyəyə uyğun, orta səviyyəli inkişafa və hazırlığa, yetirməyə görə aparır. Demək olar ki, belə bir süni şəraitdə təfəkkürün tənqidiliyinin səviyyəsi yüksək olan şagirdlərin inkişafı ləngiyir, təlimin inkişafetdirici prinsipləri pozulur.

Yüksək tənqidiliyə malik şagirdlərdə təlimə maraq və motivasiya azalır, eləcə də onların inkişafı sanki gecikdirilir. Çünki intellektual gərginlik situasiyaları olmadan təfəkkürün tənqidiliyinin inkişaf etdirilməsi qeyri-mümkündür. Bununla yanaşı apardığımız eksperiment və formalaşdırıcı işlər göstərdi ki, təlim prosesində şagirdlərin fərdi-psixoloji xüsusiyyətlərinin, o cümlədən temperament tiplərinin nəzərə alınması intellektual inkişafı sürətləndirir və təfəkkürün tənqidiliyinin potensial imkan kimi "mürgüləmə"sinin qarşısı alınır.

Təlimdə diferensasiya olunmuş yanaşma şagirdlərin fərdi-psixoloji xüsusiyyətlərini, o cümlədən onların koqnitiv imkanlarını qiymətləndirməyə zəmin yaradır. Sinif-dərs sistemində bunların nəzərə alınması zamanı qrup, fərdi və frontal işlərin aparılması zərurəti meydana çıxır.

Aşağıdakı iş formalarından istifadə etməklə təfəkkürün tənqidiliyini inkişaf etdirmək mümkündür:

– eynitipli məsələlərin müxtəlif variantlarından istifadə etməklə;

– müxtəlif çətinlik dərəcəsinə malik tapşırıqlardan istifadə etməklə;

– tapşırıqların yerinə yetirilməsində şagirdlərə lazımi köməkliyin göstərilməsi;

– tapşırıqların yerinə yetirilməsində zaman məhdudiyyətinin aradan qaldırılması, vaxtaşırı “dincəlmələr”;

– müxtəlif növ “ipuclarından”, şəkillərdən, sxemlərdən, slaydlardan faydalanma və s..

Göründüyü kimi, təfəkkürün tənqidiliyini diferensasiya olunmuş təlim formasında və ya yanaşmada təlim məqsədlərinə nail olmaq üçün müxtəlif çətinlik dərəcəsinə malik tapşırıqlar təlim mövzusunun hamı üçün yerinə yetirilməsinə zəmin yaradır. Tədqiqat göstərdi ki, fərdi tapşırıqlar şagird şəxsiyyətinin psixoloji strukturunu nəzərə almadan qeyri – effektivdir.

Fərdi tapşırıqları yerinə yetirərkən Ə.S. Bayramovun və L.S. Vıqotskinin təfəkkürün tənqidiliyi haqqında metodoloji müddəalarını nəzərə almaq lazımdır. Xüsusilə aktual və yaxın inkişaf zonasının nəzərə alınması təfəkkürün tənqidiliyinin inkişaf etdirilməsi üçün vacibdir. Bunun üçün isə tapşırıqlar üzərində daima nəzarəti saxlamaq lazımdır. Hər bir mövzunun öyrənilməsindən sonra onun diaqnostikasını aparmaq məsləhətdir.

Fərdi tapşırıqların növləri müəllimin qarşısına qoyduğu məqsəddən çox asılıdır.

Kiçik məktəblilərlə fərdi işlərin təşkili zamanı bir neçə məqama xüsusi diqqət yetirmək lazımdır:

1. Şagirdlərlə ünsiyyətdə nəvaziş göstərmək, qayğı sərgiləmək və xoşagələn münasibətlər qurmaq gərəkdir. Şagirdlərin şübhəliliyinə, etimadsızlığına qarşı mərhəmətlilik, ürəyiyumşaqlıq və mülayimlik nümayiş etdirmək lazımdır.

2. Müəllimlər şagirdlərdə potensial imkan kimi özünü göstərən və diqqətə çarpmayan elə cəhətləri ayırd etməsi gərəkdir ki, onlar daha çox pozitiv səciyyə daşıyır. Hətta pedaqoji baxımdan baxımsız uşaqlara belə ürək qızdırmaq, qayğı göstərmək onlara təlim fəaliyyətində yalnız uğur gətirə bilər.

Təbii ki, pedaqoji baxımdan baxımsız və gizli imkanlara malik şagirdləri aşkarlamaq və onlarda müsbət cəhətləri görmək bir qədər çətindir. Başqa bir tərəfdən həmin cəhətlər gizlidir və açıq-aydın özünü həmişə göstərmir və müəllimlər də özünün subyektiv düşüncələrinə uyğun olaraq bu vəzifəni yerinə yetirmək istəmirlər.

Müsbət cəhətləri aşkarlamaq və onlardan istifadə etməklə şagirdin potensial imkanlarını üzə çıxarmaq təlimin təşkilində ciddi uğurlar yarada bilər. Bu zaman psixoloji təsirlər ikili səciyyə daşıyır. Əvvəla, pedaqoji baxımsız şagird dərin düşüncə ilə inanır ki, o pis şagirddir və ondan yaxşı şagird olmayacaq. Özünün islah olunmazlığının və natamamlığının başa düşülməsi onun davranışına neqativ təsir göstərməklə yanaşı, bu islaholunma prosesini gecikdirir. Ancaq müəllimin və yaşlıların köməyi ilə şagird özündə müsbət cəhətləri aşkarlayıb və həmin müsbət cəhətlərə uyğun hərəkətlər etməyə və təlimlə məşğul olmağa çalışır. Yaxşını görəndən sonra, hər hansı pis hərəkəti etməkdən çəkinir.

**Problemin aktuallığı.** Dünyaya inteqrasiya şəraitində müasir təhsilin prioritet məsələləri təhsil subyektlərində bilik, bacarıq və vərdişlərin formalaşdırılması ilə məhdudlaşmır. Azad düşünə bilən, hadisələrə müstəqil mövqe formalaşdıran, qarşıya məqsəd qoyan və ona optimal şəkildə nail olmağa müvəffəq olan şagirdlər yetişdirmək təhsilin əsas məsələlərindən hesab edilir. Belə vəzifələrin yerinə yetirilməsinin optimal yollarından biri şagirdlərdə tənqidi təfəkkürün formalaşdırılmasıdır. Bu baxımdan mövzu aktualdır.

**Problemin elmi yeniliyi**. Mövcud tədqiqatlardan fərqli olaraq bu məqalədə təfəkkürün tənqidiliyi konsepsiyasına yeni prizmadan yanaşılmışdır. Müəyyən edilmişdir ki, pedaqoji fəaliyyətdə tənqidi təfəkkürün inkişaf etdirilməsi texnologiyasının tətbiqi yalnız təfəkkürü inkişaf etdirmir, həm də idraki qabiliyyətləri, xüsusilə də hafizəni yaxşılaşdırır, qavrayışı təzələyir, diqqətin mərkəzləşməsini təmin edir.

**Problemin praktik əhəmiyyəti**. Azərbaycan psixoloji fikir tarixində təfəkkürün tənqidiliyi konsepsiyasının təşəkkülü mövzusunun öyrənilməsi psixologiyanın bir çox sahələrində, xüsusilə yaş və pedaqoji psixologiya sahəsində yeni nəzəriyyələrin və konsepsiyalar yaradılmasında istifadə oluna bilər.

**Ədəbiyyat**

1. Bayramov, Ə.S. Şagirdlərdə əqli keyfiyyətlərin inkişaf xüsusiyyətləri: Monoqrafiya / Ə.S. Bayramov. – Bakı: Maarif, – 1967, – 350 s.

2. Bayramov, Ə.S. Şagirdlərdə təfəkkür müstəqilliyinin tərbiyəsi və inkişafı: Monoqrafiya / Ə.S. Bayramov. – Bakı: Maarif, – 1967, – 115 s.
3. Əlizadə, Ə. Ə. Pedaqoji psixologiya: Dərslik / Ə.Ə. Əlizadə, H.Ə .Əlizadə**.** – Bakı: ADPU-nun mətbəəsi, – 2010, – 600 s.
4. Əliyev, R. İ. Psixologiya: Dərs vəsaiti / R.İ. Əliyev. – Bakı: Qamma servis, – 2003, – 176 s.
5. Veysova, Z. A. Fəal/interaktiv təlim: Müəllimlər üçün vəsait/ Z.A. Veysova. – Bakı: Azərbaycan Respublikasının Təhsil Nazirliyi, UNİSEF, – 2007, – 154 s
6. Халперн, Д.Ф. Психология критического мышления: Методическое пособие / Д.Ф. Халперн. – СПб.: Питер, – 2000, – 512 с.

**Redaksiyaya daxil olub:** 01.05.2025.

UOT 159.9.

***Mələk Feruz qızı Kərimova***
*Xəzər Universitetinin*
*Psixologiya departamentinin koordinatoru,*
*Xəzər Universitetinin Psixoloji Xidmət Mərkəzinin rəhbəri*
*https://orcid.org/0000-0001-9156-962X*
*E-mail:mkerimova@khazar.org*
*https://doi.org/10.69682/arti.2025.92(3).204-209*

***Nigar Rəhim qızı Hüseynova***
*Xəzər Universiteti*
*https://orcid.org/0009-0004-8131-7989*
*E-mail:nigar.rahim57@gmail.com*

# BİRİNCİ KURS TƏLƏBƏLƏRİNİN UNİVERSİTET HƏYATINA UYĞUNLAŞMA PROSESİNDƏ PSİXOSOSİAL AMİLLƏRİN TƏHLİLİ

***Malak Feruz Karimova***
*coordinator of the Psychology department at Khazar University,*
*head Psychological Services Center of the Khazar University*

***Nigar Rahim Huseynova***
*Khazar University*

# ANALYSIS OF PSYCHOSOCIAL FACTORS IN THE PROCESS OF ADAPTATION TO UNIVERSITY LIFE AMONG FIRST-YEAR STUDENTS

***Мелек Феруз гызы Керимова***
*координатор кафедры Психологии Университета Хазар,*
*руководитель Центра Психологических Услуг Университета Хазар*

***Нигяр Рагим гызы Гусейнова***
*Университет Хазар*

# АНАЛИЗ ПСИХОСОЦИАЛЬНЫХ ФАКТОРОВ В ПРОЦЕССЕ АДАПТАЦИИ ПЕРВОКУРСНИКОВ К УНИВЕРСИТЕТСКОЙ ЖИЗНИ

**Xülasə.** Birinci kurs tələbələrinin ali təhsilə başlaması onların həyatında əsas mərhələlərdən biri hesab olunur. Bu dövrdə tələbələrin bir qismi yeni mühitə tez uyğunlaşsa da, digərləri emosional gərginlik, psixosomatik əlamətlər və sosial təcrid kimi çətinliklər yaşayırlar. Bəzi tələbələrin adaptasiyalarının uğursuz olması onların təhsillərini yarımçıq qoymalarına səbəb olur. Bu isə tələbənin universitetə qarşı mənfi fikirlərinin formalaşmasına, ailə münasibətlərinin zəifləməsinə, karyera uğursuzluqlarına gətirib çıxara bilər. Məqalənin məqsədi, universitet həyatına uyğunlaşma prosesinə təsir edən psixososial amilləri – cinsiyyət, sosial dəstək, maddi vəziyyət, motivasiya, ev həsrəti və fərdi xüsusiyyətləri-nəzəri çərçivədə təhlil etmək və bu sahədə profilaktik yanaşmalar üçün elmi əsasları müəyyənləşdirməkdir.
***Açar sözlər:*** *birinci kurs tələbələri, universitetə uyğunlaşma, sosial dəstək, psixoloji simptomlar.*

**Abstract.** Beginning higher education is regarded as one of the most important transitions in the lives of a first-year university student. Some students integrate into this new environment rather quickly; others face emotional stress, psychosomatic symptoms, and social isolation. While some students adapt to this new environment very easily, others suffer emotional upset, psychosomatic illness, and social isolation. For some, this failure to adapt can result in withdrawal from university. This may result in negative attitudes towards university, poor family relationships and career failures. The purpose of this paper is to theoretically address the psychosocial determi-

nants of university adaptation like gender, social support, financial status, locus of control, homesickness, and personality traits.
***Keywords:*** *first-year students, university adaptation, social support, psychological symptoms*

**Аннотация.** Поступление первокурсников в высшее учебное заведение считается одним из ключевых этапов в их жизни. В то время как часть студентов легко адаптируется к новой среде, другие сталкиваются с эмоциональным напряжением, психосоматическими симптомами и социальной изоляцией. Неудачная адаптация некоторых студентов может привести к преждевременному прекращению обучения. Это, в свою очередь, может вызвать формирование негативного отношения к университету, ухудшение семейных отношений и неудачи в карьере. Цель данной статьи – теоретический анализ психосоциальных факторов, влияющих на процесс адаптации к университетской жизни, таких как пол, социальная поддержка, материальное положение, мотивация, тоска по дому и индивидуальные особенности, а также обоснование профилактических подходов в этой области.
***Ключевые слова:*** *первокурсники, адаптация к университету, социальная поддержка, психологические симптомы*

Ali təhsil müəssisələrinə yeni daxil olan birinci kurs tələbələri üçün adaptasiya prosesi həm sosial, həm də emosional baxımdan çətin və məsuliyyətli bir mərhələdir. Orta məktəb mühitindən universitet həyatına keçid tələbələrin həyat tərzində, təhsil metodlarında və sosial münasibətlərində ciddi dəyişikliklər yaradır. Bu dövr ərzində tələbələr akademik tələblərlə yanaşı, müstəqil həyat sürmək, yeni sosial mühitə uyğunlaşmaq və şəxsi inkişaf kimi məsələlərlə qarşılaşırlar. Bu proses onların emosional vəziyyətinə və psixoloji rifahına birbaşa təsir göstərir. Bu baxımdan birinci kurs tələbələrində adaptasiya və emosional gərginliyin öyrənilməsi xüsusi əhəmiyyət kəsb edir.

Universitet təhsili tələbələrin həm akademik, həm də şəxsi inkişafının formalaşdırıldığı bir mərhələdir. Bu mərhələdə tələbələr sadəcə müəyyən sahədə mütəxəssis olmaq məqsədi ilə universitetə daxil olmurlar, onlar həm də sosial bacarıqlar, fərdi məsuliyyətlər və psixoloji yetkinlik kimi mühüm sahələrdə inkişaf edirlər. Birinci kurs tələbələri yeni akademik sistemə addım atarkən, həm də əslində gənclikdən yetkinliyə adım atırlar və bu kritik mərhələ onların akademik nailiyyətlərinə və öyrənmə proseslərinə əhəmiyyətli təsir göstərə bilir. Universitetə yeni daxil olan tələbələrin adaptasiya çətinlikləri və emosional gərginlik halları son illərdə psixologiya və təhsil sahəsində geniş müzakirə olunan mövzulardandır. Tədqiqatlar göstərir ki, tələbələrin sosial dəstəklə təmin olunmaması, tədris prosesində çətinlik çəkməsi, ailədən uzaq qalması və yeni mühitə uyğunlaşmaqda problemlərlə üzləşməsi onların emosional rifahına mənfi təsir edə bilir. Bu kimi hallar tədris göstəricilərinin aşağı düşməsinə, motivasiya itkisinə və hətta universitetdən ayrılma hallarına gətirib çıxara bilər. Bu səbəbdən, tələbələrin akademik uğurlarını və psixoloji sağlamlığını qorumaq üçün onların adaptasiya prosesinə təsir edən faktorların araşdırılması böyük əhəmiyyət kəsb edir. Tələbələrin ali təhsil sisteminə uyğunlaşma prosesi onların akademik göstəricilərinə, sosial münasibətlərinə və emosional dayanıqlılığına təsir göstərir. Universitet mühitində psixoloji gərginliyin yüksək olması tələbələrin öyrənmə prosesində çətinlik çəkməsinə, sosial əlaqələrinin zəifləməsinə və psixi sağlamlıqlarında problemlərin yaranmasına səbəb ola bilər.

Orta məktəbdən ali məktəbə qədəm qoyan təxmini 17-18 yaş aralığında olan gənclər kimliklərinin formalaşmaları ilə əlaqədar mənliklərini yeni kəşf edərkən, eyni zamanda akademik öhdəliklər, fərqli fənləri əhatə edən məzmunlar, imtahan narahatlıqları və sosial münasibətlərdə yeni təcrübələrlə qarşılaşırlar. Bu keçid mərhələsi bəzi tələbələrin motivasiyasına müsbət təsir edə bildiyi halda, bəzi tələbələrin həyatına da mənfi təsir göstərə bilir. Xüsusilə universitetə xas akademik mühitin təqdim etdiyi imkanlar və qarşılaşdıqları çətinliklər onların akademik uğurlarına uzunmüddətli təsir yarada bilər. Bəzi tələbələr bu yeni şəraitə asanlıqla uyğunlaşa bilsələr də, bəziləri emosional gərginlik, yalqızlıq, akademik yetərsizliklə bağlı çətinliklər yaşayaraq bu dövrü daha çətin keçirə bilərlər. Nəticə etibarilə, universitetin ilk ili bir tərəfdən həyəcan verici, o biri tərəfdən isə çətin ola bilər. Universitet şəxsi azadlıq, yeni imkanlar və kəşflər üçün tələbələrə geniş bir fürsət verir. Ancaq bu imkanlar və azadlıq bəzi tələbələrdə narahatlıq və qorxu hissi yarada bilər. Öz qərarları və seçimlərinin məsuliyyətini daşıyan tələbələrdə bu

bəzən qarışıqlıq, qərarsızlıq və yalnızlıq hissi ilə nəticələnə bilər. Eyni zamanda, yeni mühitdəki sosial gözləntilər və akademik tələblər də bəzi tələbələrdə əlavə gərginlik yarada bilər. Ayrıca ailədən ayrı qalmaq, öz problemlərini həll etmə öhdəliyinin artması, akademik gözləntilərin artması da tələbələrin uyğunlaşma problemlərinin artmasına səbəb ola bilir.

***Adaptasiya və universitetə adaptasiya anlayışı***

Bəşər övladı mövcud olduğundan bu yana insan ətraf mühitə, yeni münasibətlərə adaptasiya olaraq həyatını davam etdirmişdir. Darvinin təkamül nəzəriyyəsi ilə ortaya atılan adaptasiya anlayışını bioloji tərəfləri ilə nəzərdən keçirdiyimiz zaman, ətrafına uyğunlaşa bilən canlıların həyatda qala bildiklərini, uyğunlaşa bilməyənlərin isə həyatlarını itirdiklərini, nəsillərini davam etdirə bilmədiklərini dərk edirik. Yavuzer (1996) görə adaptasiya fərdin sahib olduğu xüsusiyyətlərlə birlikdə formalaşdırdığı mənliyi ilə ətraf mühit arasında balansı qoruyaraq qurduğu münasibətdir. Bu nöqteyi nəzərdən məsələyə yanaşıldığı zaman adaptasiya olmaq üçün sadəcə bioloji olaraq mühitə uyğunlaşmaq deyil, eyni zamanda psixoloji cəhətdən də adaptasiya ola bilmək əhəmiyyətlidir. Məhz psixoloji ehtiyacların qarşılanmasında insanın ətraf mühitlə qurduğu əlaqələr əhəmiyyət daşıyır. Maslou ehtiyaclar piramidasının üçüncü pilləsində insanın sosial ehtiyacları (sevgi və aidiyyət) qeyd edərək, buraya insanların sosial əlaqələrini, dostluqlarını, sevgi və başqalarına aid olma ehtiyaclarını daxil edir. .İnsanlar bir yerə aid olma, sosial qruplara qatılma və başqaları ilə münasibətlər qurmağı istəyirlər. Universitet birinci kurs tələbələrinin universitetə adaptasiya olmaları üçün bu ehtiyacları qarşılaya bilməsi əhəmiyyətlidir. Bunların qarşılana bilməməsi onların adaptasiyalarını çətinləşdirə bilir. Maslou piramidasının dördüncü pilləsində dəyər və hörmət ehtiyacları öz əksini tapır. Bu səviyyədə isə insanda özünü dəyərli və hörmətli hiss etmək ehtiyacı yaranır. İnsanlar başqaları tərəfindən qiymətləndirilmək, cəmiyyətdə hörmət görmək və varlıqlarının tanınmasını istəyirlər. Özünə inam, müvəffəqiyyətlər və status da bu ehtiyaclar daxilindədir. Məhz universitetə qəbul olmaq tələbənin özünə olan inamını artırmaqda, uğur və status qazanma kimi dəyərləndirilə bilər. Universitetə uyğunlaşa bilməyən tələbələrdə isə özlərinə qarşı dəyərsizlik, uğursuz olacaqlarına dair fikirlər formalaşa bilər. Ehtiyaclar piramidasının beşinci pilləsi isə özünü reallaşdırma ehtiyacıdır. İnsanın öz potensialını tam inkişaf etdirməsi kimi dəyərləndirilir. Özünü reallaşdırma, insanların öz yaradıcılıq qabiliyyətlərini inkişaf etdirməsi, məqsədlərini gerçəkləşdirməsi, həyatlarında əhəmiyyətli və dərin mənalar axtarması ilə bağlıdır. Bunu isə, universitetə daxil olan birinci kurs tələbələrinin gələcək arzu və idealları ilə əlaqələndirmək olar. Əlverişli universitet mühitində tələbələr öz potensiallarını kəşf etdikcə, bu onların həyatla bağlı ideallarının da formalaşdırılmasına təkan verəcəkdir. Ancaq universitetə uyğunlaşmaqda çətinlik çəkən tələbələr üçün bu piramidanın ikinci mərhələsindən sonrakı ehtiyacların qarşılanması haqqında söhbət gedə bilməz. Beləliklə, ətraf mühitin dəyişilməsi faktları sayəsində tələbələrin yeni tələblərlə üzləşməsi, qəbullanması və uyğunlaşması da adaptasiya prosesinin tərkib hissələri kimi qarşımıza çıxacaqdır.

Baker və Siryk (1984) universitetə adaptasiya prosesini dörd başlıq altında incələmişdir. Aşağıda bu başlıqlar açıqlanmışdır.

**Akademik cəhətdən uyğunlaşma** – Akademik uyğunlaşma şəxsin akademik məqsədlərini, özündən tələblərini və səylərini qiymətləndirməyi və akademik mühitin qəbul edilməsini əhatə edir.

**Sosial cəhətdən uyğunlaşma** – tələbənin universitet mühitinə nə dərəcədə uyğunlaşdığını, ailəsi yanında olmadığı halda tənhalıq problemi yaşayıb-yaşamadığını, universitetdə yeni insanlarla tanış olub dostluq əlaqələri qurub-qurmadığını ifadə edən anlayışdır. Bir başqa ifadə ilə tələbənin yeni sosial mühitlə səmərəli şəkildə əlaqəyə girərək, sosial münasibətlər quraraq universitetin sosial mühitinə qoşulmasını əhatə edir.

**Şəxsi / Emosional uyğunlaşma** – tələbənin universitetə adaptasiya olmaq isə, stress və narahatlığı hansı səviyyədə yaşadığını və fiziki reaksiyalarının nə dərəcədə olduğunu ölçür. Bu anlayışla tələbənin özünü nə dərəcədə bədbin, depressiv hiss etdiyini ifadə edilir. Əgər bu uyğunlaşma yaxşıdırsa, tələbə psixoloji və fiziki baxımdan özünü daha yaxşı hiss edir.

**Universitetə (quruma) bağlılıq** – tələbələrin özlərini emosional olaraq universitetə nə dərəcədə aid hiss etdiklərini, nə dərəcə bağlı olduqlarını göstərir. Universitetə bağlılığın vacib elementləri, universitetdə olmaqdan və xüsusilə

də davam etdiyi proqramdan tələbənin razı qaldığını yəni məmnun olma hissini əhatə edir. [1,s.123]

Bəs adaptasiyaya təsir edən psixososial amillər nələrdir? Tədqiqatlar təhlil edildiyi zaman aşağıdakı başlıqlara əsasən bu amilləri qruplaşdırmaq mümkündür:

**Cinsiyyət amili**

Universitetə keçid və uyğunlaşma prosesində qadın və kişi tələbələrin müqayisə edildiyi bir çox tədqiqatda, qadın tələbələrin universitet həyatının ilk ilində kişi tələbələrlə müqayisədə daha çox çətinlik və stress yaşadıqları və universitetə uyğunlaşma problemləri göstərdikləri bildirilir. Sax, Bryant və Gilmartin (2004) qadın tələbələrin kişi tələbələrə nisbətən daha çox emosional stress yaşadıqları üçün universitet həyatında iştirak etməkdə, universitetin sosial və akademik mühiti ilə əlaqə yaratmaqda çətinlik yaşayırlar. Eyni zamanda (Contreras və digərləri, 2017) apardığı tədqiqatda psixopatoloji simptomların, aqressiyanın yayılma faizinin qadın tələbələr arasında xeyli yüksək olduğunu müəyyən etmişdir ki, bu da xüsusi məqsədli psixi sağlamlıq resurslarına ehtiyac yarandığını göstərir.

**Sosial-iqtisadi amillər**

Tələbələrin maddi vəziyyəti bir çox tədqiqatda ələ alınan faktorlardan biridir. Tələbələrin maddi vəziyyəti aşağı olan ailələrdən gəlməsi onların təhsil həyatlarına təsir edən faktor kimi qarşımıza çıxır. Walpole (2003) apardığı tədqiqatda az gəlirli ailələrdən gələn tələbələrin yüksək gəlir səviyyəsi olan ailələrdən gələn yaşıdları ilə müqayisədə daha çox dezavantajlı olduqlarını qeyd etmişdir. Universitetə keçid prosesində bu tələbələr daha çox çətinliklərlə üzləşirlər. Dərsdənkənar fəaliyyətlərdə daha az iştirak edərək, zamanlarının böyük bir hissəsini işləməklə keçirərək həyatlarını təmin etməyə çalışırlar. Bu fikir başqa bir tədqiqatda öz əksini tapır kı, tələbələrin əksəriyyətinin universitet təhsilini hər hansı bir işdə işləmədən başa çatdırması praktiki olaraq mümkün deyil (Archer və Hutchings, 2000). Bu tələbələr üçün iqtisadi çətinliklər və maddi problemlər universitet təhsilini davam etdirmək və ya dayandırmaq məsələsində əsas faktorlardan biri kimi qiymətləndirilir (Museus və Ouaye, 2009). Ahmad və digərlərini (2002) Malayziyalı tələbələrlə apardığı tədqiqat nəticələrinə görə, birinci kurs tələbələri sağlamlıq, maliyyə və akademik çətinliklərlə üzləşməkdə, iqtisadi vəziyyətlərinin universitetdəki maddi ehtiyaclarını qarşılamadığını müəyyən etmişdir. Türkiyəli tədqiqatçılar Şahin, Şahin-Fırat, Zoraloğlu və Açıkgöz (2009) tərəfindən 13 dövlət universitetində aparılan tədqiqatda isə tələbələrin əsas problemlərinin iqtisadi çətinliklər və əsas ehtiyaclarını qarşılamaqla bağlı olduğu müəyyən edilmişdir. Nəticələr göstərmişdir ki, tələbələrin əksəriyyəti ciddi iqtisadi çətinliklər içərisindədir və bu vəziyyət onların akademik, sosial və psixoloji vəziyyətinə mənfi təsir göstərir.

**Sosial dəstək faktoru**

Birinci kurs tələbələrinin universitetə daxil olduqları zaman tanımadıqları bir mühitdə sosial olaraq özlərini tək hiss etmələri çox müşahidə olunan situasiyalardan biridir. Onların emosional rifah halının yaxşı olmasında həmyaşıd dəstəyi əhəmiyyətlidir. Tədqiqatlar göstərir ki, sosial dəstək alan tələbələr universitet mühitinə daha asanlıqla uyğunlaşırlar. Bu uyğunlaşma isə, onların akademik göstəricilərinə müsbət təsir edərək, universitetdə təhsillərini davam etdirmələrinə kömək edir. Birinci kurs tələbələrinin universitet həyatına daha yaxşı uyğunlaşmaq üçün valideynləri və ailələri ilə münasibətlərini diqqət yetirmək vacibdir [12]

Gan və digərləri (2019) Malayziyanın dörd dövlət universitetində təhsil alan 267 birinci kurs tələbəsi ilə (orta yaş = 20.81 il; 62.5% qadın) tədqiqat keçirmişdir. Əvvəlki tədqiqatlar göstərib ki, valideynlərinə və yoldaşlarına bağlı olan tələbələr yeni mühitə uyğunlaşmaqda çətinlik çəkmirlər. Valideyninə çox bağlı olan birinci kurs tələbələrinin universitet həyatına uyğunlaşmaları daha çətin olur. Bu onların ailədən qopa bilməmələri ilə izah edilə bilər. Müstəqilləşməyə, fərdiləşməyə hazır olmamaları da buna səbəb kimi göstərilə bilər. Digər tərəfdən isə, dostları ilə bağlılığı çox olan tələbələr universitetə daha yaxşı uyğunlaşırlar. Sosial mühiti geniş olan, yoldaşları ilə münasibətləri yaxşı olan tələbələr üçün universitet həyatı daha asan keçir. Beləliklə bu tədqiqat nəticələrinə əsasən qeyd etmək olar ki, universitetə adaptasiya prosesində dostlara bağlı olmaq, valideynlərə bağlı olmaqdan daha güclü təsirə malikdir.

Sadoughi & Hesampour (2016)-2014-2015-ci tədris ili üçün Kashan Universitetində təhsil alan 320 nəfər tələbələrin universitetə uyğunlaşmada yaşadıqları stressi və qarşılaşdıqları akademik uyğunlaşma problemlərini araşdırmış-

dır. Tədqiqat nəticələrinə əsasən sosial dəstəyin müxtəlif aspektləri ilə akademik uyğunlaşma arasında müsbət əlaqə olduğunu aşkar etmişdir. Təklik artdıqca akademik uyğunlaşma azalmaqdadır. Ailə dəstəyinin azlığı da uyğunlaşmağa mənfi təsir edir.

**Tələbənin motivasiyasının adaptasiya prosesinə təsiri**

Universitetin birinci kursuna daxil olan tələbənin təhsilini davam etdirib etdirməməsinə təsir edən əsas amillərdən biri də akademik motivasiyadır. Birinci kurs tələbələri orta təhsildən ali təhsilə keçid prosesində öyrəşdikləri sistemdən fərqli bir struktura uyğunlaşmağa çalışırlar. Bu isə bəzən onların motivasiyasına müsbət və ya mənfi təsir göstərə bilər. Akademik motivasiya tələbələrin öyrənməyə qarşı nə qədər istəkli olduğunu, səy göstərdiyini və bağlı olduğunu göstərir.

Akademik motivasiya yalnız tələbənin məktəb və ya universitet nəticələrinə deyil, həm də öyrənmə prosesinə münasibətinə, səylərinə və daimi öyrənmə bacarıqlarına təsir edir [9] Universitet mühitində tələbələr artıq öz həyatlarının məsuliyyətlərini öz üzərlərinə götürürlər. Onların akademik motivasiyaya sahib olmaları uğurlu təhsil prosesi üçün kritik əhəmiyyət kəsb edir.

**Tələbənin şəxsi keyfiyyətləri (stressin öhdəsindən gəlmə və özgüvən)**

Özü ilə bağlı yetərlilik inancı tələbənin müəyyən bir tapşırığı yerinə yetirməyə dair özünə olan inamı kimi izah edilə bilər və bu isə akademik motivasiyanın yüksəlməsində vacib rol oynayır [5]. Tələbələr özünə inandıqları zaman öyrənməyə daha çox həvəs göstərir və dərslərdə aktiv iştirak etmələri artır. Eyni zamanda, qarşıya məqsəd qoyma və bu məqsədlərə çatmaq arzusu da motivasiya üzərində güclü təsir göstərir. Effektiv öyrənmə strategiyaları və zaman idarəetməsi akademik motivasiyaya birbaşa təsir edən mühüm amillərdəndir. Bay, Tuluk və Gençoğanın (2003) apardıqları tədqiqata əsasən tələbələrin dərs çalışma bacarıqları və zaman idarəetmə strategiyalarının tələbələrin akademik uğur və motivasiyalarında müəyyənedici təsiri malikdir. Zamanını səmərəli idarə edən tələbələr dərslərə daha mütəmadi qatılır, imtahanlara daha yaxşı hazırlaşır və nəticədə akademik uğurları artır.

**Ev həsrəti-evdən ötəri darıxma hissi**

Evdən ötəri darıxma birinci kurs tələbələri arasında çox müşahidə edilən hallardan hesab edilə bilər. Bu zaman tələbələr yeni mühitdə ailə və tanış mühit üçün nostalji və həsrət duyğuları artır. Tələbələrin bu emosiyalarına laqeyd yanaşıldığı zaman, onların emosional sağlamlığına mənfi təsir göstərə bilər, bu isə depressiya və narahatlığa səbəb ola bilər. Ev həsrəti çəkən tələbələrin vaxtında müəyyən edilib onlara dəstək olunması bu məsələnin həllində vacib amillərdən biridir. Evdən ötəri darıxma, ev və ona bağlı olan obyektlər üçün güclü həsrət və bu barədə davamlı düşüncələrlə xarakterizə olunur. Evdən köçmək həmişə tələbələrin əksəriyyətinin ev həsrətinə səbəb olur ki, bu da onların performansına mənfi təsir göstərir. Həddindən artıq stress isə yemək və yuxu problemlərinə, enerji itkisinə və baş ağrısına səbəb ola bilər. Şiddətli ev həsrəti yaşayan tələbələr bəzi tənqidi hallarda intihara səbəb olan narahatlıq və depresif əhval-ruhiyyədə olurlar. Tehran Universitetinin üç yüz əlli beş (198 kişi və 157 qadın) yataqxana tələbələri üzərində aparılan tədqiqat nəticələrinə əsasən sosial narahatlıq və irrasional inanclar ev həsrəti ilə ($p<0.01$), müvafiq olaraq ($r=0.56$), ($r=0.28$), emosional zəka isə mənalı mənfi korrelyasiya ($r=-0.52$) ilə ev həsrəti ($P<0.01$). Nəticələr göstərir ki, sosial narahatlıq ev həsrətini proqnozlaşdırmaq üçün ən təsirli amildir. Tədqiqat sosial təşviş, irrasional inanclar və evdən ötəri darıxma arasında əhəmiyyətli korrelasiyaları müəyyən etmişdir. Xüsusilə, sosial təşvişin evdən ötəri darıxma ilə güclü müsbət korrelyasiya göstərdiyi aşkar edilmişdir ($r=0.56$). Bu, sosial təşviş səviyyəsinin yüksək olduğu tələbələrin evdən ötəri darıxma hissini daha çox yaşadığını göstərir. İrrasional inanclar evdən ötəri darıxma ilə müsbət korrelyasiya nümayiş etdirmişdir ($r=0.28$). Bu, irrasional inanclara sahib olan tələbələrin universitet həyatına uyğunlaşmaqda daha çox çətinlik çəkdiyini göstərir. Tədqiqatın digər nəticəsinə əsasən emosional zəka isə evdən ötəri darıxma ilə mənfi korrelyasiya göstərmişdir ($r=-0.52$). Bu nəticə, emosional zəka səviyyəsi yüksək olan tələbələrin duyğularını və sosial qarşılıqlı əlaqələrini daha yaxşı idarə etdikləri üçün evdən ötəri darıxmanı daha az yaşadıqlarını bildirir .Tədqiqatda sosial təşvişi olan tələbələrin daha çox ev həsrəti çəkdiyini göstərir. Evdən ötrü çox darıxan birinci kurs tələbələrində qarışıq narahatlıq və depressiya ilə müşahidə edilən uyğunlaşma pozuntularına səbəb ola biləcəyini göstərir. [11]

Beləliklə, birinci kurs tələbələrinin adaptasiyası problemi ilə bağlı tədqiqatlar incələndiyi zaman, sosial münasibətlərin, ailə dəstəyinin əhəmiyyətli olduğu görülür. Tələbələrin maddi rifahlarının yaxşı olması da onların adaptasiya prosesinə təsir edən amillər arasındadır. Digər tərəfdən cinsiyyətə görə baxıldığı zaman, qadın tələbələrin daha çox adaptasiya çətinlikləri ilə qarşı qarşıya qaldıqları müəyyən edilmişdir. Ev həsrəti çəkən tələbələrdə depressiya, təşviş, bəzən intihara qədər gedən əlamətlərin ola biləcəyi də tədqiqatlarda öz əksini tapmışdır. Tələbələrin universitet daxilində sosial fəaliyyətlərə daxil olması, müəllimləri ilə rahat ünsiyyətə girə bilmələri də onların universitetə adaptasiya prosesinə müsbət təsir göstərə bilər. Beləcə, tələbə özünü universitetə aid hiss edərək, motivasiyalı şəkildə və sosiallaşaraq təhsilini davam etdirər.

**Problemin aktuallığı**. Birinci kurs tələbələrinin universitet həyatına uyğunlaşma prosesinə təsir edən psixososial amillərin anlaşılması, bu sahədə profilaktik və dəstək tədbirlərinin hazırlanması baxımından xüsusi əhəmiyyət daşıyır. Mövzunun tədqiqi, universitetə uyğunlaşmaqda çətinlik çəkən, təhsilini yarımçıq qoyan və ya universiteti tərk edən tələbələrin sayının azalmasına töhfə verə bilər.

**Problemin elmi yeniliyi.** Bu tədqiqatın elmi yeniliyi, birinci kurs tələbələrinin yeni mühitə adaptasiya prosesinə təsir edən psixososial faktorların nəzəri əsaslarının sistemli şəkildə araşdırılması və bu istiqamətdə aparılacaq gələcək elmi tədqiqatlara zəmin yaratmasıdır.

**Problemin praktik əhəmiyyəti.** Psixososial faktorların universitet həyatına uyğunlaşma prosesindəki rolunu elmi mənbələrə əsaslanaraq təhlil etmək, və bu bilgilər əsasında tələbələrə psixoloji dəstək mexanizmlərinin inkişafına töhfə vermək məqalənin əsas məqsədlərindəndir. Bu baxımdan, mövcud tədqiqat və nəzəriyyələrin təhlili praktik yanaşmaların formalaşmasına xidmət edir.

**Ədəbiyyat**


1. Aladağ, M. Universitet yaşamına uyum sürecinde karşılaşılan sorunlar və başa çıxma strategiyaları // Eğitim ve Bilim. – 2009. – c. 34, №151. – s. 123–135.
2. Baker, R. W., Siryk, B. Measuring adjustment to college // Journal of Counseling Psychology. – 1984. – c. 31, №2. – s. 179–189.
3. Baker, R. W., Siryk, B. Exploratory intervention with a scale measuring adjustment to college // Journal of Counseling Psychology. – 1986. – c. 33, №1. – s. 31–38.
4. Baker, S. R. Intrinsic, extrinsic, and amotivational orientations: Their role in university adjustment, stress, well-being, and subsequent academic performance // Current Psychology. – 2004. – c. 23, №3. – s. 189–202. – doi: 10.1007/s12144-004-1019-9.
5. Bandura, A. Self-efficacy: The exercise of control. – New York: W. H. Freeman and Company, 1997.
6. Bay, E., Tuluk, G., Gençoğan, B. Üniversite öğrencilerinin sosyal destek düzeyleri ile psikolojik uyumları arasındaki ilişki // Eğitim ve Bilim. – 2003. – c. 28, №127. – s. 45–52.
7. Credé, M., Niehorster, S. Adjustment to college as measured by the Student Adaptation to College Questionnaire: A quantitative review of its structure and relationships with correlates and consequences // Educational Psychology Review. – 2011. – c. 24, №1. – s. 133–165. – https://doi.org/10.1007/s10648-011-9184-5.
8. Gan, Y., [və b.]. Digital mental health interventions for university students with anxiety and depression: A meta-analysis of randomized controlled trials // Journal of Medical Internet Research. – 2021. – c. 23, №9. – e21342. – https://doi.org/10.2196/21342.
9. Pintrich, P. R., De Groot, E. V. Motivational and self-regulated learning components of classroom academic performance // Journal of Educational Psychology. – 1990. – c. 82, №1. – s. 33–40. – https://doi.org/10.1037/0022-0663.82.1.33.
10. Sadoughi, M., Hesampour, F. The relationship between social support and academic adjustment among university students // International Journal of Humanities and Cultural Studies. – 2016. – c. 3, №1. – s. 123–130.
11. Voysani, N., [və b.]. Psychosocial adjustment and academic achievement among university students: The role of resilience and social support // Journal of College Student Development. – 2014. – c. 55, №6. – s. 595–607. – https://doi.org/10.1353/csd.2014.0059.
12. Wintre, M. G., Yaffe, M. First-year students' adjustment to university life as a function of relationships with parents // Journal of Adolescent Research. – 2000. – c. 15, №1. – s. 9–37. – https://doi.org/10.1177/0743558400151002.


**Redaksiyaya daxil olub:** 01.05.2025.

UOT 159.9.

***Rəna Nüsrəddin qızı Cəbrayılova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*
*Pedaqoji psixologiya kafedrasının baş müəllimi*
*https://orcid.org/0009-0002-9335-4782*
*E-mail: rena.cebrayilova1234@gmail.com*
*https://doi.org/10.69682/arti.2025.92(3).210-213*

# YENİYETMƏLƏRDƏ UĞUR ƏLDƏ ETMƏK ÜÇÜN MOTİVASİYANIN İNKİŞAF ETDİRİLMƏSİNİN METOD VƏ VASİTƏLƏRİ

***Rana Nusraddin Jabrayilova***
*senior lecturer of the department of Educational psychology of*
*Azerbaijan State Pedagogical University*

# METHODS AND WAYS OF DEVELOPING MOTIVATION FOR SUCCESS IN TEENAGERS

***Рена Нусреддин гызы Джабраилова***
*старший преподаватель кафедры Педагогической психологии*
*Азербайджанского Государственного Педагогического Университета*

# МЕТОДЫ И СРЕДСТВА РАЗВИТИЯ МОТИВАЦИИ К УСПЕХУ У ПОДРОСТКОВ

**Xülasə.** Elmi məqalədə uğur əldə etmək üçün motivasiyanın inkişaf etdirilməsinin metod və vasitələri tədqiqi edilir. Yeniyetmələrin uğur əldə etmək motivasiyasının yolları araşdırılır, metod və vasitələri seçilir. Müəllifin fikrincə, yeniyetmələrdə uğur əldə etmək üçün motivasiyanın formalaşmasına təsir edən digər mühüm amil emosiyalar və hisslərdir. Onlar motivin gücünü və modallığını müəyyən edirlər.
***Açar sözlər:*** *uğur əldə etmək motivasiyası, özünüqiymətləndirmə, özünüdərk, sosial mühit, əməkdaşlıq*

**Abstract.** The scientific article studies the methods and means of developing motivation for success. The ways of motivating adolescents to achieve success are investigated, methods and means are selected. According to the author, another important factor influencing the formation of motivation for success in adolescents is emotions and feelings. They determine the strength and modality of the motive.
***Key words:*** *motivation to achieve success, self-esteem, self-awareness, social environment, cooperation*

**Аннотация.** В научной статье изучаются методы и средства формирования мотивации к успеху. Исследуются способы мотивации подростков к достижению успеха, подбираются методы и средства. По мнению автора, еще одним важным фактором, влияющим на формирование мотивации к успеху у подростков, являются эмоции и чувства. Они определяют силу и модальность мотива.
***Ключевые слова***: *мотивация к достижению успеха, самооценка, самосознание, социальная среда, сотрудничество*

Yeniyetmələrdə uğur əldə etmək motivasiyasının formalaşmasında sosial mühit mühüm rol oynayır. Bu problem bir çox rus alimləri, məsələn, L. İ. Bojoviç, İ.V. Dubrovina, L.F. Obuxova, S.A. Beliçeva, A. M. Prixojan, L. M. Semenyuk, V.S. Sobkin, A. Q. Liders, T.V. Kornilova tərəfindən öyrənilmişdir. D.İ. Feldşteyn onların fikirlərini ümumiləşdirərək, yeniyetməlik dövründə insanın mahiyyətinin formalaşmasını vurğulamışdır. Alim yeniyetmələri iqtisadiyyat, ekologiya, ictimai-siyasi məsələlər kimi böyüklərin problemlərinin müzakirəsinə cəlb etməyə qadir olan təhsil prosesinin düşünülmüş strukturlaşdırılmasının vacibliyini qeyd edir.

Bu, yeniyetmələrdə subyektiv mövqenin formalaşması üçün lazımdır. L.İ. Bojoviç yeniyetmələrlə və ətraf mühitin qarşılıqlı əlaqəsini öyrənmişdir. L.S. Vıqotskinin fikirləri ilə razılaşaraq L.İ. Bojoviç eyni ekoloji şəraitdə müxtəlif psixi xüsusiyyətlərin formalaşmasının mümkün-

na əhəmiyyətli dərəcədə təsir göstərir. Valideynlər və müəllimlər DƏHP-nun əlamətlərini erkən tanıdıqda, şagirdlər üçün vaxtında və düzgün müdaxilə tədbirləri görülə bilir. Erkən müdaxilə, şagirdlərin diqqət və özünü tənzimləmə bacarıqlarının inkişafında mühüm rol oynayır.

**İnklüziv təhsil mühitinin yaradılması:** Məlumatlı müəllimlər, DƏHP-u olan şagirdlərin xüsusi ehtiyaclarına uyğunlaşaraq, fərdiləşdirilmiş və interaktiv tədris metodlarını tətbiq edirlər. Həm valideynlər, həm də müəllimlər DƏHP ilə bağlı məlumatlı olduqda, əlavə dəstək proqramlarından (psixoloji, pedaqoji və davranışsal dəstək) yararlana bilirlər. Bu resurslar şagirdlərin akademik performansını artırmağa və öyrənmə çətinliklərini azaltmağa kömək olur. Məlumatlı valideynlər və müəllimlər arasında sıx əlaqə və davamlı geri bildirim şagirdlərin inkişafını izləmək və lazımi dəyişiklikləri həyata keçirmək üçün vacibdir. Bu, DƏHP-u olan şagirdlərin təhsil prosesində qarşılaşdıqları problemlərin daha effektiv həllinə səbəb olur.

**DƏHP-u uşaqların uğursuzluqlarının aradan qaldırılmasına aid bir neçə nəzəriyyə var:**

**1) Bilişsel nəzəriyyə-** Öyrənmə prosesində informasiyanın işlənməsi, yaddaş və diqqət kimi koqnitiv funksiyaların rolunu vurğulayır. DƏHP-u diaqnozu olan şagirdlərdə qısa müddətli yaddaşın zəifləməsi, diqqətin səmərəli şəkildə cəmlənməməsi və məlumatların emalında çətinliklər müşahidə olunur. Bu nəzəri çərçivə, şagirdlərin dərs materialını mənimsəmə prosesində yaranan problemlərin, onların koqnitiv resurslarının məhdudluğundan qaynaqlandığını irəli sürür. Belə ki, bu problemlərin aradan qaldırılması üçün tədris metodlarının interaktiv, vizual və qısa müddətli təqdimatlarla dəstəklənməsi tövsiyə edilir.

2) **Davranışsal nəzəriyyə.** Öyrənmədə ətraf mühit faktorlarının və mükafatlandırma sistemlərinin şagird davranışlarına təsirini izah edir. DƏHP-u olan uşaqların impulsivlik və hiperaktivlik kimi xüsusiyyətləri, onların sinif içi davranışlarında nizamsızlığa səbəb olur. Bu nəzəriyyəyə görə, müsbət gücləndirmə, davranış terapiyası və strukturlaşdırılmış sinif idarəetməsi kimi strategiyalar vasitəsilə, şagirdlərin davranışlarının və öyrənmə prosesinin tənzimlənməsi mümkündür. Bu yanaşma, həm müəllimlərin, həm də valideynlərin şagirdlərlə qurduğu əlaqənin, onların akademik və sosial inkişafına müsbət təsir etdiyini göstərir.

3) **Ekoloji sistemlər nəzəriyyəsi.** Bronfenbrennerin ekoloji sistemlər nəzəriyyəsi, uşağın inkişafını birbaşa və dolayı şəkildə təsir edən fərqli mühitlər – ailə, məktəb, sinif və cəmiyyət – arasında qarşılıqlı əlaqə kimi izah edir. DƏHP-u olan şagirdlərin akademik performansını və sosial adaptasiyasını formalaşdıran təkcə fərdi xüsusiyyətlər deyil, həm də onların təhsil mühitindəki dəstək sistemləri və ailə şəraiti mühüm rol oynayır. Bu nəzəriyyə, inklüziv təhsil mühitlərinin və koordinasiyalı müdaxilə proqramlarının əhəmiyyətini vurğulayır.

4) **İcra funksiyaları nəzəriyyəsi-** İcra funksiyaları nəzəriyyəsi, planlaşdırma, təşkilatçılıq, diqqəti cəmləmə və özünü tənzimləmə kimi yüksək səviyyəli koqnitiv proseslərin pozulmasının öyrənmə çətinliklərində necə rol oynadığını araşdırır. DƏHP-u olan şagirdlərdə bu funksiyaların zəifləməsi, onların tapşırıqları vaxtında və səmərəli şəkildə yerinə yetirməsinə mane olur. Müvafiq müdaxilə metodları, məsələn, xüsusi təlim proqramları və davranış müdaxilələri, bu funksiyaların inkişaf etdirilməsinə yönəldikdə, akademik uğurun artırılmasına kömək edir.

**Yaş və cins fərqlilikləri:** DƏHP-u daha çox oğlan uşaqlarında müşahidə olunur və erkən yaşlarda diaqnoz qoyulması, müdaxilənin effektivliyini artırır. Belə şagirdlər, diqqət, yaddaş və icra funksiyalarında yaşadıqları çətinliklər səbəbindən, normal inkişaf göstərən həmyaşıdları ilə müqayisədə akademik nailiyyətlərdə orta hesabla 20-30% aşağı göstəricilər sərgiləyə bilirlər. Meta-analizlər və uzunmüddətli tədqiqatlar göstərir ki, fərdi müdaxilə proqramları və erkən dəstək DƏHP-u olan şagirdlərin akademik performansını əhəmiyyətli dərəcədə yaxşılaşdıra bilir.

**Erkən müdaxilə:** DƏHP-nin erkən diaqnozu və dərhal fərdiləşdirilmiş tədris müdaxiləsi, şagirdlərin akademik və sosial inkişafında mühüm rol oynayır.

**Elmi ədəbiyyatda əsas nəzəri çərçivələr** – bilişsel, davranışsal, ekoloji sistemlər və icra funksiyaları nəzəriyyələri – DƏHP-u olan şagirdlərin öyrənmə çətinliklərini və akademik performansını izah etmək üçün geniş istifadə olunur. Statistik məlumatlar isə bu problemlərin qlobal səviyyədə yayılmış olduğunu və müvafiq müdaxilə proqramlarının şagirdlərin uğuruna müsbət təsir etdiyini göstərir

Təhsil mühitində öyrənmə maneələrinin aradan qaldırılması DƏHP-u diaqnozu olan şagirdlərin akademik performansına və sosial adaptasiyasına müsbət təsirini müxtəlif nəzəri çərçivələr və statistik məlumatlarla nail olmaq olar. Bilişsel və davranışsal nəzəriyyələr, DƏHP-u olan şagirdlərin diqqət, yaddaş və icra funksiyalarındakı məhdudiyyətləri açıqlayaraq, onların dərs materialını mənimsəməsində yaranan çətinlikləri vurğuladı. Ekoloji sistemlər nəzəriyyəsi isə, ailə, məktəb və cəmiyyət kimi amillərin qarşılıqlı təsirinin, şagirdlərin inkişafına necə təsir etdiyini göstərdi. Bundan əlavə, icra funksiyaları nəzəriyyəsi, DƏHP-u olan şagirdlərin planlaşdırma və özünü tənzimləmə bacarıqlarının zəifliyinə işarə edərək, müvafiq müdaxilə proqramlarının əhəmiyyətini ortaya qoydu.

Nəticə etibarilə, təhsil mühitində DƏHP-u olan şagirdlərin qarşılaşdıqları öyrənmə maneələrinin aradan qaldırılması üçün inklüziv və fərdiləşdirilmiş yanaşmaların tətbiqi zəruridir. Gələcək tədqiqatlar, bu müdaxilə strategiyalarının uzunmüddətli effektivliyini və şagirdlərin akademik uğurlarına təsirini daha da dərinləşdirilmiş şəkildə öyrənməyə yönəldilməlidir. Bu, həm təhsil sistemində, həm də cəmiyyət səviyyəsində DƏHP-u olan şagirdlərin potensial inkişafının maksimum dərəcədə reallaşdırılmasına şərait yaradacaqdır.

**Problemin aktuallığı**. Diqqət əskikliyi və hiperaktiv pozuntu (DƏHP), uşaqlıq dövründən etibarən şəxsin, diqqətini cəmləməkdə və hiperaktivlik kimi impulsiv hərəkətləri tənzimləməkdə çətinlik çəkdiyi neyroinkişaf pozuntularından biridir. DƏHP olan şəxslər diqqəti cəmləşdirməkdə və davranışları nəzarət altında saxlamaqda çətinlik çəkə bilər və həddindən artıq aktiv ola bilərlər. Konsentrasiya çətinlikləri və impulsivlik hiperaktivlik bu vəziyyətin əsas xüsusiyyətləridir. DƏHP olan şəxslər tək bir iş üzərində cəmləşməkdə və ya uzun müddət səssiz qalmaqda çətinlik çəkirlər. Bir çox insan müəyyən zamanlarda diqqətsizlik və dəyişkən enerji səviyyələri yaşasa da, DƏHP olan insanlarda vəziyyət daha tez-tez və daha ciddi şəkildə baş verir. Bu vəziyyət uşaqlarda daha çox görülsə də, böyüklərdə də rastlanan davranış pozuntusudur.

**Problemin elmi yeniliyi**. Uşaqlar diqqətsizlik səbəbindən verilən tapşırıqları yerinə yetirməkdə çətinlik çəkə bilərlər. Onların düşünmədən impulsiv hərəkətə meyli tələsik və potensial mənfi nəticələrə səbəb ola bilər. Hiperaktivlik həddindən artıq motor fəaliyyətini əhatə edir və uşaqlar, xüsusən də gənc insanlar hərəkətsiz oturmaqda çətinlik çəkə bilər. Ümumilikdə, DƏHP olan uşaqların təxminən 20-60%-də öyrənmə geriliyi ola bilər. Bununla belə, DƏHP olan hər bir uşaq diqqət çatışmazlığı və hərəkətlilik səbəbindən də öyrənmə çətinliyi ilə üzləşə bilər.

**Problemin praktik əhəmiyyəti.** DƏHP-in dəqiq səbəbi hələ tam müəyyən edilməsə də, genetikanın təsirli olduğu düşünülür. DƏHP diaqnozu qoyulmuş insanlar üzərində aparılan araşdırmalarda, dopamin səviyyələrinin aşağı olduğu və beynin, düşüncəni idarə edən bölgələrinin digər hissələrə nisbətən daha az aktiv olduğu müşahidə edilmişdir. Bundan əlavə, bu insanlarda beyindəki struktur fərqlər arasında boz maddənin həcminin azalması müəyyən edilmişdir. Boz maddə nitq, özünü idarə etmə, qərar vermə və əzələlərə nəzarət kimi funksiyalarda mühüm rol oynayır.

## Ədəbiyyat


1. İnklüziv təhsilin təşkili Qaydası. https://e-qanun.az/framework/53554
2. 2018–2024-cü illərdə Azərbaycan Respublikasında sağlamlıq imkanları məhdud şəxslər üçün inklüziv təhsilin inkişafı üzrə Dövlət Proqramı. https://eqanun.az/framework/37269
3. “Təhsil haqqında” Azərbaycan Respublikası Qanunu. Bakı. Hüquq ədəbiyyatı, 2009, 80 s.
4. Ümumi təhsil haqqında Azərbaycan Respublikasının Qanunu. www.e-qanun.az
5. Алёхина С.В. Принципы инклюзии в практике // Аутизм и нарушения развития. 2020. №1(40). С. 1-6.


**Redaksiyaya daxil olub:** 21.04.2025.

UOT 159.9.

***Nurəddin Emil oğlu Daşdəmirov***
*Bakı şəhəri, Sabunçu rayonu 293 nömrəli tam orta məktəbin*
*fiziki tərbiyə müəllimi*
*https://orcid.orq/0009-0005-7591-9390*
*E-mail. nuru93@ mail. ru*
*https://doi.org/10.69682/arti.2025.92(3).225-229*

# ÖZÜNÜMÜDAFİƏ BACARIQLARININ FORMALAŞDIRILMASI PROSESİNDƏ ŞAGİRDLƏRİN PSİXOLOJİ HAZIRLIĞININ XÜSUSİYYƏTLƏRİ

***Nuraddin Emil Dashdamirov***
*physical cultre teacher,*
*of secondary School No. 293 of Sabunchu district of Baku city,*

# PSYCHOLOGICAL READINESS FEATURES OF STUDENTS IN THE PROCESS OF DEVELOPING SELF-DEFENSE SKILLS

***Нуреддин Эмиль оглы Дашдамиров***
*учитель физической культуры школы №293*
*Сабунчинского района города Баку*

# ОСОБЕННОСТИ ПСИХОЛОГИЧЕСКОЙ ПОДГОТОВКИ УЧАЩИХСЯ В ПРОЦЕССЕ ФОРМИРОВАНИЯ НАВЫКОВ САМООБОРОНЫ

**Xülasə.** Məqalədə qeyd edilir ki, uşaqların təhlükəsizliyinin qorunması problemi hər zaman cəmiyyəti düşündürür. Müəllifin fikrincə, bu problemin həlli yollarından biri, ən mühümü, məktəblilərin özünümüdafiə bacarıqlarını formalaşdırmaq və inkişaf etdirməkdir. Qeyd edilir ki, onlar eksterimal şəraitdə həyəcanlanmadan, çaşqınlıq göstərmədən vəziyyəti qiymətləndirməyi öyrənməlidirlər. Bunun üçün məşqçilər hər bir məşq prosesində onları psixoloji cəhətdən özünümüdafiəyə hazırlamalı və yalnız bundan sonra praktiki olaraq priyomların öyrədilməsinə başlamaları daha yaxşı nəticələr əldə etməyə imkan verər.

Məqalədə özünümüdafiə bacarıqlarının formalaşdırılması prosesində şagirdlərin psixoloji hazırlığının xüsusiyyətləri aydınlaşdırılır və dəyərli tövsiyələr verilir.

***Açar sözlər:*** *özünümüdafiə, psixoloji hazırlıq, psixoloji davranış, aqressivlik, iradə tərbiyəsi, taktiki düşüncələr*

**Abstract.** The article highlights that the issue of ensuring children's safety has always been a concern for society. According to the author, one of the most important solutions to this problem is to develop and enhance students' self-defense skills. He emphasizes that students should learn to assess situations without panic or confusion in extreme conditions. To achieve this, coaches should first psychologically prepare students for self-defense in every training session before moving on to practical techniques, which can lead to better results.

The article examines the characteristics of students' psychological readiness in the process of developing self-defense skills and provides valuable recommendations.

***Key words:*** *self-defense, psychological readiness, psychological behavior, aggressiveness, willpower training, tactical thinking*

**Аннотация.** В статье отмечается, что проблема обеспечения безопасности детей всегда являлся приоритетом общества. Подчеркивается, что одним из важнейших путей решения данной проблемы является формирование и развитие у школьников навыков самообороны. Отмечается, что им следует научиться оценивать ситуацию в экстремальных условиях, не горячась и не паникуя. Для этого тренеры должны психологически готовить их к самообороне в каждом тренировочном процессе, и только после этого они начнут практически обучать их приёмам, что позволит получить более высокие результаты.

В статье уточнены особенности психологической подготовки и даны ценные рекомендации.

***Ключевые слова***: *самооборона, психологическая подготовка, психологическое поведение, агрессивность, воспитание воли, тактическое мышление*

Uşaqların təhlükəsizliyi hər zaman, bütün dövrlərdə valideynlərin, ümumilikdə, bütün cəmiyyətin diqqət mərkəzində olmuşdur. Hal-hazırda cəmiyyətin heç də bütün üzvlərinin həyat şəraitinin arzuolunan səviyyədə olmaması və digər səbəblərdən insanlar arasında aqressivliyin, əsəb gərginliyinin artması ictimai həyatda bəzi xoşagəlməz hadisələrin meydana gəlməsinə şərait yaradır. Ona görə də uşaqların təhlükəsizliyinin qorunması problemi meydana çıxır. Bu problemin həlli yollarından biri, fikrimizcə, ən mühümü, məktəblilərin özünümüdafiə bacarıqlarını formalaşdırmaq və inkişaf etdirməkdir. Bu məqsədlə əlbəyaxa döyüş sənəti metodikasından istifadə etməyin səmərəli olduğu qərarına gəldik. Məktəblilərin fiziki tərbiyəsi sistemində fiziki özünümüdafiəsini təşkil etmək üçün onları dərsdənkənar fiziki tərbiyə məşğələlərinə fakültativ məşğələlərə cəlb etmək, onlarda maraq oyatmaq zəruridir. Bu məqsədlə məktəblilərin özünümüdafiə bacarıqlarının formalaşdırılması prosesində şagirdlərin psixoloji hazırlığının xüsusiyyətlərini aydınlaşdırmaq qərarına gəldik.

Həyatımız gözlənilməz hadisələrlə dolu olduğu üçün, istənilən vəziyyətlərdə şagirdlər də necə davranmalı olduqlarını bilməlidirlər. Ona görə də onlar ekstremal şəraitdə həyəcanlanmadan, çaşqınlıq göstərmədən vəziyyəti qiymətləndirməyi öyrənməlidirlər. Bunun üçün məşqçilərin hər bir məşq prosesində şagirdlərə aşağıdakı tövsiyələri verərək, onları psixoloji cəhətdən özünümüdafiəyə hazırlaması və yalnız bundan sonra praktiki olaraq priyomların öyrədilməsinə başlamaları daha yaxşı nəticələr əldə etməyə imkan verər.

Həmin psixoloji davranış qaydaları ilə bağlı tövsiyələr bunlardır:

1. Özünüzü meydan oxuyurcasına aparmayın.

Birinci olaraq aqressivlik göstərməyin. Yaranmış vəziyyətin gərəksizliyini izah etməyə çalısın. Unutmayın: heç bir halda rəqib sizin qorxduğunuzu və ya tərəddüd etdiyinizi hiss etməməlidir. Əlləriniz və ya ayaqlarınızla boş lazımsız hərəkətlər etməyin. Mövzusu sizə tamamilə aydın olmayan söhbətə qoşulmayın.

Kiçik anlaşılmazlıqlarda, “əgər bu prinsipial deyilsə”, güzəştə gedin və əlbəttə ki, bu sizin xeyrinizə olacaq.

Bir neçə rəqiblə döyüşərkən sizin əsas vəzifəniz onların diqqətini özünüzə çəkərək onları yanınızdakı qız yoldaşınızdan uzaqlaşdırmaqdır. Rəqibdə nəciblik axtarmayın.

Əgər münaqişə qaçılmaz olarsa, birinci zərbəni gözləməyin və onun haradan gələcəyini təxmin etməyə çalışmayın. Bu vəziyyətdə, əlbəttə ki, onu əldən verəcəksiniz və ondan sonra fiziki və psixoloji olaraq özünüzə gələ biləcəyiniz məlum deyil. Hər halda, sizə özünüzə gəlib bərpa olunmaq üçün vaxt olacaq .

Hücum etməyi qərara aldıqdan sonra siz rəqibin diqqətini özünüzdən yayındırmağa cəhd edin. Bunu təxminən belə etmək olar: onun kürəyinin arxasına nəzər salmaq, başınızı yüngülcə yana, ayaqların altına və s. atmaq; diqqəti daha kobudcasına yayındırmaq olar: əlinin altında olan istənilən predmeti üzünə vurmaq. Bu hücuma başlamaq üçün kifayət qədər, yəni bir neçə saniyə sərbəst vaxt verəcək. Rəqiblər bir neçə nəfərdirsə, onlara həmən an hücum edin. Əllərlə və ya əllər və ayaqlarla ikiqat kombinə edilmiş zərbələr az vaxt kəsiyində maksimum döyüş hərəkətlərini keçirməyə imkan verəcək. Rəqiblərin bir-birinə qarşı tutacaqları mövqeni, yəni öz hərəkətləri ilə bir-birinə mane olacaqlarını dərhal seçməyə çalışın. Nəzərə alın ki, bu vəziyyətdə rəqiblərin hərəkətlərini dərhal neytrallaşdırmaq mümkün olmayacaq. Lakin uğurlu manevr üçün vaxt qazanacaqsınız.

Unutmayın! Qələbənizi təmin edən hərəkət yüksək sürətlə bütün döyüş nöqtələrinə zərbələrdir. Rəqibə qarşı vuruşmağa girişməyin. O, qeyri-iradi geyiminizin hər hansı bir hissəsini qamarlaya bilər və bununla hərəkətlərinizi məhdudlaşdırar, ən yaxşı halda, bədənin qalan hissəsi hücum etmək imkanı verə bilər. Lakin, yüksək sürət və qüvvətlə həyata keçirilən döyüşçü priyomu bu imkanı praktiki olaraq aradan qaldırır. Buna görə də, siz rəqibə döyüşçü priyomu tətbiq etməyə çalısırsınızsa, onu keyfiyyətlə icra edəcəyinizdən əmin olmalısınız. Rəqib üçün ayıldıcı faktor olaraq, əlinizə düşən istənilən əşya: ağac parçası, daş, bir ovuc palçıq, qum, şüşə qırığı və s. işə yarıyar. Həmçinin yadda saxlayın ki, sizin qəfil bərk qışqırığınız bir anlığa rəqibinizin sinir sistemini tormozlaya bilər.

Bir sözlə, vəziyyəti avtomatik qiymətləndirib öz xeyrinə istifadə etməyi bacarmaq lazım-

dır. Əgər düşmən hər hansı bir soyuq silahla silahlanmışdırsa, ya öz inadlı nitqinizlə, ya da küçədə seçməyə müvəffəq olduğunuz hər hansı predmetlə ona təsir etməyə çalısın. Birini qorxutmaq lazımdır, digəri bir sakitləsdirici tona alınır, üçüncünü, hərəkətlərinizin məntiqini dayandıracaq, bir sözlə, hər şey sizin qarşınızda duran şəxsin psixikasından və məqsədindən asılıdır. Lakin təəssüf ki, bu üsulla münaqişədən qaçmaq heç də həmişə mümkün olmur. Əgər başqa çıxıs yolu yoxdursa və geri çəkilmək mümkün deyilsə, o zaman bıcaq öz trayektoriyasına çatana qədər onu ələ keçirməyə çalısın. Bıçağın iti dilindən və ya kəsmək imkanından qorxmayın. Bu vəziyyətdə artıq itiriləsi heç nəyiniz yoxdur. Rəqibinizi bir zərbə ilə tərkisilah etməyə çalışın. Əgər mümkün deyilsə, "yapışqan" olmağa çalısın ki, rəqibinizə hərəkət azadlığı verməyəsiniz. Bıçağı öz nəzarətinizdən buraxmamağa çalısın. Lakin, elə ki, müdafiədə uğursuzluq hiss etdiniz, rəqibinizi atın və ya özünüz ondan geri atılın və özünüzə daha uğurlu mövqe seçin. Öz hərəkətlərinizlə rəqibi vurnuxmağa məcbur etmək yaxşı olar, yəni onu qabaqcadan düzgün olmayan və ya qeyri-müəyyən hərəkət etməyə məcbur edərək, onun bu vəziyyətindən bacardığınız qədər istifadə edə bilərsiniz. Qarşınızda soyuqqanlılıqla silahı oynadan rəqibinizə qarşı xüsusi ilə diqqətli olmalısınız, çünki onun bu hərəkəti əsəblərinin möhkəm olmasından və qətiyyətliliyindən xəbər verir. Əgər yıxılsanız və yerdə uzanaraq qalsanız, ehtimal ki, sizi tapdalayacaqlar. Bu vəziyyətdə, rəqibin zərbələrinin hədəfindən yayınmaq üçün yerdə diyirlənməyə çalısın. Unutmayın ki, qələbə üçün, hər şeydən öncə, təmiz və soyuq bir başınız olmalıdır. Qəzəblənsəniz özünüzü və ətraf mühitinizi idarə edə bilməyəcəksiniz! Təcrübə göstərir ki, özləri üzərində nəzarəti itirənlər döyüşdə yaralanırlar. Hərəkətlərinizin rejissoru olun.

Bütün bu göstərilənlər doğma olaraq qəbul edilə bilməz. Çünki, eyni hallar baş vermir, lakin sizin şüuraltı döyüş sxemləriniz artıq formalaşacaq və döyüş şəraitində siz onlardan istifadə edə biləcəksiniz.

2. İradə tərbiyəsi.

Təkbətək döyüşlə məşğul olan insan daim müxtəlif çətinlikləri, o cümlədən, fiziki, psixoloji çətinlikləri və ağrı hisslərini dəf etməyi, ekstremal şəraitdə qərarlar qəbul etməyi və vəziyyəti təhlil etməyi bacarmalıdır.

İdmançı təlimə başlamazdan əvvəl bilməlidir ki, bu ona nə üçün lazımdır, onu buna təhrik edən hansı motivlərdir. Əks halda, onun cəhdləri əvvəlcədən uğursuzluğa məhkumdur. Lakin, bu o demək deyil ki, əhalinin müəyyən təbəqələri, o cümlədən, yeniyetmələr, öz iradəsini yetişdirməməlidirlər. Hər bir vətəndaş özünü təkmilləsdirməlidir, öz imkanlarını və bacarıqlarını dərk etməlidir. İnsan özünə sahib olmağı öyrənməli, istədiyini deyil, lazım olanı etməyi bacarmalıdır. Həmişə və hər şeydə təkmilləsmək, hər şeyi və həmişə ən yaxşı şəkildə dəqiq və səliqəli edərək öz hərəkətlərinin nəticələrini qabaqcadan görməyə çalışmalıdır. Insan həmişə uğursuzluqların səbəblərini özündə axtarmalı, obyektiv və subyektiv səbəblərə istinad etməlidir. Hər kəs özü özünə nəzarətçi olmalıdır.

Qarşıya qoyulmuş məqsədə nail olmağı təmin edən zəruri keyfiyyət *əzmkarlıqdır*. Mübarizənin ən kəskin anlarında qərar qəbul etmək, tərəddüd etmədən, qorxu və inertliyi aradan qaldıraraq, onları yerinə yetirmək üçün cəsarət və qətiyyət lazımdır. Bu keyfiyyətlərin yetişdirilməsinə özünə əminliyin, öz gücünə inamın, döyüş şəraitini anlamaq bacarığının təkmilləsdirilməsindən başlamaq məqsədəuyğundur. İradəli keyfiyyətlər özünü idarəetmədə, dözümlülükdə, təşəbbüskarlıqda və intizamlılıqda özünü göstərir. Öz növbəsində, bu keyfiyyətlər: çasqınlıq, məyusluq, döyüşdən əvvəl və ya döyüş zamanı baş verə bilən mənfi emosiyaların aradan qaldırılması üçün tələb olunur. Həm də bu keyfiyyətlər zərbələrin köçürülməsi və yorğunluq əlamətlərini aradan qaldırmaq üçün vacibdir.

3. Taktiki düşüncələr.

Taktiki düşüncələr sırf müdafiə xarakterli ola bilər. Seriyalarla edilən sürətli hücumlar zamanı müdafiə olunan passiv hərəkətləri ilə rəqibi yormaq üçün özünü təhlükəsiz şəkildə örtməyə çalısır. Müdafiəni yerinə yetirərkən əks hücum üçün ani olaraq hücumçunun zəif tərəflərini dərhal aydınlaşdırmaq lazımdır.

Müdafiənin qoyuluşunda vəziyyətdən asılı olaraq bir neçə üsluba riayət etmək olar.

1. İnam əldə etmiş və eyni zamanda sayıqlığını itirərək ehtiyatsız olan rəqibin sayıqlığını aşağı salmaq.

2. Hücumu inkişaf etdirmədən qarşılıqlı zərbələr endirmək olar. Bir yaxşı qarşılıqlı zərbə rəqibin döyüşmək həvəsini söndürə bilər.

3. Fikrimizcə, üçüncü və ən çox seçilən müdafiə növü hücumun tam inkişafı ilə güclü əks-hücumun aparılmasıdır. Bunun nəticəsində rəqib, bir qayda olaraq, heyrətlənir, onda öz hərəkətlərinə inamsızlıq yaranır, kobud səhvlərə yol verməyə başlayır və nəticədə, onu sıradan çıxaran zərbə alır. Bir çox mübarizə növlərində müdafiə priyomları rəqibi şok vəziyyətinə gətirməlidir.

Müdafiə üsullarını tətbiq etmək, ilk növbədə, rəqibi hücum etmək imkanı və istəklərindən məhrum etmək məqsədi daşıyır. Son nəticəyə görə, müdafiə üsullari bir neçə kateqoriyaya bölünə bilər.

Bacarıqla tətbiq olunan priyom rəqibə dözülməz ağrı verir və o, dərhal hücum etmək arzusundan vaz keçir.

Düzgün qurulmuş müdafiə rəqibin sonrakı uğurlu əks-hücumuna yaxşı zəmin yaradır. Müdafiənin hər hansı mürəkkəb priyomlarına müraciət etmədən, rəqibin zərbə endirməsi zamanı bu arzuolunmaz təmasdan, bədəni sürətlə kənara çəkməklə asanlıqla qaçmaq və, beləliklə, özünə ani əks-hücum üçün zəmin hazırlamaq və ona cavab zərbəsi vurmaq olar.

Ən yaxşı müdafiə hücumdur, buna görə də rəqibdən daha əvvəl hücum etməyə çalısmalısınız.

Mübarizənin gedişi nə qədər sürətli olsa da, bəzi qaydalara riayət etmək zəruridir:

1. Diqqəti yalnız rəqibə deyil, həm də ətrafdakılara konsentrə etmək vacibdir.

2. Tamamilə soyuq olmalı, yalnız priyom tətbiq edərkən partlatmaq lazımdır.

3. Bədənin bütün gücünü tətbiq olunan zərbəyə cəmləsdirməyi bacarmaq lazımdır. Hədəf ilə əlaqə zamanı bədən qranit kimi bərk olmalıdır.

4. Bacarıqla aldadıcı hərəkətlərdən istifadə etmək, rəqibini yayındırmaq, daim hərəkət etmək və bütün hərəkətlərdə rəqibi qabaqlamaq.

5. Rəqib fiziki cəhətdən necə görünsə də ona maksimum diqqəti ayırmaq lazımdır.

6. Mümkün qədər rahatlaşmağı bacarmaq zəruridir.

Enerji konsentrasiyası ilə bağlı aşağıdakıları bilmək lazımdır:

Özündə hər şeyi dəf edən enerjini üzə çıxarmağı bacarmaq kifayət deyil. Onu idarə etməyi və düzgün istiqamətləndirməyi bacarmaq lazımdır. Bu, düzgün əzələ koordinasiyasından, ziddiyyətli hərəkətlərin aradan qaldırılmasından asılıdır. Maksimal effektlə orqanizmin bütün güclərindən istifadə etməyə imkan verən enerjinin konsentrasiyası bir tərəfdən hərəkətin yerinə yetirilməsinin sürətini və zərbə səthlərində bütün qüvvənin yığılmasını nəzərdə tutur.

4. Təkbətək döyüş üzrə psixoloji hazırlığın xüsusiyyətləri aşağıdakılardır:

* Şəxsi tədbirlər üçün məsuliyyət.

* Vurub çıxaran amillərin böyük miqdarı.

* İdman ustalığının güclü şəkildə ifadə edilmiş komponentləri və "texnika, taktika, fiziki hazırlıq, psixoloji hazırlıq" məqsədinə nail olmaq üçün onların qarşılıqlı əlaqəsi.

Nəzərə almaq lazımdır ki, hər bir insan haqqında söyləmək olmaz ki, “o əsil döyüşçüdür”, hətta o ən yüksək texnika, taktika və fiziki hazırlığa malik olsa belə. Şəxsiyyətin daxilində gedən psixi və psixoloji proseslər böyük əhəmiyyət kəsb edir.

Psixi proseslərə aşağıdakılar aiddir:

duyğular, qavrayış, təsəvvür, əzələ yaddaşı, diqqət, emosiya, istək, və s.

Şəxsiyyətin psixoloji xüsusiyyətlərinə aiddir:

* şəxsiyyətin istiqaməti, temperament, xarakter, maraq və insan qabiliyyətləri. r.

Fəaliyyətin psixoloji xüsusiyyətlərinə aiddir:

* fəaliyyətinin müəyyən bir növü ilə bağlı qavrayış, təfəkkürün, mülahizələr və digər psixi proseslərin xüsusiyyətləri.

*İxtisaslaşdırılmış psixi proseslərin inkişafı.*

Qavrama

1. Məsafə hissi. Döyüşçü döyüşərkən özü ilə rəqibi arasında ən kiçik məsafəyə nəzarət etmək üçün özündə vərdiş yaratmalı və hücum üçün uyğun məsafəni vaxtında fiksasiya etməyi bacarmalıdır.

2. Vaxt hissi. Həyəcan və tormozlanma proseslərinin tarazlığı vaxtsız hərəkət etməkdən çəkinmək üçün şərait yaradır.

3. Məkanda oriyentasiya.

4. Bədənin mövqeyi hissi.

5. Hərəkət azadlığı hissi.

6. Zərbə hissi. Bu ən vacib xüsusiyyətlərindən biridir. Bu, çəldliyin qavranılması və yumruğun məqsədlə təması anının nəzərə alınması ilə bağlıdır. Müxtəlif güc, sürət və məsafədən, həm də müxtəlif çıxış vəziyyətindən zərbə endirməyi öyrənmək lazımdır. Döyüşçü öz zərbəsi ilə rəqibinin sarsılacağına əmin olmalıdır. Zərbənin güclü təsir effekti rəqibin gözləmədiyi bir anda ona zərbə endirmək bacarığından, zər-

bənin dəqiqliyindən, gücündən, zərbənin yerindən asılıdır. Zərbə yumruğun maksimal sərtliyini təmin edən hissəsi ilə vurulmalıdır.

7. Diqqət ən əhəmiyyətli xüsusiyyətdir. O, intensiv və dayanıqlı olmalıdır.

8. Hərəkət sürəti. Bu, sinir-əzələ proseslərinin yüksək hərəkətliliyi sayəsində müəyyən bir sürətlə hərəkəti və işi həyata keçirmək qabiliyyətidir. Sürət keyfiyyəti hərəkət sürətini, hərəkət reaksiyalarının tezliyini və sürətliyini ehtiva edir. Hərəkətlərin sürətlənməsində insanın iradəli səyləri, psixoloji əhval-ruhiyyəsi mühüm rol oynayır.

Döyüşçünün cəldliyi effektiv sadə və mürəkkəb reaksiya qabiliyyəti ilə xarakterizə olunur. Sadə reaksiya əvvəlcədən bilinən, lakin birdən-birə ortaya çıxan rəqibin hərəkətinə cavabdır. Döyüş zamanı təmiz reaksiya praktiki olaraq baş vermir. Onu məşqdə işləyənlərin hərəkətləri qabaqcadan şərtləndirildiyi zaman görmək olar. Döyüşdə iki növ mürəkkəb reaksiyalar ortaya çıxır. Hərəkət obyektinə reaksiya, yəni rəqibə və seçim reaksiyasına. Birinci halda saniyə ərzində cəld davranaraq hərəkət edən rəqibə zərbələr endirmək, yəni lazımi mövqe, müəyyən texniki vəsait seçmək və bununla yanaşı fəal tərpənmək lazımdır. İkinci halda döyüşçü, öz hərəkətləri ilə rəqibin hərəkətlərinə təsir göstərir, bir qayda olaraq, müvəffəqiyyət sürət üstünlüyündən asılıdır, seçim reaksiyasının mürəkkəbliyi isə döyüşçülərin hərəkətlərindən yaranan vəziyyətlərdən asılıdır.

**Nəticə etibarilə** qeyd etməliyik ki, yeniyetmə şagirdlərin təlim məşqlər bu tövsiyələrin yerinə yetirilməsi ilə keçirilərsə, onların özünümüdafiə qabiliyyətləri əhəmiyyətli dərəcədə formalaşdırılmış olar. Onlarda özünəgüvən, təmkinlilik, dözümlülük, əzmkarlıq kimi psixoloji keyfiyyətlərin formalaşmasına zəmin yaradar.

**Problemin elmi yeniliyi** ondan ibarətdir ki, özünümüdafiə bacarıqlarının formalaşdırılması prosesində şagirdlərin psixoloji hazırlığının xüsusiyyətləri aydınlaşdırılmış, təhlil edilmiş və lazımı tövsiyələr verilmişdir.

**Problemin praktik əhəmiyyəti** və tətbiqi. Məqalədə göstərilən müddəa və tövsiyələrdən ümumtəhsil məktəblərinin tərbiyəsi müəllimləri dərsdənkənar və fakültativ məşğələlərdə və məşqçilər idman bölmələrində təlim zamanı istifadə edə bilərlər.

## Ədəbiyyat


1. Abdullayev Y.B. Cudo güləşinin təsnifatı və terminologiyası. Dərs vəsaiti. -Bakı: Mütərcim, -2002. -180 s.
2. Məmmədli S.B., Məmmədli O.B. Əlbəyaxa döyüş.- Bakı: Hərbi Nəşriyyat, -2020. - 262 səh.
3. Hüseynov F. Müasir təlim texnologiyaları idmanda yaradıcı komponentlərin inkişaf vasitələri kimi. ADBTİA /elmi xəbərlər/ -Bakı: Müəllim, 2020. - 38s.
4. Левский В. 500 советов по самообороне. -М., Гранд., 2021. -160 с.
5. Чумаков Е.М. Сто уроков борьбы самбо. -М., Фи С., -2023. -205 с.


**Redaksiyaya daxil olub:**21.05.2025

*UOT 159.9.*

***Elnarə Əkbər qızı İsazadə***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*
*Pedaqoji psixologiya kafedrasının müəllimi*
*https://orcid.org/0009-0000-4255-6654*
*E-mail: elnare.i0171@gmail.com*
*https://doi.org/10.69682/arti.2025.92(3).230-233*

# GƏNCLƏR ARASINDA DEVİANT DAVRANIŞIN SƏBƏBLƏRİ VƏ XÜSUSİYYƏTLƏRİ

***Elnara Akbar Isazade***
*lecturer at the dpartment of Pedagogical psychology of*
*Azerbaijan State Pedagogical University*

# CAUSES AND CHARACTERISTICS OF DEVIANT BEHAVIOR AMONG YOUNG PEOPLE

***Эльнара Акбар гызы Исазаде***
*преподаватель кафедры педагогической психологии*
*Азербайджанского Государственного Педагогического Университета*

# ПРИЧИНЫ И ОСОБЕННОСТИ ДЕВИАНТНОГО ПОВЕДЕНИЯ СРЕДИ МОЛОДЕЖИ

**Xülasə.** Elmi məqalədə deviant davranışın səbəbləri və xüsusiyyətləri araşdırılır. Gənclərdə deviant davranışın formaları ardıcıllıqla tədqiq edilir. Məqalədə müəllif tərəfindən gənclərdə aqressiv vəziyyətin xüsusiyyətləri öyrənilir. Müəllif qeyd edir ki, aqressiya başqa insanlara zərər vurmağa yönəlmiş fiziki və ya şifahi davranışda özünü göstərən deviant davranışın başqa bir formasıdır. Elmi məqalədə gənclər arasında deviant davranışın yayılmasına mənfi təsir göstərən amillər ardıcıllıqla şərh edilir.
***Açar sözlər:*** *deviant davranış, motivasiya, psixi sağlamlıq, sosial sapmalar, davranış formaları, xarakter aksentuasiyası*

**Abstract.** The scientific article examines the causes and characteristics of deviant behavior. The forms of deviant behavior among young people are studied consistently. In the article, the author studies the characteristics of aggressive states among young people. The author notes that aggression is another form of deviant behavior that manifests itself in physical or verbal behavior aimed at causing harm to other people. The scientific article consistently sets out the factors that negatively affect the spread of deviant behavior among young people.
***Key words:*** *deviant behavior, motivation, mental health, social deviations, behavioral patterns, character accentuation*

**Аннотация.** В научной статье рассматриваются причины и особенности девиантного поведения. Последовательно изучаются формы девиантного поведения у молодежи. В статье автор изучает особенности агрессивных состояний у лиц молодого возраста. Автор отмечает, что агрессия еще одна форма девиантного поведения, проявляющаяся в физическом или вербальном поведении, направленном на причинение вреда другим людям. В научной статье последовательно излагаются факторы, негативно влияющие на распространение девиантного поведения среди молодежи.
***Ключевые слова:*** *девиантное поведение, мотивация, психическое здоровье, социальные отклонения, поведенческие паттерны, акцентуация характера*

Cəmiyyətimizdə müasir inkişaf mərhələsində gənclər arasında sosial, əqli və fiziki sapmaların sayının artması üçün çoxlu şərait mövcuddur. Hər bir cəmiyyətin özünəməxsus sosial

sapma formaları və onun mövcudluğunun tarixi şərtlərin miqyası da var. Bunlar içərisində sosial, ekoloji, siyasi və mənəviləri fərqləndirirlər. Sosial sapmaların miqyası bizə konkret cəmiyyətin mənəvi ab-havasını, ondakı qanunçuluq və asayişin səviyyəsini, sosial qrupların birlik dərəcəsini qiymətləndirməyə imkan verir. Hər hansı bir davranışı qiymətləndirmək onu hansısa norma ilə müqayisə etməyi nəzərdə tutur.

Rus tədqiqatçısı M.İ. Rojkov deviant davranışların motivasiyasını sosial və psixoloji amillərlə əlaqələndirir və onları dörd əsas qrupa ayırır:

* şəxsiyyətin hüquqi və əxlaqi şüurundakı qüsurlar;

* şəxsiyyətin tələbatlarının məzmunu;

* şəxsiyyətin xarakterinin xüsusiyyətləri;

* şəxsiyyətin iradi, emosional aləminin xüsusiyyətləri [2,s.67].

Deviant davranışın əsas qiymətləndirilməsi onun real dünya ilə qarşılıqlı əlaqəsinin təhlilidir, çünki normanın əsas prinsipi insanın real mühitinə uyğunlaşma qabiliyyətidir. Bir insanın ətrafdakı reallıqla qarşılıqlı əlaqəsi beş yolla təmsil olunur: uyğunlaşma, mübarizə, ağrılı qarşıdurma, geri çəkilmə və məhəl qoyma. Gerçəkliyə müqavimət göstərməyə cəhd edən insan nifrət etdiyi reallığı məhv etməyə çalışır, şəxsi inanc və dəyərlərinə əsaslanaraq onu dəyişdirir.

Onun bütün problemləri reallıqda baş verən faktlardan qaynaqlandığı üçün məqsədinə çatmağın yeganə yolu reallıqla mübarizə aparmaq və sosial davranış normalarını pozan hərəkətlərdən maksimum fayda əldə etməkdir. Reallıqla belə qeyri-sağlam qarşıdurma psixi pozğunluqların əlamətidir. Bu sapmalara sahib olan gənclər qavrayış və anlayışının təhrif olunması səbəbindən reallığı düşmən kimi qəbul edirlər. Onlar ətrafındakı insanların hərəkətlərinin motivlərini adekvat qiymətləndirə və onları düzgün şərh edə bilməzlər.

Reallıqla qarşıdurma zamanı gənc şüurlu şəkildə reallıqla mübarizə aparır, deviant davranışı olan fərddə ağrılı qarşıdurma zamanı isə bu qarşılıqlı əlaqə variantı yeganə və məcburi hesab olunur. Məktəbdəki uyğunsuzluğu nəzərə alsaq onun ən çox yayılmış mənbəyi təbiətdə keçici olan davranışın patoloji olmayan formasıdır. Psixoloqlar hesab edirlər ki, uşaq psixikasının gənc yaşda inkişafı iki mərhələdən ibarətdir: mənfi (12-15 yaş) və müsbət (16-18 yaş).

Birinci mərhələdə gənclər özlərini başqaları ilə müqayisə etməyə çalışırlar. İkinci mərhələdə isə onların sosiallaşması baş verir. Onlar mənəvi dəyərlərlə tanış olur və həyat qaydalarını inkişaf etdirirlər [7]. Təbii ki, bu bölgü şərtlidir, lakin deviant davranışın qeyri-patoloji formasını düzəltmək üçün pedaqoji və sosial tədbirlər seçilərkən bu mərhələlər nəzərə alınmalıdır. Lakin deviant davranışın patoloji formaları müəllim və həkimlərdən iradi səylər tələb edir.

Müasir cəmiyyətdə davranışın hər iki formasının diaqnostikası çox mürəkkəb və vacibdir. Davranış reaksiyalarının patoloji təbiətini qiymətləndirmək üçün A.E. Liçko tərəfindən təklif olunan meyarlardan istifadə etmək lazımdır. Meyarlar arasında ümumiləşdirmələrə meylli pozuntuların və fərdin davranış problemlərinin getdikcə dərinləşən sosial uyğunsuzluğuna səbəb olan intensivliyi vurğulamaq olar. Patoloji formalar xarakter xüsusiyyətləri həddindən artıq intensivləşəndə və tez-tez xarakter aksentuasiyası səbəbindən təzahür edir. Belə bir vəziyyətdə başqalarına müqavimət göstərən müəyyən bir psixogen təsir növünə münasibətdə zəif tərəf aşkarlanır.

Beləliklə, deviant davranış psixi sağlamlıq və əxlaqi və etik normalardan kənara çıxan davranışlara bölünür. İkincisi, internetdə deviant davranış kimi sosial patologiyanın müxtəlif formalarında: sərxoşluqda, narkomaniyada və s. hallarda özünü göstərir. Müəyyən normaların pozulmasından asılı olaraq deviant davranış beş növə bölünür: *delikvient (qanunsuz hərəkət), addiktiv (asılılıq yaradan), patoxarakteroloji, psixopatoloji, hiper qabiliyyətli.*

***Delikvient*** (latınca – deliktum – qanunsuz hərəkət, ingiliscə – delinquency- qanunu pozma, günahkarlıq)deviasiya fərdlərin antisosial, qanunsuz davranışlarıdır ki, bunlar həm ayrı-ayrı vətəndaşlara, həm də bütünlükdə cəmiyyətə böyük ziyan vura bilər. ***Delinkvient davranış*** cinayət məsuliyyətinə cəlb olunan bir hərəkət növüdür. O, sadə əylənmək istəyi ilə təzahür edə bilər, lakin belə bir hərəkət çox ağır cəzalandırıla bilər. İnternetdə delinkvient davranışlar da geniş yayılmışdır.

***Addiktiv*** (ingiliscədən – addiction – zərərli vərdiş, meyl kimi tərcümə olunur) davranış insanın müxtəlif vasitələrin (psixikaya təsir edən farmakoloji və qeyri-farmakoloji maddələr) köməyi ilə öz real psixi vəziyyətindən qaçmağa meyl

etməsidir. ***Addiktiv davranış*** qadağan olunmuş maddələrin istifadəsində ifadə olunan zərərli vərdiş ola bilər. O, psixi vəziyyəti elə bir dərəcədə dəyişdirmək üçün nəzərdə tutulmuşdur ki, bu zaman insanda ondan fiziki asılılıq yaranır.

Müasir konsepsiyalardan birinə görə, tamamilə sağlam bir insanın vəziyyəti ilə əlil bir insanın vəziyyəti arasında keçid spektri mövcuddur. Məhz addiktiv davranış da sağlamlıqdan əlilliyə gedən yoldakı mərhələlərdən biridir.

***Addiktiv davranış*** üsullarından istifadə edilən maddələrin istifadəsi yolu ilə psixikanın vəziyyətini dəyişdirərək və ya diqqəti cəlb edən obyektlərə yönəldilməsi ilə reallıqdan qaçmaqdan asılı olmayaraq insanda intensiv emosiyalar yaranır. Bütün bunlar onu o qədər ovsunlayır ki, insan öz həyatını müstəqil idarə etməyi dayandırır, aciz qalır, çünki iradəsi zəifləyir və ona aludəçiliyə müqavimət göstərmək şansı vermir. Adətən insan ağır sosial-iqtisadi şərait, çoxsaylı sayda məyusluqlar, evdə və işdə münaqişələr, qohumlarının itkisi səbəbindən asılılıq vəziyyətində olur. Asılılıq vəziyyətinə meylli bir insanın əsas motivi darıxdırıcı, monoton, laqeyd, məmnun olmayan bir ruh halının çevrilməsidir. Monoton həyat tərzinə görə varlıq maraqsızlaşır. Asılılıq davranışı olan insanlar bəzi psixoloji xüsusiyyətlərə malikdirlər:

1. Gündəlik həyatda çətinliklərə dözümlülük azalır, lakin böhran vəziyyətləri yaxşı keçir. 2. Zahiri təzahür edən üstünlüklərlə birləşən gizli aşağılıq kompleksi meydana çıxır, sosiallıq yaranır. 3/Yalan danışmaq vərdişi yaranır. 4/ Başqalarını günahlandırmaq, onların günahı olmadığını başa düşməkdə məqsəd yaranır.

5/ Qərar verməkdən qaçmaq istəyi formalaşır.

Addiktiv (narkomanın) təbii adaptiv imkanlarının pozulmasının ilk əlaməti psixoloji diskomfortdur. Hər bir insan həyatında əhval dəyişikliyi ilə qarşılaşır, lakin hər kəs onlara fərqli reaksiya verir və öhdəsindən gəlir. Bəziləri özlərinə sahib ola bilər, həmçinin baş verənlərə görə məsuliyyət daşıya və qərar verə bilər. Bəziləri isə əhval-ruhiyyənin qısamüddətli dəyişməsinin öhdəsindən gələ bilmirlər. Bu insanlar frustrasiyaya qarşı dözümsüzdürlər, psixoloji rahatlıqlarını bərpa etmək üçün aludəçiliyi (addiktiv) seçirlər.

E.N. Podkovko asılılığın cəlbedici olduğuna inanır, çünki o, ən az müqavimət yoludur. Asılılıq mexanizmi sayəsində psixi vəziyyəti dəyişən maddələrin köməyi ilə insan öz əhvalını dəyişir. Elə buna görə də, emosional cəhətdən qeyri-sabit yaşda orta məktəb şagirdləri alkoqol, narkotik və zəhərli maddələrdən istifadə etməyə başlayırlar. Həmçinin onlar da qumar oynamağa başlayırlar [6].

Aqressiya başqa insanlara zərər vurmağa yönəlmiş fiziki və ya şifahi davranışda özünü göstərən deviant davranışın başqa bir formasıdır. O, həm birbaşa, həm də dolayı formalarda özünü göstərir. Dolayı aqressiya şəxsi düşmənçilik, sarkazm və ya istehza altında gizlənə bilər ki, bu da rəqibə təzyiq göstərir. Bu, əksər gənclərdə müşahidə olunur.

Amerikalı psixoloq Ann Darki aqressiv hərəkətlərin aşağıdakı növlərini müəyyən etmişdir: 1/ fiziki aqressiya və ya hücum; 2/ pis niyyətli dedi-qodular, zarafatlar, qəzəblənmələr, qışqırmaq, ayaqları tapdalamaq; 3/ qıcıqlanmaya meyl; 4/ neqativizm passiv müqavimətdən aktiv mübarizəyə qədər müxalifət davranış modelidir; 5/ inciklik; 6/ inamsızlıq və ehtiyatla başlayan və bütün insanların zərər vurması və ya onu planlaşdırması ilə bitən şübhə; 7/ hədə-qorxu, söyüş və s.-nin cavablarının həm forması, həm də məzmunu vasitəsilə mənfi hisslərdə ifadə olunan şifahi aqressiya.

Cinsi yetişkənlik gizli aksentuasiyanın təzahürü üçün təxribatdır. Bu zaman orta məktəb şagirdi yeniyetməlik dövrünə, yetkinliyə keçərkən yaşadığı çətinliklərdən çox təsirlənir. Bütün bunlar psixikanın, təfəkkürün və qavrayışın yenidən qurulması ilə müşayiət olunur.

Deviant davranışın təzahürləri də şəxsiyyət pozuntularıdır. Birinci növ pozuntu çətin və ya konflikt vəziyyətində olan bir insanın öz həllini tapa bilmədiyi zaman özünü göstərir. Münaqişə vəziyyətindən qaçmaq üçün o, "mən"i ilə ona travma verən mühit arasındakı əlaqəni kəsməlidir. Belə bir boşluq insanı mühitdən ayırır və son nəticədə şəxsiyyətin yadlaşmasına gətirib çıxarır. Əgər "mən"in özünün yadlaşması, öz bədəninin hissiyyatının itirilməsi, habelə hər hansı bir məlumatın mənasının itirilməsi varsa, burada şəxsiyyətsizləşmə baş verir. Şəxsiyyət pozuntusunun ikinci növü ümidsizlik vəziyyət və ruhun böhranı ilə müşayiət olunan şiddətli melanxoliya kimi başa düşülən depressiyadır. İnsan depressiya vəziyyətində olanda vaxt onun üçün çox yavaş gedir, tez yorulur və performan-

sı aşağı düşür. Şiddətli depressiya intihar cəhdlərinə səbəb ola bilər.

Gənclər arasında deviant davranışın yaranmasına təsir göstərən mühüm amillərdən biri valideynlərin övladlarının inkişafına və uğurlarına maraq göstərməməsidir. Onlar məsuliyyəti təhsil müəssisələrinin üzərinə ata bilərlər. Lakin onlar da öz növbəsində müasir gənclərin çətin problemlərinə cavabdeh olmağı bacarır, lakin həmişə onlara kömək edə bilmirlər. Valideynlərin daimi yorğunluğu və əsəbiliyi, orta məktəb şagirdinin problemlərinə biganəliyi, onların acizliyi və gələcəklə bağlı narahatlılıq kimi problemlərlə müasir gənclər qarşılaşa bilərlər.

Aparılan araşdırmalara əsasən məlum olub ki, bir çox valideynlər övladlarına qarşı aqressiv davranırlar və aqressivliyin 17%-i sərt xarakter daşıyır. Statistikaya görə, hər il 2000-dən çox gənc evdə zorakılıq səbəbindən intihara cəhd edir [7]. Son zamanlar gənclərin sağlamlığı getdikcə pisləşdiyindən və pis vərdişlər meydana çıxdığı üçün artan narahatlıq və həyəcan təbili çalınır. Bu gün orta məktəb şagirdlərinin alkoqol və narkotikdən istifadə səviyyəsi kritik səviyyədədir.

Bu tendensiya artarsa, nəticələr geri dönməz ola bilər. Gənclərin sosial uyğunsuzluğu ölkədəki həyatın sosial-iqtisadi şəraiti, əhalinin həyat səviyyəsinin kəskin aşağı düşməsi, gələcəyə dair qeyri-müəyyənlik, hərbi əməliyyatlarda iştirak təhlükəsi, insan həyatının dəyərsizləşməsi səbəbindən də yarana bilər. Yuxarıda göstərilənlərin hamısı gəncin psixikasına, xüsusən də uşaqların asanlıqla zədələnən psixikasına təzyiq göstərir.

Ümumdünya Səhiyyə Təşkilatı gənclərin ətrafdakı reallıqdan qaçmağa çalışmasının səbəblərini üç əsas qrupa ayırıb: a/ ailə problemləri, zəif tərbiyə, valideyn nümunəsi; b/ şəxsi amillər, o cümlədən narahatlıq, depressiya, emosional qeyri-sabitlik, aşağı özünüqiymətləndirmə, insanlara həddindən artıq etibar etmək və s.; c/ fərdin mənsub olduğu qrupun qəbul edilmiş davranış normalarından ibarət sosial-mədəni amillər.

Müxtəlif qurumlar tərəfindən gənclərə psixoloji yardımların göstərilməməsi istiqamətində fəaliyyətlər səmərəli şəkildə həyata keçirilmir. Bu, müxtəlif təşkilat və idarələrin qarşılıqlı fəaliyyətinin və işinin əlaqəli olmaması, gənclərə yardım göstərilməsi ilə bağlı zəif qurulmuş informasiya şəbəkəsi, pedaqoji dəstək problemlərinə kifayət qədər diqqət yetirilməməsi ilə əlaqədardır.

**Problemin aktuallığı.** Tədqiqatın aktuallığı gənclər arasında deviant davranışın yaranmasına təsir göstərən amilləri araşdırmaqdır.

**Problemin elmi yeniliyi.** Elmi məqalədə deviant davranışın səbəbləri və xüsusiyyətləri araşdırılır. Gənclərdə deviant davranışın formaları ardıcıllıqla tədqiq edilir.

**Problemin praktik əhəmiyyəti.** Məqalədən ali və orta ixtisas məktəblərinin müəllimləri, tələbələr, magistrantlar və doktorantlar istifadə edə bilərlər.

## Ədəbiyyat


1. Çələbiyev, N.Z. Ailə psixologiyası. -Bakı: Mütərcim, -2015. -422 s.
2. Воспитание трудного ребенка. Дети с девиантными поведениями. / Под ред. М.И. Рожкова -М.: Владос, -2003. -67 с.
3. Змановская, Е.В. Девиантное поведение личности и группы: учеб.пос-е. -СПб.: Питер, -2011. -352 с.
4. Ковальчук, М.А. Девиантное поведение. Профилактика, коррекция, реабилитация / М.А. Ковальчук, И.Ю. Тарханова. – Санкт-Петербург: ВладосПресс, 2010. – 288 с.
5. Максимова, Н.Ю. Психология девиантного поведения / Н.Ю.Максимова. – Москва: Лебедь, 2011. – 515 с.
6. Подковко, Е.Н. Социально-педагогические условия организации деятельности социального педагога с подростками девиантного поведения /Е.Н. Подковко, Н.Г. Селезнева // Психология, социология и педагогика. – 2012. – № 5. – С. 34-39.
7. Простяков, В.В. Психолого-педагогические причины и условия,влияющие на формирование девиантного поведения несовершеннолетних /В.В. Простяков // Юридическая психология. – 2011. – № 1. – С. 24-26.


**Redaksiyaya daxil olub:** 27.05.2025.

*UOT 159.9.*

***Xavərxanım Ağamehdi qızı Bakıxanova***
*Bakı Dövlət Universitetinin Gender və tətbiqi psixologiya kafedrasının*
*fəlsəfə doktoru proqramı üzrə doktorantı*
*https://orcid.org/0000-0002-3031-5770*
*E-mail: khaverbakikhanova@bsu.edu.az*

## SOSİO-EMOSİONAL KOMPETENSİYALAR: MÜASİR CƏMİYYƏTİN TƏLƏBLƏRİ

***Khavarkhanim Aghmehdi Bakikhanova***
*doctorial student in the program of philosophy*
*of the department of Gender and applied psychology of Baku State University*

## SOCIO-EMOTIONAL COMPETENCES: REQUIREMENTS OF MODERN SOCIETY

***Хаварханум Агамехди гызы Бакиханова***
*докторант по программе доктора философии кафедры Гендерной и прикладной психологии*
*Бакинского Государственного Университета*

## СОЦИАЛЬНО-ЭМОЦИОНАЛЬНЫЕ КОМПЕТЕНЦИИ: ТРЕБОВАНИЯ СОВРЕМЕННОГО ОБЩЕСТВА

**Xülasə.** Tarixə nəzər saldıqda şahidi oluruq ki, hər bir dövrün cəmiyyətdən müəyyən gözləntiləri, tələbləri mövcuddur. Günü-gündən müasirləşən, elm və texnologiyanın sürətlə inkişaf etdiyi dövrdə təəccüblü haldır ki, emosional amillərə tələbat artmışdır. Araşdırmalar nəticəsində məlum olmuşdur ki, hsosio-emosional kompetensiyaların diqqətə alınmaması ciddi problemlərlə nəticələnir.

Sosio-emosional kompetensiyalar dedikdə, əsasən insanların emosiya və hislərini tanımaq, idarə etmək, digərləri ilə münasibətlər yaratmaq, empatiya bacarığını inkişaf etdirmək və s. kimi amillər nəzərdə tutulur. Qeyd etsək yanılmarıq ki, bu bacarıqlar müasir dövrümüzdə istənilən sferada vacib rol oynayır. Müşahidələr zamanı məlum olmuşdur ki, sosio-emosional kompetensiyalar təkcə insanların şəxsi inkişafında müsbət rol oynamır. Eyni zamanda cəmiyyətin inkişafında da əhəmiyyətli fərqlər öz əksini tapır. Bu kimi nüanslar son dövrlərdə sosio-emosional kompetensiyalara qarşı marağı artırmışdır. Günü-gündə müasirləşən cəmiyyətimiz sosio-emosional kompetensiyalardan əsas tələbi müasir dövrün tələbələrinə cavab verən müxtəlif bacarıqlardır. Bu bacarıqlar vasitəsilə insanlar şəxsi, sosial və peşə inkişafına asanlıqla yatırım edə bilsinlər. Bunlara emosional intellekt, empatiya, ünsiyyət, problemlərin həlli və qərar vermə, stressi idarəetmə və s. kimi bacarıqları nümunə göstərə bilərik.

***Açar sözlər**: müasir, sosio – emosional kompetensiyalar, sosio-emosional öyrənmə, təhsil, inkişaf*

**Abstract.** Looking back at history, we witness that each era has certain expectations and demands from society. In an era of rapid development of science and technology, which is becoming more and more modern day by day, it is surprising that the demand for emotional factors has increased. As a result of research, it has been found that not taking socio-emotional competencies into account results in serious problems.

When we say socio-emotional competencies, we mainly mean factors such as recognizing and managing people's emotions and feelings, creating relationships with others, developing empathy skills, etc. It would not be wrong to note that these skills play an important role in any sphere in our modern era. During observations, it has become clear that socio-emotional competencies play a positive role not only in the personal development of people. At the same time, significant differences are also reflected in the development of society. Such nuances have increased interest in socio-emotional competencies in recent times. Our society, which is becoming more and more modern day, has various skills that meet the needs of modern students. Through these skills, people can easily invest in their personal, social, and professional development. Examples of these include emotional intelligence, empathy, communication, problem-solving and decision-making, stress management, and more.

***Keywords**: modern, socio-emotional competencies, socio-emotional learning, education, development*

**Аннотация.** При взгляде на историю, мы видим, что каждая эпоха предъявляет определенные ожидания и требования к обществу. В эпоху бурного развития науки и техники, которая с каждым днем становится все более современной, удивительно, что спрос на эмоциональные факторы возрос. Исследования показали, что пренебрежение социально-эмоциональными компетенциями приводит к серьезным проблемам.

Социально-эмоциональные компетенции в основном касаются распознавания и управления эмоциями и чувствами людей, построения отношений с другими людьми, развития навыков эмпатии и т. д. Не будет ошибкой отметить, что в нашу современную эпоху навыки играют важную роль в любой сфере. Наблюдения показали, что социально-эмоциональные компетенции имеют не только положительную роль в личностном развитии людей. В то же время существенные различия отражаются и на развитии общества. Подобные нюансы в последнее время усилили интерес к социально-эмоциональным компетенциям. Наше общество, которое модернизируется с каждым днем, требует различных навыков, отвечающих основным требованиям социально-эмоциональных компетенций современных учащихся. Используя эти навыки, люди могут легко инвестировать в свое личное, социальное и профессиональное развитие. К ним относятся эмоциональный интеллект, эмпатия, коммуникация, решение проблем и принятие решений, управление стрессом и т. д.

***Ключевые слова:*** *современный, социально-эмоциональные компетенции, социально-эмоциональное обучение, образование, развитие*

**Problemin aktuallığı** Sosio-emosional kompetensiyaların müasir dövrün tələbələrini qarşılaması problemi son dərəcə aktualdır. Cəmiyyətin inkişaf dinamikası qeyri-sabit olduğunu nəzərə aldıqda insanların şəxsi və sosial həyatda müəyyən uğurlara sahib olmaları üçün sosio-emosional kompetensiyalara yiyələnməkləri vacib şərtdir.

Bundan əlavə müəyyən faktlar da mövcuddur ki, problemin aktuallığını ön plana çıxarır. Bunlara cəmiyyətdə baş verən qlobal dəyişiklikləri, psixoloji sağlamlıq və stress məsələlərini, iş mühitində baş verən dəyişiklikləri, təhsil sisteminin tələbləri, ailə dinamikası, informasiya texnologiyaları və sosial medianı aid etmək olar.

Müasir dövrdə qloballaşma, mədəni fərqliliklər, daima dəyişən sosial mühit şəxsiyyətlərarası münasibətlərin və kommunikasiyanın mürəkkəb hal almasına gətirib çıxarmışdır. Müşahidələr göstərir ki, sosio-emosional kompetensiyalara yiyələnmiş şəxslər müxtəlif mədəniyyətlərin nümayəndələrinə daha yaxşı əlaqələr qura bilir. Digər tərəfdən insanların psixi sağlamlığı məsələləri xüsusilə pandemiya dövründə diqqəti cəlb etməyə başladı ki, bu da stress, əhval dəyişiklikləri, narahatlıq hissi və s. bağlı sosio-emosional kompetensiyaların inkişafının vacibliyini xatırlatdı.

Araşdırmalar sübut edir ki, ailə mühiti, təhsil və iş sahəsi olmasından asılı olmayaraq sosio-emosional kompetensiyalar bizim həyatımızın bütün sferalarında əhəmiyyətli rola malikdir. Bu təkcə sosial inteqrasiya, psixoloji sağlamlıq məsələsi hesab olunmur. Cəmiyyətin irəliləməsi, harmoniyada yaşaması üçün də olduqca labüddür. Qeyd etsək yanılmarıq ki, sosio-emosional kompetensiyaların inkişafına yatırım etməklə cəmiyyətimizin daha anlayışlı, əməkdaşlığa açıq bir mühitə çevirə bilərik.

Hər bir dövrün özünəməxsus müəyyən tələbləri var. Müşahidələr göstərir ki, müasir dövrün tələblərindən biri də sosio-emosional bacarıqların inkişaf etdirilməsidir. Gündəlik həyatda bu məsələlərin daha geniş müzakirə edilməsi və tətbiq olunması olduqca əhəmiyyətlidir.

**Problemin işlənmə dərəcəsi** barədə təbii ki, D.Goleman, P.Salovey, J.D.Mayer, B.Brown, C.Dweck, M.Borba və s. adlarını xüsusi qeyd etməliyik. D.Goleman əsərlərində iş mühiti, təhsil və sosial münasibətlərdə, P.Salovey və J.D.Mayer təhsil və sosial həyatda, B.Brown liderlikdə, C.Dweck şəxsi inkişafda, M.Borba isə uşaqların şəxsi inkişafında sosio-emosional kompetensiyaların rolunu araşdırmış və nəticələri öz əsərlərində qeyd etmişlər.

Bundan əlavə CASEL təşkilatının da adını qeyd etməliyik. Bu təşkilat sosio-emosional öyrənmə sahəsində lider hesab olunur. Təşkilat sosio-emosional öyrənmənin tətbiqi və inkişafı üzərində bir çox tədqiqatlar həyata keçirmişdir. Bu təşkilatın tədqiqatlarını nəzərdən keçirdikdə şahidi oluruq ki, sosio-emosional kompetensiyaların müasir dövrün tələbləri və təhsil sistemi ilə olan əlaqəsi barədə bir çox araşdırmaları mövcuddur.

**Məqsəd və vəzifələr**. Sosio-emosional kompetensiyaların müasir dövrün tələblərinə müsbət istiqamətdə təsirini təhlil etmək. Tədqiqatın əsasında elmi ədəbiyyatın, müxtəlif tarixi faktların təhlili durur.

**Əldə edilən nəticələr**. Müşahidələr göstərir ki, hər dövrün cəmiyyətdən özünəməxsus müəyyən tələbləri var. Təbii ki, bu tələblər coğrafi mövqe, adət-ənənə, dünyagörüşü, ekoloji mühit və s. kimi amillərdən birbaşa asılıdır. Cəmiyyətin müasir dövrün tələblərinə uyğun gəlməsi, inkişaf etməsi üçün bütün sferalarda daim təkmilləşdirmə, maarifləndirmə tədbirləri həyata keçirmək məqsədəuyğundur. Araşdırmalar nəticəsində məlum olur ki, müasir dövrün sosio-emosional kompetensiyalardan bir sıra tələbləri, gözləntiləri mövcuddur. Bunlar aşağıdakılardır:

- Emosional intellekt
- Empatiya
- Problemlərin həlli və qərar vermə
- Stressi idarəetmə bacarığı
- İşbirliyi və komanda işinə yanaşma
- Şəxsi inkişaf və özünü idarəetmə

Digər tərəfdən müşahidələr göstərir ki, sosio-emosional kompetensiyalar xüsusilə uşaqların və gənclərin həyatında uğurlu gələcək üçün əsas amillərdir.

Araşdırmalar göstərir ki, sosio-emosional kompetensiyaların inkişaf etdirilməsi müəyyən müsbət təsirlərlə nəticələnir. Bunlar aşağıdakılardır:

**Yüksək şəxsi rifah:** Məlum olduğu kimi sosio-emosional kompetensiyalara yiyələnmiş insanlar öz emosiyalarını və hislərini daha yaxşı tanımaq, idarə etmək bacarıqlarına sahib olduqları üçün həyat keyfiyyətlərini müsbət istiqamətə daha asanlıqla dəyişə bilirlər.

**Güclü şəxsiyyətlərarası münasibətlər:** Adından da göründüyü kimi sosio-emosional kompetensiyalar bir başa uğurlu şəxsiyyətlərarası münasibətlərin qurulmasına xidmət edir.




*Şəkil 1.1. Sosio-emosional kompetensiyaların inkişaf etdirilməsilə əldə edilən nəticələr*

**Təhsil və peşə inkişafı:** Araşdırmalar nəticəsində məlum olur ki, sosio-emosional kompetensiyaların mənimsənilməsi və inkişafı təhsil müəssisələri və iş mühitində daha effektiv nəticələr əldə edilməsilə nəticələnir. Təsadüfi deyil ki, sosio-emosional kompetensiyalara yiyələnmiş şəxslər çalışdıqları müəssisələrdə liderlik bacarıqları ilə seçilirlər.

**Sosial mühitlərə daxil olma:** Sosio-emosional bacarıqlar vasitəsilə bir çox insanlar fikirlərini daha asan ifadə etdikləri üçün müxtəlif sosial mühitlərə daxil olmaq onlara narahatlıq yaratmır. Bu müsbət keyfiyyətlər nəticəsində əlaqələrini genişləndirməyə nail olurlar.

**Problemlərin uğurlu həlli:** Məlum olmuşdur ki, sosio-emosional kompetensiyalara yiyələnmiş şəxslərin analitik düşünmə qabiliyyətlərinin üstün olması nəticəsində daha uğurlu qərarlar qəbul edirlər.

Müşahidələr göstərir ki, sosio-emosional kompetensiyaların inkişaf etdirilməsi üçün ən uyğun mühit təhsil müəssisələridir qeyd etsək yanılmarıq. Bir çox mütəxəssislər qeyd edirlər ki, hətta baxça dövründən uşaqlara sosio-emosional kompetensiyalar mənimsədilməsi həmin şəxslər növbəti təhsil həyatlarında digər təhsilalanlardan müsbət mənada fərqlənmələri ilə nəticələnir.

Təhsil sistemində sosio-emosional kompetensiyaların tətbiqi ilə bağlı müxtəlif strategiyalar mövcuddur. Bunlar arasında əsasən aşağıda qeyd olunanlar daha effektiv hesab olunur:

❖ **Tədris planlarına inteqrasiya:** Bir çox mütəxəssislər sosio-emosional kompetensiya bacarıqlarının mənimsədilməsi və inkişaf etdirilməsi üçün sosio-emosional öyrənmə proqram-

larının tədris planlarına əlavə edilərək digər fənlər kimi tədris olunmasının vacibliyini qeyd edirlər.

❖ **Təlimçilərin təkmilləşdirilməsi:** Bildiyimiz kimi, təhsil sistemimizdə dəqiq elmlərə daha çox önəm verilir. Rəsm, musiqi, idman, əmək və s. kimi şagirdlərin mənəvi rahatlıq tapa biləcəyi fənlərə isə təəssüflər olsun ki, ciddi yanaşılmır. Bu kimi amilləri nəzərə alaraq mütləq şəkildə müəllimlər sosio-emosional öyrənmə sahəsində maarifləndirilməlidirlər. Hətta xüsusi təlimlərin təşkil olunması daha məqsədəuyğun hesab olunur.

❖ **İnteraktiv təlim metodları:** Müşahidələr göstərir ki, interaktiv təlim metodları sosio-emosional kompetensiyaların inkişafı üçün əhəmiyyətli rola malikdir. Bildiyimiz kimi interaktiv təlim metodlarının əsasını qrup işi təşkil edir. Araşdırmalar sübut edir ki, hətta qrup şəklində dördlük halında qarşı-qarşıya əyləşmək belə sosio-emosional kompetensiyaların inkişafına müsbət təsirə malikdir.

❖ **Ailələrlə iş:** Təbii ki, hər şey ailədə başlayır. Valideynlər uşaqların sosio-emosional bacarıqlarını müxtəlif oyunlar, gəzintilər təşkil etməklə, nağıllar vasitəsilə inkişaf etdirməsi labüddür. Ailədə qoyulan bünövrənin təhsil müəssisələrində tətbiq olunan metodlarla təkmilləşdirilməsi daha effektiv nəticələrin əldə olunmasına gətirib çıxarır.

❖ **Müxtəlif proqramların təşkili:** Araşdırmalar göstərir ki, müxtəlif sosial fəaliyyətlər, oyunlar, yaradıcılıq layihələri sosio-emosional kompetensiyaların inkişafında əhəmiyyətli rola malikdir.

**Problemin elmi yeniliyi**. Təhsil sistemində icra olunan müxtəlif layihələr vasitəsilə sosio-emosional kompetensiyaların inkişaf etdirilməsinə diqqət cəlb edilmişdir. Ölkəmizin heç bir yeniliklərdən geri qalmadığını nəzərə alsaq yaxın gələcəkdə müxtəlif araşdırmaların işıq üzü görəcəyi danılmazdır.

**Problemin praktik əhəmiyyəti.** Məqalədə irəli sürülən elmi-nəzəri fikirləri, texnikaları müəllimlər tərəfindən gündəlik dərs praktikasında şagirdlərin fəallığının artırılmasında, təhsil işçiləri, praktik psixoloqlar, valideynlər, bu sahədə tədqiqat aparan elmi işçilər öz fəaliyyətlərində istifadə edə bilərlər.

**Nəticə** olaraq qeyd edə bilərik ki, sosio-emosional kompetensiyalar müasir dövrün tələblərini qarşılamaqda əsas vasitədir. Müasir cəmiyyət sosio-emosional kompetensiyaların inkişafını tələb edir. Buna səbəb bu kompetensiyaya yiyələnmiş şəxslərin daha anlayışlı, empatik, əməkdaşlığa, ünsiyyətə meylli, yüksək idarəetmə qabiliyyətinə malik olurlar.

Müasir dövrdə qloballaşma, mədəni fərqliliklər, daima dəyişən sosial mühit şəxsiyyətlərarası münasibətlərin və kommunikasiyanın mürəkkəb hal almasına gətirib çıxarmışdır. Müşahidələr göstərir ki, sosio-emosional kompetensiyalara yiyələnmiş şəxslər müxtəlif mədəniyyətlərin nümayəndələrinə daha yaxşı əlaqələr qura bilir. Digər tərəfdən insanların psixi sağlamlığı məsələləri xüsusilə pandemiya dövründə diqqəti cəlb etməyə başladı ki, bu da stress, əhval dəyişiklikləri, narahatlıq hissi və s. bağlı sosio-emosional kompetensiyaların inkişafının vacibliyini xatırlatdı.

Sosio-emosional kompetensiyaların mənimsədilməsi üçün ən uyğun mühit təbii ki, təhsil müəssisələridir. Araşdırmalardan məlum olur ki, bu barədə aşağı yaşlarından uşaqlara məlumat verilməli, oyunlar və nağıllar vasitəsilə kompetensiyalar mənimsədilməlidir. Təhsil müəssisələri sürətlə dəyişən və inkişaf edən dövrün tələblərinə uyğun nəsillərin yetişdirməsi labüddür. Bu prosesdə sosio-emosional kompetensiyaların mənimsədilməsi məqsədəuyğundur.

**Ədəbiyyat**


1. Brown, B. Dare to Lead/ Random House -2018. -332 s.
2. Goleman, D. Emotional İntelligence/ Bloomsbury Publishing – 1996. -249 s.
3. Mischel, W. The Marshmallow Test: Mastering Self-Control/ Little, Brown and Company – 2014. -256 s.
4. Salovey, P., Mayer, D. Emotional İntelligence/ Baywood Publishing -1990. – s. 185-211
5. Susanne, A. Plays Nice With Others: Social Emotional Learning and Academic Success. / - Early Education and Development, - 2010. № 5, - s. 652-680
6. Tuomi, I. (2022). Artificial intelligence, 21st century competences, and socio emotional learning in education: More than high-risk? / European Journal of Education – 2022. 57 № 4 , - s. 601-619.
7. https://biaz.ucoz.net/publ/metodiki_bolm/i_nformatika/muasir_dovrd_h_yatin_t_l_bl_ri_v_t_limin_m_qs_dl_ri/14-1-0-214
8. https://aztehsil.com/qt/499-masir-dvrd-hyatn-tlblri-v-tlimin-mqsdlri.html
9. https://virtualkitabxana.wordpress.com/wp-content/uploads/2015/11/zulfiyye_veysova-compressed.pdf
10. https://arti.edu.az/2023/07/25/sagirdyonumlu-t%C9%99lim-n%C9%99dir/


**Redaksiyaya daxil olub:**20.05.2025

*UOT 159.9.*

***Mənsur Sərdar oğlu Xaspoladov***
*“Viqas” psixoloji və nitq inkişaf mərkəzinin psixoloqu*
*https://orcid.org/0000-0002-8607-4996*
*E-mail:xmensur@mail.ru*
*https://doi.org/10.69682/arti.2025.92(3).238-245*

# AUTİZM SPEKTR POZUNTULU UŞAQLARIN İNTELLEKTUAL İNKİŞAFININ PSİXOLOJİ PROBLEMLƏRİ

***Mansur Sardar Haspoladov***
*psychologist of the Center for psychological and speech development "Vigas"*

# PSYCHOLOGICAL PROBLEMS OF INTELLECTUAL DEVELOPMENT IN CHILDREN WITH AUTISM SPECTRUM DISORDER

***Мансур Сардар оглы Хасполадов***
*психолог Центра психологического и речевого развития «Вигас»*

# ПСИХОЛОГИЧЕСКИЕ ПРОБЛЕМЫ ИНТЕЛЛЕКТУАЛЬНОГО РАЗВИТИЯ ДЕТЕЙ С РАССТРОЙСТВОМ АУТИСТИЧЕСКОГО СПЕКТРА

**Xülasə.** Autizm Spektr Pozuntusu (ASP) sosial ünsiyyət pozuntuları, təkrarlanan davranışlar və sensor həssaslıqlarla xarakterizə olunan nevroinkişaf pozuntusudur. ASP-li uşaqlarda intellektual inkişaf əhəmiyyətli dərəcədə fərqlənir və bu, onların təhsil və psixoloji uyğunlaşma prosesində çətinliklərə səbəb olur. Bu məqalə, ASP-li uşaqların intellektual inkişafına təsir edən əsas psixoloji problemləri, o cümlədən sosial təcrid, emosional tənzimləmə çətinlikləri, koqnitiv elastikliyin məhdudluğu və sensor emal problemlərini araşdırır. Bundan əlavə, fərdiləşdirilmiş təhsil planları, koqnitiv-davranış terapiyası, sosial bacarıq təlimləri və sensor inteqrasiya terapiyası kimi effektiv müdaxilə strategiyalarına diqqət yetirilmişdir. Bu psixoloji çətinliklərin çoxşaxəli yanaşma ilə həll edilməsi, ASP-li uşaqların öyrənmə nəticələrini və ümumi həyat keyfiyyətini əhəmiyyətli dərəcədə yaxşılaşdıra bilər.
***Açar sözlər:*** *autizm Spektr Pozuntusu, İntellektual İnkişaf, Psixoloji Problemlər, Təhsil Müdaxilələri, Koqnitiv-Davranış Terapiyası*

**Abstract.** Autism Spectrum Disorder (ASD) is a neurodevelopmental condition characterized by impairments in social communication, repetitive behaviors, and sensory sensitivities. Intellectual development in children with ASD varies significantly, leading to challenges in education and psychological adaptation. This article examines the key psychological issues affecting the intellectual development of children with ASD, including social isolation, emotional dysregulation, cognitive flexibility limitations, and sensory processing difficulties. Furthermore, it explores effective intervention strategies such as individualized education plans, cognitive-behavioral therapy, social skills training, and sensory integration therapy. Addressing these psychological challenges through a multi-faceted approach can significantly enhance the learning outcomes and overall quality of life for children with ASD.
***Keywords:*** *Autism Spectrum Disorder, Intellectual Development, Psychological Challenges, Educational Interventions, Cognitive-Behavioral Therapy.*

**Аннотация.** Расстройства аутистического спектра (РАС) – это нарушение нейроразвития, характеризующееся нарушением социальной коммуникации, повторяющимся поведением и сенсорной чувствительностью. Интеллектуальное развитие детей с РАС значительно варьируется, что приводит к трудностям в образовании и психологической адаптации. В данной статье рассматриваются ключевые психологические проблемы, влияющие на интеллектуальное развитие детей с РАС, включая социальную изоляцию, эмоциональную дисрегуляцию, ограничения когнитивной гибкости и

трудности обработки сенсорной информации. Кроме того, исследуются эффективные стратегии вмешательства, такие как индивидуализированные образовательные планы, когнитивно-поведенческая терапия, тренировки социальных навыков и сенсорная интеграционная терапия. Решение этих психологических проблем с использованием многоаспектного подхода может значительно повысить успеваемость и общее качество жизни детей с РАС.

***Ключевые слова:*** *расстройства аутистического спектра, интеллектуальное развитие, психологические проблемы, образовательные вмешательства, когнитивно-поведенческая терапия*

Autizm Spektr Pozuntusu (ASP) sosial qarşılıqlı əlaqə, ünsiyyət və davranış çətinlikləri ilə müşayiət olunan kompleks nevroinkişaf pozuntusudur (American Psychiatric Association, 2013). ASP-li uşaqların intellektual inkişafı fərqli səviyyələrdə müşahidə olunur: bəziləri ortalama və ya üstün intellekt göstəricilərinə malikdir, digərləri isə intellektual gerilik yaşayır (Lord və başq., 2020). ASP ilə əlaqəli kognitiv və psixoloji çətinliklər onların öyrənmə prosesinə əhəmiyyətli təsir göstərir və fərdiləşdirilmiş təhsil və terapevtik müdaxilələri tələb edir. Bu məqalə, ASP-li uşaqların intellektual inkişafına təsir edən psixoloji maneələri araşdırmağı və onların həlli üçün səmərəli müdaxilə strategiyalarını təklif etməyi hədəfləyir.

***İntellektual inkişafın xüsusiyyətləri autizm spektr pozuntusu olan uşaqlarda koqnitiv fərqliliklər***

Autizm spektr pozuntusu olan uşaqların intellektual funksiyaları geniş diapazonda dəyişir. Bəzi uşaqlar üstün yaddaş və analitik bacarıqlara sahib olduğu halda, digərləri əsas kognitiv tapşırıqlarda çətinlik çəkir (Happé & Frith, 2020). Araşdırmalar göstərir ki, ASP-li fərdlərin təxminən 30-50%-i intellektual geriliyə malikdir, digərləri isə normal və ya üstün intellekt göstəricilərinə sahibdir (Estes və başq., 2011).

***Koqnitiv sərtlik və öyrənmə çətinlikləri***

ASP-li uşaqların əksəriyyətində kognitiv elastiklik çətinlikləri müşahidə olunur ki, bu da onların yeni təhsil mühitlərinə və problem həll etmə tapşırıqlarına uyğunlaşmasını çətinləşdirir (Geurts və başq., 2009). Onların düşüncə tərzi çox vaxt sərt və dəyişməz olur, bu da öyrəndikləri bilikləri müxtəlif kontekstlərdə tətbiq etmələrinə mane olur.

***Yaddaş və diqqət pozuntuları***

Bəzi ASP-li uşaqlar üstün vizual yaddaşa malikdirlər, lakin sözlü işlək yaddaş və uzunmüddətli diqqət baxımından çətinlik çəkirlər (Boucher və başq., 2012). Diqqət problemləri onların yeni bilikləri mənimsəməsinə, müəllim göstərişlərini izləməsinə və dərs prosesində fəal iştirak etməsinə mane ola bilər.

Sosial koqnitiv çətinliklər

ASP-li uşaqların sosial siqnalları, üz ifadələrini və bədən dilini düzgün başa düşməməsi onların həmyaşıdları ilə qarşılıqlı münasibətlərini və qrup öyrənməsinə inteqrasiyasını çətinləşdirir (Mundy, 2018).

***İntellektual inkişafda psixoloji problemlər. Sosial təcrid və ünsiyyət maneələri***

ASP-li uşaqlar sosial qarşılıqlı əlaqə qurmaqda çətinlik çəkirlər. Bu, onların həmyaşıdları tərəfindən qəbul edilməməsinə və təcrid olunmasına səbəb ola bilər ki, bu da onların akademik motivasiyasına və təhsil fəaliyyətlərinə mənfi təsir göstərir (Bauminger & Kasari, 2000).

***Emosional tənzimləmə çətinlikləri***

ASP-li uşaqlarda yüksək emosional reaktivlik, təşviş, qəzəb və emosional tənzimləmədə çətinliklər müşahidə edilir. Bu emosional pozuntular onların kognitiv funksiyalarına və ümumi intellektual inkişafına mənfi təsir edir (Mazefsky və başq., 2013).

Özünüdərk və Motivasiya Problemləri

ASP-li uşaqlar akademik mühitdə özlərini dərk etməkdə və motivasiya hissini qorumaqda çətinlik çəkə bilərlər. Onlar spesifik sahələrdə yüksək göstəricilər əldə edə bilsələr də, ümumi bilik sahələrinə maraq göstərməyə bilərlər (Jones və başq., 2019).




***Sensor həssaslıq*** problemləri

ASP-li uşaqlar işıq, səs və toxunuş kimi ətraf mühit stimullarına qarşı hiperhəssaslıq və ya hipohəssaslıq göstərə bilərlər. Bu sensor çətinliklər onların təhsil mühitində rahat olmasını və diqqətini cəmləməsini çətinləşdirir (Baranek

***İntellektual inkişafı dəstəkləyən müdaxilə strategiyaları***

***Fərdiləşdirilmiş təhsil planları (IEP)***

Fərdiləşdirilmiş təhsil ***planları*** (IEP) ASP-li uşaqların fərdi öyrənmə ehtiyaclarını qarşılayacaq şəkildə tərtib edilir. Bu planlar fərdi tədris metodları, adaptiv texnologiyalar və şəkil əsaslı ünsiyyət sistemləri kimi strategiyaları əhatə edir (Koegel və başq., 2012).

**Koqnitiv-davranış terapiyası (CBT)**

Koqnitiv-davranış terapiyası (CBT) ASP-li uşaqların emosional tənzimləmə bacarıqlarını inkişaf etdirmək, icraedici funksiyalarını gücləndirmək və problem həll etmə qabiliyyətlərini artırmaq üçün təsirli bir yanaşmadır (Wood və başq., 2009).

***Sosial bacarıqların inkişafı***

ASP-li uşaqlarda sosial qarşılıqlı əlaqəni inkişaf etdirmək üçün rollu oyunlar, sosial hekayələr və həmyaşıdları ilə birgə təlimlər kimi metodlar effektiv ola bilər (Bellini və başq., 2007).

***Sensor inteqrasiya terapiyası***

Bu terapiya ASP-li uşaqların sensor emal çətinliklərini idarə etməyə və ətraf mühit stimullarına daha uyğun cavab verməyə kömək edir (Pfeiffer və başq., 2011).

***Valideyn və müəllim təlim proqramları***

ASP-li uşaqlarla işləyən valideynlər və müəllimlər üçün xüsusi təlim proqramlarının tətbiqi onların daha effektiv dəstək göstərməsinə kömək edir (Kasari və başq., 2015).




***Autizm spektr pozuntusu ilə bağlı statistika və epidemiologiya***

Autizm spektr pozuntusu (ASP) son illərdə artan yayılma tezliyi ilə dünya üzrə əhəmiyyətli bir sağlamlıq məsələsinə çevrilmişdir. Dünya Səhiyyə Təşkilatının (WHO) 2020-ci il statistikaları əsasında, ASP-li uşaqların sayı hər il artır. Lakin, ASP-li uşaqların diaqnozlarının hələ də düzgün şəkildə təyin edilmədiyi və sosial stiqma səbəbindən daha çox həssas olduqları da qeyd edilməlidir. Bu vəziyyət, xüsusilə inkişaf etməkdə olan ölkələrdə daha da çətinləşir.

Dünya üzrə statistikalar:

Amerika Birləşmiş Ştatları (ABŞ): CDC (Amerika Xəstəliklərə Nəzarət və Profilaktika Mərkəzi) 2023-ci ildə yayımladığı məlumatlara görə, hər 36 uşaqdan biri ASP diaqnozu alır.

Avropa: Avropada ASP-nin yayılma tezliyi müxtəlif ölkələrdə dəyişir, lakin ümumilikdə 1-2% arasında olduğu bildirilir.

Afrika və Asiya: Bu regionlarda, xüsusən də inkişaf etməkdə olan ölkələrdə ASP diaqnozu daha azdır və genetik məlumatların olmaması və diaqnoz metodlarının qeyri-kafi olması səbəbindən bu sahədə dəqiq məlumat tapmaq çətindir.

Yerli statistika və vəziyyət:

Azərbaycanda, ASP-li uşaqların sayı hələ də tam olaraq müəyyən edilməyib. Bununla belə, qeyri-hökumət təşkilatları və psixoloqların apardığı tədqiqatlar bu növ pozuntuların artdığını göstərir.

Azərbaycanda məktəbəqədər və məktəb yaşlı uşaqlar üçün müvafiq təhsil dəstək xidmətlərinin inkişafı sahəsində son illərdə mühüm irəliləyişlər müşahidə olunur.




**Autizmin səbəbləri və risk amilləri**

Autizm Spektr Pozuntusunun dəqiq səbəbləri hələ də tam başa düşülməyib, lakin genetik, bioloji və ətraf mühit faktorları bu pozuntunun inkişafına mühüm təsir göstərir. Bu faktorlar müxtəlif səviyyələrdə ASP-nin yaranmasında rol oynaya bilər.

***Genetik amillər***:

ASP-nin genetik meylliliyi çoxsaylı tədqiqatlarla təsdiqlənmişdir. Ailə üzvləri arasında oxşar diaqnozların tez-tez rast gəlinməsi genetik təsirin olduğuna işarə edir.

Autizmli uşaqların 60-90%-i genetik meyllilikdən təsirlənir.

Həmçinin, ASP-li uşaqların valideynlərində və yaxın qohumlarında da autizm, şizofreniya və digər nevroinkişaf pozuntuları daha çox rast gəlinir.

Tədqiqatçılar, ASP ilə əlaqəli SHANK3, NRXN1 və MECP2 kimi genləri müəyyən ediblər.

***Ətraf mühit amilləri***:

Autizmli uşaqlarda ətraf mühit amilləri də mühüm rol oynayır. Bu amillər prenatal (hamiləlik dövründə) və postnatal (doğum sonrası) faktorlar olaraq iki qrupa bölünür.

Prenatal risklər:

Hamiləlik dövründə infeksiyalar və toksinlər: Hamiləlik zamanı infeksiyalar və ya toksik maddələrə məruz qalma, məsələn, zika virusu, rübella və ya toksinlər autizm riskini artırır.

Fol turşusu çatışmazlığı: Fol turşusunun aşağı səviyyələri hamiləlikdə autizm inkişafına səbəb ola bilər.

Yüksək yaşda hamiləlik: Ananın yaşının 35-dən yuxarı olması riski artırır.

Postnatal risklər:

Erkən doğuş və aşağı doğum çəkisi ASP riskini artıra bilər.

Ailə daxili amillər: Ailədə yüksək stress səviyyəsi və uşağa lazımi diqqətin verilməməsi də mühit faktorları arasında yer alır.

***Autizmin diaqnostik meyarları və qiymətləndirilməsi***

Autizm spektr pozuntusunun diaqnozu DSM-5 (Ruh Xəstəliklərinin Diaqnostik və Statistik Təlimatı) və ICD-11 (Beynəlxalq Xəstəliklər Təsnifatı) ilə müəyyən edilir. ASP diaqnozu qoyularkən, uşağın sosial ünsiyyət və davranışlarına, həmçinin sensor xüsusiyyətlərinə diqqət yetirilir.

Diaqnostik ***meyarlar***:

Sosial ünsiyyət və qarşılıqlı əlaqə çətinlikləri: Uşaqlar sosial siqnalları başa düşməkdə çətinlik çəkir və əlaqələr qurmaqda çətinlik yaşayarlar.

Stereotipik davranışlar və məhdud maraqlar: Təkrarlanan hərəkətlər və spesifik mövzulara maraq göstərmə.

Sensor həssaslıqlar: Yüksək və ya aşağı həssaslıqla ətraf mühit stimullarına reaksiya vermə.

Tədqiqat metodları:

ADOS-2 (Autism Diagnostic Observation Schedule): ASP əlamətlərini müəyyən etmək və uşağın davranışlarını qiymətləndirmək üçün istifadə edilir.

CARS (Childhood Autism Rating Scale): Bu alət uşaqlarda ASP-nin şiddətini müəyyən edir və diaqnozun doğruluğunu artırır.

***Erkən müdaxilə və təhsil Strategiyaları***

ASP-li uşaqların inkişafını yaxşılaşdırmaq üçün erkən müdaxilə vacibdir. Erkən diaqnoz və müdaxilə, uşağın sosial bacarıqlarını artırmaq və özünə inamını gücləndirmək üçün əhəmiyyətli ola bilər.

***Tətbiqi davranış təhlili*** (ABA)

ABA metodu, uşaqların sosial bacarıqlarını və gündəlik həyat fəaliyyətlərini yaxşılaşdırmağa yönəlmiş bir terapiya üsuludur. Bu üsul, uşaqla qarşılıqlı əlaqədə olan şəxslərin müəyyən davranışları necə qiymətləndirib formalaşdırdığını öyrədir.

***Alternativ və artırılmış ünsiyyət sistemləri*** (AAC)

Nitq bacarığı məhdud olan uşaqlar üçün PECS (Picture Exchange Communication System) və Makaton kimi metodlar, ünsiyyətin asanlaşdırılmasına kömək edir.

Sensor integrasiya terapiyası

ASP-li uşaqların sensor çətinlikləri ilə mübarizə aparmaq və onların sensor dünyalarını daha yaxşı idarə etmək üçün bu terapiya tətbiq olunur.




***Texnoloji innovasiyalar və ASP-li uşaqlar*** üçün rəqəmsal həllər

Yeni texnologiyalar, xüsusilə virtual reallıq (VR) və artırılmış reallıq (AR) tətbiqləri, ASP-li uşaqların sosial bacarıqlarını inkişaf etdirmək üçün istifadə olunur. Texnologiya, uşaqların öyrənmə prosesini əyləncəli və daha təsirli edərək təhsil alətlərinin modernləşdirilməsini təmin edir.

NAO Robotu və Milo Robotu kimi robotlar, ASP-li uşaqlara sosial bacarıqları inkişaf etdirmək və onlarla ünsiyyət qurmaqda kömək edir.

***ASP-li fərdlərin cəmiyyətə inteqrasiyası və sosial dəstək***

Autizmli fərdlərin cəmiyyətə inteqrasiyasını təmin etmək və onların həyat keyfiyyətini artırmaq üçün inklüziv təhsil və iş imkanları vacibdir. Bunun üçün müvafiq qanunvericilik və

proqramlar hazırlanmalı, həmçinin cəmiyyətin maarifləndirilməsi və stereotiplərin aradan qaldırılması əsas məqsəd olmalıdır.

İnklüziv təhsil: Təhsil müəssisələrində ASP-li uşaqlar üçün xüsusi siniflər və dərslər təşkil edilməli və sosial bacarıqlarına uyğun tədris metodları tətbiq olunmalıdır.




**Nəticə**

ASP-li uşaqların intellektual inkişafı çoxsaylı psixoloji və koqnitiv faktorlarla müəyyən edilir. Sosial çətinliklər, emosional tənzimləmə problemləri və sensor emal çətinlikləri onların akademik müvəffəqiyyətinə əhəmiyyətli dərəcədə təsir göstərə bilər. Bununla belə, fərdiləşdirilmiş təhsil planları, koqnitiv-davranış terapiyası və sosial bacarıqların inkişaf etdirilməsi kimi müdaxilə üsulları bu uşaqların intellektual inkişafını dəstəkləyə bilər. Müəllimlər və psixoloqlar elmi əsaslı yanaşmalar tətbiq edərək ASP-li uşaqların akademik və sosial həyatlarına töhfə verə bilər, onların cəmiyyətə daha uğurlu inteqrasiyasına kömək edə bilərlər.



**Problemin elmi yeniliyi.** Autizm Spektr Pozuntusu (ASP) olan uşaqlarda intellektual inkişafın psixoloji faktorlar tərəfindən necə təsirləndiyini və effektiv müdaxilə metodlarının təsirini kompleks şəkildə araşdırır.

**Problemin praktik əhəmiyyəti.** Bu araşdırma ASP-li uşaqların təhsil və sosial adaptasiya proseslərini optimallaşdırmaq üçün fərdiləşdirilmiş terapiya və təhsil yanaşmalarının tətbiqini təşviq edir.

**Problemin aktuallığı.** ASP-nin yayılma tezliyinin artması və cəmiyyətə inteqrasiyanın çətinliyi bu sahədə yeni elmi yanaşmalara və müdaxilə metodlarına ehtiyacı artırır.

**Ədəbiyyat**


1. Baranek, G.T., David, F.J., Poe, M.D., Stone, W.L., Watson, L.R. Sensor təcrübə sorğusu: Autizm, inkişaf gecikmələri və tipik inkişaf göstərən uşaqlarda sensor xüsusiyyətlərin fərqləndirilməsi // Uşaq Psixologiyası və Psixiatriya Jurnalı. – London: Wiley, – 2006. – c. 47, № 6, – s. 591–601.
2. Bauminger, N., Kasari, C. Yüksək funksiyalı autizmli uşaqlarda təkliyə çəkilmə və dostluq münasibətləri // Uşaq İnkişafı. – Oxford: Wiley, – 2000. – c. 71, № 2, – s. 447–456.
3. Bellini, S., Peters, J.K., Benner, L., Hopf, A. Autizm spektr pozuntusu olan uşaqlar üçün məktəb əsaslı sosial bacarıq müdaxilələrinin meta-analizi // Təkmilləşdirici və Xüsusi Təhsil. – Thousand Oaks: SAGE Publications, – 2007. – c. 28, № 3, – s. 153–162.
4. Boucher, J., Mayes, A., Bigham, S. Autizm spektr pozuntusunda yaddaş // Psixoloji Bülleten. – Washington: APA, – 2012. – c. 138, №3, – s. 458–496.
5. Estes, A., Rivera, V., Bryan, M., Munson, J. Autizm spektr pozuntusu olan uşaqlarda intellektual bacarıqlar: Uzunmüddətli tədqiqatlardan əldə olunan nəticələr // Autizm Araşdırmaları. – New Jersey: Wiley, – 2011. – c. 4, № 3, – s. 185–200.
6. Geurts, H.M., Corbett, B., Solomon, M. Autizmdə koqnitiv elastikliyin paradoksu // Koqnitiv Elmlərdə Yeniliklər. – London: Elsevier, – 2009. – c. 13, № 2, – s. 74–82.
7. Happé, F., Frith, U. İllik Tədqiqat İcmalı: Keçmişə nəzər salaraq gələcəyə baxmaq – autizm anlayışının dəyişməsi və gələcək tədqiqatlara təsirləri // Uşaq Psixologiyası və Psixiatriya Jurnalı. – London: Wiley, – 2020. – c. 61, № 3, – s. 218–232.
8. Jones, W., Klin, A. Autizmli fərdlərdə sosial səhnələrdə gözlərə diqqət yetirmə // Amerika Uşaq və Yeniyetmə Psixiatriyası Akademiyasının Jurnalı. – Washington: Elsevier, – 2019. – c. 58, № 1, – s. 1–9.
9. Kasari, C., Rotheram-Fuller, E., Locke, J., Gulsrud, A. Bağlantı yaratmaq: Autizmli uşaqlar üçün sosial bacarıq müdaxilələrinin təsadüfi nəzarətli sınağı // Uşaq Psixologiyası və Psixiatriya Jurnalı. – London: Wiley, – 2015. – c. 56, № 4, – s. 411–419.
10. Koegel, R.L., Matos-Ferreira, A., Koegel, L.K. Autizmli fərdlərdə ünsiyyətin inkişaf etdirilməsi üçün müdaxilələr // Nevrologiyada Cari Baxışlar. – Philadelphia: Lippincott Williams & Wilkins, – 2012. – c. 25, № 2, – s. 187–193.


**Redaksiyaya qəbul olub:** 29.04.2025.

UOT 159.9.

***Şərafət Aram qızı Baxışova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*
*Məktəbəqədər təhsilin pedaqogikası kafedrasının dosenti,*
*pedaqogika elmləri doktoru*
*https://orcid=0000-0002-7848-2068*
*E-mail: sharafat_baxishova1960@mail.ru*

## TƏBİƏT BİZİM VƏ UŞAQLARIMIZIN GƏLƏCƏYİDİR

***Sharafat Aram Bakhishova***
*associate professor of the department of Pedagogy of preschool education at the*
*Azerbaijan State Pedagogical University,*
*doctor of pedagogical sciences*

## NATURE IS OUR FUTURE AND THE FUTURE OF OUR CHILDREN

***Шарафат Арам гызы Бахышева***
*доцент кафедры педагогики дошкольного образования*
*Азербайджанского Государственного Педагогического Университета,*
*доктор педагогических наук*

## ПРИРОДА – ЭТО НАШЕ БУДУЩЕЕ И БУДУЩЕЕ НАШИХ ДЕТЕЙ

**Xülasə.** Bütün dünya ölkələri kimi Azərbaycan da müxtəlif xarakterli ətraf mühit problemləri ilə üzləşir. Ətraf mühitin mühafizəsi zamanın tələbi ilə yaranmışdır. Təbiət və onun mühafizəsi çox geniş anlayışdır. Təbiət və təbiətin sərvətlərindən, ətraf mühitdən düzgün və səmərəli istifadə edilməsi, planetdə ekoloji tarazlığın qorunub saxlanılması, təbii ehtiyatlardan səmərəli istifadə olunması ümumbəşəri problemdir. Şübhəsiz ki, bu problemlərin həlli Azərbaycanın da qarşısında duran strateji vəzifələrdən biridir. Həmin vəzifənin öhdəsindən gəlmək üçün planlı və uzunmüddətli fəaliyyət proqramları tələb olunur.
***Açar sözlər:*** *Ətraf mühitin qorunması, təbiət, ekologiya, təbiətlə fəal ünsiyyət, mənəvi zənginlik, təbiətlə tanışlıq*

**Abstract.** Like all the countries of the world, Azerbaijan also faces various environmental problems. Environmental protection has arisen due to the demand of time. Nature and its protection is a very broad concept. Correct and efficient use of nature and nature's resources, environment, preservation of ecological balance on the planet, efficient use of natural resources is a universal problem. Undoubtedly, solving these problems is one of the strategic tasks facing Azerbaijan. To cope with that task, planned and long-term action programs are required.
***Keywords:*** *Environmental protection, nature, ecology, active communication with nature, spiritual wealth, acquaintance with nature*

**Аннотация.** Как и все страны мира, Азербайджан также сталкивается с различными экологическими проблемами. Охрана окружающей среды возникла по требованию времени. Природа и ее охрана – это очень широкое понятие. Правильное и эффективное использование природы и природных ресурсов, окружающей среды, сохранение экологического баланса на планете, эффективное использование природных ресурсов является общечеловеческой проблемой. Несомненно,

решение этих проблем является одной из стратегических задач, стоящих перед Азербайджаном. Для решения этой задачи необходимы плановые и долгосрочные программы действий.
***Ключевые слова****: защита окружающей среды, экология, природа, активное общение с природой, духовное богатство, знакомство с природой*

Yaşadığımız cəmiyyətdə sağlamlığı təmin etmək üçün ilk növbədə özümüzdən və öz ətrafımızdan başlamalıyıq. Sosial məsuliyyət hissi duymaq hər bir vətəndaşın borcudur. Biz üzərimizə düşən borcu indidən yerinə yetirməyə başlasaq, gələcəkdə daha səmərəli və sağlam şəkildə yaşaya bilərik. Gələcək nəsil isə bizim düzgün davranışlarımıza baxmaqla dünyanı yaşamaq üçün daha sağlam mühitlə təmin edəcəkdir.

Dünyada insan sağlamlığını təmin etmək üçün BMT tərəfindən bir çox işlər görülmüş, Ümumdünya Səhiyyə Təşkilatı yaradılmış və Minilliyin İnkişaf Məqsədlərində əsas meyarlardan biri kimi prioritetləşdirilmişdir. Sağlamlıqla bağlı əsas problemlər inkişaf etmiş və inkişaf etməkdə olan ölkələrdə baş verdiyindən, əsas diqqət onlara verilməkdədir.

Minilliyin İnkişaf Məqsədlərində 7-ci ətraf mühitin qorunması və 8-ci məqsədi inkişaf üçün qlobal əməkdaşlığı artırmaqdır. Bunların hər ikisində insan sağlamlığına böyük önəm verilir. Bura daxil olan hədəflərə insanların təmiz içməli su ilə təmin olunması, sanitariyanın artırılması, davamlı şəkildə lazımı dərmanlara əlçatanlığın artırılması daxildir.

Göründüyü kimi bu hədəflərin çoxu insan sağlamlığına və səhhətinə yönəlmişdir. Bu hədəflərə əsasən dünya əhalisi bərabər şəkildə sabit və davamlı tibbi xidmətə malik olmalı və xəstəliklərdən qorunmalıdır. Bunlara nail olmaq üçün bütün ölkələrin diqqətini sağlamlıq məsələlərinə yönəltmək və davamlı tibbi xidmət göstərən keyfiyyətli səhiyyə sistemlərini qurmaq vacibdir.

İnsanlara, onların sağlamlığı üçün sağlam və təhlükəsiz ətraf mühit zəruridir. Azərbaycan Respublikasının Konstitusiyasının 39-cu maddəsinə əsasən, hər kəsin sağlam ətraf mühitdə yaşamaq hüququ vardır. Həmçinin "Əhalinin Sağlamlığının qorunması haqqında" Azərbaycan Respublikasının Qanununun 3-cü Maddəsinə əsasən, əhalinin sağlamlığının qorunması sahəsində dövlətin vəzifələrindən biri ətraf mühitin qorunmasının, ekoloji təhlükəsizliyin təmin edilməsidir [1].

Ekoloji tarazlığın pisləşməsinə gətirib çıxaran ən vacib təhlükələrdən biri, yaşıl sahələrin tədricən azaldılmasından sonra atmosferə salınan zərərli qazların konsentrasiyasıdır. Qlobal istiləşmə insan, heyvan, bitki, qısacası bütün canlı orqanizmlərə pis təsir edir. Əhəmiyyətli təhlükələrə məruz qalan canlı orqanizmlər ekoloji tarazlıqdakı bu dəyişikliklərlə ciddi sağlamlıq problemlərinə məruz qala bilərlər.

Fizika üzrə Nobel mükafatçısı Nils Borun sözləri çox ibrətamizdir: "Bəşəriyyət atom bombası, saysız müharibələr və epidemiyalardan məhv olmayacaq. O, özünü öz tullantıları və zibilləri altında dəfn edəcək"[6].

Ətraf mühitin qorunması üzrə ictimai təşkilatlar cəmiyyəti fəal şəkildə məsuliyyətli olmağa, ehtiyatlardan düşünmədən istifadənin və ətraf mühitin çirklənməsinin mümkün nəticələri barədə düşünməyə çağırır.

Təbiət və təbiətin sərvətlərindən, ətraf mühitdən düzgün və səmərəli istifadə edilməsi, planetdə ekoloji tarazlığın qorunub saxlanılması, təbii ehtiyatlardan səmərəli istifadə olunması ümumbəşəri problemdir. Şübhəsiz ki, bu problemlərin həlli Azərbaycanın da qarşısında duran strateji vəzifələrdən biridir. Həmin vəzifənin öhdəsindən gəlmək üçün planlı və uzunmüddətli fəaliyyət proqramları tələb olunur.

Antuan de Sent-Eksüperi deyirdi ki, "biz hamımız Yer kürəsi adlı gəminin sərnişinləriyik. Deməli, bizim minəcək başqa nəqliyyat vasitəmiz yoxdur"[5].

Bu gün uşaqların tərbiyəsində ekoloji tərbiyəni nəzərə almaq xüsusilə vacib məsələlərdəndir. Çünki təbiətlə tanışlıq ən kiçik yaşlardan başlayır. Məhz təbiət uşaqların ilk tərbiyəçisi sayılır. Russoya görə, uşağın tərbiyəsi təbiətə uyğun olmalıdır. Russo uşağın təbiətəmüvafiq təbii tərbiyəsini irəli sürmüşdür. Bu o deməkdir ki, tərbiyə uşağın təbiətini və yaş xüsusiyyətlərini nəzərə almalıdır. Russo yazırdı: "Təbiət tələb edir ki, uşaqlar böyük olmazdan əvvəl, uşaq olmalıdırlar"[4].

Russonun fikrincə, uşaqlar tərbiyəni üç mənbədən: təbiət, əşya və insanlardan alır. Təbiət vasitəsilə tərbiyə insanın qabiliyyətlərini, hiss orqanlarını inkişaf etdirmək, əşya və hadisələrlə tərbiyə uşaq şəxsiyyətinə onu əhatə edən mühit-

lə təsir etmək deməkdir. İnsanlarla tərbiyə isə uşaq şəxsiyyətinə müəyyən məqsədlə edilən pedaqoji təsirlərdir. Russoya görə, alınan bilik və vərdişlər insanlar tərəfindən verilən tərbiyəyə daxildir. Bu üç təsir vəhdətdə həyata keçirilirsə, tərbiyə işi düzgün aparılar, qarşıya qoyulmuş məqsədə tez bir zamanda nail olmaq olar. Tərbiyədə ən böyük səhv həddindən artıq tələsməkdir. Russo deyirdi ki, onun tərbiyə etdiyi Emil nə hakim, nə əsgər, nə keşiş, nə də həkim olacaq, o hər şeydən əvvəl İnsan olacaqdır.

Məktəbəqədər təhsil müəssisələrində uşaqlar təbiətlə və ətraf aləmlə tanışlıq məşğələlərində təbiət və onun mühafizəsi haqqında ilkin təsəvvürlərə yiyələnir, onlarda təbiətə məhəbbət, onu qorumağın vacibliyi fikri aşılanır. Təbiət üzərində müşahidələr uşaqların biliklərini, dünyagörüşünü, zövqünü inkişaf etdirməyə kömək göstərir.

Məktəbəqədər təhsil müəssisələrində ekologiya və insan sağlamlığı problemi ilə əlaqədar məşğələlərdə aparılan işlər asudə vaxtın təşkili və məşğələdənkənar tədbirlər yolu ilə daha da dərinləşdirilir.

Məktəbəqədər təhsil müəssisələrində uşaqlarda doğma təbiətə, ətraf mühitə məhəbbət və qayğılı münasibət, onun korlanmasına qarşı barışmazlıq hissləri aşılanır, onlarda ekoloji şüur və mədəniyyət formalaşdırılır.

Təlim və təlimdənkənar prosesdə təbiəti mühafizə üzrə zəruri bacarıq və vərdişlər formalaşdırılır, uşaqlar fəal ekoloji fəaliyyətə hazırlanır.

Ətraf mühitin idarə olunması, uşaqların sağlamlığının qorunması və yaxşılaşdırılmasında gigiyenik təhsil böyük rol oynayır və çox vacib amillərdən biridir.

Məktəbəqədər təhsil müəssisələrində yerli şəraitdən asılı olaraq təbiəti mühafizə işinin müxtəlif formalarından istifadə olunur. “Ekoloji cığır”, “Ana təbiət, bayramın mübarək!” tədbirləri də bütünlüklə təbiətin qorunmasına həsr olunur ki, həmin tədbirlərdən sonra uşaqlar hətta küçə və parklarda əkilmiş gül-çiçəkləri də qorumağa vərdiş edirlər. Təbiətin dostları və gənc bağbanlar kimi tədbirlərin məktəbəqədər təhsil müəssisələrində keçirilməsini ənənə şəklinə salmaq məqsədəuyğundur.

Uşaqlar ətraf aləmlə tanışlıqda hər an müxtəlif situasiyalarla qarşılaşır. Çox vaxt qoyulmuş sual heyrət doğurur. Aristotelin təbirincə desək, “təfəkkür heyrətdən başlayır”. Ətraf aləmlə tanışlıq heyrət doğurur. Bu prosesdə uşaq heyrətdən konkret biliklərə yiyələnir, əşya və hadisələrin xüsusiyyətlərini daha dəqiq öyrənir. Məhz belə bir mühit uşaqların nitqini və təfəkkürünü daha da inkişaf etdirir. Uşağın təfəkkürü, əqli qüvvələri təbiətin qoynunda möhkəmləndirilməlidir. Bu uşaq orqanizminin təbii qanunauyğunluqlarının tələbidir. Odur ki, təbiət hər hansı gəzinti, ekskursiya, uşaq qəlbinə yol açan cığır, təfəkkür dərsidir.

Montessori pedaqoji yanaşmasına görə qrup otaqlarında mühit yaradılmalı, uşaqları inkişaf etdirməlidir. Qrup otaqları müəyyən vəsaitlərlə zəngin olmalıdır, çünki kiçik yaşlı uşaqlar vəsaitlərdən yeni nə isə öyrənmək, hər hansı məsələni araşdırmaq üçün istifadə edə bilərlər. Tərbiyəçi-müəllimlər uşaqları onların inkişaf ehtiyaclarını qarşılamağa kömək edəcək vəsaitlərlə təmin etmək üçün müşahidələr aparırlar.

Reggio Emilia metodunda ətraf mühit uşaq-uşaq, böyük-uşaq arasında olan sosial əlaqənin göstəricisidir. Ətraf mühit elə təşkil olunmalıdır ki, burada cəmiyyət və onun dəyərləri öz əksini tapsın. Məhz bu baxımdan Reggio Emilia metodunda ətraf mühitə 3-cü müəllim deyirlər.

Məhz elə bu baxımdan da məktəbəqədər təhsil müəssisələrində ətraf aləmlə tanışlıq məşğələlərində müşahidələrə də geniş yer verilir. Adətən valideynlər və tərbiyəçi-müəllimlər belə zənn edirlər ki, uşaq bütün günü həyətdə, bağçada gəzir və hər şeyi öyrənirlər. Lakin uşaqlara gördükləri, müşahidə etdikləri haqqında izah etmək, söyləmək, nağıl qurmaq kimi tapşırıqlar verildikdə uşaqlar çətinlik çəkirlər. Bu baxımdan uşaqların müşahidəsinə istiqamət vermək vacibdir, çünki bu onların müşahidəsini daha da məzmunlu edir.

Məşhur fransız yazıçısı Jorj Sand öz xatirələrində yazır: “Mənim anam gözəl bir bulud parçasını və ya günəşin gözəl bir şəkildə batmasını, şır – şır axan suyu gördükdə məni dayandırıb deyərdi: “Bax, bu nə qədər gözəldir!” Bəlkə anam diqqətimi yönəltməklə buraxmalı olacağım bütün bu şeyləri tam gözəlliyi ilə hiss etməyə məcbur edirdi. Anamın əlində elə bil sehr açarı vardı”.

Valideynlərin az bir qismi gəzinti zamanı uşaqların diqqətini ətraf aləmdəki əşya və hadisələrə yönəldir, onların mahiyyətini öyrədir, uşaqların qarşısında müxtəlif əşya və hadisələrə

dair suallar qoyur, onların suallarına cavab verir. Gəzinti məqsədli olmalı və valideyn orada qarşıya çıxa biləcək hallara, suallara necə cavab verəcəyi üzərində əvvəlcədən düşünməlidir.

Prof. M. Muradxanov yazmışdır: "Uşağı məktəbə hazırlamaq işində ona təbiət və yaşayış haqqında suallar vermək, xüsusən təbiət hadisələri arasındakı əlaqə və asılılığa onların diqqətini cəlb etmək də çox əhəmiyyətlidir"[2].

Məktəbəqədər yaşlı uşaqların ətraf aləmdə gördükləri əşyaların adlarını yadda saxlamaları ilə qənaətlənmək olmaz. Onlar həmçinin əşyalar və hadisələr arasında müxtəlif əlaqələri müəyyənləşdirməyi də bacarmalıdırlar. Bu dövrdə uşaqlar sadəcə bioloji, fiziki, ictimai hadisələrin mahiyyətini dərk etməlidirlər. Ona görə də uşaqları canlı və cansız aləmin müxtəlif sahələrinə daxil etmək lazımdır.

Məktəbəqədər dövrün vəzifəsi bir tərəfdən uşağı məktəb proqramına yaxınlaşdırmaq, digər tərəfdən onun özünün maraq dairəsinə, səviyyəsinə, ehtiyacına uyğun proqram yaratmasına imkan verməkdir. Uşaq müstəqilliyə alışmaqla yanaşı, yeni biliklərə, bacarıqlara yiyələndiyini də dərk etməlidir.

Uşaqların inkişafında və tərbiyəsində müxtəlif vasitələr mövcuddur. Onlardan ən başlıcası təbiətlə tanışlıqdır. Təbiət mənəvi zənginlik üçün tükənməz mənbədir. Uşaqlar daima bu və ya digər formada təbiətlə ünsiyyətdə olurlar. Onları yaşıl düzənliklər, çaylar, meşələr, quşlar, böcəklər, kəpənəklər, heyvan və müxtəlif təbiət hadisələri daima cəlb edir. Bu da uşaqlarda əməyə, bədii fəaliyyətə, canlı maraq oyadır, onları oyuna cəlb edir və inkişafları üçün zəngin qida verir. Meşədə, göldə, çay kənarında, oyun, göbələk, giləmeyvə yığmaq, çiçək toplamaq, heyvan və bitkilərin müşahidəsi uşaqlara şən, həyəcanlı anlar bəxş edir.

Ümumiyyətlə, insanlar uşaqlıqda aldıqları təəssüratları, xatirələri unutmur, ömür boyu yaşadırlar. Təbiətə məhəbbət, uşaqlıqda oynadığı yerlərə bağlılıq, onlarda öz doğma yurduna, təbiətə, vətənə məhəbbət hissi yaradır. Uşaqlarda vətənpərvərlik tərbiyəsi inkişaf edir. Təbiətlə tanışlıq prosesi idrak prosesinin mühüm bir mərhələsi kimi bu prosesin bir sıra məsələlərini özündə əks etdirir. Təbiətlə fəal ünsiyyət prosesində uşaq özünü canlı təbiətin üzvü, bir parçası kimi dərk etməklə, təbiətə fəal müdaxilənin mümkünlüyünü dərk edir. Dibçəkdə çiçək əkmək, ona su vermək, torpağını yumşaltmaq, heyvanlara, akvariumdakı balıqlara qulluq etmək prosesində uşaqlarda təbiətə qayğılı münasibət formalaşdırırıq.

Məktəbəqədər yaşlı uşaqların ətraf aləmdə dəfələrlə gördükləri əşyalar haqqında söhbətlər aparıldıqda, onlar həmin əşyaların adlarını sadalamaqla kifayətlənirlər. Bir çox hallarda uşaqların diqqəti aydın, parlaq, hərəkətdə olan əşyaya yönəldiyindən qavrayışları məhdudlaşır. Təəssüf ki, valideyn və tərbiyəçi-müəllimlər də bununla razılaşırlar. Əşya və hadisələrin adlarını bilmək, onları bir-birindən fərqləndirmək hələ işin başlanğıcıdır. Onların mahiyyətinin dərk olunması üçün uşaqları müşahidəçiliyə alışdırmaq lazımdır. Bunun üçün uşaq valideynin, tərbiyəçi-müəllimin rəhbərliyi və köməkliyi ilə hər hansı bir əşyanın hissələrini görməyi, onların adlarını və vəzifələrini müəyyənləşdirməyi bacarmalıdır. Uşaq ağac üzərində müşahidə aparırsa, onun gövdəsinin, budaqlarının, yarpağının, meyvəsinin böyüklüyünə, formasına, rənginə, ətrafda olan digər ağaclardan nəyinə görə fərqlənməsinə fikir verməlidir. Müşahidə prosesində uşaq əşyaya əl vurub sığallamaqla, onun kələkötür, tikanlı, isti, soyuq, quru, yaş, yapışqanlı, bərk, yumşaq olduğunu, dadına baxıb, şirin, acı, turş, şit, meyxoş olduğunu, iyləyib, ətirli, üfunətli və sair olduğunu müəyyən etdikdən sonra onu tanıyır, dərk edir, başqalarından fərqləndirə bilir. Belə müşahidə "təhliledici müşahidə" adlanır. Məhz təhliledici müşahidə uşağı müşahidəçiliyə alışdırır, nəticədə onun təfəkkürünü və nitqini inkişaf etdirir.

Məktəbəqədər yaşlı uşaqların ətraf mühit və təbiətlə tanış edilməsinin əsas vəzifələrinin aşağıdakı kimi müəyyənlədirilməsi məqsədəuyğundur:

a) uşaqların ətraf aləm haqqında bilik, bacarıq və vərdişlərə yiyələnməsi. Uşaqlara milli – mənəvi dəyərlərdən istifadə etməklə ictimai həyat hadisələri haqqında məlumatlar vermək;

b) uşaqlarda ictimai aləmə və təbiətə obyektiv münasibət tərbiyə etmək. Onlarda öz xalqının ictimai həyat hadisələrinə milli özünəqayıdış vaxtında qiymətləndirmə bacarığı tərbiyə etmək;

c) uşaqlarda yaşlıların təsərrüfat, təbiətdəki əməyinə məhəbbət və sadə əmək bacarıqları tərbiyə etmək;

d) uşaqlara Vətənin ictimai həyatında və təbiətdəki gözəlliklərini görmək və qiymətləndirmək bacarığını aşılamaq;

e) uşaq şəxsiyyətinin ətraf aləm faktorlarının müsbət təsirləri nəticəsində formalaşdırılması.

Məktəbəqədər yaşlı uşaqların təbiətlə tanış edilməsi onların idrak maraqlarının inkişafında əsas rol oynayır. Ətraf aləm və təbiətlə tanışlığa aid ilk biliklərə yiyələnmə uşaqların əqli tərbiyəsi ilə yanaşı, həm də əxlaqi və estetik tərbiyəsinin mənbəyi hesab olunur. Uşaqların əqli cəhətdən məktəb təliminə hazırlanmasında təbiət və ətraf mühit mühüm vasitədir. Nahaq yerə demirlər ki, "Təbiət insanın ilk müəllimidir". Uşaqlar kiçik yaşdan təbiətlə təmasda olmasa, tərbiyə-təlimdə ondan istifadə edilməsə onların hərtərəfli inkişafının qarşısında duran vəzifələri həll etmək olmaz. Məktəbəqədər təhsil müəssisələrində uşaqların hərtərəfli inkişafının qarşısına vəzifələr qoyulur ki, bunlar da birbirilə sıx əlaqədardır. Təbiət uşağın təfəkkürünü fəaliyyətə gətirir. Cisim və hadisələrin mahiyyətini, onların arasındakı mühüm əlaqə və münasibətləri əks etdirən, varlığın insan beynində ümumiləşmiş inikası olan təfəkkür prosesində uşaqlar qavranılmış cisimlər qrupuna aid ümumi, həm də mühüm cəhətləri ayırır və onları sözlərlə ifadə edirlər.

K.D. Uşinski əbəs yerə deməmişdir ki, "Nitqdə məntiqi nə varsa, o, insanın təbiət üzərində müşahidələrindən irəli gəlir"[3]. Əqli tərbiyənin əsas vəzifəsi uşaqlara cansız təbiət əşyaları, canlı təbiət və təbiət hadisələri, obyektləri arasında əlaqələr haqqında biliklərin təlim edilməsidir. Əqli tərbiyənin ayrılmaz hissəsi olan sensor tərbiyədir. Uşaqlar tərəfindən biliklərin mənimsənilməsi onların idrak qabiliyyətlərinin inkişafı ilə sıx bağlıdır.

Təfəkkürün inkişafı üçün uşaqları təbiət hadisələri və əşyaları ilə tanış etmək lazımdır. Uşaqlar təbiət hadisələri arasında əlaqə və münasibətlərin səbəblərinin dərk edilməsi təfəkkürün inkişafına təsir edir, onu formalaşdırır. Təbiət hadisələrinə məqsədyönlü müşahidələri – müşahidəçiliyi öyrətməklə onlarda diqqəti inkişaf etdiririk ki, bu da əqli inkişafla sıx əlaqədardır və uşaqların təlimə hazırlanmasının şərtidir. Əlbəttə, uşaqlarda təbiətə maraq tərbiyə etmək çox vacibdir. Bitki və heyvanları müşahidə edərkən uşaqların diqqətini onların xarici görünüşünə, hərəkətlərinə, davranışına yönəltmək və təkcə təbiətlə tanışlıq deyil, həm də ona münasibəti formalaşdırır. Uşaqların bilavasitə təbiətlə təmasda olması müşahidəçiliklə bərabər, hər şeyi bilməyə maraq inkişaf edir. Bunun da əsasında uşaqda axtarıcılıq, tədqiqatçılıq bacarığı formalaşır.

Uşaqların əxlaq tərbiyəsində doğma təbiətə məhəbbət və canlılara qoruyucu münasibət tərbiyəsi xüsusi yer tutur. Qrup otağında yaradılmış canlı guşədə uşaqların heyvanlara, bitkilərə etdiyi qulluq onlarda müşahidəçilik, əməyə məhəbbət, tapşırılmış işə cavabdehlik kimi keyfiyyətlərin tərbiyə olunmasına kömək edir. Uşağın özünün qulluq etdiyi, böyütdüyü bitki və heyvanlar onlar üçün daha əziz olur. Uşaqlarda əməyə, əmək adamlarına məhəbbət, hörmət kimi müsbət keyfiyyətlərin formalaşdırılması üçün yaşlıların təbiətdə əməyi ilə onları yaxından tanış etmək məqsədəuyğundur. Təbiətin qoynunda olmaq, orada gücləri çatan işləri görmək uşaqların həm fiziki, həm də estetik tərbiyəsi üçün əsas vasitədir.

Beləliklə, uşaqlara öyrətməliyik ki, təbiət həyat deməkdir. Deməli, təbiət yox olarsa, biz də yox olarıq. Biz təbiətə qayğı göstərməli, vətəndaşlıq borcumuzu yerinə yetirməliyik. Təbiəti qorumalı və onu sevməliyik. Unutmaq olmaz ki, təbiəti mühafizəçi deyil, sevgi qoruyur.

**Problemin aktuallığı.** Məktəbəqədər yaşlı uşaqların təbiətlə tanış edilməsi onların idrak maraqlarının inkişafında əsas rol oynayır. Ətraf aləm və təbiətlə tanışlığa aid ilk biliklərə yiyələnmə uşaqların əqli tərbiyəsi ilə yanaşı, həm də əxlaqi və estetik tərbiyəsinin mənbəyi hesab olunur.

**Problemin elmi yeniliyi.** Təbiətlə tanışlıq prosesi idrak prosesinin mühüm bir mərhələsi kimi bu prosesin bir sıra məsələlərini özündə əks etdirir. Təbiətlə fəal ünsiyyət prosesində uşaq özünü canlı təbiətin üzvü, bir parçası kimi dərk etməklə, təbiətə fəal müdaxilənin mümkünlüyünü dərk edir. Uşaqlarla birlikdə təbiət qoynunda gəzmək, təbiəti sevmək, onun bir parçası olmaq və bunu hiss etmək möhtəşəmdir.

**Problemin praktik əhəmiyyəti.** Problemin məzmunundan, orada yer alan fikirlərdən pedaqoji ali məktəblərin tələbələri, habelə məktəbəqədər təhsil müəssisələrində çalışan mütəxəssislər faydalana bilər.

## Ədəbiyyat


1. "Azərbaycan Respublikasının Konstitusiyası". Azərbaycan Respublikasının Qanunvericilik Toplusu. 31 iyul 1997-ci il, № 1.
2. Muradxanov, M.50 sual – 50 cavab.- Bakı: Gənclik, –1981. – 94 s.
3. Uşinski, K.D. Seçilmiş pedaqoji əsərləri. –Bakı: Azərnəşr, – 1953. -113 s.
4. Руссо, Ж.-Ж: Pro et Contra [Идеи Жан-Жака Руссо в восприятии и оценке русских мыслителей и исследователей (1752—1917). Антология] / Составители: А. А. Златопольская и др. — СПб.: Издательство РХГА, 2005. — 798 с. — ISBN 5-88812-220-3.
5. «Так говорил Антуан де Сент-Экзюпери»: сборник афоризмов / Составитель Е. Гаврилова. - Ростов н/Д.: «Феникс», -2015. — 93 с.;
6. http://www.nbi.ku.dk/english/www/niels/bohr/universitetet/.


**Redaksiyaya daxil olub:** 29.04.2025.

*UOT 159.9.*

***Rafael Mail oğlu Əliyev***
*Azərbaycan Dövlət Neft və Sənaye Universitetinin müəllimi*
*https://orcid.org/0000-0001-9702-265X*
*E-mail:adnsu@internet.ru*
*https://doi.org/10.69682/arti.2025.92(3).252-255*

# OSMAN SARIVƏLLİNİN YARADICILIĞININ JANR VƏ ÜSLUB XÜSUSİYYƏTLƏRİ

***Rafael Mail Aliyev***
*teacher at Azerbaijan State University of Oil and Industry*

# GENRE AND STYLE FEATURES OF OSMAN SARIVELLI'S CREATIVITY

***Рафаэль Маил оглы Алиев***
*преподаватель Азербайджанского Государственного Университета Нефти и Промышленности*

# ЖАНРОВО-СТИЛЕВЫЕ ОСОБЕННОСТИ ТВОРЧЕСТВА ОСМАНА САРИВЕЛЛИ

**Xülasə.** İyirminci yüzillik Azərbaycan poeziyasında özünəməxsus yaradıcılıq üslubu və qopuzdan-sazdan gələn ənənənin ruhuna bağlanmaq baxımından əvəzsizlik sərgiləyən sənətkarlar sırasında Osman Sarıvəllinin xüsusi yeri var. Görkəmli sənətkarın zəngin ədəbi irsi müxtəlif aspektlərdə fərqli təhlillərin mövzusuna çevrilmiş və bu gün də eyni yanaşma paradiqmatik səviyyəsilə daha çox rəngarəngliklərlə özünü nümayiş etdirir. Ruhu etibarilə xalq poeziyasına bağlı olan ədibin ayrı-ayrı şeirləri və müxtəlif mövzularda yazdığı çeşidli ədəbiyyat nümunələri bunun göstəricisidir. Min illərə dayanan adət-ənənələr, qəlibləşmiş dəyər və əxlaq normaları, etnosun zəngin yaşam mədəniyyəti və s. müxtəlif formalarda ədibin əsərlərində özünə yer almaqla spesifikləşir. Xalqın bütün parametrlərdə keçib gəldiyi yolun zənginliyini, etnoqrafik mükəmməlliyini, türk şeir ənənəsinin ümumi dinamikasını aydınlaşdırmaq və mahiyyətində daşınanların nədən ibarət olduğunu müəyyənləşdirmək üçün O. Sarıvəlli yaradıcılığı əsaslı qaynaqdır.
***Açar sözlər:*** *O. Sarıvəlli, xalq poeziyası, dil, üslub, ozan-aşıq yaradıcılığı, epos, dastan, folklor, milli-mənəvi dəyərlər və s.*

**Abstract.** Osman Sarivelli has a special place among the artists who have demonstrated their unique creative style and dedication to the spirit of the tradition originating from the gopuz-saz in twentieth-century Azerbaijani poetry. The rich literary heritage of the outstanding artist has become the subject of different analyses in various aspects, and today the same approach demonstrates itself with more variety at a paradigmatic level. The individual poems of the writer, who is connected to folk poetry in spirit, and the various literary examples he wrote on various topics are an indication of this. Thousands of years of traditions, molded values and moral norms, the rich life culture of the ethnos, etc. are specified by taking their place in the works of the writer in various forms. O. Sarıvelli's creativity is a fundamental source for clarifying the richness of the path that the people have taken in all parameters, the ethnographic perfection, the general dynamics of the Turkish poetic tradition, and for determining what is conveyed in its essence.
***Keywords:*** *O. Sarıvelli, folk poetry, language, style, ozan-ashıg creativity, epic, folklore, national-spiritual values*

**Аннотация.** Осман Сарывелли занимает особое место среди мастеров слова, продемонстрировавших свой уникальный творческий стиль и преданность духу традиции, берущей начало от гопуза и саза в азербайджанской поэзии XX века. Богатое литературное наследие выдающегося мастера стало предметом различных анализов в различных аспектах, и сегодня тот же подход с большим разнообразием демонстрирует себя на парадигматическом уровне. Об этом свидетельствуют отдельные стихи автора, связанного по духу с народной поэзией, и различные литературные образцы, написанные им на различные темы. Тысячелетние традиции, формировавшиеся ценности и

моральные нормы, богатая жизненная культура этноса и т.д. занимают особое место в произведениях писателя. Творчество О. Сарывелли является фундаментальным источником для выяснения богатства пути, пройденного народом по всем параметрам, этнографического совершенства, общей динамики турецкой поэтической традиции, а также для определения того, что передается в ее сути.
***Ключевые слова:*** *О.Сарывелли, народная поэзия, язык, стиль, озан-ашыгское творчество, эпос, фольклор, национально-духовные ценности.*

Böyük şairin anadan olmasının yüz iyirmi ili tamam olur və iyirminci yüzilin başlanğıcında, daha doğrusu, 1905-ci ildə dünyaya gələn bu sənətkar bütün ruhu və genetik düşüncə kodu ilə mükəmməl bir zənginliyə köklənmişdi. Dünyaya göz açdığı Qazax mahalının Şıxlı kəndi sazın, sözün, mükəmməl elat həyatının çeşidli mənzərəsi ilə körpəlikdən onun ruhuna işıq tutmuş, gediləcək yolunun ümumi dinamikasını müəyyənləşdirmişdi. "Qocanın nağılları", "Daşsız qəbirlər", "Xram uçur", "Bənövşə", "Çobanın məktubları", "Ürəklərdə yanan işıqlar", "Şənlik nəğməsi", "Bu səslər içində mənim səsim var", "Qışı nahaq danladım", "Onu xatırlarkən", "Sənətin cürəti, elmin qüdrəti", "Enir Avey dağı, ucalır evlər", "Nənəmə deyin", "Aşıq dostuma", "Bu yerlər", "Dağların" və s. şeirləri bütün ruhu, ahəngi ilə xalqın zəngin mədəniyyət təsəvvürlərini, dünyagörüşünü əks etdirmək məqsədi daşıyır. Elat həyat tərzinin əsrarəngizliklərinə bələd olan sənətkar hər şeirində onun müxtəlif məqamlarını əks etdirməklə nümunəyə çevrilmiş və böyük ədəbiyyata öz töhfələrini vermişdir.

Qazax müəllimlər seminariyasında (1926-1929), təhsil alan, Azərbaycanın ayrı-ayrı bölgələrində (Göyçay rayonunun Qaraməryəm, Bığır kəndlərində) müəllimlik edən, daha sonra Moskva Dövlət Universitetində (1929-1932) ali təhsil alan sənətkar Bakı Pedaqoji texnikumunda (1932-1935) bir müddət müəllim işləmiş və daha sonra Bakı Teatr texnikumunda müdir vəzifəsində çalışmışdır. AEA-nın Nizami adına Dil və Ədəbiyyat İnstitutunda müdir müavini, "Ədəbiyyat qəzeti"ndə redaktor olmuşdur. Çeşidli ömür yolu keçən O. Sarıvəlli xalqın yaddaşına şair kimi adını yazdırmışdır. Müxtəlif illərdə çap olunan kitabları ("Dəmir sətirlər" (1934), "Bənövşə" (1940), "Şairin hədiyyəsi" (1943), "Gətir, oğlum, gətir" (1943), "Gənclik eşqi" (1946), "Bahar çiçəkləri" (1949), "Yeni dünyanın qapısı" (1950), !İqlimdən-iqlimə" (1963), "Sabahı yaradanlar" (1970), "Seçilmiş əsərləri" (1971-1975), "Hər kim yüz il yaşamasa" (1976), "Mən sabaha gedirəm" (1979), "Kür qırağında" (1987) və s. bütün ruhu ilə xalq yaradıcılığı ənənələrinə köklənmə baxımından nəzər-diqqəti cəlb edir.

Ümumiyyətlə, ədəbiyyata qədəm qoyan bütün sənətkarlar xalqın şifahi yaradıcılığından bu və ya digər dərəcədə bəhrələnmə məramı ilə əsaslı təhlillərə imkan yaradır. Klassik ədəbiyyatın görkəmli nümayəndələri xalqın zəngin folklor mədəniyyətindən bəhrələnməklə özlərinin dünya şöhrətli əsərlərini yaratmışlar. Məsələyə geniş kontekstdən baxdıqda onu deməliyik ki, "folklor yazılı ədəbiyyatın yaranması və inkişafı üçün əsas mənbələrdən biridir. Azərbaycan ədəbiyyatı çox qədim zamanlardan başlayaraq şifahi xalq ədəbiyyatı ilə bağlı inkişaf etmişdir" (2, s. 465). O. Sarıvəllinin yaradıcılığı bu baxımdan tipoloji müstəvidə təhlillər aparmağa daha çox imkan yaradır. Türk şeir ənənəsinə köklənən sənətkar gəraylı, qoşma və s. formalarda yazdığı şeirlərlə xalqın zəngin etnoqrafik mədəniyyətindən, əfsanə, rəvayət, nağıl, atalar sözü, məsəl, dastan, mərasim folkloru və s. örnəklərindən yaradıcı şəkildə istifadə etməklə nümunəyə çevrilmişdir.

"Aşıq dostuma", "Qadası", "Bu yerlər", "Dağların", "Sevdiyim", "Məni", "İncimə", "Olarmı", "Yadında varmı", "Dərdin alım", "Qara geyinmə", "Dağlar", "Sən olmadınmı", "Qızlar mahnısı", "Kəməndə düşdü", "De gəlsin", "Mən belə dedim", "O kimdir başımda çalır, çağırır", "Mən gedər oldum", "Dağlar mahnısı", "Başına döndüyüm", "Mən Qazağa gəlmişəm", "Necədir" və s. şeirləri sazın ahənginə, musiqinin ecazkarlığına əlavə çalarlar qatmaqla əvəzsizlik sərgiləyir.

Sürünün dalında dağ, dərə, bozqır,
Ağsaqqal atamı gətirdi təngə.
Qana bilməyirdik, yazıq nə çalır,
Yandıra-yandıra, dil tökə-tökə.

Neçə qış dolandı, neçə yaz oldu,
Qayğısız günlərin ömrü az oldu.
Hələ çatmamışdıq on beş yaşına,
Bizi də cənginə keçirdi zaman. (6, s. 32).

Arxaik yaddaş, etnik düşüncənin əski laylarını bədii mətnə gətirmək, elat həyat tərzinin qalaqlanan mənzərəsi "Çobanın məktubları"nda yüksək sənətkar intelleksiyası ilə bir özünəməxsusluğu sərgiləyir. Ümumiyyətlə, O.Sarıvəlli bütün səviyyələrdə xalq ruhuna köklənən şəxsiyyətlərdən olmaqla, onun etnoqrafik zənginliklərini öz təsəvvüründə çeşidli tərəfləri ilə daşıya bilən sənətkarlardan olmuşdur. Yaradıcılığının mövzu mündəricəsi, hansısa bir hadisəni təqdim üsulları, dil zənginliyi və s. bunun göstəricisi kimi əvvəldən axıra qədər aparıcılığı müəyyənləşdirir. "Ta qədim zamanlardan bugünədək yazılan əsərləri nəzərdən keçirdikdə onlarda bir-birinə həm yaxın, həm də fərqli cəhətlərin olduğunu görürük. Bu fərqlər bədii əsərlərin ideyası, mövzusu, kompozisiyası, forması, dili və s. cəhətlərində özünü göstərir.

Bəzi ədəbiyyatçılar bədii yaradıcılığın fərdi iş üslubunu nəzərə alaraq belə qənaətə gəlirlər ki, dünyada nə qədər yazıçı varsa, bir o qədər də bədii stil vardır, çünki bir yazıçı ilə digər yazıçı arasında tam mənada eyniyyət işarəsi qoymaq olmaz" (4, s. 100). O. Sarıvəlli poeziyası, onun özünəməxsus və həm də orijinallıqla səciyyələnən üslubu bunun bariz nümunəsidir. Ayrı-ayrı şeirlərində sərgilənən paradiqmatik səviyyə xalq dilində əzbər olan nəğmə, bayatı, layla, oxşama, nağıl, rəvayət, aşıq şeiri (həm də musiqisi) ilə həmahəng görünür. "Bənövşə" şeiri bunun tipik nümunəsi olmaqla görkəmli sənətkarın həyatının, keçib gəldiyi yolun ağrılı-acılı anlarını sıralamaq baxımından bir əsrarəngizlik sərgiləyir.

Yaşadım çöllərdə on il, on beş il,
Yağışda, yağmurda günüm olmadı.
Dostlar yaxşı bilir mənə yad deyil,
Çiçəklərin adı, quşların adı.

Mənə sirdaş oldu günəş, ay, ülkər,
Dərələrin çayı, dağların qarı.
Ömrümə yar oldu uzun sənələr,
Xramın sahili, Kürün kənarı. (6, s. 28).

Avtobioqrafik səciyyəsi ilə spesifiklik qazanan bu poetik misralar əvvəldən axıra qədər eyni ahəngə köklənməklə nümunəyə çevrilir və bir insan ömrünün çeşidli, ağrılı-acılı anlarını sıralamaq xüsusiyyəti ilə səciyyələnir. Burada diqqəti cəlb edəcək məqamlardan birisi şairin düşüncələrinin tipoloji aspektdə bənövşə ilə müqayisəsi və onun xalq təsəvvüründə olanlarla öz yaşadıqları arasında bərabərlik işarəsi qoya bilməsidir.

Mən çoxdan səninlə tanış olmuşam,
Naxırlar dönəndə çöldən bir axşam,
Həzin çalındıqca qəlbimin simi,
Ağlayıb söylədim sənə dərdimi:

-Ey mənim könlümə vəfalı həmdəm,
Yarım Əsli oldu, mən də bir Kərəm.
Gecə axtarıram, gündüz gəzirəm,
Sən də sevgilimi ara, bənövşə!

Ondan bir nişanə, bir əsər gətir,
Özün kimi gözəl, təzə-tər gətir;
Söylə muradımı, bir xəbər gətir,
Olarmı dərdimə çara, bənövşə?! (6, s. 29).

Bənövşə haqqında ədəbiyyatın yazılı və şifahi qolunda bir-birindən gözəl poetik nümunələr yaranıb, ancaq özünəməxsusluq, simvollaşmanın metaforik xarakteri və işarəvi paradiqması ilə bu poetik nümunə ayrıca bir orijinallığı sərgiləyir. Sənətkar öz taleyi, çəkdiyi ağrılarla bənövşənin görkəmi (boynu büküklüyü) arasında bir oxşarlıq görür və onu daha yaxşı başa düşücək bir kəsin ancaq və ancaq bənövşə olacağını düşünür. Bu səbəbdən də ona müraciət edir və həm də ondan düşdüyü vəziyyətdən qurtulmaq üçün kömək diləyir, yardımçı olmasını istəyir. M. Cəfər vurğulayırdı ki, "xəlqilik böyük sənətin ən böyük meyarıdır. Biz nəzəriyyədən, hər nə qədər intellektuallıqdan, realizmdən, psixologizmdən, bədii forma əlvanlığı və sairədən danışsaq da, yenə bir nəticəyə gəlib çıxırıq ki, şeirin ürəyi xalqın ürəyi, şeirin fəlsəfəsi xalqın həyat fəlsəfəsi, şeirin əxlaqı xalqın gözəl əxlaqi keyfiyyətləri, şeirin dili xalqın dili olmalıdır" (1, s. 142). O. Sarıvəllinin ayrı-ayrı şeirləri, eləcə də bütünlükdə yaradıcılığı üzərində apardığımız müşahidələr bunun bariz göstəricisidir. Dil zənginliyi, özünəməxsus üslub sərgiləməsi və elat həyat tərzinin göstəricisi olaraq formalaşdırdığı təsəvvür öz məzmun qatları ilə buna həssaslıq nümayiş etdirir.

O. Sarıvəlli şeirinin ana axarını qopuzdan, sazdan min illər boyunca daşınıb gələn təsəvvürlər, ruh, ahəng, elat həyat tərzinin təbiiliyə bağlanan qeyri-adilik sərgiləyən mənzərəsi təşkil edir. Böyük sənətkar ruhu, poeziyası ilə bütünlükdə xalqın milli-mənəvi mədəniyyətinin, etnik kimliyinin göstəricisi və daşıyıcısı olmaqla

nümunəyə çevrilir. "Yadında varmı", "Dağların", "Qadası", "İncimə", "Olarmı", "Var mənim", "Qara geyinmə", "Dərdin alım", "Qızlar mahnısı" və s. şeirləri sərgilədiyi təsəvvürlə sazın ahənginə, ecazkar ritm harmoniyasına həmahəng doğulmuşdur. Məlum olduğu kimi, "şairin vətəni onun öz ana dili, ana dilinin hər kəlməsi, hər səsidir, hər söz elə vətənin bir parçasıdır, hər sözün yaddaşı vətənin və xalqın tarixidir" (5, s. 164). Doğrudan da onun hər bir misrasında, bəndində və bütün mətn boyu dediklərində vətən torpağının ətri gəlir, sevginin, vurğunluğun yurd, elat timsalında əvəzsizliyi faktlaşır. O. Sarıvəlli istedadı və xalqın etnoqrafik mədəniyyətinə bələdliyi, dil zənginliyi, etnik təsəvvürdən çıxışları və ruhu bütün səviyyələrdə tamamlayıcı funksiyasından çıxış etməklə onun bədii örnəklərinin dillər əzbəri olmasına səbəb olur.

**Problemin aktuallığı**. Xalq şairi O. Sarıvəllinin zəngin ədəbi irsi bütün parametrlərdə istər mətn tutumu, istərsə də dil və üslub özünəməxsusluğu ilə ayrıca bir mədəniyyət, ədəbiyyat hadisəsidir.

**Problemin elmi yeniliyi.** Xalqın etnoqrafik mədəniyyətinin bilicisi, həm də bütün səviyyələrdə etnos zənginliyinin daşıyıcısı kimi Osman Sarıvəlli özlüyündə sözə məna vermə, düşüncələrini canlandırma üsullarının ümumi texnologiyası ilə ayrıca üslub yaradıcısıdır.

**Problemin praktik əhəmiyyəti.** Müxtəlif zaman kəsiklərində yazdığı şeirləri, eləcə də ayrı-ayrı məqalələri və "Qüdrətli şair, ustad sənətkar" (8), "Aşıq ürəkli şair, şair ürəkli aşıq Şəmşir" (7) monoqrafiyası ədibin düşüncələrini, həyata baxışını, zəngin istedadını aydınlaşdırmaq üçün qaynaq rolu oynayır. Bütün bunlar O. Sarıvəlli timsalında xalq şeiri ənənəsinin və Azərbaycan poeziyasının ucalıq anlamında əlçatmazlığını sərgiləyir və müxtəlif istiqamətli araşdırmalar üçün əsaslı material verir.

**Ədəbiyyat**


1. Cəfər M. Sənət yollarında.- Bakı: Gənclik, -1975, -368 s.
2. Əfəndiyev, P. Azərbaycan şifahi xalq ədəbiyyatı. / P. Əfəndiyev -Bakı: Maarif, -1992, -477 s.
3. Hüseynov, M. Dil və poeziya. / M. Hüseynov. -Bakı: Elm, -2008, -434 s.
4. Xəndan, C. Seçilmiş əsərləri. -Bakı: Azərnəşr, -1972, -260 s.
5. Nəbiyev, B. Tənqid və ədəbi proses. -Bakı: Azərnəşr, -1976, -188 s.
6. Sarıvəlli, O. Seçilmiş əsərləri. 3 cilddə, II c., -Bakı: Azərnəşr, -1974,- 252 s.
7. Sarıvəlli, O. Aşıq ürəkli şair, şair ürəkli aşıq Şəmşir. -Bakı: Avropa, -2010, -112 s.
8. Sarıvəlli, O. "Qüdrətli şair, ustad sənətkar.- Bakı: Avropa, -2012, -128 s.


**Redaksiyaya daxil olub:** 01.05.2025.

UOT 159.9.

***Aygün Kərim qızı Kərimov-Həmzəyeva***
*Bakı şəhəri, Nərimanov rayonu, Evrika özəl*
*tam orta ümumtəhsil məktəbinin Azərbaycan dili və ədəbiyyatı müəllimi*
*E-mail: aygunkerim1995@mail.ru*
*https://orcid.org/0009-0001-0462-0165*
*https://doi.org/10.69682/arti.2025.92(3).256-260*

# NİZAMİ GƏNCƏVİ YARADICILIĞINDA AZAD QADIN SURƏTLƏRİ

***Aygun Karim Karimova-Hamzayeva***
*Azerbaijani language and literature teacher*
*at Evrika private secondary school of Narimanov district of Baku*

## IMAGES OF A FREE WOMAN IN THE WORK OF NIZAMI GANJAVI

***Айгюн Керим гызы Керимова-Хамзаева***
*учитель азербайджанского языка и литературы*
*общеобразовательной частной школы Эврика Наримановского района города Баку*

## ОБРАЗЫ СВОБОДНОЙ ЖЕНЩИНЫ В ТВОРЧЕСТВЕ НИЗАМИ ГЯНДЖЕВИ

**Xülasə.** Dahi Azərbaycan şairi Nizami Gəncəvinin yaradıcılığı o qədər rəngarəng, o qədər şaxəlidir ki, onun yaradıcılığını müxtəlif istiqamətlərdə öyrənirlər. Nizami Gəncəvinin əsərlərində qadın qəhrəmanlarından yazmazdan öncə onun ümumi insan haqqındakı düşüncələrini bilmək yerinə düşər. Belə ki Nizami Gəncəvi öz qəhrəmanlarını -insanları yazdığı əsərlərdə müəyyən bir ideal səviyyədə görmək istəyirdi. Onun yaradıcılığında dövrün bütün zümrələrindən, yəni çobandan tutmuş, şaha qədər müxtəlif surətlər verilib. Bunların arasında qadın surətləri daha çoxdur. Bu surətlər həm aparıcı surətlərdir, həm də simvolik surətlərdir. Şairin "Xəmsə"sinə daxil olan üç əsərinin adı məhz qadın adları ilə bağlıdır.
***Açar sözlər:*** *Nizami, azad qadın, əsər, surət, islam dini, humanistlik, demokratiya, müsəlman qadın*

**Abstract.** The work of the great Azerbaijani poet Nizami Ganjavi is so diverse and multifaceted that his work is studied in different directions. Before writing about the female heroes in Nizami Ganjavi's works, it is appropriate to know his thoughts about humanity in general. Thus, Nizami Ganjavi wanted to see his heroes - people - at a certain ideal level in his works. In his works, various images from all classes of the era are given, from the shepherd to the king. Among them, there are more female images. These images are both leading images and symbolic images. The names of the three works of the poet included in "Khamsa" are precisely related to the names of women.
***Keywords:*** *Nizami, free woman, work, image, Islamic religion, humanism, democracy, Muslim woman*

**Аннотация.** Творчество великого азербайджанского поэта Низами Гянджеви настолько разнообразно и многогранно, что его творчество изучается в различных направлениях. Прежде чем писать о главных героинях произведений Низами Гянджеви, стоит узнать его мысли о человечестве в целом. Таким образом, в написанных им произведениях Низами Гянджеви хотел видеть своих героев – людей – на некоем идеальном уровне. В его работах представлены различные образы представителей всех сословий той эпохи – от пастухов до королей. Среди них больше женских фигур. Эти образы являются одновременно и ведущими, и символическими. Названия трех произведений, вошедших в «Хамсу» поэта, связаны с женскими именами.
***Ключевые слова:*** *Низами, свободная женщина, труд, образ, исламская религия, гуманизм, демократия, мусульманка*

"Xosrov və Şirin", "Leyli və Məcnun" və "Yeddi gözəl" əsərlərindəki əsas surətlər qadınlardır. İnsanları azad görmək istəyən humanist şair qadınları kişilərdən ayırmır. Onları cəmiyyətin əsas üzvü hesab edir. İslam dininin hakim olduğu bəzi Şərq ölkələrində qadın hüquqsuz,

yalnız kişilərin zövqünü oxşayan varlıq kimi qiymətləndirildiyi bir dövrdə qadını ilahi varlıq kimi tərənnüm edib, onun daxili aləmi, kədər və iztirabları, məhəbbəti və sədaqəti, ictimai həyatda mövqeyi haqqında fikir demək üçün Nizami Gəncəvi kimi qüdrətli sənətkar lazım idi. Məhz buna görə Nizaminin yaratmış olduğu müsbət qadın surətləri öz yüksək mənəviyyatı, sədaqəti, qoçaqlığı, ədalətli olması, fədakarlığı və mərdliyi ilə fərqlənirlər.

Nizami VIII əsr bundan əvvəl müsəlman qadınlarının halını müşahidə etməkdən aldığı (kədərli) təəssüratını bildirmiş və onların hüquq və azadlığı haqqında yazmışdır. Təbii ki şairin yaratdığı qadın obrazları onun utopik görüşlərinin və fantaziyasının məhsulu idi. Həmin dövrdə nə hökmdar qadın var idi nə də qadın azad sevib azad gəzə bilirdi.

Nizami azadlıqla yanaşı nümunəvi ailə qurmaq tərəfdarı idi. O, əsərlərində Nüşabəni ərə verir, kəniz qızı Arximedlə evləndirir. O, “Arximed ilə çinli kəniz” adlı hekayətində hətta çox arvadlılığı zərərli hesab edir, bu adətin əleyhinə çıxırdı. O deyirdi: Sənə bir yoldaş tay bəs edər, çoxlu adamı olan kişi adamsız qalar. Zəmanə ona görə etibarsızdır ki, onun yeddi atası, dörd anası vardır. Əgər oğlunu pak ürəkli görmək istəyirsənsə ürək kimi bir ata, bir analı ol!

Nizami Gəncəvi qadını xilaskar missiyasında təqdim edirdi. O, göstərirdi ki, qadın insanların həyatını müxtəlif məqamlarda xilas edən bir qüvvədir. Leyli Məcnun Qeysdən Məcnuna qədər ucaldır, Qeysi onu başa düşməyən cəmiyyətdən xilas edib, azad səhranın qollarına atır. Şirin Xosrovu təkəbbürdən, mənəm-mənəmliyindən xilas edib, fədakarlığı öyrədir.

Şairin təsvir etdiyi və rəğbət bəslədiyi qadınlar sədaqətli, etibarlı, fədakar və əxlaqlıdırlar. Dövrünün bəzi ədəbi əsərlərində qadın fitnə-fəsad törədən bir məxluq kimi təsvir olunmuş, ona bir əyləncə kimi baxılmışdır.

Nizami Gəncəvi “İskəndərnamə”də qadınların örtülü olmasının əleyhinə çıxaraq, qıpcaq qadınlarının üzüaçıqlığını rəğbətlə qarşılamış və əsərdəki “İskəndərin qıpçaq səhrasına çatması” fəslində bu məsələyə toxunmuşdur.

İskəndər qıpcaq səhrasına çatan zaman “odlu üz yanağı su kimi ay və günəşdən daha parlaq, qara gözlü, əql alan, üzləri niqabsız” (açıq) azad və sərbəst gəlinlərlə rastlaşır. Onları görənlər gənclik ruhu ilə həvəsə gəlir, lakin şahın qorxusundan öz ehtiraslarını boğurlar. Bunu görən İskəndər düşünür: “Şübhəsiz qadın qadındır, kişi isə kişi”. Gəlinlərin üzlərinin açıq olması İskəndərin xoşuna gəlmir. İskəndər bu adəti ləğv etmək fikrinə düşür. İskəndərlə qıpcaq başçılarının bu qayda haqqında mübahisəsi çox maraqlı verilir. İskəndər “qadın üzü örtülü və xəlvətdə olsa daha yaxşıdır, yadlara üz göstərən bir qadın nə ərinin həyasını, nə də özünün əzəmətini saxlar” – deyə öz fikrini bildirdikdə qıpcaq başçısı ona belə maraqlı cavab verir: “Üz örtmək bizim adətimiz deyil, çünki bu sifət qıpcaqların qaydasına yaddır, əgər sənin qanunun üz örtməksə, bizim qanun göz örtməkdir (təmiz ürəklilik), yadların üzünə baxmamaq daha yaxşıdırsa, cəzanı ona yox, bizə vermək lazımdır. Əgər bizim sözümüz daha kobud gəlməsə bəs onun (xalqın) üzünə və arxasına baxması nəyinə gərəkdir? Bizim gəlinlərlə bu hədd kifayətdir ki, başqasının yataqları ilə işləri yoxdur. Örtük ilə bizim xalqın üzünü yaralanma, sən öz gözünə pərdə salan ol! Gözünə pərdə çəkən hər kəs nə ayən, nə da günəşin üzünə nəzər salar “

Şair bu kəskin cavab qarşısında İskəndərin düşdüyü ağır vəziyyəti belə göstərir:

“Şah o fəsahətli cavabları eşitdikdə, mühakimə yürütməkdə dili aciz oldu”.

Qıpçaqlar İskəndərə “biz şahın hər əmrinə tabeyik, lakin öz adətlərimizdən keçən deyilik” – deyə cavab verirlər. Nizami Gəncəvinin yaradıcılığıda qadın surətlərini ayrı-ayrılıqda təhlil etdikdə şairin qadın haqqındakı fikirlərini daha aydın görmək olar.

**Nüşabə surəti**. Nüşabə təkcə “İskəndərnamə”dəki müsbət keyfiyyətləri ilə seçilmir, bu surət şairin bütün yaradıcılığında çox mühüm yer tutur. Şair məhz Azərbaycan qadınını belə görmək istəyir.

Nüşabə Bərdə hökmdarıdır. O, ölkəni ədalətlə idarə etdiyindən, “orada hər danə yüz danə yetirir”. Bütün ili işrətlə məşğul olan hökmdar “Tovuz kimi o dişi ceyran kəskin fikirli, açıq ürəkli alimanə xasiyyətlidir”. Nüşabənin ətrafında minlərlə qız, hər biri bir ay kimi ona xidmət edir. Onun otuz min qılınc vuran qulamı vardır. Səhraya qoşun çəkən İskəndər su və əkininə heyran qaldığı o yerə kimin başçılıq etdiyi ilə maraqlanır. O bərəkətli ölkəni idarə edənin kişilərdən daha cəld, dəniz gövhərindən daha təmiz, , mərd bir qadın olduğunu deyirlər.

Şair qadınlar ölkəsi və onun hakimi – Nüşabənin fəaliyyətinin geniş təsvirini verir. Nüşabə sarayında ciddi intizam vardır, saraya bir nəfər yad şəxs gələ bilməz, gümüş bədənli qadınlar onun hər əmrinə itaət edir, günlərini əylənmək və udun səsindən zövq almaqla keçirirlər.

Nizami Nüşabənin başqa müsbət cəhətlərindən birini onun tədbirli olmasında görür. O, öz tədbiri əsasında düşmənin hücumunun qarşısını alır və müstəqil yaşaya bilir. O, bir hakim kimi bütün işlərlə maraqlanır. Nizami Gəncəvi Nüşabəni sadəcə bir qadın kimi təsvir etmir, ədalətli hökmdar haqqında öz fikirlərini bu surət vasitəsi ilə oxuculara çatdırır .

Nüşabə İskəndərə ziyafət verərkən, ona yemək əvəzinə daş-qaş gətirir. Bununla o, İskəndərin müharibə etməkdə gördüyü məqsədi ona çatdırır. İskəndərin "daş-qaş yeyilərmi?" – sualı qarşısında Nüşabə – "nə üçün yeyilməyən daşın arxasınca öz ölkəni buraxıb bura gəlibsən?" – deyə cavab verir.

Çinli kəniz surəti."İskəndərnamə" poemasında çinli qız Xaqan tərəfindən müxtəlif hədiyyələrlə birlikdə İskəndərə verilir. O, gözəlin tayı-bərabəri yoxdur. Şair onun üzünü aya, boyunu sərvə bənzədir, bədəninin su kimi lətif olduğunu deyir və belə gözəl böyüdən anaya (dayəyə) afərinlər söyləyir: Belə bir qiymətli gövhər bəsləyən dayəyə min afərin olsun.

Şair hələ hadisəni başlanğıcında Xaqanın dili ilə o qızın böyük istedada malik olduğuna işarə edərək yazır:

– Deməyə nə ehtiyac var, o iş zamanı öz hünərini göstərər.

Çin qızı gözəl musiqişünas, döyüş meydanında kimsəsiz bir qəhrəman kimi təsvir olunur. Hər tərəfli istedada malik olan bu qız haqqında şair yazır:

"Anadangəlmə onda dördüncüsü olmayan üç xasiyyət vardı: birincisi öz yaraşığı ilə insanı valeh edir; ikincisi döyüş vaxtı elə qüvvətlidir ki, qoçaq igidlərdən də üz döndərməz; üçüncüsü, onun xoş səsi və ruhunu sədası Zöhrədən daha çox nəğmə deyir. Bərk və ucadan oxumağa başlayan zaman onun səsindən quş və ilan çatı".

Nizami çinli kəniz surətinə "İskəndərin çinli kənizlə şənlik etməsi" fəslində yenidən qayıdır. Şair burada onun yenə də gözəlliyinin, sənətkarlığını və İskəndərə eşq elan etməsi hadisələrini geniş təsvir edir. O, qız əlində ud öz gözəl səsi ilə həm İskəndərin böyüklüyünü, həm də özünün ona layiqli bir gəlin olacağını bildirir.

"Xosrov və Şirin" əsərində at oynadan qılınc vuran, ox atan Şirin kimi şən və qəhrəman bir qızın qiyabi bir məhəbbət uğrunda mübarizə meydanına atıldığını və ömrünün sonuna kimi ilk məhəbbətinə sadiq qaldığını görürük. Nizami Şirini Azərbaycan qadınının ən yaxşı keyfiyyətlərini özündə birləşdirən bir varlıq kimi təsvir edir, onun həyalı və ismətli olduğundan söhbət açır. Xosrova kəbinsiz arvad olmayacağından danışarkən Şirin deyir:

And olsun ölümsüz əbədiyyətə,
And olsun yatmayan oyaq xilqətə,
And olsun fitrətə qida verənə
Ki, şah olsan belə, kəbinsiz yenə
Yetişə bilməzsən istəklərinə.

Şirinin Xosrovdan istədikləri ilə Xosrovun Şirindən umduqları arasında uçurum var idi. Şirin öz azadlığına Fərhad və Xosrov arasında seçim edə bilməyi ilə çatır. Şirinin sevmək seçib-seçilmək azadlığı vardır.

Bəs Şirin niyə öldürülür? Əslində, "Xosrov və Şirin" Nizami Gəncəvi yaradıcılığında eyni sonluqla bitən növbəti əsər idi. Birincidə Məcnun Leylidən sonra, ikincidə isə Şirin Xosrovun ölümündən sonra bu dünyanı tərk edir. "Leyli və Məcnun"da hər iki obraz mənəvi cəhətdən özünüintihara, özünüməhvetməyə fokuslanır, "Xosrov və Şirin"də isə Xosrov əməllərinin nəticəsində, Şirin isə özünü qoruma acizliyində bulunaraq həyatına qəsd edir. Halbuki, Şirin Xosrovun səltənətini nankor oğlun əlindən rahatıqla ala bilərdi. Və yeni şahlıqda yeni qanunlar yaradaraq Xosrovun həyatda olmamasına baxmayaraq səltənətinin davamını qura bilərdi. Əlbəttə, edə bilərdi. Qələm Nizaminin əlində idi və güman olunur ki, məhz bu yerdə dahi Nizami bir neçə vərəq dəyişməli olub. Son anda isə məhz bu cür sonluğun olmasını məqbul hesab edir. Qadınlar ölümləri ilə şahları mat edən xilaskar və qalib qüvvədir.

Nizami əsərlərindəki qadın sürətlərindən biri də Leyli surətidir. "Leyli və Məcnun" əsərində Nizami Gəncəvi bir məqam vurğulayıb. Qeys Leylini sevəndən sonra dəyişir. Adı da dəyişir özü də. O, Məcnuna çevrilir. Məhz bu sevgidən sonra Məcnun kimi sevmək anlayışı meydana gəlir. Leyli vasitəsilə ənənəvi sevgi zənciri qırılır. İnsanlar daha əvvəlki kimi yox, Məcnun kimi sevməyə başlayırlar. Leyli sevgisi və Məc-

nun sevgisi artıq bir meyara çevrilir. Leyli burada Qeysi adi sevgidən ənənəvi sevgidən xilas edib ona Məcnunluğa ucaldır. Şair əsərdəki iki surəti elə poetik, elə ustalıqla tərənnüm edib ki, heç birini irəli çəkmək olmur. Bu surətlərin hər ikisi dünya ədəbiyyatına məhəbbətin simvolik, yaxud rəmzi surəti kimi daxil edilib. Leyli dünya ədəbiyyatında həqiqi, saf eşqin nümayəndəsi kimi məşhurdur. Nizami öz əsərlərində Leylini elə təsvir edib ki, surətdə ön plana keçə bilib. Avropalılar Leyli surətini də öz məhəbbət dastanlarındakı qadın surətləri ilə müqayisə ediblər. Lakin onu da demək lazımdır ki, Avropa ədəbiyyatında oxşar surətlər olsa da, Leyliyə bərabər surət tapmaq çətindir. Leyli surəti hətta şərq dünyasında da başqa məhəbbət dastanlarındakı qadın surətlərindən öz saflığı ilə fərqlənir.

Leyli həqiqi həyat eşqinin simvolu kimi uzun illərdən bəri dillərdə dastan olub. Bu surət fransız ədəbiyyatında İzolda, Nikolet, ingilis ədəbiyyatında Culyetta, alman ədəbiyyatında İzolda və sair qadın surətlərinin yaranması üçün nümunə olub. Lakin bunların heç biri Leyliyə bərabər ola bilməyib. O surətlərin heç birində Leylinin həqiqi saf eşqini tapmaq çətindir. Şair "Leyli və Məcnun"da qadına böyük bir məhəbbətlə yanaşır. Leyli hüquqsuz bir qızdır. Lakin onda həsrətlə döyünən bir qəlb, möhkəm bir iradə var. O, müstəqil düşünən, vəfalı və fədakardır. Cəmiyyət onun arzularını boğur, məhəbbətini tapdayır – onu sevgilisindən ayırırlar, sevmədiyi bir adamla yaşamağa məcbur edirlər. Çürük adət və ənənələr Leylinin yolunu bir uçurum kimi kəsir. Lakin bütün bunlar onun iradəsini qırmır, Leyli ölənə kimi Məcnunu sevir və ona sadiq qalır. Leyli öz azadlığına kiçik-kiçik yalanları ilə çatır. Rəfiqələri ilə görüşəcəyini deyərək Məcnuna qaçır, anası ilə söhbətdə Məcnunu varlığını danır.

Nizaminin "Yeddi gözəl" poemasını şərq ədəbiyyatında uzun zaman qəhrəmanlıq dastanı adlandırıblar. Elə buna görə də böyük şairin bu əsərinin əsas qəhrəmanı Bəhram olsa da "Yeddi gözəl"dəki əhvalatın baş xətti ilə yanaşı davam və inkişaf edən hadisələr gözəllərin ayrı-ayrılıqda söylədikləri əfsanələr maraqlı və qiymətlidir. Nizami Gəncəvi bu hekayələri dünyanın müxtəlif millətlərinin qadınlarının dili ilə nəql edir. Şairin bu qadın surətlərinə nə qədər rəğbətlə yanaşması əsərin adından da məlumdur. Nizaminin əsərdə təsvir etdiyi qadın surətləri şüurlu, təmkinli, təcrübəlidir. Onlar hadisələrin və ya sirlərin izahını həyatdan və təbiətdən kənarda axtarmırlar. Onların ən yaxşı cəhətlərindən biri odur ki, bu qadınlar çox zaman səadətin də, fəlakətin də səbəbini özlərində, insanın özündə, insanın içində, əxlaqi və əməllərində axtarırlar. Əsərdə gözəllər ilə şah arasındakı söhbətlər elə qurulub ki, oxucu qadınlar haqqında fikirləşir, onları əsərdə əsas qəhrəmanlar kimi qarşılaşdırır. "Yeddi gözəl" əsərindəki qadınlar öz bilgiləri ilə azadlıqlarına qovuşurlar.

Qızlarla oğlanların birgə təhsil almasını qəbahət hesab etməyən böyük mütəfəkkir "İskəndərnamə" poemasında da Arximedin oxuduğu məktəbdə bu qaydanı adi bir hal kimi qələmə almışdır. "Leyli və Məcnun" əsərində Leyli ilə Məcnun məktəbdə bir-birinə aşiq olur.

Gözəl, namuslu, ağıllı, zəkalı, sədaqətli, ədalətli, mətin, istedadlı, müdrik və hər cür yüksək məziyyətləri özündə cəmləşdirmiş qadın surətlərinə demək olar ki, dahi şairin bütün əsərlərində rast gəlmək olar. Nizaminin yaratdığı ölməz qadın surətlərinin mərkəzində məhəbbət, gözəllik, ağıl, zəka, sədaqət, yenilməz iradə simvolu dayanır.

**Problemin aktuallığı.** Şərq ədəbiyyatında islamiyyətin yayılmasından sonra yaradılan qadın surətləri əsasən mənfi planda verilirdisə, böyük Nizami bu ənənəni kökündən dəyişmiş, əsərlərində dünya ədəbiyyatı tarixində əbədi yaşayacaq müxtəlif səciyyəli müsbət, nəcib qadın surətləri yaratmışdır.

**Problemin elmi yeniliyi.** Nizami qadını cəmiyyətin hər yerində görürdü. Ailədə, şahlıq kürsüsündə, təhsildə və s. Nizaminin qadınları təhsil alır, nəğmə oxuyur, əylənir, sevib-sevilir, döyüş meydanında məharət göstərir, üzü aşıq gəzir, bəzənir- düzənir və azad yaşayır.

**Problemin praktik əhəmiyyəti.** Nizamiyə görə qadınların ixtiyar sahibi olmasında, kamil bir şəxsiyyət kimi formalaşmasında təhsilin və bilginin rolu mühümdür. Yəni təhsil qadın tərbiyəsinin əsas, aparıcı tərkib hissəsi olmalıdır. Buna görə də təsadüfi deyil ki, Nizami poemalarında qadınların təhsil alması nəinki təqdir olunur, hətta bu prosesi əks etdirən səhnələr də məhəbbətlə təsvir edilir.

**Ədəbiyyat**


1. Muxtarov Ə.Ə. Qılınc və qələmin vəhdəti: Nizami Gəncəvi ili 880! / Ə. Muxtarov // Ədalət.- 2021.- 31 dekabr.- № 105.- s. 7.
2. Abbasov İ.A. Nizaminin türk ruhu / İ. Abbasov // Xalq qəzeti.- 2021.- 31 dekabr.- № 286.- S. 10.
3. Talıbzadə A.T. Nizami və İslam mifologiyasının bioloji mutantı İskəndər: aksioloji analiz / A. Talıbzadə // Azərbaycan.- 2021.- № 12.- s. 65-71.
4. Qurbanova. T.A. Şeyx Nizami "Xəmsə"də səhhəti haqqında / T. Qurbanova // Azərbaycan.- 2021.- № 12.- s. 56-64.
5. Bəşirova. H.A. Eşq fəlsəfəsinin şərhi / H. Bəşirova // Azərbaycan.- 2021.- № 12.- s. 35-41.



**Redaksiyaya daxil olub:** 19.05.2025

UOT 159.9.

***Fəridə Bilal qızı Əliyeva***
*Azərbaycan Dövlət İqtisad Universitetinin müəllimi*
*https://orcid.org/0009-0007-9448-0365*
*E-mail:aliyeva_farida@unec.edu.az*
*https://doi.org/10.69682/arti.2025.92(3).261-264*

# MEŞƏLƏR TƏBİƏTİN AĞ CİYƏRLƏRİDİR

***Farida Bilal Aliyeva***
*lecturer at the Azerbaijan University of Economics*

# FORESTS ARE THE LUNGS OF NATURE

***Фарида Билал гызы Алиева***
*преподаватель Азербайджанского Государственного Экономического Университета*

# ЛЕСА – ЛЕГКИЕ ПРИРОДЫ

*Bura yaşıl möcüzədir, möcüzə*
*Heyrətimin zirvəsinə çatmışam.*
*Oturmuşam bir bulaqla diz-dizə*
*Segahının ovsununa batmışam.*
***Tofiq Yusif***

**Xülasə.** Məqalədə meşələr, onların təbiətdə, Yer kürəsində canlı aləmin qorunub saxlanmasında, meşə heyvanları və bitkiləri üçün əlverişli mühit yaradılmasında rolu haqqında geniş məlumat verilmişdir. Həmçinin ekologiyanın pozulması ilə əlaqədar olaraq meşələrin məhv olması, qloballaşma istilik prosesləri və itirilmiş meşələrin bərpa olunması haqqında da yazılmışdır. Azərbaycan meşələri haqqında ümumi məlumat verilərək mənfur düşmənlər tərəfindən dağıdılmış meşə zolaqları açıqlanmışdır.
***Açar sözlər:*** *Meşələr, oksigen, biosfera, iqlim saflaşması, Azərbaycan meşələri, qlobal istiləşmə*

**Abstract.** The forests in the article, their nature, living on Earth. The role of the world in the preservation of the environment and the creation of a favorable environment for forest animals and plants was widely reported. It is also written about the destruction of forests due to environmental degradation, global warming and the restoration of lost forests. General information about the forests of Azerbaijan and information about the forest strips destroyed by hated enemies have been made public.
***Keywords:*** *Forests, oxygen, biosphere, climate change, Azerbaijani forests, global warming*

**Аннотация.** В статье дана обширная информация о лесах, их роли в природе, в сохранении живого мира на Земле, в создании благоприятной среды обитания для лесных животных и растений. Автор также повествует об уничтожении лесов из-за деградации окружающей среды, о проблемах глобального потепления и восстановления утраченных лесов. Представлены общие сведения о лесах Азербайджана и информация о лесных полосах, уничтоженных ненавистными врагами.
***Ключевые слова:*** *леса, кислород, биосфера, изменение климата, леса Азербайджана, глобальное потепление*

Təbiətin ağ ciyərləri olan meşələr nəfəsimiz, oksigenimiz, yaşam mənbəyimizdir. Çaylar bəzən kəmər kimi dolanar belinə, bəzən zümzüməsilə laylay çalar bu yatmış gözələ. Yayda yaşıl donunu geyər, qışda ağ libasa bürünər. Onun hər ağacında, hər kolunda bir tarix yaşayır. Quşlarımız qoynunda cəh-cəh vurar. Hər fəslin öz rəngində görüşünə gələr. Nazlı təbiətin sonasıdır meşələr. Meşələr təbiətin mühüm tərkib hissələrindən biri kimi canlı aləmin həyatında əhəmiyyətli rol oynayır. Sadə desək, yer kürəsini meşələrsiz təsəvvür etmək mümkün deyil. Meşələr

canlılara nəfəs verməklə yanaşı insanların gözün oxşayar, ruhuna qida verər.

Yer kürəsində canlı aləmin qorunub saxlanmasında, bəzi kimyəvi elementlərin bioloji təbii dövranında, atmosferdə istiliyin, torpaqda nəmliyin, çaylarda və göllərdə su ehtiyatının yaranmasında, iqlimin saflaşmasında və bir sıra digər sahələrdə meşələrin rolu əvəzolunmazdır.

Məlumdur ki, meşə zolaqlarının olması torpağın yuyulmasının qarşısını alır, torpağın üst qatının sovrulmasına mane olur və sıx yerləşən ağacların hesabına kölgəliklər əmələ gəlir ki, bu da günəş şüalarının tam ötürülməsinə imkan vermir. Bütün bunlar meşə heyvanları və bitkiləri üçün əlverişli mühit yaradır. Meşələr suyu torpaqda tənzimləyir, quru küləklərin və tozlu tufanların qarşısını sipər kimi qoruyur. Ormanlar canlıların həyatı üçün zəruri olan oksigen mənbəyidir. Bir hektar meşədə yetişən ağaclar 200 insanı qəbul edəcəyi oksigenlə təmin edə bilər. Başqa sözlə 1 ha yaşıl sahə 5-6 ton oksigen verir və hər bir ağac il ərzində 120 kq oksigen istehsal edir ki, bu il ərzində 3 nəfərlik ailəyə bəs edir. Hesablamalara görə dünya meşələri ildə 283 qiqaton karbonoloksid udur. Tək bir ağac fotosintez yolu ilə 1 saata 1,7 kilo oksigen istehsal edir.

Bu cür məlumatların sayı sonsuzdur, məhz bu baxımdan hər birimiz düşünməliyik ki, bəşəriyyətin məhvi yalnız insanların deyil, bütün canlı təbiətin məhvi deməkdir, bu isə bizim gələcək nəsillər qarşısında ən bağışlanmaz günahımız olar. Beləliklə meşələr su, torpaq, hava kimi biosferanın çox vacib olan komponentlərinin sabitləşməsi üçün şərait yaradan əsas mənbədir.

Yaşlanan meşə ağacları çürüyür, lakin köklərindən ayrılan yeni pöhrələrdən cavan ağaclar boy ataraq onları əvəz edir. Bu çürümə nəticəsində əmələ gələn göbələklər mineral maddələrin torpağa qayıtmasına kömək edir. Bu isə onu göstərir ki, təbiətdə hətta çürüyən ağac belə yeni bir prosesin başlanğıcına səbəb olur. Odur ki, meşələri qorumaq, yeni meşə zolaqları salmaq hər zaman insanlar üçün mühüm əhəmiyyət kəsb edibdir.

Bir məsələni də nəzərdən qaçırmaq olmaz ki, müasir dövrdə sənaye sahələrin texnogen inkişafı, şəhər əhalisinin sayının artması böyük sanitar-gigiyenik funksiyalar tələb edir, bunu da təbii yolla meşələr yerinə yetirə bilir.

Meşə ağaclarının kökləri tozabənzər bərk hissəcikləri tutub saxlamaqla yanaşı, həmçinin müxtəlif inqrediyentləri zərərsizləşdirir. Tədqiqatlar göstərir ki, aerozol bulanlığını 20-40% azaldır, hətta bəzi ağac növlərinin ayırdığı fitosidlər bir çox xəstəlik törədən göbələkləri, mikrobları və virusları məhv edir. Məhz fitosidlərə səbəb meşələrin havası təmizlənir, saflaşır.

Meşələr faydalı bitkilərlə – cır meyvələr, giləmeyvələr həmçinin qiymətli dərman bitkiləri ilə zəngindir. Meşədə bitən qoz, badam və fıstıq ləpələrində kalorilik dərəcəsi süddən və buğda çörəyindən yüksəkdir.

Hazırda dünyanın İnkişaf etmiş bir sıra ölkələrini, xüsusilə BMT-ni dünya meşələrinin hazırkı vəziyyəti, bir çox meşə yanğınları, səhralaşma, torpaqların eroziyası və ətraf mühitin çirklənməsi kimi proseslər çox narahat edir. Meşəliklərin azalması yer səthinin temperaturunun artmasına səbəb olur ki, bu da qlobal istiləşmənin əsas səbəblərindən biridir. Artıq iqlim dəyişilməsində istiləşmənin getdiyi müşahidə olunur. Bu isə təbii, həmçinin insan fəaliyyəti nəticəsində baş verir ki, bu da qlobal problemlərin əsaslarından biridir. Bunun nəticəsidir ki, orta illik temperatur artmış və dünya əhalisi hazırda sudan korluq çəkir. Məhz insan fəaliyyəti nəticəsində istər sənaye, enerji istehsalında, istər hava, su, yer nəqliyyatı, kənd təsərrüfatı, mənzil-kommunal sahəsində atılan tullantıların kanalizasiyalarla su hövzələrinə axıdılması və meşələrin nizamsız qırılması nəticəsində qlobal problemlər yaşayırıq.

BMT-nin məlumatına görə, son 10 ildə yanacaq üçün sərf edilən oksigen itkisinin miqdarı xeyli artmışdır. Bu müddət ərzində sənayedən və digər sahələrdən atmosferə 360 mlrd ton karbon və digər zəhərli qazlar buraxılmışdır. Dünyada meşə və yaşıllıqların yaratdıqları oksigenin təxminən 23% sənayeyə, yaşayış sahələrinin qızdırılmasına sərf edilir. Hesablanmışdır ki, bu miqdar oksigenlə 43 mlrd adam təmin edilə bilər. Bütün bu göstərilən faktlar və rəqəmlər onu sübut edir ki, artıq bu sahədə düşünüb- daşınmağın vaxtı çatmışdır.

Qeyd etsək ki, meşələrin çox hissəsi 5 ölkədə – Braziliya, Kanada, Çin, Rusiya və ABS-dadır. Meşə sahəsi 850mln ha olan Rusiya dünyada ən böyük meşə sahəsinə sahibdir. İndi bu ölkələrdəki məsələlərdə də böyük ərazilərdə artıq ağac yoxdur. BMT-nin hesabatına görə dünyada hər il təxminən Yunanıstanın sahəsindən 100 dəfə böyük ərazilərdə meşələr yox olur.

Meşələrin belə azalmasına xüsusilə taxta-şalban istehsalı, əkinçilik, meşə yanğınları, insanların laqeyd münasibəti, nizamsız qırılmalar mənfi təsir göstərir. Ümumiyyətlə, son iki əsirdə meşələrin 40% , ötən 40 ildə 460 mln hektarı məhv olub. Bundan başqa dünyadakı ağac növlərindən 10% yəni 8 mindən çox ağac növü yox olma təhlükəsi ilə üzləşibdir.

Vaxtilə Azərbaycanın ümumi ərazisinin 35%-i meşə ilə örtülü olmuşdursa, hazırda bu 11,8%-i təşkil edir. Odur ki, ölkəmiz az meşəli zona hesab olunur. Bunun bir səbəbi də düşmən tapdağı altında 30 il qalan 54000 ha meşə zolaqlarımızın vəhşicəsinə məhv edilməsi nəticəsindədir. Lakin unutmaq olmaz ki, Azərbaycan meşələri ağac növlərinin zənginliyi ilə fərqlidirlər. Bu da düşmənin nəzərindən qaçmamış və işğal müddəti bu sərvəti qonşu ölkələrə satmaqdan belə çəkinməyib Öz iqlim şəraitinin zənginliyi ilə Azərbaycan dünyanın bir çox ölkələrindən fərqlənir. Doqquz iqlim qurşağından yeddisinə malik olduğundan onun meşələri füsunkarlığı ilə seçilir. Bir çox xarici tədqiqatçılar, o cümlədən iranlı alim Rəşidəddin Fəzlullah, Məhəmməd Naxçıvani öz əsərlərində Azərbaycan meşələrinin nadir ağac və kolları haqqında məlumat yazmışlar. Dünyada yayılmış bütün meşə bitki növlərinə burada rast gəlinir. Ümumiyyətlə Azərbaycan florası çeşidinə görə Qafqazın digər ölkələrindən əhəmiyyətli dərəcədə fərqlənir. Belə ki, Qafqazda bitən ümumi bitki çeşidinin 66%-i Azərbaycanda mövcuddur. Azərbaycanda meşələrini əsasən üç növ ağac – vələs, palıd və fısdıq əhatələmişdir. Bundan başqa, bu meşələrdə ağcaqayın, cökə, qızılağac, söyüd, qovaq, qarağac və digər enliyarpaqlı ağaclara da rast gəlinir. Azərbaycan Respublikası nadir ağac və kolların vətəni sayılır. Bu torpaqda bitən qara cökə meşələrin nadir incisi hesab olunur, həmçinin cənub zonasında yerləşən talış meşələrində dünyanın çox az ölkəsində təsadüf olunan dəmirağac bitir. Qarabağ meşələrinin zənginliyi və füsunkarlığı isə dillər əzbəridir. Vaxtilə Qarabağa səfər edən Aleksandr Düma buradakı əsrarəngiz təbiətə, zəngin bitki örtüyünə dünyanın heç bir yerində rast gəlmədiyini özünün xatirələrində yazmışdı. Mənfur niyyətli erməni düşmənlərimiz torpaqlarımızı zəbt edərkən ilk olaraq məhz məşhur Topxana meşələrini qırmağa başlamışdı. Çünki onlar bilirdi ki, Azərbaycanımızın əvəzsiz incisi olan Topxana meşəsi öz zənginliyi ilə fərqlidir.

Meşələrimizdə arıçılığın inkişafı üçün də əlverişli şərait vardır. Hazırda meşə müəssisələrində 700-ə yaxın arı ailəsi saxlanılır. Arılar meşə bitkilərinin tozlanmasına köməklik edir, bol toxum məhsullarının alınmasına şərait yaradır və əlavə bal məhsulu alınmasını təmin edir. Çox təəssüflə qeyd olunmalıdır ki, Ermənistanın təcavüzü nəticəsində meşələrimizə külli miqdarda ziyan vurulmuşdur. Belə ki, Kəlbəcər, Laçın, Zəngilan, Xankəndi (Şuşa rayonu da daxil olmaqla), Xocavənd, Ağdərə meşə təsərrüfatlarının 261 min hektardan artıq meşə sahələri vəhşicəsinə qırılaraq talan edilmişdir. Orada bitən çox qiymətli palıd, fısdıq, vələs, ağcaqayın, ayı fındığı, qoz, şərq çinarı kəsilərək Ermənistana və İrana daşınıbdır. İşğaldan azad olunmuş torpaqlarımızda olan təbiət, qoruq və yasaqlıqlarımız da düşmənin vəhşi caynaqlarına məruz qalmışdır:

**1.** Laçın rayonunda Qaragöl DTQ-1987 də yaradılmış 240 ha sahəsi var idi-tamamilə məhv edilib.

**2.** Zəngilan rayon Bəsitçay DTQ-1974 də H. Əliyevin təşəbbüsü ilə yaradılmışdır və bu Avropada unikal meşə sayılır, burada olan Çinar ağacları kökündən qırılaraq məhv edilmişdir. Qoruğun 107 ha sahəsindən indi 42 ha qalıb (65%)

**3.** Qubadlı rayon Təbiət Yasaqlığı- 1969 da yaradılmışdır 6923 ha sahənin 1577 ha məhv edilib.

**4.** Laçın rayonunda 1988 də 75000ha sahə olub- indi isə 4457 ha qalıb, 3043 ha erməni vandalları tərəfindən məhv edilib.

**5.** Zəngilan rayonunda Arazboyu Dövlət Təbiət Yasaqlığı 1993 də yaradılıb, sahəsi 1700 ha idi, hazırda 135 ha qalıb – 1565 ha məhv edilib.

**6.** Daşaltı dövlət təbiət Yasaqlığı 1981 də H. Əliyev tərəfindən yaradılıb, 1988 də 400 ha sahəsi olub, hazırda 350 ha 50 ha-ı yenə də ermənilər tərəfindən məhv edilib.

Meşələrin qorunub mühafizə edilməsi və yeni meşə zolaqlarının salınması istiqamətində dünyada olduğu kimi ölkəmizdə də xeyli məqsədyönlü iş aparılıb və aparılır. Bu gün regionlarda infrastrukturun inkişafı ilə bağlı hazırlanan, demək olar ki, bütün dövlət proqramlarında meşələrin bərpası və inkişafı ilə bağlı müddəalar öncül yerlərdən birini tutur. Ekologiya və Təbii Sərvətlər Nazirliyi yarandığı ilk gündən – 2001-

ci ilin may ayından bu günə kimi ardıcıl və düzgün ekoloji siyasət yeridərək meşələrin bərpa olunması və yeni meşə zolaqlarının salınması ilə yanaşı, meşələrin qorunub mühafizə olunması istiqamətində də ciddi uğurlara imza atıb. Nazirliyin saytında verilən rəsmi məlumata görə, təkcə ötən 2010-cu ildə meşələrimizin bərpası istiqamətində sözügedən nazirlik tərəfindən xeyli işlər görülüb. Belə ki, nazirliyin tabeli qurumları tərəfindən həmin il ərzində 10550 hektara qarşı 10696 hektar sahədə meşə bərpa, o cümlədən, 3500 hektara qarşı 3521 hektar sahədə meşə əkini və səpini, 7175 hektar sahədə isə təbii bərpaya kömək tədbirləri görülüb. Bundan əlavə, saytın məlumatına görə, tinglik sahələrində yetişdirilən ağac və kol cinslərindən ibarət müxtəlif çeşidli 24,3 min ədəd əkin materialları nəzərdə tutulan meşə əkini, təmir doldurma işləri və magistral yol kənarları, çay və su hövzələrinin ətrafına əkilib. Nazirlik və onun müvafiq qurumları ötən illər ərzində meşələrin qanunsuz qırılması hallarına qarşı mübarizədə də xeyli uğurlara imza atıb. Belə ki, adıçəkilən qurumun məqsədyönlü siyasəti nəticəsində Respublikamızın meşələrində 2003-cü ildəki qanunsuz meşə qırılması halları 49 min kubmetrlik həcmdən azalaraq 2010-cu ildə cəmi 34,9 min kubmetr təşkil edib ki, bu da kiçik uğur sayıla bilməz. Hazırda meşələrin qorunub mühafizə olunması ilə 1300 nəfər meşə mühafizə işçisi məşğul olur ki, onlar da bu işə operativ nəzarəti həyata keçirir. 2010-cu il ərzində protokollaşdırılmış qanunsuz qırıntılara görə 374 nəfər meşə mühafizə işçisi barəsində müxtəlif intizam tənbeh tədbirləri həyata keçirilib. Statistik məlumatlara görə, ümumiyyətlə son 15 il ərzində Azərbaycanda meşələrin bərpası üzrə görülən tədbirlərin həcmi iki dəfə artıb.

BMT Baş Assambleyası 1,6 milyard dünya insanının həyatında meşələrin daşıdığı həyati əhəmiyyəti nəzərə alaraq 2011-ci ili Beynəlxalq meşə ili elan edib. Bununla bağlı ölkəmizdə də xeyli tədbirlər keçirilmiş, 60 hektarlıq bataqlıq əraziyə ümumilikdə 10 milyon 50 min kubmetr qrunt səpilərək 39 hektar sahədə həmişəyaşıl zeytun ağacları əkilib. Ümumilikdə Azərbaycanın meşə fondu 10 milyona qədər yaşıllaşdırma işləri aparmışdır. Ekologiya və Təbii Sərvətlər Nazirliyi tərəfindən landşaftın yaşıllaşdırılması məqsədilə Bayıl yamacında da 60 hektarlıq sahədə ağaclar əkilib. Ekologiya və Təbii Sərvətlər Nazirliyinin "Yaşıl Bakı" İctimai Birliyi ilə keçirdiyi iməcilikdə isə 4 hektarlıq sahədə 3000 ədəd sərv və zeytun ağacları əkilib. Ağacəkmə ilə bağlı iməciliklər Respublikanın bütün yerli meşə təsərrüfatlarında, o cümlədən Bakı-Quba, Bakı-Şamaxı, Ələt-Salyan və Ələt Hacıqabul magistral yollarının kənarlarında da keçirilib. Bu gün nazirlik tərəfindən ölkə boyu aparılan yaşıllaşdırma siyasəti uğurla davam etdirilir. Son illər bir sıra bölgələrdə yanacağın olmaması səbəbindən baş verən qanunsuz meşə qırıntıları ilə mübarizədə ciddi uğurlara imza atmış nazirlik yaşıllıqlar diyarı Azərbaycanı cənnətməkana çevirmək məqsədindən bir an da geri çəkilməyərək bu yolda böyük işlər görür.

Hər müəllimin borcudur ki, bütün bunlar haqqında tələbələrinə məlumat verməklə onlarda torpaqdan yalnız nemət götürmək məqsədi ilə istifadə etmək deyil, ona nəvaziş göstərmək, yaşıllıqları qorumaq lazımdır kimi fikirləri formalaşdırsın. Hər tələbə bir ağac əksə vətənimiz yaşıllıqlar diyarına çevrilər.

**Problemin aktuallığı.** Təbiətin balansının pozulmasında meşələrin azalması qlobal istiləşməyə səbəb olur. Bununla bağlı BMT-nin məlumatından görünür ki, son 10 ildə yanacaq üçün sərf edilən oksigen itkisinin miqdarı xeyli artmışdır. Bütün ölkələrdə bu problemin həlli haqqında geniş müzakirələr aparılır və yeni meşə zolaqlarının salınması ilə bağlı müəyyən tədbirlər həyata keçirilir. Odur ki, problemin müasir dövrümüzdə tədqiqata cəlb olunması, araşdırılması onun aktuallığını əsaslandırır.

**Problemin elmi yeniliyi.** Məqalədə ilk dəfə olaraq Azərbaycan meşələri haqqında məlumatların təlim prosesində istifadə edilməsi problemi araşdırılır.

**Problemin praktik əhəmiyyəti.** Məqalədə Azərbaycanda meşələrin azaldığı bölgələr araşdırılmış onların həlli yolları müəyyən edilmişdir.

**Ədəbiyyat**

1. Səfərova S. "Azərbaycanda meşələrin bərpası və artırılması" -Bakı, 2011.
2. Azərbaycan Respublikası Ekologiya və Təbii Sərvətlər Nazirliyi, Meşə anlayışı haqqında məlumat. http://anl.az/down/meqale/baki_xeber/2011/may/172729.htm
3. http://eco.gov.az/az/fealiyyet-istiqametleri/mesheler

**Redaksiyaya daxil olub:** 29.04.2025.

UOT 159.9.

**Lamiyə Mübariz qızı Kərimova**
*Azərbaycan Dövlət Neft və Sənaye Universiteti*
*Humanitar fənlər kafedrasının müəllimi*
*https:// orcid.org / 0009-0008-7009-6921*
*E-mail:lamiyosmanova@gmail.com*
*https://doi.org/10.69682/arti.2025.92(3).265-268*

# ƏCNƏBİ SÖZLƏRİN DİLİMİZƏ TƏSİRİ

**Lamiya Mubariz Karimova**
*teacher of the department of Humanities of*
*Azerbaijan State Oil and Industry University*

# THE INFLUENCE OF FOREIGN WORDS ON OUR LANGUAGE

**Ламия Мубариз гызы Керимова**
*преподаватель кафедры Гуманитарные науки*
*Азербайджанского Государственного Университета Нефти и Промышленности*

# ВЛИЯНИЕ ИНОСТРАННЫХ СЛОВ НА НАШ ЯЗЫК

**Xülasə.** Məqalədə Azərbaycan dilinin qorunması və düzgün istifadəsi məsələləri araşdırılır. Tədqiqatın məqsədi dilimizdə yayılmış leksik və qrammatik yanlışlıqları müəyyənləşdirmək və onların aradan qaldırılması yollarını təklif etməkdir. Müzakirə olunan əsas problemlər arasında türkcədən və digər xarici dillərdən alınan sözlərin düzgün istifadəsi, ictimai yerlərdə və reklam lövhələrində rast gəlinən dil qüsurları, tərcümə səhvləri və orfoqrafik uyğunsuzluqlar yer alır. Nəticədə, Azərbaycan dilinin qorunması və inkişafı üçün dövlət qurumları və cəmiyyətin üzərinə böyük məsuliyyət düşdüyü, mediada və ictimai sahələrdə dil qaydalarına ciddi nəzarətin vacib olduğu qənaətinə gəlinir.
***Açar sözlər:*** *Azərbaycan dili, dilin qorunması, leksik səhvlər, reklam dili, tərcümə problemləri, dil siyasəti, ictimai yazılar*

**Abstract.** The article examines the issues of the protection and correct use of the Azerbaijani language. The aim of the study is to identify the lexical and grammatical errors common in our language and to suggest ways to eliminate them. The main problems discussed include the correct use of words borrowed from Turkish and other foreign languages, language errors found in public places and on billboards, translation errors and orthographic inconsistencies. As a result, it is concluded that state institutions and society have a great responsibility for the protection and development of the Azerbaijani language, and that strict control over language rules in the media and public spheres is necessary.
***Keywords:*** *Azerbaijani language, language protection, lexical errors, advertising language, translation problems, language policy, public posts.*

**Аннотация.** В статье рассматриваются вопросы сохранения и правильного использования азербайджанского языка. Цель исследования – выявить распространенные лексические и грамматические ошибки в нашем языке и предложить пути их устранения. Среди основных обсуждаемых проблем – правильное использование слов турецкого и других иностранных языков, языковые ошибки, встречающиеся в общественных местах и на рекламных щитах, ошибки перевода и орфографические несоответствия. В результате делается вывод, что на государственных учреждениях и обществе лежит большая ответственность за защиту и развитие азербайджанского языка, важен строгий контроль языковых правил в средствах массовой информации и общественной сфере.
***Ключевые слова:*** *азербайджанский язык, сохранение языка, лексические ошибки, язык рекламы, проблемы перевода, языковая политика, публичные записи*

**Giriş**

Dil hər bir xalqın kimliyini, tarixini və mədəniyyətini əks etdirən ən mühüm amillərdən biridir. Tarix boyu dillər bir-biri ilə təmasda olmuş, qarşılıqlı təsir nəticəsində yeni sözlər və ifadələr yaranmışdır. Bu təsir ticarət, müharibələr, elm və texnologiyanın inkişafı, qloballaşma və informasiya texnologiyalarının geniş yayılması ilə daha da güclənmişdir. Azərbaycan dili də bu prosesdən kənarda qalmamış, müxtəlif dövrlərdə ərəb, fars, rus, ingilis və digər dillərdən çoxsaylı sözlər qəbul etmişdir. Bəzi əcnəbi sözlər dilimizdə tam mənimsənilmiş, bəziləri isə orijinallığını qoruyaraq istifadə olunmuşdur.

Bu məqalədə əcnəbi sözlərin Azərbaycan dilinə təsiri, onların müsbət və mənfi tərəfləri, həmçinin dilimizin bu təsirlər qarşısında necə qorunmalı olduğu araşdırılacaqdır.

**Əsas hissə**

Azərbaycan dili tarix boyu müxtəlif xarici təsirlərə məruz qalmışdır.

Xüsusilə, islamın yayılması ilə ərəb və fars sözləri dilimizə daxil olmuşdur. Bu sözlər əsasən dini, elmi və ədəbi sahələrdə geniş yayılmışdır. Məsələn, "kitab", "elm", "mədəniyyət", "ədalət", "həyat", "mövcud" kimi sözlər ərəb mənşəlidir. Fars dilindən isə "pəncərə", "xəstə", "düşmən", "şəkər", "bəhanə" kimi sözlər dilimizə keçmişdir.

Çar Rusiyası və Sovet dövründə rus dilindən çox sayda söz dilimizə keçmişdir. Bu təsir xüsusilə texniki, elmi və rəsmi terminlərdə özünü göstərmişdir. "Proses", "fakt", "nümunə", "komissiya", "dəftərxana", "briqada" kimi sözlər rus dilindən alınmışdır.

Müasir dövrdə qloballaşma və informasiya texnologiyalarının inkişafı nəticəsində ingilis dilindən bir çox sözlər dilimizə daxil olmuşdur. Xüsusilə, "internet", "menecer", "marketinq", "startup", "layihə", "kompüter", "online", "brend" kimi sözlər geniş istifadə edilir [1, s. 744].

Bu gün Azərbaycanda internet mediası sürətlə inkişaf edir. Xəbər saytlarının sayı getdikcə artır, lakin bu, bir çox hallarda dilimizin korlanmasına səbəb olur. Xüsusilə mətbuat orqanları və yeni yaranan xəbər portalları dil normalarına riayət etmirlər. Yazılı mediada – qəzet və jurnallarda, eləcə də internet saytlarında orfoqrafik, qrammatik və üslub xətalarına tez-tez rast gəlirik. Ən geniş yayılmış səhvlərdən biri isə cümlədə söz sırasının pozulmasıdır [2, s. 256].

Son illərdə dilimizə çox sayda alınma söz daxil olub. Bu proses müəyyən mənada təbii sayılsa da, bəzi yad ünsürlər dilimizdə lazımsız şəkildə geniş yayılıb. Qloballaşma dövründə elm və texnologiyanın inkişafı ilə yeni anlayışlar yaranır, bu da dilimizə yeni sözlərin daxil olmasına səbəb olur. Buna baxmayaraq, biz ana dilimizi qorumalı və saflığını qorumağa çalışmalıyıq. Bunun üçün isə qəbul olunmuş qanunlara əməl edib, dilimizdə mümkün olduğu qədər yad sözlərdən istifadə etməməliyik.

Xüsusilə rus dilindən keçmiş çoxlu sözlər gündəlik ünsiyyətdə və mətbuatda geniş istifadə olunur. Tarixən rus dili ilə sıx əlaqədə olmağımız buna səbəb olub. Lakin bu, həmin sözləri gündəlik istifadədə saxlamağımız üçün bir bəhanə olmamalıdır. Məsələn, "xolodilnik" əvəzinə "soyuducu", "vilka" əvəzinə "çəngəl", "ruçka" əvəzinə "qələm", "kuxna" əvəzinə "mətbəx", "pol" əvəzinə "döşəmə", "patalok" əvəzinə "tavan", "ventilyator" əvəzinə "sərinkeş" kimi Azərbaycan dilinə uyğun qarşılıqları var və bunların işlədilməsi daha doğru olar. Əgər ailə mühitində uşaqlar ilk dəfə düzgün sözləri eşitsələr, gələcəkdə yad sözlərdən istifadə etməzlər [5, s. 198].

Mətbuatda və gündəlik danışıqda ən çox işlənən rus sözlərindən biri də "astanovka"dır. Televiziya kanallarında, xəbər saytlarında və məqalələrdə bu sözə çox rast gəlirik. Halbuki, onun Azərbaycan dilində qarşılığı "dayanacaq"dır. Eyni vəziyyət "şofer" (sürücü), "probka" (tıxac), "varata" (darvaza), "fortoçka" (nəfəslik) kimi sözlər üçün də keçərlidir. Çoxları bu sözlərin Azərbaycan dilində mövcud olan qarşılıqlarını bilmədiklərindən və ya vərdiş etdiklərindən onları işlətməyə davam edirlər.

Bundan başqa, "sroçnı" (təcili), "karoçi" (xülasə), "daje" (hətta), "vsyo" (vəssalam), "temboli" (ələlxüsus), "srazı" (dərhal), "imenni" (məhz) kimi ifadələr də gündəlik danışıqda geniş yayılıb. Halbuki, bunların hər biri üçün dilimizdə uyğun qarşılıqlar mövcuddur və onlardan istifadə etmək daha doğrudur.

Televiziya və internet mediasında ən çox işlənən yad sözlərdən biri də "moyka"dır. Şəhərdə avtomobil yuma məntəqələrinin əksəriyyətində bu söz yazılıb. Halbuki, Azərbaycan dilində bunun "avtoyuma" və ya "maşın yuma məntəqəsi" kimi qarşılıqları var. Hətta nüfuzlu xəbər saytları və televiziyalar da bu səhvə yol verirlər. Məsələn, "Maşını moykaya qoydu, qayıdanda

yerində tapmadı", "Moykadan maşını oğurladılar" kimi başlıqlara tez-tez rast gəlirik. Halbuki, dilimizin saflığını qorumaq istəyiriksə, bu cür səhvlərə yol verməməliyik.

Dilimiz bizim milli kimliyimizin əsas göstəricisidir və onu qorumaq hər birimizin borcudur. Alınma sözlərin həddindən artıq istifadəsi dilimizin zənginliyinə zərər vurur. Bunun qarşısını almaq üçün mətbuat orqanları, televiziya və internet media düzgün dil qaydalarına riayət etməli, eyni zamanda, hər birimiz gündəlik ünsiyyətdə Azərbaycan dilinin imkanlarından tam istifadə etməliyik.

Məsələn, "Hər kəsi salamlayıram" ifadəsi Azərbaycan dilinin qaydalarına uyğun deyil. Düzgün variant "Hamını salamlayıram" olmalıdır. Çünki "hər kəs" fərdi olaraq insanları bildirir, "hamı" isə ümumiləşdirici anlayışdır. Bu kimi yanlış istifadələr türkcənin təsirindən qaynaqlansa da, Azərbaycan dilində işlədilməsi doğru deyil.

Bundan başqa, "çağrı mərkəzi" ifadəsi də dilimizə yad olan "çağrı" sözündən istifadə etməklə formalaşıb. Azərbaycan dilində "çağırış" sözü mövcuddur və daha uyğun hesab edilir. Məsələn, "Çağırış Mərkəzi" ifadəsi işlədilsə, həm dil qaydalarına uyğun olar, həm də anlaşılmazlıq yaranmaz.

Dilimizin əsas problemlərindən biri də reklam və ictimai yazılarda rast gəlinən səhvlərdir. Küçələrdə, dövlət müəssisələrində və ticarət obyektlərində xarici dillərdə yazılmış lövhələr, qeyri-dəqiq tərcümələr və qaydalara zidd ifadələr geniş yayılıb. Məsələn, Bakı Dəmir Yol Vağzalının adı müxtəlif yerlərdə fərqli formalarda yazılıb: "Bakı Dəmir Yol Vağzalı", "Baki Dəmiryol Vağzalı" və "Bakı Dəmir Yolu Xəstəxanası". Halbuki bu adlar vahid bir qaydaya əsasən yazılmalıdır.

Reklam sahəsində də problemlər var. Şəhərin müxtəlif yerlərində "Parking", "Rent A Car" kimi ifadələr açıq şəkildə işlədilir. Halbuki bunların Azərbaycan dilində qarşılığı var – "Parklanma", "Avtomobil kirayəsi". Xarici dillərə meyillilik, tərcümə zamanı yol verilən səhvlər və qeyri-peşəkarlıq nəticəsində belə hallarla tez-tez rastlaşırıq [3, s. 312].

Digər bir problem isə xarici adların üstünlük təşkil etməsidir. Məsələn, bir dükanın adı böyük hərflərlə "Luxury Garden" kimi yazıldığı halda, onun Azərbaycan dilindəki qarşılığı – "Gül Bağçası" xırda hərflərlə verilir. Bu, həm dilimizin, həm də milli kimliyimizin hörmətsizliyə məruz qalmasına səbəb olur.

Bəşəriyyətin keçdiyi uzun tarixi yol göstərir ki, hər bir xalqın mövcudluğu onun dilinin yaşaması ilə birbaşa bağlıdır. Əgər bir xalqın dili unudulursa və istifadə olunmursa, həmin xalq da zamanla tarix səhnəsindən silinir. Dil sadəcə ünsiyyət vasitəsi deyil, o, bir xalqın mədəniyyətini, tarixini və kimliyini özündə əks etdirən ən mühüm dəyərlərdən biridir. Dillər də canlı varlıq kimi zamanla dəyişir, zəifləyir və hətta yox ola bilər. Latın dili buna ən bariz nümunədir. Bu dil bir zamanlar Avropanın elm və mədəniyyət dünyasında mühüm yer tutsa da, bu gün əsasən tibb və hüquq sahəsində bəzi terminlərdə yaşamaqdadır.

Ölən təkcə latın dili deyil. Tarix boyunca yüzlərlə dil yox olmuş və bir çoxu da bu prosesin astanasındadır. ABŞ-ın Milli Coğrafiya İnstitutunun araşdırmalarına görə, dünyada hər on dörd gündə bir dil məhv olur. Bu, dillərin müxtəlif səbəblərdən sıradan çıxdığını göstərir. Dillərin ölümü əsasən iki amillə bağlıdır: birincisi, xarici təsirlər nəticəsində ana dilinin yad sözlərlə dolması, ikincisi isə bu dildə danışanların sayının azalmasıdır. Dilin digər dillərin təsiri altına düşməsi, öz sözlərindən çox alınma sözlərə yer verməsi onun zəifləməsinə gətirib çıxarır. Bəzi mütəxəssislər bunu "dilin intiharı" adlandırır. Bununla belə, dillərin bir-birinə təsir etməsi və müəyyən dərəcədə qarşılıqlı əlaqədə olması yeni bir hadisə deyil. Tarixin müxtəlif dövrlərində mədəniyyətlər və dillər bir-birindən təsirlənmiş, nəticədə dillər daxilində alınma sözlər yaranmışdır. Bu, qloballaşmanın və mədəni əlaqələrin bir hissəsidir. Dünyada yalnız özünəməxsus sözlərdən ibarət heç bir dil yoxdur. Hər bir dil digər dillərdən müəyyən sözlər götürmüş və onları öz sisteminə uyğunlaşdırmışdır. Əsas məsələ isə, ana dilini qoruyaraq onun inkişafını təmin etmək və yad təsirlərin onu sıradan çıxarmasına imkan verməməkdir.

Gündəlik həyatımızda fərqinə varmadan yanından keçdiyimiz bir nümunə də paytaxt və regionlarımızdakı ticarət obyektlərinin adlarıdır. Əksəriyyətinin adı xarici dillərdədir və bu, ana dilimizə olan sayğısızlığın bariz nümunəsidir. Bunun səbəbi isə daha çox ticarətdə fərqlənmək və brend adı yaratmaq istəyi ilə izah edilsə də, nəticə olaraq doğma dilimizin kölgədə qalmasına gətirib çıxarır [4].

Xüsusilə, Bakının küçələrində rast gəldiyimiz reklam lövhələri sanki xarici bir şəhərdə olduğumuz təəssüratını yaradır. Məsələn, “Victoria mebel”, “Golden Fitness”, “Lady Star”, “Kontakt Home” kimi adlar Azərbaycan dilinin orfoqrafiya və qrammatika qaydalarına uyğun gəlmir. Hətta əlifbamızda olmayan W hərfi kimi simvollardan geniş istifadə olunur. Bu isə təkcə dilə qarşı hörmətsizlik deyil, həm də uzun illər davam edən bir mənəvi laqeydlikdir. Bu problemin qarşısını almaq üçün Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev 1 noyabr 2018-ci ildə “Azərbaycan dilinin saflığının qorunması və dövlət dilindən istifadənin daha da təkmilləşdirilməsi ilə bağlı tədbirlər haqqında” fərman imzalamışdır. Bu fərmana əsasən, Dövlət Dil Komissiyası yanında Monitorinq Mərkəzi yaradılmışdır. Mərkəzin əsas vəzifəsi dövlət dilinin tətbiqinə nəzarət etmək, media və reklamlarda ədəbi dil normalarının qorunmasını təmin etməkdir. Belə tədbirlər dilimizin qorunması və onun gələcək nəsillərə düzgün şəkildə ötürülməsi baxımından mühüm addımlardır.

**Nəticə**

Əcnəbi sözlərin Azərbaycan dilinə təsiri danılmazdır. Bu təsir bəzən müsbət, bəzən isə mənfi olur. Dilin zənginləşməsi və müasir texnologiyalarla ayaqlaşması üçün bəzi əcnəbi sözlərin qəbulu qaçılmazdır. Lakin bu prosesə nəzarət olunmazsa, ana dilimizin orijinallığını itirməsi və milli kimliyimizin zəifləməsi təhlükəsi yarana bilər. Buna görə də, əcnəbi sözlərin dilimizə təsirini minimuma endirmək, onların istifadəsini normallaşdırmaq və Azərbaycan dilinin inkişafını təmin etmək üçün cəmiyyət, alimlər, media qurumları və dövlət qurumları birlikdə hərəkət etməlidir. Dilimizi sevmək və qorumaq hər bir vətəndaşın borcudur.

**Problemin aktuallığı**. Bu məqalənin aktuallığı ondan ibarətdir ki, əcnəbi sözlərin dilimizə təsiri kimi vacib problemi özündə əks etdirir.

**Problemin yeniliyi.** Bu mövzuda geniş araşdırmalar aparılmış və bu tədqiqatlar məqalədə öz əksini tapmışdır.

**Problemin praktik əhəmiyyəti.** Elm sahəsində çalışan şəxslər və gənc tədqiqatçılar məqalədəki materiallardan istifadə edilə bilərlər.

**Ədəbiyyat**


1. Azərbaycan Milli Elmlər Akademiyası // Azərbaycan dilinin orfoqrafiya lüğəti //. - Bakı: Şərq-Qərb, - 2019, -744 s
2. Quluyev, İ.Ə. Dil və cəmiyyət: Azərbaycan dili müasir dövrdə. Bakı: Elm və Təhsil , - 2021. - 256 s.
3. Vəliyev, C.S. Azərbaycan dilinin leksik və qrammatik qaydaları. Bakı: Maarif, - 2018. - 312 s.
4. Azərbaycan Respublikasının Nazirlər Kabineti. // Azərbaycan dilinin qrammatikasına dair normativ aktlar // - Bakı: - 2022, - rəsmi sənəd.
5. Həsənov, E.R. Reklam dilində üslub və tərcümə problemləri //- Bakı: Təhsil Nəşriyyatı, - 2020. - 198 s.


**Redaksiyaya daxil olub:** 27.05.2025

## MÜNDƏRİCAT
## ОГЛАВЛЕНИЕ
## CONTENTS

***BAŞ REDAKTORDAN***
***ОТ ГЛАВНОГО РЕДАКТОРА***
***FROM THE EDITOR-IN-CHIEF***



***AZƏRBAYCAN RESPUBLİKASINDA KONSTİTUSİYA VƏ SUVERENLİK İLİ***
***YEAR OF THE CONSTITUTION AND SOVEREIGNTY" IN THE REPUBLIC OF AZERBAIJAN***
***ГОД КОНСТИТУЦИИ И СУВЕРЕНИТЕТА В АЗЕРБАЙДЖАНСКОЙ РЕСПУБЛИКЕ***



***ÜZEYİR HACIBƏYLİ – 140***
***UZEYIR HAJIBAYLI – 140***
***УЗЕИР ГАДЖИБЕКЛИ – 140***

***PROFESSOR AKİF ABBASOV – 75***
***PROFESSOR AKIF ABBASOV – 75***
***ПРОФЕССОР АКИФ АББАСОВ – 75***



***ÜMUMPEDAQOJİ PPROBLEMLƏR***
***GENERAL PEDAGOGICAL PROBLEMS***
***ОБЩЕПЕДАГОГИЧЕСКИЕ ПРОБЛЕМЫ***

***AZƏRBAYCAN DİLİNİN TƏDRİSİ METODİKASI***
***METHODOLOGY OF TEACHING THE AZERBAIJANI LANGUAGE***
***МЕТОДИКА ПРЕПОДАВАНИЯ АЗЕРБАЙДЖАНСКОГО ЯЗЫКА***



***COĞRAFİYANIN TƏDRİSİ METODİKASI***
***METHODOLOGY OF TEACHING GEOGRAPHY***
***МЕТОДИКА ПРЕПОДАВАНИЯ ГЕОГРАФИИ***



***FİZİKANIN TƏDRİSİ METODİKASI***
***METHODOLOGY OF TEACHING PHYSICS***
***МЕТОДИКА ПРЕПОДАВАНИЯ ФИЗИКИ***



***TARİXİN TƏDRİSİ METODİKASI***
***METHODOLOGY OF TEACHING HISTORY***
***МЕТОДИКА ПРЕПОДАВАНИЯ ИСТОРИИ***



***FİZİKİ TƏRBİYƏNİN TƏDRİSİ METODİKASI***
***METHODOLOGY OF TEACHING PHYSICAL CULTURE***
***МЕТОДИКА ПРЕПОДАВАНИЯ ФИЗИЧЕСКОЙ КУЛЬТУРЫ***

***MÜƏLLİMİN ÖZÜNÜTƏHSİLİ***
***SELF-EDUCATION OF THE TEACHER***
***САМООБРАЗОВАНИЕ УЧИТЕЛЯ***

## TƏQDİM OLUNAN MƏQALƏLƏRƏ TƏLƏBLƏR

1. Digər redaksiyalara təqdim olunmamış məqalələr qəbul edilir.
2. Məqalələr son tədqiqatların nəticələrini əks etdirməli, yeni ideyalarla zəngin olmalı, elmi məqalələrin yazılışına qoyulan tələblər gözlənilməlidir.
3. Məqalələrdə öz əksini tapan fikirlər müəlliflərə aid olmalıdır. İstifadə edilmiş fotolar açıq mənbələrdən götürülməlidir. Antiplagiat və digər tədqiqat etikasının tələblərinin təmin olunması məqalə müəlliflərinin məsuliyyətindədir.
4. Plagiatlıq faktları aşkar edildikdə həmin məqalənin nəşri dayandırılır.
5. Təqdim olunan məqalələrdə müəlliflərə aid Orcid öz əksini tapmalıdır.
6. Məqalələr Azərbaycan, rus və ingilis dillərində qəbul edilir Hər məqaləyə adları çəkilən dillərdə xülasələr və açar sözlər yazılır.
7. Məqalələr Azərbaycan. dilində latın əlifbası (Times New Roman), rus dilində krill əlifbası və ingilis dilində ingilis (ABŞ) əlifbası ilə Times New Roman - 14 şrift ilə 1,5 intervalla yığılmalı, elektron variantı ilə birlikdə (filəşkartda) təqdim olunmalıdır.
8. Məqalələr üç dildən - Azərbaycan, rus və ingilis dillərindən birində çap olunur. 3 dildə (Azərbaycan, rus və ingilis) məqalənin xülasəsi təqdim edilir. Xülasədə irəli sürülən başlıca elmi müddəalar, tədqiqatdan alınan nəticələr, problemin nəzəri və praktik əhəmiyyəti öz əksini tapmalıdır.
9. Məqalə aşağıdakı ardıcıllıqla yazılır: birinci sətirdə müəllif(lər)in adı, atasının adı və soyadı; ikinci sətirdə elmi dərəcəsi və elmi adı (yaxud doktorant də dissertant olması və s.); üçüncü sətirdə iş yeri, vəzifəsi; dördüncü sətirdə böyük hərflərlə məqalənin adı. Daha sonra bu qaydada həmin məlumatlar rus və ingilis dillərində təkrar edilir.
10. Həmmüəlliflərin üç nəfərdən artıq olması məqsədəuyğun deyildir.
11. Redaksiya məqalədə zəruri dəyişiklər və ixtisarlar, redaktə aparrmaq hüququna malikdir. Məqalələrə iki mütəxəssisin rəyi, şöbə və ya kafedranın, həmçinin ali məktəbin Elmi Şurasının və ümumtəhsil, yaxud orta ixtisas təhsili müəssisəsinin pedaqoji şurasının iclas protokollarından çıxarışlar əlavə olunur.
12. Məqalədəki faktların, məlumatların dürüstlüyünə müəlliflər cavabdehdir. İrəli sürülən elmi müddəalar müəllifin özünə məxsus olmalı, istifadə edilmiş nəzəri fikirlərin mənbəyi göstərilməlidir.
13. Məqalədə son 5-10 ildə çap olunan əsərlərə istinadlara üstünlük verilməlidir. Məqalənin sonunda verilən ədəbiyyat siyahısı əlifba ardıcıllığı ilə deyil, istinad olunan ədəbiyyatların mətndə rast gəlindiyi ardıcıllıqla nömrələnməli və məsələn, (1) və ya (1, s. 119) kimi işarə olunmalıdır. Eyni ədəbiyyata mətndə başqa bir yerdə təkrar istinad olunarsa, onda istinad olunan həmin ədəbiyyat əvvəlki nömrə ilə göstərilməlidir.
14. Jurnal öz profilinə uyğun məqalələri dərc edir.
15. Elmi məqalələrin sonunda elm sahəsinin və məqalənin xarakterinə uyğun olaraq aktuallıq əsaslandırılmalı, elmi yeniliyi, tətbiqi əhəmiyyəti, iqtisadi səmərəsi və s. aydın şəkildə verilməlidir.
16. Daha sonra istinad olunmuş ədəbiyyatın siyahısı verilir.
17. Məqalə müəlliflərinin hüquqları qorunur.
18. Jurnalda "ardı növbəti nömrədə" adı altında seriya məqalələr dərc olunmur.
19. Məqalələrin müxtəlif dillərdə olan xülasələri bir-birinin eyni olmalı və məqalənin məzmununa uyğun gəlməlidir.
20. Məqalənin sonunda rəyçilərin adı, atasının adı və soy adı, elmi dərəcəsi və elmi adı; sonrakı sətirdə məqalə müəllifinin elektron ünvanı (E-mail) göstərilməlidir.
21. Məqaləyə müəllif haqqında aşağıdakı məlumatlar əlavə olunur: məqalə müəllif (lər)inin adı, atasının adı soyadı, işlədiyi müəssisə (hansı müəssisədə doktorant və dissertant olması) və müəssisənin ünvanı, müəllif(lər)in vəzifəsi, elmi dərəcəsi və adı, iş və ev telefonları, ev ünvanı, elektron poçt ünvanı (Email).

## ТРЕБОВАНИЯ К ПРЕДСТАВЛЕННЫМ СТАТЬЯМ

1. Принимаются статьи, не представленные в других редакциях.
2. Статьи должны отражать результаты последних исследований, быть богатыми новыми идеями, в них должны быть соблюдены требования, предъявляемые написанию научных статей.
3. Идеи, отраженные в статьях, должны принадлежать авторам. Используемые фотоматериалы должны быть взяты из открытых источников. Авторы статьи несут ответственность за соблюдение антиплагиатных и других требований исследовательской этики.
4. При обнаружении фактов плагиата публикация статьи прекращается.
5. Текст статьи должен составлять около 6-8 страниц. Ключевые слова для статьи должны быть представлены на трех языках: азербайджанском, русском и английском.
6. Текст статьи должен быть представлен на флеш-карте вместе с электронным вариантом, с интервалом 1,5; шрифтом 14 Times New Roman - латинского алфавита на азербайджанском языке, кириллицы на русском языке, и английским алфавитом (США) на английском языке.
7. Статьи публикуются на одном из трех языков - азербайджанском, русском и английском. Резюме статьи предоставлено на 3 языках (азербайджанском, русском и английском). В статье должны быть отражены основные научные положения, изложенные в резюме, выводы, сделанные из исследования, должна быть представлена теоретическая и практическая значимость проблемы.
8. Статья должна быть написана в следующем порядке: на первой строке имя, фамилия и отчество автора (авторов); вторая строка содержит ученую степень и ученое звание (диссертант или докторант и т. д.); третья строка указывает место работы, должность; на четвертой строке представлено название статьи прописными буквами. Затем эта же информация повторяется на русском и английском языках.
9. Нежелательно иметь более трех соавторов.
10. Редакция имеет право вносить изменения и сокращения в статью.
11. Вместе со статьей должно быть предоставлено два отзыва специалистов: заведующих кафедрой или отделом, а также выписка из протокола Ученого совета вузов и педагогического совета общеобразовательного или среднего специального образования.
12. Авторы статьи несут ответственность за достоверность приведенных в статье фактов и информации. Предлагаемые научные положения должны принадлежать автору и должен быть указан источник используемых теоретических идей.
13. Ссылки следует давать на работы, опубликованные за последние 5-10 лет. Список литературы, приведенный в конце статьи, должен быть пронумерован не в алфавитном порядке, а в том порядке, в котором указанная литература появляется в тексте, например (1) или (1, стр. 119). Если та же самая литература повторяется в другом месте в тексте, то эта же литература должна быть указана под предыдущим номером.
14. Журнал публикует статьи, имеющие отношение к его профилю.
15. В конце научной статьи должна быть обоснована актуальность в соответствии с характером статьи и областью науки, четко указана научная новизна, важность ее применения, экономическая эффективность и т.д.
16. Затем предоставляется список использованной литературы.
17. Права авторов статьи защищены.
18. Журнал не публикует серии статей под заголовком «продолжение в следующем номере».
19. Резюме статей на разных языках должны быть одинаковыми и соответствовать содержанию статьи.
20. В конце статьи должно быть указано имя, отчество и фамилия рецензентов, их ученая степень и ученое звание; следующая строка должна содержать адрес электронной почты автора статьи.
21. В статью добавляется следующая информация об авторе: имя, фамилия, отчество автора (авторов), учреждение, где он работает (докторантом или диссертантом которого является) адрес учреждения, должность, ученая степень и звание автора(ов), домашний и рабочий телефоны, домашний адрес, электронная почта (E-mail).

## REQUIREMENTS FOR SUBMITTED ARTICLES

1. Submitted articles should not be published or accepted for publication in other editions.
2. Articles should reflect the results of recent research, be rich in new ideas and they must comply with the requirements for writing scientific articles.
3. The opinions reflected in the articles should belong to the authors. The used photo materials must be taken from open sources. Ensuring compliance with anti-plagiarism and other research ethics requirements is the responsibility of the article authors.
4. When the facts of plagiarism are discovered, the publication of the article is stopped.
5. The text of the article should be about 6-8 pages. Keywords for the article should be presented in three languages: Azerbaijani, Russian and English.
6. The text of the article should be presented on the flash card together with the electronic version, with an interval of 1.5; 14 point Times New Roman font - Latin alphabet in Azerbaijani, Cyrillic in Russian, and English alphabet (USA) in English.
7. Articles are published in one of three languages - Azerbaijani, Russian and English. A summary of the article is provided in 3 languages (Azerbaijani, Russian and English). The article should reflect the main scientific provisions presented in the summary, the conclusions drawn from the study, the theoretical and practical significance of the problem should be presented.
8. The article is written in the following order: on the first line the name, surname and patronymic of the author (s); the second line contains the academic degree and academic title (doctoral student or candidate for a degree, etc.); the third line indicates the place of work, position; the fourth line represents the title of the article in capital letters. Then in this order the same information is repeated in Russian and English.
9. It is undesirable to have more than three co-authors.
10. The Editorial Board has the right to make changes and reductions in the article.
11. Two expert reviews should be provided together with the article: heads of department or chair, as well as extract from the protocol of Academic Council of the higher school and the Pedagogical Council of general or secondary special education institutions.
12. The authors of the article are responsible for the accuracy of the facts and information provided in the article. The proposed scientific provisions should belong to the author and the source of used theoretical ideas must be indicated.
13. The articles should refer to works published in the last 5-10 years. The list of references given at the end of the article should not be numbered in alphabetical order, but in the order in which the indicated literature appears in the text, for example (1) or (1, p. 119). If the same literature is repeated elsewhere in the text, then the same literature should be indicated under the previous number.
14. The journal publishes articles related to its profile.
15. At the end of a scientific article, the relevance should be justified according to the nature of the article and the area of science, scientific novelty, importance of its application, economic efficiency, etc. should be clearly indicated.
16. Then a list of references is provided.
17. The rights of the authors of the article are protected.
18. The journal does not publish a series of articles under the heading “continued in the next issue”.
19. Summary of articles in different languages should be the same and consistent with the content of the article.
20. At the end of the article the name, patronymic and last name of the reviewers, their academic degree and academic title should be indicated; the next line should contain the email address of the author of the article.
21. The following information about the author is added to the article: name, surname, patronymic of the author (authors), the institution where he works (doctoral student or candidate for a degree), address of the institution, position, academic degree and the title of the author (s), home and work phones, home address, email address.

